Redaktor: **Əliqismət Bədəlov**

Rəyçi: **Rəna Mirzəzadə,** AMEA-nın Fəlsəfə və Hüquq İnstitutunun Politologiya və siyasi sosiologiya şöbəsinin müdiri, professor

**Zərifə Quliyeva.** Zəfər tariximizin fatehləri. Bakı, *"AFPoliqrAF"*, 2024, 368 səh.

Kitabda tanınmış ictimai-siyasi xadim, YAP Veteranlar Şurasının üzvü, "Modern İnkişaf və Ailə" İctimai Birliyinin sədri, Zərifə xanım Quliyevanın son illərdə müxtəlif qəzet və saytlarda dərc olunan məqalələri, şərhləri və verdiyi müsahibələri toplanmışdır. Məzmun etibarı ilə Prezident, Ali Baş Komandan İlham Əliyevin Azərbaycanın ərazi bütövlüyünün və suverenliyinin bərpası uğrunda son dərəcə gərgin, mürəkkəb, həm də şərəfli siyasi fəaliyyətindən, ölkəmizə qarşı çıxan ermənipərəst dövlətlərə, həmçinin bəzi qərəzli beynəlxalq təşkilatlara qarşı məharətli diplomatiyasından, eyni zamanda, Birinci vitse-prezident, Heydər Əliyev Fondunun prezidenti və ICESCO-nun xoş məramlı səfiri Mehriban xanım Əliyevanın dövlətimizin başçısına arxa-dayaq olmasından bəhs olunan bu kitab geniş oxucu auditoriyası üçün nəzərdə tutulmuşdur.

Kitabda, həmçinin Ulu Öndər Heydər Əliyev və Azərbaycan oftalmologiyasını dünya səviyyəsində tanıdan akademik Zərifə xanım Əliyeva haqqında yazılmış məqalələr də öz əksini tapıb.

**ISBN** 978-9952-541-84-7

# Ön söz

Bu gün Azərbaycan dünyanın inkişaf etmiş dövlətləri ilə bir sıradadır. Son 21 ildə həyata keçirilən daxili və xarici siyasət qazandığımız uğurların məntiqi nəticəsidir. Qürurverici haldır ki, hazırda bir sıra beynəlxalq əhəmiyyətli iri infrastruktur layihələrin reallaşdırılması Azərbaycanla razılaşdırılır. 10 noyabr 2020-ci il tarixdə Azərbaycan Prezidenti İlham Əliyev, Rusiya Federasiyasının Prezidenti Vladimir Putin və Ermənistanın baş naziri Nikol Paşinyanın imzaladıqları üçtərəfli Bəyanatdan sonra ölkəmizin beynəlxalq aləmdəki reytinqi sürətlə yüksəldi. Məlum olduğu kimi, həmin bəyanat Ermənistanın məğlubiyyətini rəsmən təsdiqləmişdi. Üç il sonra – 2023-cü ilin sentyabrında Silahlı Qüvvələrimizin Qarabağda apardığı lokal xarakterli antiterror tədbirlərindən sonra separatçı rejimin kökü birdəfəlik kəsildi. Bununla da Azərbaycanın ərazi bütövlüyü tam təmin edildi. Bu Qələbə Azərbaycanın tarixində silinməz iz buraxdı. Ölkəmizin ərazi bütövlüyü və suverenliyimiz dünya birliyində də qəbul edildi. Bunu Prezident İlham Əliyevə dünyanın müxtəlif ölkələrinin dövlət və hökumət başçıları tərəfindən ünvanlanmış təbrik teleqramları da təsdiqləyir. Bu gün qürurla deyə bilərik ki, Azərbaycan dünyada suveren dövlət kimi qəbul edilir.

Prezident, Ali Baş Komandan İlham Əliyevin dünyada lider dövlət başçısı olması artıq beynəlxalq aləmdə də qəbul edilir. Bu gün tanınmış ictimai-siyasi xadimlərin, QHT rəhbərlərinin, politoloq və ekspertlərin də bu barədəki açıqlamaları, rəyləri hər birlimizi qürurlandırır. Son illər bu istiqamətdə yazılan məqalələri, şərhləri, müsahibələri böyük maraqla izləyirəm. Diqqətimi daha çox cəlb edən YAP Veteranlar Şurasının üzvü, "Modern İnkişaf və Ailə" İctimai Birliyinin sədri, ictimai-siyasi xadim Zərifə xanım Quliyevanın son illərdə müxtəlif qəzet və saytlarda dərc olunan məqalələri, şərhləri və müsahibələri oldu. Həmin yazıları oxuduqca Zərifə Quliyevanı daha yaxından tanımaq məqsədilə onun həyat və yaradıcılığına nəzər yetirdim.

Zərifə Quliyeva 1952-ci il fevralın 13-də Balakən rayonunda anadan olub. 1959-cu ildə Naxçıvan şəhər 4 saylı orta məktəbin 1-ci sinfinə daxil olmuş, 1969-cu ildə Əli Bayramlı (indiki Şirvan) şəhəri orta məktəbini bitirmişdir. 1969-cu ildə Nəriman Nərimanov adına Azərbaycan Dövlət Tibb İnstitutunun müalicə-profilaktika fakultəsinə daxil olmuş, 1976-cı

ildə isə həmin ali təhsil ocağını müvəffəqiyyətlə bitirmişdir.

Zərifə xanım ilk əmək fəaliyyətinə 1975-ci ildə Bakı şəhər 5 saylı kliniki xəstəxanasında həkim kimi fəaliyyətə başlamış, 1981-ci ildən 1984-cü ilədək həmin xəstəxanada qəbul şöbəsinin müdiri vəzifəsində çalışmışdır. 1984-cü ildən respublikanın ictimai-siyasi həyatında fəaliyyətini davam etdirmiş və Nizami Rayon Partiya Komitəsində təlimatçı kimi həm də, səhiyyə, təhsil, mədəniyyət sahələrinə kuratorluq edərək geniş fəaliyyət göstərmişdir. Z.Quliyeva beş il bu sahədə fəaliyyət göstərdikdən sonra həmin ildən 1995-ci ilədək Nizami rayon 17 saylı tibbi-sanitar hissənin baş həkimi vəzifəsində işləmişdir.

Z.Quliyeva1990–1993-cü illərdə mənfur erməni işğalçılarına qarşı Qarabağ müharibəsi dövründə atəşkəs imzalanana qədər on millərlə insana qan yardımı proqramını təşkil etmiş, bu işin Qanköçürmə İnstitutu tərəfindən yerinə yetirilməsinə nail olmuşdur. O, bu illər ərzində müxtəlif sosial və ictimai, şəhid ailələri və qazilərlə bağlı tədbirlər təşkil etmiş, yaradıcılığını davam etdirmiş, müxtəlif mətbuat orqanlarında ayrı-ayrı mövzularla bağlı çıxışlar etmiş, hətta bir neçə kitabın müəllifi omuşdur. Zərifə xanım  Quliyeva 2005-ci ildə “Təhsil” nəşriyyatı tərəfindən “Ömrün son baharı” adlı ilk kitabını oxuculara təqdim etmişdir. 2006-cı ildə həmin nəşriyyat tərəfindən “Sənsiz səninlə” adlı ikinci kitabı, 2008-ci ildə “Son ümidim” adlı üçüncü kitabı, 2010-cu ildə “Naksiana” nəşriyyatı tərəfindən “Tale yazısı” adlı dördüncü kitabı, 2011-ci ildə “Sabah” nəşriyyatı tərəfindən “Nicat günü” adlı beşinci kitabı çapdan çıxmışdır.

Göründüyü kimi, Zərifə xanımın bir-birnin ardınca müxtəlif mövzulu əsərləri oxucuların ixtiyarına verilmişdir. Onun “Ömrün son baharı” kitabı “İlin kitabı” nominasiyasının ən yaxşısı olmuş, Simurq Milli Mükafat Fondunun 2006-cı il “Baharın uğur çələngi” müsabiqəsi laureatının ali dərəcəli diplomuna layiq görülmüşdür. Z.Quliyeva yaradıcılığını davam etdirmiş, ölkəmizin aparıcı medialarında  “Bəşəri və milli dəyərlərin qayğıkeşi”, “Yüksək inkişaf mərhələsinə doğru”, “Xalqın xilaskarı”, “Azərbaycan xalqının əbədiləşmiş lideri”, “Qadınlar ölkəmizin ictimai-siyasi həyatında mühüm rol oynayırlar, “Prezident İlham Əliyevin bəyanatı işğalçılara sərt cavab oldu” və digər siyasi xarakterli məqalələrlə çıxış etmişdir.

Z.Quliyeva respublikanın ictimai-siyasi həyatında fəal iştirakına görə Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin mart 2017-ci il tarixli Sərəncamı ilə “Tərəqqi” medalına layiq görülmüşdür. Onun aldığı

mükafatların siyahısı çox zəngindir. Bu mükafatların ən qiymətlisi isə özünün dediyi kimi, təltiflər arasında əlçatmaz zirvə olan “Heydər Əliyevin 100 illiyi (1923-2023)” yubiley medalıdır. Zərifə Quliyeva ölkəmizin ictimai-siyasi həyatında, Ulu öndərin 100 illiyinə həsr olunmuş tədbirlərdə, həmin tədbirlərin bəzilərinin təşkilində fəallığına, Heydər Əliyev irsinin tədqiqində və təbliğində xüsusi xidmətlərinə, dövlət quruculuğunda, o cümlədən azərbaycançılıq ideyasının həyata keçirilməsində, ölkənin sosial-iqtisadi, elmi-texniki və mədəni inkişafındakı xidmətlərinə görə Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 02 fevral 2024-cü il tarixli Sərəncamı ilə “Heydər Əliyevin 100 illiyi (1923-2023)” yubiley medalı ilə təltif edilmişdir.

Zərifə xanım həkim, ictimai-siyasi xadim və  sahibkarlıq fəaliyyətində də özünü sübut etmiş, müxtəlif mükafatlarla təltif olunmuşdur.  O, hələ respublikamız müstəqilliyini yenicə bərpa etdiyi illərdə ağır və dözülməz vəziyyətlə qarşılaşdığı vaxtlarda deyirdi ki, Azərbaycanı bu bəladan yalnız Ulu Öndər Heydər Əliyev qurtara bilər. Çünki Heydər Əliyev dövlət idarəçiliyində zəngin təcrübəsi olan dünyaca tanınmış ictimai-siyasi xadimdir. Ümummilli lideri dünyanın əksər ölkələri dövlət xadimi kimi tanıyır. Onun bu fikirləri aparıcı mərbu orqanlarda da dərc olunmuşdu.

2003-cü il prezident seçkiləri ərəfəsində ölkədə yaranmış gərginlik zamanı Zərifə xanım bu dəfə də cəsarətli, qətiyyətli fikirləri ilə diqqət mərkəzində olmuşdu. O deyirdi ki, Azərbaycanın güclü, qüdrətli dövlətə çevrilməsi üçün Ulu öndər Heydər Əliyevin siyasi kursu davam etdirilməlidir. Bu siyasi kursu  yalnız Ümummilli liderin ən layiqli varisi İlham Əliyev davam etdirə bilər. Zərifə xanım o vaxt yazdığı məqalələrdə də, çıxışlarında da fikrini əsaslandırmaq üçün Ulu öndər Heydər Əliyevin 2003-cü il prezident seçkilərində xalqa müraciətindəki bəzi məqamları xatırladırdı. Ulu öndər 1 oktyabr 2003-cü il tarixli xalqa müraciətində demişdi: “Mən öz mənalı həyatımın düz 60 ilini xalqımın bu günü və sabahı ilə yaşamışam. Bunun son on ili müstəqil Azərbaycan dövlətinə xidmətdə keçib. Bu sahədə görülən işlər Sizə məlumdur, lakin mənim hələ tamamlanmamış çox perspektivli planlarım var. Üzümü Sizə – həmvətənlərimə tutaraq, qarşıdan gələn prezident seçkilərində prezidentliyə namizəd, mənim siyasi varisim, Yeni Azərbaycan Partiyası sədrinin I müavini İlham Əliyevi dəstəkləməyə çağırıram. O, yüksək intellektli, praqmatik düşüncəli, müasir dünya siyasətini

və iqtisadiyyatını gözəl bilən, enerjili və təşəbbüskar bir şəxsiyyətdir. Sizi əmin edirəm ki, həm İlham Əliyev, həm də Yeni Azərbaycan Partiyası bundan sonra da xalqımızın ən layiqli övladlarını öz ətrafında sıx birləşdirərək Azərbaycan dövlətinin inkişafı və xalqımızın firavanlığı yolunda çox işlər görəcəklər. İnanıram ki, mənim axıra çatdıra bilmədiyim taleyüklü məsələləri, planları, işləri Sizin köməyiniz və dəstəyinizlə İlham Əliyev başa çatdıra biləcək. Mən ona özüm qədər inanıram və gələcəyinə böyük ümidlər bəsləyirəm."

Xalqımız Heydər Əliyev siyasi kursunun Azərbaycana qazandırdığı uğurlar fonunda 2003-cü il 15 oktyabr prezident seçkilərində yüksək fəallıq nümayiş etdirərək, cənab İlham Əliyevi dəstəkləməklə növbəti dövr üçün uğurlarımıza yol açdı. Ölkə Prezidenti İlham Əliyevin 2003-cü ildə keçirilən andiçmə mərasimində ifadə etdiyi bu əminliyi bir daha yada salaq: "Mən Azərbaycanın xoşbəxt gələcəyinə inanıram. Əminəm ki, ölkəmiz bundan sonra da inkişaf edəcək, daha da güclənəcəkdir. Azərbaycanda demokratiya daha da inkişaf edəcək, siyasi plüralizm, söz azadlığı təmin olunacaqdır. Ölkəmiz müasir dövlətə çevriləcəkdir. Bütün bunları etmək üçün Azərbaycanda çox işlər görmək lazımdır. Ancaq bütün bunları həyata keçirmək və Azərbaycanı qüdrətli dövlətə çevirmək üçün ən başlıcası ölkədə Heydər Əliyevin siyasəti davam etdirilməlidir. Bu gün yüksək kürsüdən çıxış edərkən mən Azərbaycan xalqına söz verirəm ki, bu siyasətə sadiq qalacağam, heç vaxt bu yoldan dönməyəcəyəm, Heydər Əliyevin siyasətini davam etdirəcəyəm."

Zərifə xanım məqalələrində yazır ki, xalq Ulu Öndərə inanırdı və güvənirdi. Ona görə də prezident seçkilərində onun ən layiqli varisinə səs verməyi qərara aldı. Çünki hamı yaxşı bilirdi ki, Heydər Əliyev siyasi kursu Azərbaycanı xoşbəxt gələcəyə aparacaq, güdrətli və güclü dövlətə çevirəcək. 2003-cü ildə keçirilən gərgin seçkilərdə  xalqın 76,84 faiz səsini qazanan cənab İlham Əliyev Prezident seçildi və andiçmə mərasimində dedi ki, o, Heydər Əliyev siyasi kursuna sadiq qalacaq.

Z.Quliyeva öz məqalələrində Azərbaycan torpaqlarının Prezident İlham Əliyevin rəhbərliyi, müdrikliyi, uğurlu xarici siyasəti sayəsində işğaldan azad ediləcəyinə, soydaşlarımızın doğma yurd-yuvalarına qayıdacağına əminliyini ifadə edirdi. Məqalələrində, çıxışlarında dönə-dönə yazır və bildiridi ki, Prezident İlham Əliyevin rəhbərliyi ilə işğal altında olan torpaqlarımız azad ediləcək, məcburi köçkün sözü ləğv ediləcək, hər

kəs öz isti ocağına dönəcək. Çünki Prezident İlham Əliyev andiçmə mərasimində milyonların qarşısında əlini Qurani-Kərimə, Konstitusiyamıza qoyaraq and içib. Bu gün də həmin sözlər hər birimizin yaddaşındadır. Prezident İlham Əliyev 2003-cü il oktyabrın 31-də keçirilən andiçmə mərasimində demişdi: "Azərbaycanın torpaqları işğaldan azad olunmalıdır, bir milyon qaçqın və köçkün öz doğma yurdlarına qayıtmalıdır, ölkəmizin ərazi bütövlüyü bərpa edilməlidir. Azərbaycan heç vaxt bu vəziyyətlə, torpaqlarının işğal altında qalması ilə barışmayacaqdır. Hamı bilməlidir ki, sülh tərəfdarı olmağımıza baxmayaraq, müharibənin yenidən başlanmamasını və bu məsələnin sülh yolu ilə həllini istəməyimizə baxmayaraq, bizim səbrimiz də tükənməz deyildir. Azərbaycan öz doğma torpaqlarını nəyin bahasına olursa-olsun, azad edəcəkdir".

Z.Quliyeva yazır ki, çoxlarına əfsanə, rəvayət kimi görünən bu vəd artıq reallığa çevrilib. İşğaldan azad edilmiş ərazilərimizdə sürətli genişmiqyaslı yenidənqurma, bərpa-quruculuq işlərinə başlanılıb. Dünyanın bir sıra dövlətlərinin, həmçinin beynəlxalq miqyaslı iri şirkətlərin də bu işlərdə fəallıq göstərmələri Azərbaycanın ərazi bütövlüyünün, suverenliyinin dəstəklənməsindən xəbər verir. Prezident İlham Əliyev və Birinci vitse-prezident Mehriban xanım Əliyeva işğaldan azad edimiş həmin əraziləri qarış-qarış gəzir, yenidənqurma, tikinti-quraşdırma işlərində və mədəni irsimizin bərpasında tövsiyə və tapşırıqlarını verirlər. Artıq Qarabağ əvvəlkindən də cazibədar görünür. Həmin ərazilərdə 3 aeroport tikilir. Artıq ikisi istifadəyə verilib. Hətta bu aeroportlar xarici qonaqları, dövlət başçılarını qəbul edib. Prezidentin imzaladığı "Böyük Qayıdış" proqramı da reallaşıb. Soydaşlarımız böyük coşqu ilə doğma dədə-baba yurdlarına qayıdırlar. Müxtəlif ölkələrin dövlət başçılarının Qarabağa səfərləri bu ərazilərdə öz ölkələrinin adından məktəb və digər müəssisələrin tikintisini reallaşdırmaları dünyaya bəyan edir ki, "Qarabağ Azərbaycandır!"

Zərifə xanımın son illər aparıcı mediada dərc olunmuş müxtəlif mövzulu məqalələrinin "Zəfər tariximizin fatehləri" adlı kitabında dərc olunması bugünümüz üçün vacib və zəruridir. Əvvəlcə yeni kitabına seçdiyi ada münasibət bildirmək istərdim. Həm xalqımız, həm dünya azərbaycanlıları, həm də beynəlxalq ictimaiyyətə çox yaxşı məlumdur ki, Ermənistan üzərindəki tarixi Qələbəmizin memarı Prezident, Müzəffər Ali Baş Komandan İlham Əliyev, ona həmişə mənəvi arxa-dayaq olan

Birinci vitse-prezident Mehriban xanım Əliyevadır. Söz yox ki, müharibədə mərd oğul və qızlarımız, əsgər və zabitlərimiz böyük qəhrəmanlıq göstərdilər, torpağımızın hər qarışı uğrunda döyüşlərdə sinələrini sipər etdilər və cəmi 44 gün ərzində düşməni diz çökdürdülər. Onlara rəhbərlik edən, tapşırıqlar verən, istiqamətləndirən isə Prezident, Müzəffər Ali Baş Komandan İlham Əliyev idi. Bütün bunlardan sonra Azərbaycan tarixi ədalətin və öz ərazi bütövlüyünün bərpasına hərbi-siyasi yolla nail oldu. Dövlətimizin başçısı öz çıxışlarında əsgər və zabitlərimizin qəhrəmanlığını yüksək qiymətləndirərək deyib: "Biz XXI əsrin müharibəsini aparmışıq və bu gün artıq sirr deyil ki, dünyanın aparıcı hərbi məktəblərində İkinci Qarabağ müharibəsindəki əməliyyatlarımız, bizim uğurlarımız, Qələbəmiz öyrənilir".

"Azərbaycanın yaratdığı XXI əsrin üstün müharibə modeli həm də Silahlı Qüvvələrimizin şəxsi heyətinin vətənpərvərliyi, yüksək döyüş ruhu, həmçinin xalqımızın sarsılmaz həmrəyliyi ilə fərqlənir. Azərbaycan əsgəri, zabiti "Arxamızda Vətən torpağıdır" – deyərək daim irəli gedib. Öz növbəsində, müharibə günlərində cəmiyyətimizin həmrəyliyi, arxa cəbhənin dəstəyi yenilməz Ordumuza irəli getmək, düşmənin başını əzmək üçün güclü impuls verib.

Zərifə xanımın məqalələrinin "Azərbaycan beynəlxalq aləmdə", "Dünyaca dəyərli Azərbaycan xanımı", "Vədə sadiq Prezident", "Azərbaycan tarixinin Zəfər salnaməsi-Qarabağ Azərbaycandır!" fəsillərinə bölünməsi zərurətdən irəli gəlib. Bu, o deməkdir ki, Z.Quliyevanın son illər yazdığı məqalələri, siyasi şərhləri, baş verən qlobal hadisələrə münasibəti müxtəlif mövzuları əhatə edir. O. akademik Zərifə Əliyeva və Birinci vitse-prezident Mehriban xanım Əliyevaya həsr etdiyi məqalələri ilə Azərbaycan xanımının dünyada artan nüfuzunu bir daha oxuculara bəyan edir. Bəli, bu yazıları oxuyanda gözlərimiz önündə dünyaca dəyərli Azərbaycan xanımı canlanır.

İnanırıq ki, Zərifə xanım Quliyevanın bu kitabı da oxucular tərəfindən rəğbətlə qarşılanacaq.

**Əliqismət Bədəlov,**
"Xalq qəzeti",
Azərbaycan Jurnalistlər Birliyinin üzvü,
keçmiş SSRİ Jurnalistlər İttifaqının üzvü

## Zirvə görüşü zamanın həmrəylik çağırışıdır

Hər bir xalqın dünyada tanınmasında, uğurlar əldə etməsində və təbii ki, beynəlxalq aləmdə cərəyan edən qlobal proseslərin öndə gedənlərinə çevrilməsində liderlərin xüsusi əhəmiyyəti mövcuddur. Liderlik amili elə bir şəxsiyyətlərə aid olunur ki, onlar xalqın və dövlətin maraqlarını müdafiə etməklə yanaşı, həm də inkişaf etdirir. Məhz bu kimi önəmli faktorun təhlilini apararkən, Azərbaycanın bu siyahıda birinci olması şəksizdir. Çünki Azərbaycanın inkişaf və tərəqqisi, eləcə də, xalqın rifahı faktorunda Azərbaycan Prezidenti İlham Əliyev Liderlik amili mövcuddur. Artıq 21 ildir ki, Azərbaycan xalqının etimadı əsasında ölkəyə rəhbərlik edən Prezident İlham Əliyev Ümummilli Lider Heydər Əliyevin siyasi kursunu şaxələndirərək, uğurla reallaşdırması nəticəsində, perspektiv baxımdan əhəmiyyətli nəticələrin əldə olunmasında öz uğurlu sözünü deyir. Məhz Prezident İlham Əliyevin həyata keçirdiyi sosial-iqtisadi və siyasi islahatlar müasir Azərbaycanın müstəqilliyini daha da möhkəmləndirib, regional gücünü və qlobal əhəmiyyətini kifayət qədər artırmış olub. Güclü iqtisadiyyata malik olan dövlət hər şeyə qadirdir. Bəli, həqiqətən də bu danılmaz aksiomadır. Məhz ölkəmizin iqtisadiyyatın inkişaf tempinə görə regionda lider dövlətə çevrilməsi də təsadüfi deyil. Azərbaycan hökumətinin yürütdüyü müstəqil siyasət həmişə birmənalı olub: "Güclü dövlət, güclü iqtisadiyyat və sosial rifah. Bax, bu prinsiplərin vəhdəti bu gün Azərbaycanı dünyada seçilmiş ölkələrin sırasına daxil edibdir. Bunun nəticəsində, biz uğurla inkişaf edirik".

### *Dövlətləri və millətləri birləşdirən uğurlu siyasət*

Dünyanı çalxalayan koronavirus pandemiyası zamanında Qoşulmama Hərəkatının sədri kimi Prezident İlham Əliyevin təşəbbüsü ilə Qoşulmama Hərəkatının Təmas Qrupu formatında videokonfrans vasitəsilə Zirvə görüşününü keçirilməsi, ilk növbədə, dövlət başçısının dünyada böyük nüfuza malik lider olmasının göstəricisidir. Qoşulmama Hərəkatının Bakıda keçirilən XVIII Zirvə görüşündə təşkilata sədrliyi öz üzərinə götürən zaman Prezident İlham Əliyev bəyan etdi ki, Azərbaycan beynəlxalq arenada üzv ölkələrin maraqlarının müdafiə edilməsi üçün əməli addımlar atacaq, həmrəyliyin gücləndirilməsini və qarşılıqlı dəstəyi rəhbər tutacaq. Göründüyü kimi,

bu Zirvə görüşü də bir daha göstərdi ki, Azərbaycan Prezidentinin sözü ilə əməli birdir. Zirvə görüşündə ölkə başçısı Azərbaycanın koronavirusla mübarizə modelini dünyaya təqdim edərkən faciənin qarşısının alınması üçün həmçinin, dünyaya yol göstərdi. Konfransda ölkə başçısı bəyan etdi ki, dövlətlər bir-birindən təcrid olunmalı deyillər. Çünki pandemiya ilə əlaqədar qlobalizasiya prosesi dayandırılıb.

Bu faktoru da xüsusi qeyd etmək istərdim ki, bu gün bütün sahələrdə olduğu kimi, koronavirusla mübarizə tədbirlərində də ölkəmiz dünyada özünəməxsus imic formalaşdırıb - AZƏRBAYCAN MODELİ. Bu reallıqdır. Çünki Azərbaycanın unikal təcrübəsi dünya tərəfindən qəbul edilir, bəyənilir. Həmçinin reallaşdırılan sosial-iqtisadi dəstək proqramları, genişmiqyaslı anti-böhran tədbirlər də beynəlxalq qurumlar tərəfindən yüksək qiymətləndirilir. Çünki Azərbaycan artıq beynəlxalq aləmdə inkişaf, tərəqqi, yüksəliş simvoluna çevrilir. Və bütün dünyanın etiraf etdiyi bu reallıq Prezident İlham Əliyevin fəaliyyətinə verilən haqlı və real qiymətdir. Azərbaycan dünya üçün qlobal düşüncəni təqdim etdi. Bu, həmçinin dövlətləri və millətləri birləşdirən siyasət oldu. Bu siyasət ölkəmiz tərəfindən təqdim olundu. Azərbaycanın gördüyü işlər təkcə bu gün yox, gələcəkdə də öyrəniləcək.

Prezident İlham Əliyev Zirvə görüşündə çıxışı zamanı bildirdi ki, koronavirus pandemiyası dünyada vəziyyəti tamamilə dəyişib və nəticədə yeni reallıqlar meydana çıxıb. Azərbaycan yeni vəziyyətə çevik və adekvat reaksiya verir. Azərbaycanın təşəbbüsü ilə keçirilən Qoşulmama Hərəkatının koronavirusa qarşı Təmas Qrupunun Zirvə görüşü də bunu göstərir. Zirvə görüşündə Prezident İlham Əliyev ölkəmizdə koronavirus pandemiyasına qarşı aparılan tədbirlər haqqında ətraflı məlumat verdi. Cənab Prezidentin qeyd etdiyi kimi, pandemiyanın dünyanı bürüdüyü indiki şəraitdə əməkdaşlığa böyük ehtiyac var. Zirvə görüşündə Prezident İlham Əliyev koronavirus pandemiyasının bütün dünya dövlətlərinə mənfi təsir göstərdiyini xatırladaraq, bu bəlanın və onun fəsadlarının aradan qaldırılması Hərəkata üzv dövlətlərin və bütün bəşəriyyətin qarşısında duran ən vacib problem olduğunu bildirdi. Ölkəmizdə də koronavirus infeksiyasının yayılmasının qarşısının alınması üçün vaxtında həyata keçirilən təxirəsalınmaz, çevik və zəruri qabaqlayıcı tədbirləri diqqətə çatdıraraq, pandemiya dövründə insanların sağlamlığının və

onların sosial müdafiəsinin təmin edilməsinin Azərbaycan dövləti üçün prioritet məsələ olduğunu qeyd etdi.

### *Prezident İlham Əliyevin düşünülmüş diplomatik siyasəti beynəlxalq səviyyədə*

Görüşdə BMT-nin Baş katibi Antonio Quterreş və Avropa İttifaqının Ali nümayəndəsi və Avropa Komissiyasının vitse-prezidenti Cozef Borel videomüraciətlə çıxışlarında pandemiya ilə mübarizədə Azərbaycan Prezidentinin bu təşəbbüsünü yüksək qiymətləndirdilər. Zirvə görüşündə, həmçinin BMT Baş Assambleyasının 74-cü sessiyasının prezidenti Ticani Məhəmməd-Bande, Ümumdünya Səhiyyə Təşkilatının Baş direktoru cənab Tedros Adhanom Qebreyesus, Afrika İttifaqı Komissiyasının sədri Musa Faki Mahamat və təşkilata üzv olan bir çox ölkələrin dövlət və hökumət başçıları çıxış edərək koronavirus pandemiyası ilə mübarizə yolları haqqında fikirlərini bildirdilər, bu mübarizədə əməkdaşlığın əhəmiyyətini vurğuladılar. Demək olar ki, bütün çıxışlarda Azərbaycan Prezidentinin təşəbbüsləri yüksək qiymətləndirildi. Bu, bizim üçün qürurverici haldır. Və Zirvə görüşü bir daha göstərdi ki, Azərbaycan nəinki milli səviyyədə COVID-19-la mübarizədə səmərəli tədbirlər görür, eyni zamanda, regional və qlobal miqyasda da koronavirusa qarşı həmrəyliyin və əməkdaşlığın gücləndirilməsinə özünün mühüm töhfəsini verir.

Göründüyü kimi, çoxtərəfli diplomatiyanın təşviq edilməsi, Qoşulmama Hərəkatının üzv dövlətləri arasında əməkdaşlığın və həmrəyliyin gücləndirilməsi Prezident İlham Əliyev tərəfindən Azərbaycanın Qoşulmama Hərəkatında sədrliyinin prioritetlərindən biri kimi müəyyən edilib.

Beləliklə, hər bir ölkənin inkişafı və xalqın təhlükəsizliyi o ölkənin prezidentinin həyata keçirdiyi uğurlu siyasət nəticəsində həyata keçirilir. Məhz əvvəlki beynəlxalq tədbirlərdə olduğu kimi, bu mötəbər Zirvə görüşündə də Prezident İlham Əliyevin düşünülmüş diplomatik siyasəti bir daha yüksək dəyərləndirildi.

Bir sözlə, Azərbaycan nəinki milli səviyyədə COVID-19-la mübarizədə səmərəli tədbirlər görür, eyni zamanda, regional və qlobal miqyasda da koronavirusa qarşı həmrəyliyin və əməkdaşlığın gücləndirilməsinə əhəmiyyətli töhfəsini verir.

## Paşinyan növbəti dəfə İlham Əliyevdən diplomatiya, tarix, hüquq dərsi aldı

Prezident İlham Əliyevin iştirak etdiyi Şərq Tərəfdaşlığı ölkələrinin videokonfrans formatında keçirilən sammitin ümumi nəticələrini müqayisə etsək, bu tədbiri Valday və Münxen zəfərlərinin məntiqi davamı kimi dəyərləndirə bilərik. Çünki əvvəlki görüşlərdə olduğu kimi, Şərq Tərəfdaşlığı ölkələrinin videokonfrans formatında keçirilən Sammitində də bir daha Ermənistan dövlətinin işğalçılıq siyasətinin qlobal müstəvidə ifşa olunması ilə yadda qaldı. Bütün bunlar isə Azərbaycan Prezidenti İlham Əliyevin düşünülmüş uğurlu diplomatik siyasətinin bariz nəticəsidir. Məhz Azərbaycanın bu diplomatik hücumları qarşısında acizlik nümayiş etdirən Ermənistan iqtidarı sözügedən sammitdə də rüsvayçı məğlubiyyətdən qaça bilmədi.

### *Azərbaycan Prezidenti öz həqiqətləri ilə onu ifşa etdi*

Bəli, keçirilən bütün mötəbər tədbirlərdə bu, aydın şəkildə nümayiş olunmaqdadır. Çünki hər bir uğurun arxasında həqiqətlər, faktlar durur. Deməli, bu görüşdə də nəticə ən böyük həqiqəti ortaya qoydu: artıq erməni saxtakarlığı keçmir və Azərbaycan Prezidentinin hücum diplomatiyası dünya erməniliyini darmadağın edir. Bütün dünya bunun şahidi oldu. Ermənistan baş nazirinin çıxışı və davranışları bir daha göstərdi ki, o, siyasətdə naşı bir adamdır. Hər kəs aydın şəkildə görürdü ki, Paşinyanın populist çıxışı Ermənistandakı vəziyyət nəzərə alınaraq daxili auditoriyaya hesablanıb. O, siyasi və diplomatik bacarığı olmadığı üçün kobud səhvlərə yol verirdi. Əvvəla tədbirdəki çıxışı Paşinyanın dil biliyinin bərbad olduğunu göstərirdi. O, qabaqcadan hazırlanan çıxışını ingilis dilində oxusa da, növbəti fikirlərini erməni dilində ifadə eləməyə çalışdı. Ermənistan baş naziri Sammitdə çıxışı zamanı ingilis dilində kağızdan oxuyarkən beynəlxalq aləmdə qəbul olunan "Naqornıy Karabagh" sözünü işlədir, halbuki ermənicə çıxışında "Artsax" sözünü dilə gətirdi.

Lakin görüşdə çıxış edən Prezident İlham Əliyev BMT Təhlükəsizlik Şurasının 4 qətnaməsini xatırladıb və Ermənistan qoşunlarının Azərbaycanın işğal edilən bütün ərazilərindən qeyd-şərtsiz və tam çıxarılmasının tələb olunduğunu bildirib: "Dağlıq Qarabağ və Azərbaycanın daha 7 rayonu 30

ilə yaxındır ki, Ermənistanın işğalı altındadır. Ermənistanın etnik təmizləmə siyasəti nəticəsində 1 milyondan artıq azərbaycanlı qaçqın və məcburi köçkünə çevrilmişdir. BMT Təhlükəsizlik Şurasının 4 qətnaməsi Ermənistan qoşunlarının Azərbaycanın işğal edilmiş bütün ərazilərindən qeyd-şərtsiz və tam çıxarılmasını tələb edir. Ermənistan bu qətnamələrə, habelə ATƏT, Qoşulmama Hərəkatı, NATO, Avropa Parlamenti və digər beynəlxalq təşkilatlar tərəfindən qəbul edilmiş müvafiq sənədlərə əməl etmək əvəzinə işğal olunmuş ərazilərdə qeyri-qanuni məskunlaşma siyasəti həyata keçirir. Danışıqların mahiyyət və formatını məhv etməyə çalışan Ermənistanın baş nazirinin dediyinin əksi olaraq, Dağlıq Qarabağ Ermənistan deyil, Dağlıq Qarabağ Azərbaycandır və bütün dünya bunu belə tanıyır. Azərbaycanın ərazi bütövlüyü bərpa olunmalıdır.” Göründüyü kimi, Azərbaycan Prezidenti İlham Əliyev Paşinyana növbəti dəfə tarix dərsi keçdi. Dövlətimizin başçısı Ermənistanın Azərbaycan ərazisinin 20 faizini işğal etdiyini, işğal olunmuş torpaqlarda mülki azərbaycanlılara qarşı etnik təmizləmə apardığını, ermənilərin işğal altındakı torpaqlarımızda mədəni irsimizi məhv etdiklərini, Dağlıq Qarabağda Ermənistanın heç bir tarixi irsinin olmadığını bir daha səsləndirdi.

### *Azərbaycan Prezidenti yüzillik erməni yalanını beynəlxalq miqyasda bir daha ifşa etdi, Ermənistan baş nazirini isə yenə də "öz dilindən yandırıb” gülüş hədəfinə çevirdi*

Prezident İlham Əliyev Paşinyanın siyasətdə təsadüfi və uğursuz adam olduğunu, dövlət başçısı kimi yetkinləşmədiyini Aşqabadda MDB liderlərinin qarşısında sübut etmişdi, açıq deyək, onu rəzil duruma salmışdı. Prezident İlham Əliyevin Paşinyana ironiyasına bütün prezidentlər gülmüşdü, yalanlarının ifşasını isə məmnunluqla izləmişdilər...

Şübhəsiz, Paşinyan Azərbaycan Prezidenti İlham Əliyevlə növbəti müzakirəyə sanki bir döyüş kimi hazırlaşmışdı. Amma artıq 21 ildir ki, İlham Əliyevlə döyüşün hansında qaliblə məğlubların yeri dəyişib?! Çünki artıq MDB də, Avropa da, ABŞ da tarixin ən qüdrətli Azərbaycanının timsalında Prezident İlham Əliyevi ən böyük sərkərdə, bugünkü müflis, səfil, forpost Ermənistanın nümunəsində isə Paşinyanı böyük siyasi avantürist kimi tanıyır, qəbul edir!..

Prezident İlham Əliyev növbəti dəfə mühüm beynəlxalq platformada

Ermənistanın işğalçılıq siyasətini ifşa edib və baş nazir Paşinyanın populist çıxışana tutarlı cavab verib: "Çıxışımda dediklərim beynəlxalq təşkilatların qətnamələrinə əsaslanan tarixi həqiqətdir. Birincisi, bu, hər kəsə bəlli olan bir faktdır ki, Ermənistan Azərbaycanın ərazisini işğal edib. İkincisi isə Ermənistanın baş nazirinə irqçilik haqqında danışmağı məsləhət görməzdim, çünki erməni terrorçuları dünyaca məşhurdurlar".

Sammitdə ən yadda qalan məqam isə Prezident İlham Əliyevin Paşinyana sakit olmağı məsləhət görməsidir: "Parisin Orli hava limanında terror hadisəsi törədən Karapetyan soyadlı şəxs sonradan Ermənistana ekstradisiya edilib və Ermənistan prezidenti tərəfindən əfv olunub. Məhz buna görə belə məsələlər ətrafında müzakirə gedəndə ona sakit oturmağı tövsiyə edərdim".

Azərbaycan Prezidenti çıxışında, həmçinin vurğuladı ki, ölkəmiz pandemiya ilə mübarizə üçün Ümumdünya Səhiyyə Təşkilatına 10 milyon dollar könüllü maliyyə yardımı ayırıb. Eyni zamanda, Azərbaycan 29 dövlətə humanitar yardım göstərib və bu işi davam etdirir. Bu, Azərbaycanla Ermənistan arasında bütün sahələrdə olduğu kimi, iqtisadi sahədə də dərin uçurumun mövcudluğunu nümayiş etdirən tutarlı faktdır. Təsadüfi deyil ki, Ümumdünya Səhiyyə Təşkilatı Azərbaycanı koronavirusla mübarizədə nümunə ölkə adlandırır, Azərbaycanın digər ölkələrə yardımını təqdir edir, Ermənistan isə virusla mübarizə üçün sadəcə pul dilənir.

Bir sözlə, Sammitdə də Prezident İlham Əliyev Paşinyana tarix və siyasət dərsi keçdi, erməni yalanlarını ifşa etdi. Azərbaycan Prezidentinin Ermənistan baş nazirini növbəti dəfə siyasi iflasa uğratması faktını hətta Ermənistan mətbuatı və ictimaiyyəti də etiraf etmək məcburiyyətindədir.

## Paşinyan Azərbaycan Prezidentinin diplomatiyası qarşısında həmişə diz çöküb

Heç şübhəsiz, hər bir dövlətin aparıcı xarici siyasət onun yaxın və uzaq ölkəlrlə münasibətlərində böyük rol oynayır. Ən əsası isə bu siyasətin mərkəzində ölkənin suverenliyi və ərazi bütövlüyü dayanır. Məhz bu baxımdan da Ermənistan – Azərbaycan, Dağlıq Qarabağ münaqişəsi ölkəmizin bir nömrəli problemidir. Eyni zamanda, sözsüz ki, hər bir ölkənin inkişafı və xalqın təhlükəsizliyi o ölkənin prezidentinin həyata keçirdiyi uğurlu siyasətin nəticəsində həyata keçirilir. Bu gün Azərbaycan xalqı Prezident İlham Əliyevə böyük inam bəsləyir və dövlət başçısının həyata keçirdiyi siyasəti tam dəstəkləyir. Çünki Azərbaycan əhalisi Prezident İlham Əliyevin həyata keçirdiyi uğurlu siyasətin nəticəsini öz firavan və təhlükəsiz həyatında görür və ona görə də xalqımız öz Prezidentinə inanır və dövlət başçısının ətrafında sıx birləşib. Ən əsası isə bu günkü sabitlik və təhlükəsiz həyat şəraiti, məhz Prezident İlham Əliyevin apardığı uğurlu siyasətin nəticəsidir ki, Azərbaycan dünyanın ən sabit və təhlükəsiz ölkələrindən biridir.

Lakin Ermənistan və erməni xalqı isə, bu müsbət amillərdən çox-çox uzaqdır. Çünki Prezidentimizin dediyi kimi, işğalçı ölkəyə həmişə oğrular, banditlər rəhbərlik edib. İşğalçı ölkənin baş naziri Paşinyanın son iki il ərzində hakimiyyətdə olduğu müddətdə etdiyi təxribatları, sərsəm çıxışları bir daha onun faşistlərdən fərqlənmədiyini ortaya qoydu. Ona görə də nə həqiqəti, nə də tarixi faktları saxtalaşdırmaq olmaz. Çünki həqiqət həqiqətdir, yalan isə gec-tez üzə çıxır, tarix də tarixində qalır. Nikol Paşinyan hələ hakimiyyətə gəlməmişdən İrəvan küçələrində təşkil etdiyi mitinqlərdə səsləndirdiyi daşnak şüarları ilə faşistlərdən fərqlənmədiyini ortaya qoymuşdu. Hakimiyyətə gəldikdən sonra da öz sələflərinin siyasətini davam etdirməklə, faşizm ideyalarına sadiqliyini sübut etmiş oldu. Elə Paşinyan Hitlerin yaxın silahdaşı Qaregin Njdeyə ucaldılmış abidəyə haqq qazandırmaqla bir daha faşizm xislətini nümayiş etdirdi. Bunu, işğal olunmuş Azərbaycan torpaqlarının azad olunmaması və hər vəchlə danışıqlardan yayınması da, bir daha Paşinyanın faşistlərdən fərqlənəmədiyini göstərdi.

Digər bir fakt isə Paşinyanın babasının nasist hakimiyyəti ilə əməkdaşlıq etməsidir. Göründüyü kimi, faşist elə faşistdir və paşinyanlar kimi. Erməni xalqı da, bütün dünya dövlətləri də Paşinyan hökumətinin yalan vədlərinin boş və mənasız olduğunu artıq anlayır.

"Azərbaycan ərazi bütövlüyünü bərpa edəcək" – dövlət başçımız dəfələrlə çıxışlarında bildirib ki, bu gün Dağlıq Qarabağda hakimiyyəti zəbt etmiş xunta rejimidir və əvvəlki rejimin tör-töküntüləridir: "Onların generalları oğru, onların dırnaqarası "qəhrəmanları" cinayətkar, onların rəhbərləri rüşvətxordur. Keçmiş rejimin nə qədər nümayəndələri həbs olunub, nə qədər axtarışa verilib. Bu, nə deməkdir?! O deməkdir ki, 2018-ci ilə qədər 20 il ərzində Ermənistana cinayətkarlar rəhbərlik ediblər. Onlardan biri indi həbsxanadadır, o birisi isə hələ ki azadlıqda. Halbuki onun da ölkədən çıxışına qadağa qoyulub. Yəni, bir ölkənin müstəqilliyi hələ 30 ilə çatmayıb, ölkənin 20 ili cinayətkarların ixtiyarına buraxılıb. Əlbəttə ki, bu cinayətkar dəstə, cinayətkar rejim yaradıb. O cinayətkar rejim ki, bütün milli azlıqları əzibdir. Orada bir nəfər də olsun milli azlığın nümayəndəsi yoxdur".

Bu gün həqiqətən də Ermənistan və onun baş naziri Paşinyan Azərbaycan Prezidenti İlham Əliyev kimi bir dahi diplomat rəhbəri və güclü Azərbaycan dövləti qarşısında acizdir və həmişə də məğlub olub, olacaq da! Çünki Ermənistan uğursuz dövlətdir və onların "qəhrəmanları", generalları oğrulardır, ordusu da işğalçıdır. Bunu indi Ermənistan xalqı da görür ki, Azərbaycan güclü dövlətdir, güclü də ordusu var. Çünki ölkə Prezidenti, Ali Baş Komandanımızın diqqət və qayğısının müsbət reallığıdır ki, Azərbaycan Ordusu dünya miqyasında güclü ordular sırasındadır. Dövlət başçımız bütün görüş və çıxışların bildirib ki, ordu quruculuğu prioritetdir. Xalqımız Prezident İlham Əliyevin həyata keçirdiyi uğurlu siyasətə inanır və bu siyasət nəticəsində Azərbaycan mütləq öz torpaqlarını işğaldan azad edəcək, doğma torpaqlarından didərgin düşmüş bütün soydaşlarımız geri qayıdacaqlar. Qaldı ki, son zamanlar özünü azərbaycanlı adlandıran bir qrup xəyanətkar, Avropanın bəzi ölkələrində "mühacir" adı ilə məskunlaşanların Azərbaycan əleyhinə apardıqları "qara piar" kampaniyasına, bu yerdə ataların dediyi kimi, "sirkə nə qədər tünd olsa, öz qabını çatladar". Bu, "sapı özümüzdən olan baltalar" milli kimliklərini unutmuş əxlaqsızlardır. Bu satqınların, Azərbaycana qarşı

ermənilərlə çiyin-çiyinə vuruşan bu parazitlərin milliyyəti azərbaycanlı ola bilər, amma Orduxan Teymurxan, Tural Sadıqlı, Məhəmməd Mirzəli, Vidadi İsgəndərli, Sevinc Osmanqızı, Əli Kərimli, Gültəkin Hacıbəyli, Cəmil Həsənli və digərləri pul, var-dövlət toplamaq həvəsi milli kimliklərini unutmuş mənəviyyatsızlardır. Azərbaycan xalqı onların kimliyini bilir və ölkəmizdə sabitliyin, inkişafı istəməyənlərin, milli maraq və mənafelərimizə zərbə vurmağa çalışanların öz niyyətlərini həyata keçirmələrinə heç vəchlə imkan verməyəcək və verilməyəcək də!.

Bu gün hər birimiz istər səngərdə, istərsə də sosial şəbəkələrdə Azərbaycanın haqq səsini ucaltmağı bacarmalıyıq. 2016-cı il Aprel qələbəsi, ondan sonrakı döyüşlərdə və bu günlərdə Tovuz ətrafında baş verən təxribatlarda düşmənə layiqli cavab və sarsıdıcı zərbələr vurmaqla Azərbaycanın haqq səsinin beynəlxalq ictimaiyyət tərəfindən dəstəklənməsi və əldə etdiyimiz qələbələr bir daha göstərdi ki, Azərbaycan xalqı öz Prezidentinin, Ali Baş Komandanımızın ətrafında daha sıx birləşib və millət olaraq bir yumruq kimi həmrəydir. Bu birlik və həmrəylik isə qələbədir, uğurdur. O gün uzaqda deyil!

## Xalqın dövlət başçısına inam və rəğbəti tükənməzdir

Hər bir dövlət xadiminin, tarixi şəxsiyyətin real gücü, qüdrəti tarixin ən ağır, ən çətin dönəmlərində üzə çıxır. Azərbaycan xalqı həqiqətən xoşbəxt xalqlardandır ki, indiki son dərəcə narahat, taleyüklü bir dönəmdə ölkəmizə Prezident İlham Əliyev kimi müdrik siyasətçi, görkəmli dövlət xadimi rəhbərlik edir. İndi dünyanın bir çox böyük dövlətlərinin belə koronavirus pandemiyasının ağır fəsadları qarşısında zəif, naəlac qaldığı bir məqamda, Azərbaycanda Prezident İlham Əliyevin müdrik liderliyi ilə bu təhlükənin önlənməsi, əhalinin sağlamlığının qorunması üçün ardıcıl, düşünülmüş addımlar atılıb. Nəticə göz qabağındadır.

Bu gün Azərbaycan xalqı və dövləti, bəlkə də, son yüzilin ən ağır sınağından uğurla, zəfərlə çıxmaq üzrədir. Təhlükənin ilk anından "Biz birlikdə güclüyük" deyə bəyan edən və dövlətin bütün resurslarını səfərbər etməyi bacaran cənab Prezidentin tarixi xidmətləri nə qədirbilən xalqımız unudacaq, nə də əlahəzrət zaman. Çünki son 21 il ərzində Prezidentimiz ölkəmizi uca zirvələrə yüksəltməkdədir. Xalqı ona görə Prezidentini sevir ki, O, heç bir vaxt hər hansı böyük dövlət və ya beynəlxalq təşkilatın diqtəsi ilə hərəkət etmir, Azərbaycanın siyasi sabitliyində, iqtisadi gücündə, sosial rifahında, güclü ordusunda və uğurlu xarici siyasətində öz təsdiqini tapır. 2018-ci il 11 aprel prezident seçkilərindən sonra bəyan etdiyi və tətbiqinə başladığı genişmiqyaslı və hərtərəfli islahatlar kursu sayəsində Azərbaycanın siması büsbütün dəyişməkdədir. Dövlət başçısının rəhbərliyi altında atılan irimiqyaslı adımlar xalqımız tərəfindən yüksək qiymətləndirilir və alqışlanır. Təsadüfi deyildir ki, hər gün minlərlə soydaşımız Prezidentimizin ünvanına minnətdarlıq məktubları göndərir və bu məktublarda ümumi bəlaya çevrilmiş pandemiyaya qarşı mübarizədə dövlət başçısının qətiyyətinə, tələbkarlığına, humanizminə, xeyirxahlığına, qayğısına və şəfqətinə heyran qaldıqlarını dilə gətirir, öz rəhbərləri ilə fəxr və qürur hissi keçirdiklərini vurğulayırlar. Xalqının qürür mənbəyinə çevrilmiş Prezident İlham Əliyev isə bəyan edir ki, bütün imkan, potensial və resurslarımızdan istifadə edib bu çətin sınaqdan da şərəflə çıxacağıq. Hal-hazırda karantin rejiminin müddətini pandemiyanın hələ də mövcudluğu şəraitində uzatsaq da, eyni zamanda, mərhələli

şəkildə sosial təcrid siyasətinin yumşaldılması istiqamətində də addımlar atmaq niyyətindəyik. Əsas olan odur ki, həmrəyliyimiz və birliyimiz heç zaman olmadığı qədər ən yüksək səviyyədədir.

Bəli, Prezident İlham Əliyev 2003-cü ildə prezident seçilərkən Azərbaycan həlli müşkül görünən bir sıra problemlərlə üz-üzə idi. O vaxt ölkə hələ yeni-yeni dirçəlirdi, işsizlik, məcburi köçkünlərin acınacaqlı halı, bölgələrin inkişafdan geri qalması, əhalinin sosial vəziyyəti ciddi narahatlıq doğururdu. Prezidentin ilk vədi bu oldu: ***"Ölkədə yüz minlərlə yeni iş yeri yaradılacaq. Ötən illər ərzində 2 milyona yaxın iş yeri yaradıldı. İşsizlik səviyyəsi 40 faizdən 5 faizə endi. Bir dənə də olsun çadır düşərgəsi qalmayacağını demişdi. Çox keçmədən axırıncı çadır düşərgəsi ləğv olundu, qaçqın və məcburi köçkünlər üçün respublikanın 30-dan artıq şəhər və rayonunda bütün sosial-texniki infrastruktura malik 102 müasir qəsəbə salınıb, 5800 köçkün ailəsi üçün fərdi evlər, mənzillər tikilib və təqdim olunub, şəhid ailələrinə, Qarabağ müharibəsi əlillərinə 620-dən çox mənzil verilib...".***

***"Bizim üçün əsas məsələ vətəndaşların sağlamlığı, insanlarımızın həyatıdır"***

Planetimizə qara bulud kimi çökən koronavirus pandemiyasının dünyanın ən inkişaf etmiş ölkələrində hər gün minlərlə can aldığından, minlərlə insanın sağlamlığını təhdid etdiyindən mətbuat, kütləvi informasiya vasitələri, sosial şəbəkələr vasitəsi ilə hər gün yeni məlumatlar əldə edildiyi bir zamanda və hazırda dünyada baş verən hadisələri təhlil etdikdə, bir daha Azərbaycan kimi ölkədə yaşamağımızdan qürur duyuruq. Fəxr edirik ki, ilk gündən vəziyyəti nəzarətə götürən, qətiyyətli iradəsi, təşəbbüskarlığı ilə koronavirusun ölkəmizdə sürətlə yayılmasının qarşısı almağı bacaran dövlət başçımız var. Bu, gəlişigözəl deyilən sözlər deyil, son dərəcə narahat, taleyüklü bir dönəmdə ölkəmizə rəhbərlik edən Prezident İlham Əliyev kimi müdrik siyasətçi, görkəmli dövlət xadiminin apardığı uğurlu siyasətinin gerçəklikləridir. Nəticə göz qabağındadır. Bu gün Azərbaycan xalqı və dövləti, bəlkə də, son yüzilin ən ağır sınağından uğurla, zəfərlə çıxmaq üzrədir. Təhlükənin ilk anından "Biz birlikdə güclüyük" deyə bəyan edən və dövlətin bütün resurslarını səfərbər etməyi bacaran cənab Prezidentin tarixi xidmətləridir, xalqına qayğısıdır.

Xüsusilə də, koronavirusa qarşı mübarizə tədbirlərinə başlanıldığı ilk gündən Prezident İlham Əliyev ölkə vətəndaşlarının sağlamlığının qorunmasını, koronavirus infeksiyasına qarşı mübarizənin gücləndirilməsini bir nömrəli vəzifə kimi qarşıya qoydu, bütün diqqəti bu sahəyə yönəltdi. Əhalinin sağlamlığının qorunması ilə bağlı tədbirlər haqqında Fərman imzalandı, Nazirlər Kabineti yanında Operativ Qərargah fəaliyyətə başladı, zəruri tibbi avadanlıqlar alındı, koronavirusa yoluxma hallarının müəyyənləşdirilməsi ilə əlaqədar müasir tibb müəssisələri ayrıldı, karantin zonaları yaradıldı. Prezidentin, Birinci vitse-prezidentin bir illik əməkhaqlarını, ardınca bir çox qurumların, özəl şirkətlərin və ayrı-ayrı şəxslərin koronavirus infeksiyasına qarşı preventiv addımların atılması üçün yaradılan Koronavirusla Mübarizəyə Dəstək Fonduna ianələr bağışlaması dövlətin və xalqın həmrəyliyinin, birliyinin daha bir bariz göstəricisi oldu. Eyni zamanda, Prezident İlham Əliyevin və birinci xanım Mehriban Əliyevanın dünyanı cənginə alan virusun ölkəmizdə yayılmasının qarşısının alınması sahəsində vaxtında həssas münasibət göstərmələri, ölkə vətəndaşlarına müraciətləri xalqın pandemiya ilə mübarizəyə səfərbərliyi üçün böyük stimul oldu. Lakin bütün bu uğurları görə bilməyən xalqa düşmən qüvvələr isə həmişə olduğu kimi, bu dəfə də koronavirusdan yararlanmağa başlayıb.

Dövlət başçısı koronavirus başlayandan radikal müxalifətin çirkin niyyətinə də aydınlıq gətirərək, onları xalqa düşmən qüvvə adlandırıb: "Bu düşərgədə cəmləşən insanlar uzun illərdir iqtidara qarşı yox, dövlətimizə, xalqımıza qarşı çirkin mübarizə aparırlar. Onların əsas məqsədi vəziyyəti gərginləşdirməkdir. Ölkəmiz üçün, xalqımız üçün nə qədər pisdirsə, onlar üçün o qədər yaxşıdır. Onların fəaliyyətinin tarixi də bunu göstərir. Biz bu tarixi yaddan çıxarmamışıq…”.

Prezident çıxışlarında dəfələrlə bildirib ki, həmin radikal müxalifət üçün koronavirus “göydəndüşmə bir hədiyyə” olub: “Koronavirus bunlar üçün sanki göydəndüşmə bir hədiyyədir. Bu gün koronavirusa sevinən ancaq bu antimilli qruplaşmadır. Mən, təbii ki, baş verən hadisələrdən xəbərdaram və bilirəm ki, bunların bu çirkin niyyətləri dəhşətli bir mənzərə yaradır. Ölənlərin sayının artmasını arzulayırlar, xəstələrin sayının artmasını istəyirlər, sevinirlər ki, insanlar vəfat edir. Yəni, bu, iqtidara qarşı deyil, dövlətə qarşı düşmənçilikdir. Mən hər şeyi öz adı ilə çağırıram.

Əgər kimsə xalqımıza, dövlətimizə qarşı çıxırsa, onun bir adı var – düşmənçilik. Hər kəs bunları belə də çağırmalıdır. Bunların indiki arzuları da gözlərində qalacaq. Sözüm onda deyil, sözüm ondadır ki, siyasi islahatlar bu gün tam yeni bir konfiqurasiya yaradır. Əminəm ki, marginal qruplaşmaya yeni konfiqurasiyada yer yoxdur və olmamalıdır. Azərbaycan xalqı onları 27 il bundan əvvəl tarixin zibilxanasına atıbdır".

### *Düşünülmüş styasət – uğurlu nəticələr*

Bəli, hər bir çətin anlarda ölkə Prezidenti İlham Əliyevin düşünülmüş və zamanında atdığü uğurlu addım sonda müsbət nəticəsini verir. Məhz bu gün dövlət başçımızın uğurlu və düşünülmüş siyasətinin nəticəsidir ki, ölkəmiz vəziyyətdən az itkilərlə çıxa bilir.

Koronavirusla mübarizə sahəsində görülən tədbirlər və sosial-iqtisadi vəziyyətlə bağlı keçirilən müşavirədə dövlət başçımız bildirdi ki, koronavirus xəstəliyi bundan sonra da nəzarət altında saxlanılacaq. Dövlət başçısınının qeyd etdiyi kimi, artıq üç həftədir ki, müsbət dinamika müşahidə edilir. Bütövlükdə pandemiya başlayandan dərhal sonra dövlət tərəfindən bütün lazımi qabaqlayıcı tədbirlər həyata keçirilməyə başlandı. Bunun nəticəsində ölkəmiz vəziyyətdən az itkilərlə çıxa bilir. Cənab Prezident müşavirədə bir daha söylədi ki, əsas məqsədimiz insanların sağlamlığıdır. Ondan sonra əhəmiyyət baxımından bizim iqtisadi vəziyyətimiz, iqtisadi inkişafımız, iqtisadiyyatın dayanıqlılığı və biznes dairələrinə göstərilən dəstək, postpandemiya dövrünə hazırlıq gəlir. Dövlət başçısı diqqətə çatdırdı ki, koronavirusla bağlı mübarizədə addımlar vəziyyətə uyğun şəkildə atılacaq. Karantin vəziyyəti hamını yorsa da, pandemiyanın fəsadları nəzərə alınmalıdır. Nəzərə alsaq ki, dövlət rəhbərliyi, Operativ Qərargah insanların sağlamlığı və təhlükəsizliyi üçün fasiləsiz işləyir, vətəndaşlar da vəziyyətin ciddiliyini nəzərə almalıdır. Dövlət başçısı diqqətə çatdırıb ki, karantin rejimi nə vaxt mümkünsə yumşaldılacaq, necə ki, artıq ayın 5-dən yumşalma olub. Vətəndaşlar nəzərə almalıdır ki, əgər bu yumşalmadan sonra yenə də xəstəlik kəskin artsa, karantin rejimi yenə də sərtləşdiriləcək. Ona görə də, hamı məsuliyyətli olmalı, qaydalara əməl etməli, tibbi maskalardan, dezinfeksiyaedici vasitələrdən istifadə etməli, sosial məsafəni gözləməlidir. belə olarsa, karantin rejimini daha da yumşaldıb normal həyata tez qayıtmaq mümkün ola bilər.

Onu da vurğulamaq istərdim ki, pandemiya şəraitində sosial və iqtisadi məsələlərin həlli istiqamətində də ardıcıl tədbirlər həyata keçirilir. Ölkəmizdə iqtisadi və sosial məsələlər də öz həllini tapır. Bu dövrdə 5 milyona yaxın insan geniş sosial paketlə əhatə edildi, dövlət sektorunda çalışan 900 min insanın böyük əksəriyyəti faktiki olaraq işləməsə də, dövlət tərəfindən əməkhaqqı alır. 760 min sahibkara lazımi maliyyə dəstəyi göstərildi və onların iş yerləri qorundu. Bundan əlavə, 600 min işsiz insan, o cümlədən qeyri-formal məşğulluqda fəaliyyət göstərən və müvəqqəti olaraq öz işini itirən, aztəminatlı təbəqəyə aid olan insan dövlət tərəfindən qayğı ilə əhatə olunub. Onlara 190 manat həcmində müavinətin verilməsi buna sübutdur. Həmçinin, müşavirədə ölkə Prezidenti vurğuladı ki, sosial dəstək bundan sonra da davam etdirilməlidir. Hazırda Azərbaycanın 13 şəhər və rayonunda sərt karantin rejimi tətbiq edilir. Həmin rayonların bu kateqoriyaya aid insanları bu dəstəklə bundan sonra da əhatə olunmalıdır. Avqust ayında da onlara 190 manat ödəniləcək.

### *"Bəlkə də dünyada öz vətəndaşına bu qədər qayğı və diqqət göstərən ikinci ölkə yoxdur"*

Bəli, dövlət başçısı çıxışlarında dəfələrlə bu cavabı verib. Ölkə başçısının bu cavabı Azərbaycan dövlətinin sosial siyasətinin fəlsəfəsi, iqtisadi inkişafın nəticələrinin əhalinin rifah halının yüksəldilməsinə yönəldilən real sübutudur. Bu prinsip hər gün daha geniş şəkildə davam etdirilir. Bugün ölkə Prezidentinin həyata keçirdiyi uğurlu sosial siyasəti bunu sübutudur. Bir daha dönə-dönə bildirmək istəyirəm ki, bu gün bu uğurlu siyasətə qara yaxmağa çalışan, yalan və manipuliyasiyalarla insanların fikirlərini dəyişdirməyə can atan məkrli xarici qüvvələri və nüfuzdan düşmüş radikal müxalifətin anti-Azərbaycan təbliğatı mənasız və əsassızdır. Çünki bütün reallıqları xalqımız görür və öz Prezidentinə inanır və Onun yanındadır. Məhz buna görə son günlərdə dövlət başçısına gələn təşəkkür məktublarının sayı-hesabı yoxdur. Prezidentin saytında oxuya biləcəyimiz məktublarda insanlar böyük səmimiyyətlə və ürəkdən gələn sözlərlə dövlətin həqiqətən xalqla birlikdə olduğunu deyir, “Biz birlikdə güclüyük!” şüarının sadəcə bir söz olmadığını ifadə edirlər. Əslində, hər zaman cənab İlham Əliyevin bütün düşüncələri, qərarları və addımları vətəndaşın rifahına yönəlmişdi. Son dövrdə isə belə olduğu

xüsusilə hiss edilir. Bütün bunlar bir daha onu təsdiqləyir ki, xalqımız möhtərəm Prezidentimiz İlham Əliyevin rəhbərliyi altında bundan sonra daha böyük nailiyyətlərə imza atacaqdır. Çünki Azərbaycan Prezidentinin fəaliyyətinin əsas qayəsi xalqa və dövlətə sədaqətli, layiqli xidmət prinsipi üzərində qurulmuşdur. Əminliklə demək olar ki, Azərbaycan xalqını uğurlu gələcəyə aparan bu siyasət növbəti illərdə də davam etdiriləcək, respublikamız Prezident İlham Əliyevin rəhbərliyi ilə gələcəyə doğru inamla addımlayacaq və dövlət başçımızın dediyi kimi – "Əminəm ki, dövlətimiz və xalqımız bu sınaqdan da üzüağ çıxacaq".

## Böyük zəfərlərə inam yaradan qürurverici inkişaf

Bu gerçəklik xalq və iqtidar birliyinin bariz təcəssümüdür, desəm, yanılmaram. Gəlin müqayisə aparaq, hansı dövlətin başçısı öz xalqına bu qədər yaxın və səmimi olub? Bu gün dünyanı ağuşuna alan gözəgörünməz bəla - COVID-19 pandemiyası peyda olarkən, dünyanın ən çox inkişaf etmiş ölkələri bu sınaq qarşısında aciz qaldığı bir məqamda Azərbaycan Prezidenti İlham Əliyev elə ilk andan düşünülmüş və uğurlu addımları ilə bu çətin məqamlardan çıxmağı bacardı. Koronavirusun gətirdiyi bəlalara baxmayaraq, bu gün bütün xalqımız adından böyük qürur hissi ilə bəyan etmək olar ki, Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev Yer kürəsini bürümüş koronavirus biomüharibəsində fövqəladə bacarıq nümayiş etdirmiş, ölkəsini və xalqını xilas etmək vəzifəsini həyata keçirmiş qalib Baş Komandandır. Belə ki, dövlət başçısının qəti tapşırıqları əsasında qısa müddətdə ali və orta təhsil müəssisələrində tədris prosesinin dayandırılması, ölkə miqyasında genişmiqyaslı dezinfeksiya tədbirlərinin təşkili, tərəddüd etmədən ölkəmizin sərhədlərinin bağlanmasına dair qonşu dövlətlərlə danışıqların aparılması və qəti qərarların qəbul edilməsi koronavirus biomüharibəsində gələcək qələbənin əldə olunmasının əsas təminatına çevrilmişdir.

Paralel olaraq dövlət başçımızın rəhbərliyi ilə pandemiya dövrünün çağırışlarına uyğun olaraq yeni işlək strukturların yaradılması və bir sıra dövlət qurumlarının fəaliyyətinin yenidən qurulması, onların əlaqəli və operativ işlərinin təşkili koronavirusla mübarizənin bütün cəbhə xətti boyu aparılmasına meydan açmışdır. Ölkə Prezidentinin tapşırığı əsasında Nazirlər Kabineti yanında yaradılmış Operativ Qərargahın operativ məlumatlarının vaxtında xalqa çatdırılması insanların həyat fəaliyyətinin idarə olunması və tənzimlənməsində mühüm rol oynadı. Eyni zamanda, ölkə başçısı bir illik məvacibini aztəminatlı ailələrə ayırdı, bundan başqa dövlət büdcəsindən bir milyard manat vəsait pandemiya ilə mübarizəyə xərcləndi. Birinci vitse-prezident Mehriban xanım Əliyevanın təşəbbüsü ilə Heydər Əliyev Fondundan ölkəmizin müxtəlif bölgələrində yaşayan aztəminatlı ailələrə yardımlar edildi. Bu gün Prezident İlham Əliyevin böyük uzaqgörənliklə söylədiyi "Biz birlikdə güclüyük!” çağırışı

real həyatda, ən çətin proseslərdə taleyüklü məsələlərin həllində özünün real gücünü və əhəmiyyətini isbat etmişdir.

***Növbəti qürurverici uğur – BMT-nin 130-dək üzv dövlətlərinin Prezident İlham Əliyevə böyük etimadı***

Ölkə Prezidenti İlham Əliyevin prezidentlik fəaliyyəti müddətində Azərbaycanın bütün sahələrdə ancaq və ancaq imzası imzalar içində, səsi isə yüksək tribunalardan gəlib və gəlməkdədir. Məhz pandemiya zamanında da belə Azərbaycanın dövlət başçısı İlham Əliyevin BMT-nin xüsusi sessiyasının keçirilməsi ilə bağlı təşəbbüsü, tam mənada, BMT-nin dəstəyini qazanması deyilənlərin real sübutudur və bu təşəbbüsün dəstəklənməsində dövlət başçımızın imici, onun nüfuzu böyük rol oynayır. Həmin dövlətlər başa düşürlər ki, Azərbaycan Prezidenti İlham Əliyevinin dünya birliyi çərçivəsində oynadığ rol, tutduğu mövqe bir çox dövlətlər tərəfindən dəstəklənir. Belə olan halda Azərbaycanın zəngin təcrübəsindən faydalanmaq lazımdır. BMT-nin 130-dək üzv dövləti tərəfindən Qoşulmama Hərəkatının sədri statusunda Prezident İlham Əliyevin Baş Assambleyanın xüsusi sessiyasının keçirilməsi barədə təşəbbüsünün dəstəklənməsi bir daha beynəlxalq ictimaiyyət tərəfindən ölkəmizə olan böyük etimadın, etibarın növbəti göstəricisi oldu. Bu, hər bir azərbaycanlı üçün fəxr ediləcək haldır.

Həmçinin digər bir sevindirici və qürur duyulacaq hissdir ki, məhz Qoşulmama Hərəkatının sədri kimi dövlət başçımız İlham Əliyevin təşəbbüsü ilə "COVID-19-a qarşı birlikdəyik" mövzusunda videokonfrans formatında keçirilən Zirvə görüşü dünya siyasətçilərinin əsas mövzusuna, kütləvi informasiya vasitələrinin manşet xəbərinə çevrildi.

Eyni zamanda, onu da vurğulamaq istərdim ki, Azərbaycan koronavirus infeksiyasına qarşı mübarizədə qlobal birliyin nümunəsi kimi Ümumdünya Səhiyyə Təşkilatına könüllü ianə edib və 30-dan çox ölkəyə humanitar yardım göstərib. Bir sözlə, bütün bunların arxasında heç şübhəsiz ki, Azərbaycan Prezident İlham Əliyevin yürütdüyü praqmatik siyasət dayanır. Bu gün Azərbaycanın koronavirusa qarşı mübarizədə müsbət göstəricilərinin əldə olunmasının nəticəsidir ki, artıq ölkəmizdə yumuşalma prosesi gedir. Buna isə xalq-hakimiyyət birliyinin müsbət nəticəsində əldə olunub. Çünki xalq-hakimiyyət birliyi istənilən dövlətdə

siyasi sabitliyi və təhlükəsizlik mühitini şərtləndirən həlledici amil olmaqla yanaşı, hər bir kəs özündə məsuliyyət hissi duymalıdır. Prezident İlham Əliyev cənabları da avqustun 6-da ölkəmizdə koronavirus pandemiyası ilə mübarizə sahəsində görülən tədbirlər və sosial-iqtisadi vəziyyətlə bağlı videoformatda keçirilən müşavirədə də bunu bir daha vurğulayıb.

Dövlət başçımız keçirilən müşavirədə bildirib ki, yumşalmadan sonra xəstəliyin kəskin artdığı baş verərsə, o zaman yenidən karantin rejimi sərtləşdiriləcək. Ona görə də, dövlət başçısı həmişə olduğu kimi, bu müşavirədə də bir daha xalqımızı məsuliyyətli olmağa, karantin rejiminin qaydalarına əməl etməyə çağırdı: "Ona görə bütün Azərbaycan vətəndaşlarına bir daha müraciət edirəm ki, məsuliyyətli olun. Bu, çox ağır xəstəlikdir. Bu xəstəlik yaş tanımır, cavan insanlar, gənc insanlar, fiziki cəhətdən sağlam insanlar, idmançılar xəstələnir və rəhmətə gedir. Bu, dünya üçün çox ciddi problemdir, bu gün dünyanın bir nömrəli bəlasıdır. Ona görə hamımız məsuliyyətli olmalıyıq. Əgər belə olsa, dediyim bütün tapşırıqlar yerinə yetirilsə, biz qısa müddət ərzində bu karantin rejimini daha da yumşaldıb normal həyata daha tez qayıda bilərik".

Göründüyü kimi, dövlətin siyasəti onu göstərir ki, insanların sağlamlığı, həyatı hər şeydən üstündür. Ona görə də bu vəziyyətdən qalib çıxmaq üçün nə qədər lazımdırsa, dözməli, məsuliyyətli, karantin rejiminə əməl etməliyik. Bütün bunlara isə məsuliyyətli olmağımız nəticəsində nail ola bilərik. Çünki bu, sosial məsuliyyət məsələsidir. Sirr deyil indiki situasiya təkcə dövlət orqanları qarşısında deyil, hər bir vətəndaş qarşısında ciddi məsuliyyət müəyyənləşdirir. Hamı başa düşməlidir ki, sosial yönündən asılı olmayaraq atılan müvəqqəti və məcburi addımların cəmiyyətin sağlamlığı, təhlükəli virusun neqativ təsirlərindən maksimum dərəcədə qorunmaq üçündür. Sosial şəbəkələrdə şayiə və dezinformasiya, təşviş doğuran xəbərlər yayanlara qarşı isə ciddi tədbirlər görülür, görülməlidir də. Dövlətin xalqın təhlükəsizliyi üçün bir qədər də zəruri və sərt addımlar atması ancaq və ancaq vətəndaşların sağlamlığı və təhlükəsizliyi üçündür!

Ümumiyyətlə, bütün yuxarıda göstərilənlər onu deməyə əsas verir ki, artıq ölkəmiz, xüsusilə Prezident İlham Əliyev təkcə bütün regional məsələlərdə deyil, mahiyyətindən asılı olmayaraq dünya miqyasında baş verən qlobal hadisələr zamanı qətiyyətli mövqe nümayiş etdirir. Dövlət

başçısının təşəbbüsləri qlobal miqyasında beynəlxalq həmrəyliyin və əməkdaşlığın möhkəmləndirilməsi istiqamətində mühüm nümunədir. Bu da onu göstərir ki, son 17 ildə Azərbaycanda həyata keçirilən mühüm tədbirlər beynəlxalq birliyin Azərbaycana inamının, etimadının təzahürü, ölkəmizin və dövlətimizin başçısının qlobal miqyasda nüfuzunun göstəricisidir.

Beləliklə, prosesləri təhlil etdikdə gəlinən obyektiv nəticə budur ki, Azərbaycan koronavirus sınağından üzüağ çıxır. Prezident İlham Əliyevin xüsusi nəzarətində olan və məhz onun tapşırıq və tövsiyələri əsasında müvafiq qurumların həyata keçirdiyi işlər qısa müddətdə yekun hədəflərə çatdırılacaq. Bu prosesdə dövlət bütün yükü üzərinə çəkib. Vətəndaşlardan isə bircə tələb var – karantin qaydalarına əməl etmək! Çünki Azərbaycanda koronovirusla mübarizə modeli həm də özünü daha da təkmilləşdirmək gücündədir... Budur uğrlu inkişaf! Budur, Azərbaycan Prezidentinin öz xalqına diqqəti, qayğısı! Xoşbəxtik ki, həyata keçirdiyi siyasəti bütünlüklə xalqımızın, bizim rifahımıza həsr etmiş bir LİDERİMİZ var!

## Ali Baş Komandanımızın iradəsi qarşısında işğalçı ölkə çox aciz görünür

Sarsılmaz ordu, məğlub düşməndir. Çünki müstəqil dövlətin nüfuzu iqtisadi, siyasi, elmi potensialı ilə yanaşı, onun malik olduğu ordusunun qüdrəti ilə də ölçülür. İyulun 12-dən başlayaraq Azərbaycan-Ermənistan dövlət sərhədində vəziyyətin gərginləşməsi və Ermənistan silahlı qüvvələrinin beynəlxalq hüquq normalarını pozaraq Tovuz rayonu istiqamətində yaşayış məntəqələrimizi artilleriya atəşinə tutması təcavüzkar ölkənin ağırlaşan iqtisadi vəziyyətini diqqət mərkəzindən yayındırmağa çalışmaqdan başqa bir əhəmiyyət kəsb etmir. Lakin təcavuzkar ölkənin etdiyi bu təxribatları həmişə olduğu kimi, bu dəfə də Azərbaycan Ordusunun gücü, əsgərlərimizin əzm və rəşadəti nəticəsində böyük qələbə ilə nəticələnib və bu gün də məğlubiyyət Ermənistanın, qələbə Azərbaycanın olub! İstər Aprel döyüşlərində, istər Naxçıvan əməliyyatında və bugünkü Tovuz istiqamətində gedən döyüşlərdə olduğu kimi Azərbaycan Ordusunun gücü, Azərbaycan əsgərinin əzm və rəşadəti nəticəsində son döyüşdə də qələbə bizim olacaq.

Prezident İlham Əliyev Nazirlər Kabinetinin 2020-ci ilin birinci yarısının sosial-iqtisadi inkişafının yekunlarına və qarşıda duran vəzifələrə həsr olunan iclasında da Azərbaycan Ordusunun gücünə, Azərbacyan əsgərinin əzm və rəşadəti ilə bu gün də qələbənin bizim olduğunu demişdir: "Mən hesab edirəm ki, bu əməliyyatın Azərbaycan Ordusunun şanlı tarixində öz yeri olacaq. Deməliyəm ki, son günlər ərzində Azərbaycan Ordusu bir daha öz üstünlüyünü göstərdi. Bu əməliyyatın Azərbaycan Ordusunun şanlı tarixində öz yeri olacaq. Necə ki, 2016-cı ildə Aprel döyüşlərində düşmənə dərs verdik və Ağdərə, Füzuli, Cəbrayıl rayonlarının bir hissəsini düşməndən azad etdik. İki il bundan əvvəl – 2018-ci ildə uğurlu Naxçıvan əməliyyatı nəticəsində on min hektardan çox torpaq sahəsi Azərbaycan Ordusu tərəfindən götürüldü və işğalçılar o bölgələrdən qovuldu. Azərbaycan Ordusu tərəfindən götürülmüş strateji yüksəkliklər imkan verir ki, biz Ermənistanın bir neçə yaşayış məntəqəsinə nəzarət edək. Ermənistandan Dağlıq Qarabağa gedən avtomobil yolu bizim

nəzarətimizdədir. Vaxtilə - 1990-cı illərin əvvəllərində Naxçıvan ərazisinin bir hissəsini işğal etmiş Ermənistan qüvvələri həmin ərazilərdən qovuldu, çıxarıldı, o torpaqlarda Azərbaycan bayrağı ucaldıldı".

**"Ermənistan qüvvələri bir santimetr belə Azərbaycan torpağına girə bilməmişlər və heç vaxt buna nail olmayacaqlar"**

Dövlətimizin başçısı vidiomüşavirədə çıxışı zamanı bildirib ki, bu əməliyyat - son günlər ərzində baş vermiş hərbi toqquşma bizim növbəti şanlı qələbəmizdir: "Bunu Azərbaycan xalqı bilir. Mən bu günlərdə minlərlə vətəndaşdan məktub alıram və bu məktubların hamısı dəstək xarakterlidir. Beynəlxalq hərbi ekspertlər eyni fikirdədirlər və bunu o bölgədə real vəziyyət göstərir. Ermənistan qüvvələri bir santimetr belə Azərbaycan torpağına girə bilməmişlər və heç vaxt buna nail olmayacaqlar. Əksinə, əgər biz istəsəydik, bu gün Ermənistanın o ərazisində torpaqların böyük hissəsi nəzarətimizə keçə bilərdi. Ancaq bizim qarşımızda belə məqsəd dayanmır. Ermənistan-Azərbaycan dövlət sərhədində vəziyyətlə bağlı məlumat artıq verildi və bu gün operativ vəziyyət bizi tamamilə qane edir. Biz istənilən vaxtda, lazım olan vaxtda bu günlərdə yaradılmış əlavə imkanlardan, o cümlədən döyüş məntəqələrinin yeni yerləşməsindən istifadə edib öz sözümüzü deyəcəyik. Aprel döyüşlərində olduğu kimi, mənfur qonşu bu dəfə də ən çirkin əməllərə əl atdı. O da nədən ibarətdir? Bizim kəndlərimizi atəşə tutdu və bunun nəticəsində 76 yaşında ağsaqqal Əziz Əzizov həlak olmuşdur. Bu, bir daha onu göstərir ki, Ermənistan faşist dövlətdir".

Bu bir həqiqətdir ki, Ermənistan Azərbaycanın uğurlarına daim paxıllıq edib, öz çirkin xislətini nümayiş etdirib. Elə işğalçı ölkənin BMT Baş Assambleyasının xüsusi sessiyasının keçirilməsi təşəbbüsünün əleyhinə səs verməsi bu ölkənin iç üzünü və mahiyyətini açmaqla bir daha sübut etdi ki, bu qərəzli yanaşmanın kökündə ölkədə hökm sürən və dövlət tərəfindən təbliğ edilən azərbaycanafobiyadır, Azərbaycan dövlətinə, Azərbaycan xalqına nifrətin təzahürüdür. Bütün dünya dövlətləri bir daha şahid oldu ki, Azərbaycan Prezidentinin bu təşəbbüsü irəli sürməkdə məqsədi COVİD-19-la mübarizədə vahid yanaşmanın tətbiqinə, ölkələrin özlərinə qapanmamasına, inkişaf etmiş dövlətlərin ağır vəziyyətdə olanlara

kömək göstərməsinə nail olmaq idi. O da bəllidir ki, bu gün pandemiyadan ən çox zərər çəkən ölkələrdən biri Ermənistandır. Bu təşəbbüsün reallaşması üçün 97 səs lazım olmuş, ancaq 130-dan çox ölkənin səsi əldə edilmişdi. Belə bir qlobal miqyaslı təşəbbüsün Azərbaycan tərəfindən irəli sürülməsi və dəstəklənməsi bir daha beynəlxalq müstəvidə Azərbaycana olan dəstək və rəğbətdir. Azərbaycan bu rəğbəti uzun illər həyata keçirdiyi ardıcıl xarici siyasət hesabına, prinsipial, müstəqil mövqe sayəsində qazanıb. Həmçinin onu da qeyd edim ki, doqquz il bundan əvvəl 155 ölkənin dəstəyi ilə BMT Təhlükəsizlik Şurasına üzv seçilən Azərbaycana yenidən böyük beynəlxalq dəstəyin verilməsi bir daha ölkəmizə olan inam və etimadın göstəricisidir. Lakin "demokratiya" və "rifah" adı ilə küçədən hakimiyyət başına gətirilən Paşinyan kimi savadsız faşist xislətli təcavüzkar ermənilərin ümidlərini doğrultmadığına görə hakimiyyətlə xalq arasında yaranmış qarşıdurmanı ört-basdır etmək üçün sərhəd bölgəsində təxribat törətməyi çıxış yolu seçdi. Bununla da həm erməni ictimaiyyətinin diqqətini yayındırmağa, həm də Azərbaycanın uğurlarına, nailiyyətlərinə kölgə salmağa cəhd etmək istədi. Amma hər dəfə olduğu kimi, bu dəfə də alınmadı. Çünki 2016-cı il aprel təxribatlarından sonra Ermənistanı növbəti ağır məyusluq gözləməsi labüd ildi. Əgər aprel məğlubiyyətindən sonra Sarkisyan hakimiyyətdən qovulmuşdusa, inanıram ki, Tovuz təxribatından sonra Paşinyan da hakimiyyətdən qovulacağı realdır.

Deyir zaman hər şeyi üzə çıxarır və hər kəs də gec-tez layiq olduğu cəzanı alır. 27 il "müxalifətdəyəm" deyənlərin əqidəsi, məsləki, satqınlığı, əxlaqsızlığını zaman, özü də dünyanı ağuşuna alan koronavirusun baş aldığı bir dövrdə elə üzə çıxardı ki, virus qaldı bir yana, AXCP-nin Rəyasət Heyətinin "zoom" iclasında Əli Kərimli başda olmaqla müxalifətin, xüsusilə də müsavatçılara qarşı söyüş və təhqirlərə yol verməlari ilə bir daha cəbhəçilərin nifrətini göstərdi və bu da boğazdan yuxarı "milli demokratların" siyasi məhvi olacaqının labudi idi". Bu gün təcavüzkar Ermənistanın törətdiyi təxribatlarına həmişə dəstək verən radikal müxalifət, xüsusilə də AXCP sədri Əli Kərimli iş çətinə düşən kimi, "dövlətin yanındayıq" deməklə iblis xislətindən əl çəkmədiyini nümayiş etdirmədimi? Ə.Kərimli belə şeytan oyunlarını çox edib. Belə ki, hakimiyyətdə olduqları bir il

müddətində Surət Hüseynovun dar ağacından xilas olmaq üçün Ulu Öndər Heydər Əliyevdən kömək istədilər, bununla xilas oldular, sonra aprel döyüşləri zamanı və bu gün növbəti oyun. Minlərlə xalqın nümayəndəsi əldə etdiyimiz qələbəni, dövlətinə, öz ordusuna, onun Ali Baş Komandanına dəstəyini ifadə edən yürüş etdi. Nümayiş sakit, polisin heç bir müdaxilə etmədiyi şəraitdə keçdi. Xalq axını Şəhidlər xiyabanından Milli Məclisin önündəki meydana yönəldi və orada birləşdi. Lakin "sapı özümüzdən olan bu küt baltalar" yenə də son təxribatlarda qələbəmizi qeyd edən xalq yürüşünü ləkələmək istəyərək Milli Məclisin binasına daxil olaraq, dağıdıcı niyyətli olduqlarını nümayiş etdirdilər. Baş vermiş hadisə sadə cinayət əməli deyil! Bu, hər şeydən öncə bağışlanılmaz cinayətlər idi, xüsusi hazırlanmış qüvvələrin dövlətimiz əleyhinə planlı addımı idi. Ancaq ümumxalq həmrəyliyinə qarşı pozucu mövqe tutanlar bilməlidirlər ki, Azərbaycan xalqının həmrəylik və birliyini heç bir qüvvə poza bilməz. Çünki xarici təcavüzə qarşı ümumxalq həmrəyliyinin ən güclü dayağı, məhz Azərbaycan xalqının özüdür, yetkin siyasi qüvvələrdir və vətənpərvər gənclərdir.

Dövlət başçımız hökumət üzvləri ilə keçirdiyi virtual müşavirədə ordumuza dəstək məqsədilə təşkil edilən aksiyadan danışaraq bildirdi ki, bu, bir daha Azərbaycan xalqının ağır günlərdə bir nöqtəyə vura bildiyini göstərir: "Mənə verilən məlumata görə, dünən bəzi müxalif qurumlar, o cümlədən Azərbaycan Xalq Cəbhəsinin nümayəndələri o kütlənin içinə girərək orada insanları qanunsuz əməllərə sövq etməyə çalışıblar. Qanunu pozanların arasında onlar da var, onlar indi müəyyən olunublar. Mən bir daha xəbərdarlıq edirəm, odla oynamasınlar. Bu məsələ milli məsələdir. Heç nəyə baxmayacağıq, kim nə dedi, hansı şura, hansı Avropa Şurası, hansı təşkilat. Bizim son günlərdə sərgilədiyimiz mövqe – beynəlxalq təşkilatlarda bizim əleyhimizə çirkin kampaniya aparanlara qarşı tutduğumuz mövqe artıq nəticə verir. Anti-Azərbaycan qüvvələri harada mümkünsə, onları bloklayacağıq. Onların namizədlərinin meydan oxumasına, Azərbaycana çirkab yaxmasına imkan verməyəcəyik. Heç kim bizə göstəriş verə bilməz". Bunu Prezident İlham Əliyev Nazirlər Kabinetinin 2020-ci ilin birinci yarısının sosial-iqtisadi inkişafının yekunlarına və qarşıda

duran vəzifələrə həsr olunan iclasda deyib.

Dövlət başçısı bildirib ki, mitinq-yürüş zamanı baş verən təxribat törədənlərin ermənidən pis olduğunu və cinayətkarların ciddi cəzalandırılacağını deyərək, onlara bunun axırıncı dərs olacağını deyib: “Yadınıza salın, o vaxt torpaqlar əldən gedirdi, burada parlamentin qarşısında mitinqlər təşkil edilirdi. Minlərlə insan yığışırdı, öz hiddətini ifadə edirdi. Ancaq nəticə etibarilə nə oldu? Torpaqlar əldən getdi. İndi mitinq vaxtıdırmı? Biz şəhidlər veririk, igidlər itiririk, generallar itiririk. Bu çirkin ünsürlər indi burada vəziyyəti gərginləşdirmək istəyir. Bütün aidiyyəti qurumlara deyirəm. Əgər dünənki hadisələrdə onların əli varsa, bizim qətiyyətimizi görəcəklər. Onlar ermənilərdən də pisdirlər. Erməni açıq düşməndir. Oturub orada, bunlara görə torpaqlarımızı işğal edib. Bu Xalq Cəbhəsinin fərarilərinə görə bu gün o torpaqlardadır. Amma bu, oturub bizim içimizdə xaricdən pul alır, təlimat alır, mühiti zəhərləyir, bizim təmiz havamızı üfunət iyi ilə çirkləndirir və belə məqamlarda dövlətin yanında yox, düşmənin yanındadır. Mən demişəm, hüquq-mühafizə orqanları onların bu günlər ərzində sosial şəbəkələrdə çıxışlarını təhlil etsinlər. Əgər orada cinayət tərkibi varsa, onların hamısı cinayət məsuliyyətinə cəlb edilməlidir. Döyüşlər getdiyi vaxtda onlar ordumuza şər atırlar, yalanlar uydururlar. Deyirlər ki, biz o yeri vermişik, biz oraya getməməliydik, biz buraya getməməliydik. Sən kimsən? Sən bizim ordumuza göstəriş, məsləhət verirsən. Ay başı boş, ay satqın. Bunlardır, bunlar idi Azərbaycan dövlətçiliyini yıxmaq istəyənlər. Biz bunların nazı iləmi oynayacağıq? Onlara elə dərs veriləcək ki, bu, son dərs olacaqdır. Ona görə, bir daha demək istəyirəm, hüquq-mühafizə orqanları bu işlərlə məşğul olacaq. Onların bütün antidövlət çıxışları, çağırışları təhlil ediləcək. Əgər orada cinayət tərkibi varsa, onlar dərhal cinayət məsuliyyətinə cəlb edilməlidir. Biz “Beşinci kolon”la bu işi bitirməliyik, belə davam edə bilməz. Yəni, burada dözümlülük qətiyyən yolverilməzdir. Adi günlərdə biz bəzi hallarda gözümüzü yumuruq, deyirik ki, əhəmiyyətsiz şeydir. Amma belə vəziyyətdə bu, düşmənçilikdir. Bu gün bu düşmənçiliyin başında dayanan Azərbaycan Xalq Cəbhəsidir, onun çirkin, satqın rəhbərləridir, özünü lider sayan qorxaqlar, fərarilərdir. Onlar artıq Azərbaycan xalqı tərəfindən

dəfələrlə öz yerini görüblər və görəcəklər".

Göründüyü kimi, bu gün xalq-hakimiyyət birliyi monolit xarakter kəsb edir. Xalq öz Ali Baş Komandanının arxasındadır. Ona tam inanır və güvənir. Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi ilə bu tarixi sınaqdan da şərəflə çıxacağımıza tam əminik! Bolşevizm təfəkkürlü bu satqınlar bilməlidirlər düşmən qoltuğuna sığınmaqla xalqa, dövlətə əsl xain olduqlarına və nə zamansa, bütün bunlara görə mütləq, amma mütləq cavab verməli olacaqlar – Azərbaycan xalqı və qanunları qarşısında!

## Ölkə vətəndaşlarının sosial rifahının yüksəlməsinə xidmət edən siyasət

**Prezident İlham Əliyev "Mən hər bir azərbaycanlının Prezidenti olacağam" ifadəsini işlətmişdi, bu gün isə, hər bir kəs "İlham Əliyev mənim Prezidentimdir" deyir.**

Bu nədən irəli gəlir? Əlbəttə ki, ölkə Prezidentinin əhalinin maddi rifah halının yaxşılaşdırılması istiqamətində gördüyü işlərdən, imzaladığı fərman və sərəncamlar, bütövlükdə dövlətimizin yeritdiyi siyasətin mərkəzində insan amilinin, Azərbaycan vətəndaşına diqqət və qayğının olmasından irəli gəlir. Ən çətin anlarda Prezident xalqının yanında olub. Dünyada koronavirus pandemiyasının tüğyan etdiyi ilk gündən Prezident İlham Əliyevin rəhbərliyi ilə ölkəmizdə koronavirus – COVID-19 pandemiyasının insanlar arasında geniş şəkildə yayılmasının qarşısının alınması üçün vaxtında həyata keçirilən çevik, təxirəsalınmaz və zəruri qabaqlayıcı tədbirlər Azərbaycan modelini nümunə olaraq bir daha ortaya qoymuş oldu. Xüsusilə, son həftələr ölkədə karantin müddətinin uzadılmasına ehtiyacın olması da, məhz dövlətin öz vətəndaşının sağlamlığını hər şeydən üstün tutmasının reallığının təsdiq edən amildir.

Avqustun 31-də Prezident İlham Əliyev Fövqəladə Hallar Nazirliyinin Tibb Mərkəzinin koronaviruslu xəstələrin müalicəsi üçün nəzərdə tutulan modul tipli növbəti hospitalın açılışında tibb müəssisəsinin kollektivi ilə videoformatda görüşü zamanı karantin pandemiyası dövründə vəziyyətə uyğun şəkildə həyata keçirilən işlərdən danışaraq bildirdi ki, qısa müddət ərzində normal həyata qayıdılıb. Dövlət başçısı çıxışı zamanı, həmçinin vurğuladı ki, Azərbaycanda vəziyyətə uyğun şəkildə atılan addımların nəticəsində öz səmərəsini verməsinə arxayınlaşmaq olmaz, vətəndaşlarımız məsuliyyətli olmağı unutmamalıdırlar: "Çünki bir daha demək istəyirəm ki, birinci dərəcəli məsələ insanların sağlamlığıdır. Əgər vətəndaşlarımız bundan sonra da məsuliyyətli olarlarsa, – mən qeyd etməliyəm ki, son müddət ərzində biz bu məsuliyyəti, doğrudan da görürük, hiss edirik və bu, real nəticələrdə öz əksini tapır, belə olan halda hesab edirəm ki, qısa müddət ərzində biz normal, adi həyata qayıda bilərik. Amma buna nail olmaq üçün əlbəttə ki, vətəndaşların məsuliyyəti hazırda birinci

dərəcəli məsələdir”.

Baxın, karantinin daha az ziyanla tətbiqi, eləcə də vətəndaşların evdə qalarkən bütün sosial xidmətlərlə təmin olunması dövlət başçısı cənab İlham Əliyevin və Birinci vitse-prezident Mehriban xanım Əliyevanın nəzarəti və qayğısı ilə həyata keçirilmişdir. Prezident İlham Əliyev ən çətin günlərdə dövlət-vətəndaş həmrəyliyinə ən böyük töhfəni vermiş oldu. Dövlətimizin başçısı hər bir vətəndaşın Prezidenti olduğunu bir daha sübut etdi.

Belə olan halda hər bir vətəndaş mövcud dinamikanı qoruyub saxlamaqda məsuliyyətli olmalıdır. Çünki məsuliyətsizlik, biganəlik, sanitar qaydalara əməl etməmə yoluxma sayının yenidən artmasına səbəb ola bilər. Prezident İlham Əliyev dəfələrlə çıxışlarında bildirib ki, aparılan bütün sosial siyasətin mərkəzində Azərbaycan vətəndaşı dayanır və Operativ Qərargah tərəfindən karantin qaydalarında yumşalmalar vətəndaşlarımızı arxayınlaşdırmamalı, xüsusi karantin rejiminin qaydalarına ciddi əməl edilməli, məsuliyyətsiz insanlara qarşı ictimai qınaq olmalıdır. Ölkə Prezidenti çıxışlarında da bildirib ki, dövlət nə lazımdırsa, onu edir: “Dövlət nə lazımdırsa, onu edir. Bundan artıq nəsə etmək mümkün deyil. Çünki nə lazım idisə, biz onu etmişik və edəcəyik”.

Təəssüf doğuran odur ki, bütün bu uğurlu addımlardan və əldə olunan nailiyyətlərdən sonra hələ də məsuliyyətini itirmiş insanların qaydaları pozması hallarının aşkarlandığının şahidi oluruq. Dövlət başçısı çıxışlarında da dəfələrlə hamını qanuna tabe olmağı tələb edərək bildirib ki, qanunu pozanlara qarşı heç bir güzəşt edilməyəcək. Prezident İlham Əliyev “qanun hər kəs üçün qanundur, heç kim qanundan üstün ola bilməz” fikrini qeyd edərək karantin rejiminin qaydalarına əməl etməyin hər bir vətəndaşın borcu oduğunu, vəzifəsindən, siyasi mənsubiyyətindən asılı olmayaraq hər kəs qanun qarşısında eyni məsuliyyətə malik olduğunu bildirib. Cənab Prezidentin çıxışında söylədiyi "Heç bir ayrı-seçkiliyə yol verilməməlidir və verilmir. İctimai vəziyyətinə, ictimai statusuna baxmayaraq, qanun qarşısında hamı bərabərdir. Azərbaycanda bərabərlik, ədalət və qanunun aliliyi əsas prinsiplərdən biridir və mən bütün vətəndaşları məsuliyyətə çağırıram" söyləməsi hər bir Azərbaycan vətəndaşını daha məsuliyyətli omağa səsləyir. Azərbaycan vətəndaşları bilməlidirlər ki, milli birlik və yüksək məsuliyyət karantin dövrünün əsas

tələbidir. Çox acınacaqlı haldır ki, dəfələrlə dövlət başçısının özü belə bu məsələdə vətəndaşları məsuliyyətə dəvət etməsinə, tibbi maska taxaraq nümunə olmasına baxmayaraq, bəzi məsuliyyətsiz vətəndaşlarımız, xüsusilə də bəzi məmurlarımız cəmiyyətin sağlamlığını düşünmədən qanunları pozaraq təhlükə yaradırlar. Dövlət başçısı verilən tapşırıqlara məsuliyyətlə əməl etmədiyi halda, cəza tədbirləri tətbiq olunduğunu da bildirib.

Bəli, Azərbaycan dövləti bütün sahələrdə, o cümlədən sosial sahədə də öz sözünü deyir. Çünki Azərbaycan Prezidentinin fəaliyyətinin əsas qayəsi xalqa və dövlətə sədaqətli, layiqli xidmət prinsipi üzərində qurulmuşdur. Əminliklə demək olar ki, Azərbaycan xalqını uğurlu gələcəyə aparan bu siyasət növbəti illərdə də davam etdiriləcək, respublikamız Prezident İlham Əliyevin rəhbərliyi ilə gələcəyə doğru inamla addımlayacaq.

## Yumruq kimi birliyi bizə bəxş edən SƏRKƏRDƏ

Aqillərin dediyi belə bir fikir var: "Üzük qaşı ilə tanınar". Bəli, böyük hikmət, məna var bu sözdə. Həqiqətən də, xalq, millət, dövlət özünün layiq olduğu rəhbəri, lideri ilə tanınır. Belə bir xoşbəxtliyi Ulu Tanrı Azərbaycan xalqına da bəxş edib. Dünya miqyasında öz xüsusi çəkisi, yeri olan Azərbaycan Prezidenti İlham Əliyev xalqını dünyaya tanıdan, özü də yeni bir tarix yazan **LİDERLƏRDƏN, SƏRKƏRDƏLƏRDƏNDİR!**

Son 30 il ərzində erməni faşistlərinin doğma torpaqlarımızda həyata keçirdiyi vəhşiliklər isə heç bir çərçivəyə, əndazəyə sığmır. Onlara xalqımız tərəfindən tutarlı, həlledici zərbə vurulmasının vaxtı gəlirdi...

**Bu vaxt isə özünü çox gözlətmədi…**

Bəli, 27 sentyabr 2020-ci il tarixindən Ermənistanın ardıcıl təxribatlarının və yeni işğal planlarının qarşısını alaraq, Azərbaycan Ordusu düşmənin 30 il ərzində qurduğu silahlı qüvvələrini darmadağın etdi, uzun illər ərzində işğal olunan Cəbrayıl, Qubadlı, Zəngilan, Füzuli, Şuşa, qəsəbələr, kəndlər, çoxsaylı strateji yüksəkliklər işğaldan azad olundu. Beləliklə, 44 gün ərzində Ali Baş Komandanın rəhbərliyi ilə Ordumuz bütün dünyaya öz qüdrətini, gücünü nümayiş etdirdi.

Noyabrın 10-da Azərbaycan, Rusiya prezidentləri və Ermənistanın baş nazirinin birgə bəyanatı isə Azərbaycan xalqının qələbəsi idi. Ali Baş Komandanımızın dediyi kimi: "Bu, bizim hamımızın qələbəsidir, bütün Azərbaycan xalqının. Azərbaycan xalqı bir daha göstərdi ki, nə qədər böyük xalqdır, nə qədər vətənpərvər xalqdır, nə qədər dəmir iradəyə malik olan xalqdır". 10 noyabr, 2020-ci il tarixli bəyanat – Azərbaycanın Qarabağa qovuşduğu, tarixi zəfərə imza atdığı, şəhidlərimizin, Xocalı qurbanlarının, Gəncə, Bərdə soyqırımları zamanı həlak olan günahsız insanların qisasını döyüş meydanında aldığı, işğalçı Ermənistana layiq olduğu yeri göstərdiyi tarixi gündür.

Müzəffər Ordumuzun Sərkərdəsi İlham Əliyevin dediyi kimi: "30 ilin əziyyəti, 30 ilin ümidsizliyi, 30 ilin əzabları xalqımızı sındırmadı, iradəmizə heç bir mənfi təsir göstərmədi. Çünki bizim işimiz haqq işidir, biz öz torpağımızda vuruşuruq, Vətən uğrunda vuruşuruq. Bizim davamız ədalətli davadır və əminəm ki, bu münaqişədə biz istədiyimizə nail olacağıq, haqq-ədalət öz yerini tapacaq və Azərbaycan öz ərazi bütövlüyünü

bərpa edəcək. Uzun illər ərzində məcburi köçkün kimi yaşayan soydaşlarımız da öz doğma dədə-baba torpaqlarına qayıdacaqlar".

Bu böyük qələbə **YUMRUQ KİMİ BİRLİYİ BİZƏ BƏXŞ EDƏN SƏRKƏRDƏMİZİN** rəhbərliyi, güclü Ordumuz və rəşadətli əsgər və zabitlərimizin igidliyi ilə əldə edildi. Bu tarixi zəfər qələbəsi ilə Prezident İlham Əliyev həyatını Azərbaycana həsr edən, "Şuşasız Qarabağ, Qarabağsız Azərbaycan yoxdur" - deyən Ulu Öndərin arzusunu reallaşdırdı.

"Mən bu gün Ulu Öndər Heydər Əliyevin məzarını ziyarət etdim, onun ruhu qarşısında baş əydim. Ürəyimdə dedim, xoşbəxt adamam ki, ata vəsiyyətini yerinə yetirdim. Şuşanı azad etdik! Bu, böyük Qələbədir! Bu gün şəhidlərimizin, Ulu Öndərin ruhu şaddır! Gözün aydın olsun Azərbaycan! Gözünüz aydın olsun dünya azərbaycanlıları!".

Ölkə Prezidenti İlham Əliyevin xalqa müraciətində səsləndirdiyi bu sözlər hər birimizdə böyük sevinc və qürur hisləri yaratdı. Bu böyük qələbə ilə Azərbaycan xalqını dünyaya qürurlu xalq kimi tanıtdı.

"Dağlıq Qarabağ Azərbaycan torpağı, beynəlxalq səviyyədə tanınan ərazimiz olmaqla yanaşı, ədalət məsələsidir, Azərbaycanın milli qürur məsələsidir" deyən Prezidentimizə olan inamı, sevgini birə beş artırdı.

Bəli, bu bəyanat Ermənistanın hərbi kapitulyasiyası deməkdir. Azərbaycan Prezidentinin dediyi kimi: **"İlk mərhələdə 3 ölkənin başçısı bu videokonfrans vasitəsilə bəyanatı imzalamalı idilər. Ancaq son anda Ermənistan baş naziri bundan imtina edib. Bu, müəyyən dərəcədə başadüşüləndir. Çünki faktiki olaraq bu bəyanat Ermənistanın hərbi kapitulyasiyası deməkdir. Ona görə bu bəyanatı videokonfrans formatında Rusiya Prezidenti və mən imzalamışıq və bu bəyanat rus dilində tərtib edilibdir. Mənim burada imzam var, bu sənəd bu imzalamadan sonra Rusiya səfirinə təqdim edilib və Rusiya və Ermənistan dövlət, hökumət başçıları bu sənədi imzalayacaqlar".** Belə də olmalı idi!. Çünki küçə adamının Azərbaycanın böyük Sərkərdəsi qarşısına çıxmağa belə cürəti çatmadığını anladığı üçün layiq olduğu yerdə, hansısa bir anbarda bu bəyanatı imzalamalı idi. Sözsüz ki, Azərbaycanın dəmir yumruğunun gücü ilə!. Dövlət başçımızın dediyi kimi: "Bir daha demək istəyirəm ki, Ermənistan baş naziri Paşinyanın bu hərəkəti başadüşüləndir. Halbuki, hesab edirəm ki, hər bir insan öz əməllərinə görə cavab verməlidir. Hər bir insan hətta onun üçün, ölkəsi üçün ən ağır, ən kritik vəziyyətdə özünə hörmət

saxlamalıdır. Onsuz da Paşinyan bunu imzalayacaq. Biz onu məcbur etdik. Ancaq onu hansısa bağlı bir yerdə, qapalı bir yerdə, kameralardan uzaq bir yerdə qorxaqcasına, namərdcəsinə imzalayacaq. Öz xoşu ilə bunu imzalamır. Bunun – dəmir yumruğun hesabına imzalayır!”.

Bir sözlə, tarixi sənəd imzalandı: Dağlıq Qarabağ münaqişəsi Azərbaycanın tam qələbəsi ilə başa çatdı! Beləliklə, "Qarabağ Azərbaycandır! və nida işarəsi", – söyləyən Prezidentimiz, xalqımızın Sərkərdəsi hər zaman olduğu kimi bu dəfə də vədinə əməl etdi. Noyabrın 10-u xalqımızın tarixinə şanlı, qızıl hərflərlə yazıldı! 30 ildən sonra Prezidentimiz, Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi ilə sübuta yetirdik ki, bir qarış torpağımızı belə heç kəsə verən deyilik. Qarabağ Azərbaycandır! Bu bizim yumruğumuzun, birliyimizin qələbəsidir!

***Bundan sonra heç kim bizi o torpaqlardan tərpədə bilməz!***

Mümkünsüzdür! Azərbaycan Prezidenti İlham Əliyev cənablarının qeyd etdiyi kimi, bundan sonra heç kim bizi o torpaqlardan tərpədə bilməz! Çünki 2020-ci il, noyabrın 10-u Müzəffər Azərbaycan Ordusu ZƏFƏR çaldı. Düşmənin beli qırıldı. Düşmən torpaqlarımızdan qovuldu. Füzuli, Cəbrayıl, Zəngilan, Qubadlı və Şuşa şəhərlərində, eyni zamanda, Xocalının, Xocavəndin, Tərtərin, Ağdərənin kənd və qəsəbələrində, Xankəndidə, Ağdamda, Kəlbəcərdə, Laçında zəfər bayrağımız dalğalanır.

## Tarixi qələbə, Zəfər günü – 8 NOYABR

Sentyabrın 27-dən başlanan, 44 gün davam edən və Dağlıq Qarabağ da daxil olmaqla işğal altındakı ərazilərimizin qaytarılması ilə nəticələnən Vətən müharibəsi tariximizin ən parlaq səhifəsinə, Azərbaycan xalqının iftixar və qürur mənbəyinə çevrildi. Azərbaycan xalqı öz liderinin - müzəffər Ali Baş Komandan İlham Əliyevin ətrafında sıx birləşərək bütün dünyaya öz gücünü, mətinliyini, mübarizliyini nümayiş etdirdi. Bu real faktordur ki, bütün müharibələrdə əsas sözü xalq və onun ordusu dediyi kimi uğurlu zəfərlərdə sərkərdənin də çox böyük rolu olur. Bu gün Azərbaycan xalqı hansı səviyyədə uğurlu sərkərdəyə – Ali Baş Komandana sahib olduğunu aşkar gördü. Prezident İlham Əliyev yalnız hərb meydanında müzəffər sərkərdə deyil, diplomatik cəbhədə böyük strateq nümunəsi ortaya qoydu, informasiya müharibəsində Azərbaycanın haqq səsi oldu, cəsarətlə bütün təzyiqlərə sinə gərdi, öz xalqı ilə vəhdətdə olan lider kimi mübarizlik rəmzinə çevrildi. Prezident İlham Əliyev 17 ildə həyata keçirdiyi siyasətin nəticəsində Azərbaycanı 30 ilə yaxın davam edən münaqişədə qalib tərəfə çevirdi. Ərazi bütövlüyümüzün birmənalı olaraq təsdiq edildi.

Müzəffər Azərbaycan Ordusu Ali Baş Komandanın rəhbərliyi altında cəmi 44 günə mümkünsüzü mümkün etdi! Ermənistanın hərbi kaputilyasiyasına nail olduq! Bəşəriyyətə haqqın, ədalətin böyük dövlətlərin tapdağından qurtara biləcək bir dövlətin – Azərbaycanın var olduğunu sübut etdik. Bu ədaləti 44 gün ərzində yazan Azərbaycan xalqı, dünya azərbaycanlıları, bütün Türk dünyası bir yumruq kimi birləşərək təkcə Ermənistanın yox, bütövlükdə haqsız güclərin üstünə getdi və sübut etdi ki, haqq yolunda, ədalətin, ərazi bütövlüyümüzün bərpası uğurunda vuruşuruq. Müzəffər Azərbaycan Ordusu cəmi 44 günə hərbi yolla 28 il düşmən torpağında inləyən vətən torpaqlarını işğaldan azad etdi. 44 gündə müzəffər Azərbaycan Ordusu dünyaya sübut etdi ki, döyüş meydanında zəfəri tanklarla, toplarla deyil, ağıl, zəka və bir də insan zehninin ən son nailiyyəti olan PUA-larla qazanmaq olar. Şuşa qalasının alınması əməliyyatı isə tamam başqadır. Prezident, Ali Baş Komandan İlham Əliyev xalqa müraciətində bildirdi ki, Şuşanın azad edilməsi dünya hərb tarixində xüsusi yer tutatacaq: "Şuşanın işğaldan azad edilməsi bizim gücümüzü göstərdi. Ordumuzun peşəkarlığını, hərbçilərimizin cəsarətini,

qəhrəmanlığını göstərdi. Şuşanın götürülməsi çox böyük peşəkarlıq, cəsarət tələb edən əməliyyat idi. Əminəm ki, bu əməliyyat dünya hərb tarixində xüsusi yer tutacaq. Çünki bu əməliyyatı bizim qəhrəman hərbçilərimiz dağlardan, meşələrdən, cığırlardan keçərək yalnız yüngül silahlarla silahlanmış şəkildə azad ediblər. Şuşanın işğaldan azad edilməsi bizim şanlı qələbəmizdir”.

Bəli, Azərbaycan əsgəri əsl qəhrəmanlıq, mərdlik, şücaət, rəşadət nümunəsi göstərdi. Düşmənin 30 il ərzində qurduğu, milyonlarla vəsait sərf etdiyi nəhəng istehkamlar qısa müddətdə darmadağın edildi, müzəffər ordumuzun tətbiq etdiyi savaş strategiyası müasir hərb tarixinə yeni örnək oldu. Belə vəiyyətdə Ermənistanın qarşısında yalnız iki yoldan birini seçmək qalırdı. Ya Ermənistan ordusunun son tör-töküntüləri də döyüş meydanında son nəfərinə qədər məhv ediləcəkdi, ya da “ağ bayraq” qaldırıb, biabırçı hərbi məğlubiyyətini etiraf edəcəkdi. Paşinyan hakimiyyəti reallığı, nəhayət ki, qəbul etdi və noyabrın 10-da Ermənistan “ağ bayraq” qaldırdı, kapitulyasiya bəyannaməsini imzaladı.

***30 il gözlədiyimiz o möhtəşəm tarixə şahidlik etmək zamanı yetişdi!***

8 noyabr 2020-ci il, Qarabağa qovuşduğumuz tarixi gün. Bu, Böyük Qələbə Günüdür! Şanlı tariximizə daxil olan Zəfər günüdür! Qarabağ münaqişəsinə xalqımızın zəfəri ilə NİDA qoyduğu gündür.

Azərbaycan, Rusiya prezidentləri və Ermənistan baş naziri tərəfindən noyabrın 10-da imzalanan üçtərəfli bəyanat Azərbaycan tarixinin ən böyük diplomatik qələbəsini təsdiq edən gündür. Üçtərəfli bəyanata əsasən, Dağlıq Qarabağın heç bir xüsusi statusu olmayacaq. Dağlıq Qarabağ Muxtar Vilayəti də tarixə qovuşdu. Döyüş meydanında darmadağın edilən Ermənistanın Azərbaycan Prezidentinin münaqişənin ilk günlərindən bəyan etdiyi şərtləri qəbul etməkdən başqa çıxış yolu qalmadı. Beləliklə, Paşinyan kapitulyasiya şərtlərinə razılıq verdi.

***Ərazi bütövlüyümüz təmin olundu – Heç bir statusdan söhbət gedə bilməz***

Bəyanatda digər önəmli məqam ondan ibrətdir ki, burada Dağlıq Qarabağa hər hansı statusun verilməsindən söhbət getmir və Azərbaycanın

ərazi bütövlüyü tam təmin olunur. Bu, Azərbaycanın tam və şərtsiz qələbəsinin əyani sübutudur. 8 noyabr 2020-ci il Ali Baş Komandan və şanlı Azərbaycan əsgərinin yazdığı görkəmli tarix, 28 illik həsrəti 44 gün müddətində bitirən müzəffər ordu. Bu müddət ərzində millətimiz daim vətən həsrəti, sevgisini ürəyində daşıdı, cənab İlham Əliyevə arxalandı və qələbə qazandı. Liderimiz daim çıxışlarında "Biz Qarabağımıza qayıdacağıq, Qarabağ tarixi Azərbaycan torpağıdır" deyirdi. O, ulu öndər Heydər Əliyevə və xalqına verdiyi sözləri tutdu. Ata vəsiyyətini yerinə yetirdi. Ordumuza, eləcə də möhkəm iradəli xalqına inanaraq zəfər qazandı. Bu zəfər asan başa gəlmədi. Daim danışıqlara üstünlük verən dövlətimiz, öz hünərini döyüş meydanında da göstərdi. Bu müddət ərzində digər dövlətlər təzyiq göstərməyə, bəzi sanksiyalar tətbiq etməyə çalışsalar da, Azərbaycanımızın üstünlüyünü qəbul etməyə məcbur oldular.

Böyük qələbəni al qanı ilə yazan şəhidlərimizin intiqamının alınması ilə əldə edilən zəfəri, qalibiyyəti Azərbaycan xalqına bəxş etməklə Ali Baş Komandanımız İlham Əliyev həm də həyatını Azərbaycana həsr edən, "Şuşasız Qarabağ, Qarabağsız Azərbaycan yoxdur" – deyən Ulu Öndərin arzusunu reallaşdırdı: "Mən bu gün Ulu Öndər Heydər Əliyevin məzarını ziyarət etdim, onun ruhu qarşısında baş əydim. Ürəyimdə dedim, xoşbəxt adamam ki, ata vəsiyyətini yerinə yetirdim. Şuşanı azad etdik! Bu, böyük Qələbədir! Bu gün şəhidlərimizin, Ulu Öndərin ruhu şaddır! Gözün aydın olsun Azərbaycan! Gözünüz aydın olsun dünya azərbaycanlıları!".

Ölkə Prezidenti İlham Əliyevin xalqa müraciətində səsləndirdiyi bu sözlər hər bir azərbaycanlıda böyük sevinc və qürur hissləri yaratdı. Bu böyük qələbə, eyni zamanda, Azərbaycan xalqını dünyaya qürurlu xalq kimi tanıtdı. "Dağlıq Qarabağ Azərbaycan torpağı, beynəlxalq səviyyədə tanınan ərazimiz olmaqla yanaşı, ədalət məsələsidir, Azərbaycanın milli qürur məsələsidir", – deyən Prezidentimizə olan inamı, sevgini birə beş artırdı. "Mən ona özüm qədər inanıram və gələcəyinə böyük ümidlər bəsləyirəm". Ulu Öndərin Prezidentimiz İlham Əliyev haqqında dediyi bu fikirlərin hər keçən gün öz təsdiqini tapdığının, hər bir azərbaycanlının Prezidenti olduğunun şahidi olur.

Bu gün Azərbaycan Qarabağa qovuşdu, tarixi zəfərə imza atdı, şəhidlərimizin, Xocalı qurbanlarının, Gəncə, Bərdə digər şəhər və rayonlarımızda soyqırımları zamanı həlak olan günahsız insanların qisasını

döyüş meydanında aldı, işğalçı Ermənistana layiq olduğu yeri göstərdi. Bu qələbəni, zəfəri bizlərə yaşadan isə Ulu Öndər Heydər Əliyev siyasi kursunun layiqli davamçısı ölkə Prezidentimiz, Ali Baş Komandanımız İlham Əliyevin qətiyyəti, siyasi iradəsi, Güclü Ordumuz, Rəşadətli əsgər və zabitlərimizdir.

Bir sözlə, "Qarabağ Azərbaycandır və nida işarəsi"-söyləyən Prezidentimiz hər zaman olduğu kimi bu dəfə də vədinə əməl etdi. Noyabrın 8-i xalqımızın tarixinə şanlı, qızıl hərflərlə yazıldı! 30 ildən sonra Prezidentimiz, Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi ilə sübuta yetirdik ki, bir qarış torpağımızı belə heç kəsə verən deyilik.

Qarabağ Azərbaycandır! 44 günlük qəhrəmanlıq savaşımız tarix boyu şanlı qürur mənbəyimiz olaraq qalacaq!

## Haqqa, ədalətə gedən yolun qalib lideri!

Azərbaycanın çağdaş tarixində yeni intibah mərhələsinin əsasını qoyan, milli mənafelərə söykənən strateji siyasi kursun ardıcıllığını təmin edən, təvazökarlığı həyat tərzinə çevirən Azərbaycan Prezidenti, Ali Baş Komandan İlham Əliyev sözü ilə əməli bir olan, hər bir vətəndaşının problemini öz problemi, qayğısını öz qayğısı kimi qəbul edən, iştirak etdiyi bütün seçkilərdə xalqın mütləq əksəriyyətinin səsini, etimadını qazanan, parlaq zəkası, peşəkar idarəçilik qabiliyyəti və praqmatik yanaşması ilə xalqının Prezidenti olduğunu əməli və yorulmaz fəaliyyəti ilə sübuta yetirmişdir. Möhtərəm dövlət başçımızın keçdiyi həyat yoluna nəzər saldıqca, prezidentlik fəaliyyəti müddəti ərzində Onun böyük uğurlarla zəngin olan siyasi addımları da təsdiq edir ki, İlham Əliyev siyasəti bir fenomenə çevrilmiş gerçəklikdir.

Xüsusilə də, Azərbaycanın haqqın, ərazi bütövlüyü uğrunda apardığı Vətən müharibəsində xalqını 30 illik həsrətinə 44 gün ərzində son qoymaqla bütün dünyaya sübut etdi ki, "Dağlıq Qarabağ problemi yoxdur!" Qarabağ Azərbaycandır! Çünki bu Qələbə Azərbaycan Prezidenti İlham Əliyevin rəhbərliyi ilə güclü iqtisadiyyat, güclü dövlət, güclü Ordu, rəşadətli əsgər və zabitlərimizin gücü ilə nail oldu. Dünya miqyasında öz xüsusi çəkisi, yeri olan Azərbaycan Prezidenti İlham Əliyev – **HAQQA, ƏDALƏTƏ GEDƏN YOLUN QALİB LİDERİ, YENİ BİR TARİX YAZAN SƏRKƏRDƏ** olduğunu təsdiqlədi.

Müzəffər Ordumuzun Sərkərdəsi İlham Əliyevin dediyi kimi: "30 ilin əziyyəti, 30 ilin ümidsizliyi, 30 ilin əzabları xalqımızı sındırmadı, iradəmizə heç bir mənfi təsir göstərmədi. Çünki bizim işimiz haqq işidir, biz öz torpağımızda vuruşuruq, Vətən uğrunda vuruşuruq". Bəli, Azərbaycan dövləti həmişə haqq-ədalət, ərazi bütövlüyümüz uğrunda vuruşub. Məhz buna görə də, Azərbaycan Ordusunun sentyabrın 27-dən başladığı zəfər yürüşü 44 gün ərzində 30 ilin həsrətinə son qoydu, avantürist Ermənistanın təcavüzkar silahlı qüvvələrini darmadağın etdi, işğal altında qalan torpaqlarımız özümüzə – əsl sahibinə qaytarıldı. 44 gün davam edən Vətən müharibəsi Azərbaycanın hansı imkanlara malik olduğunu bir daha dünyaya nümayiş etdirdi. Azərbaycan dünyaya göstərdi ki, böyük, yenilməz xalqdır. Ali Baş Komandanımız İlham Əliyev xalqa müraciətində

bildirdiyi kimi "Azərbaycan xalqı bu dövrdə də birlik, həmrəylik, güclü iradə göstərəcək, dağıdılmış şəhərləri, kəndləri bərpa etmək üçün əlindən gələni edəcək. Artıq istədiyimizə nail olmuşuq və bundan sonra xalqımızı təhlükəsiz və xoşbəxt həyat gözləyir".

Bəli, bu gün böyük fəxr və qürurla qeyd edirik ki, artıq torpaqlarımızın işğal günlərini deyil, işğaldan azad edilən tarixi qeyd edəcəyik. Artıq "Dağlıq Qarabağ münaqişəsi" termini yoxdur! 10 noyabr 2020-ci il Prezident İlham Əliyevin qətiyyəti və rəhbərliyi sayəsində güclü Ordumuzun, rəşadətli əsgər və zabitlərimizin sayəsində çoxəsrlik tariximizin Zəfər Günü yazıldı. Dövlətimizin başçısı, Ali Baş Komandan İlham Əliyevin 2 dekabr 2020-ci il tarixli Sərəncamları əsasında 10 noyabr Zəfər Günü, 27 sentyabr Anım Günü təsis edildi.

### *Ata vəsiyyəti – Oğul hesabatı*

Bu böyük qələbəni YUMRUQ KİMİ BİRLİYİ BİZƏ BƏXŞ EDƏN SƏRKƏRDƏMİZİN rəhbərliyi, güclü Ordumuz və rəşadətli əsgər və zabitlərimizin igidliyi ilə əldə edildi.

Həyata keçirilən bütün bu tarixi, misilsiz işlərlə yanaşı, Prezident İlham Əliyevin qarşısında müqəddəs sayıla biləcək vəzifə – Ata vəsiyyətinin – Azərbaycanın ərazi bütövlüyünün bərpa edilməsi məsələsi dururdu. Prezident İlham Əliyev, özünün də qeyd etdiyi kimi, həyata keçirilən bütün işlərin, siyasətin, atılan hər addımın son qayəsi Qarabağ idi. Cəmi 44 gün davam edən Vətən müharibəsi Azərbaycanın böyük zəfəri ilə başa çatdı. Bu, Ali Baş Komandan İlham Əliyevin qələbəsi, Ulu Öndər Heydər Əliyevin siyasi kursunun təntənəsi idi. Bu qələbə Xalqımızın, Ordumuzun, Milli Birliyimizin, Haqqın və Ədalətin zəfəri idi.

Bu tarixi Zəfər Qələbəsi ilə Prezident İlham Əliyev həyatını Azərbaycana həsr edən, "Şuşasız Qarabağ, Qarabağsız Azərbaycan yoxdur" – deyən Ulu Öndərin arzusunu reallaşdırdı.

Şuşanın azad edilmləsi münasibətilə xalqa müraciət edən Prezident İlham Əliyev bəyan etdi: "Mən bu gün Ulu Öndər Heydər Əliyevin məzarını ziyarət etdim, onun ruhu qarşısında baş əydim. Ürəyimdə dedim, xoşbəxt adamam ki, ata vəsiyyətini yerinə yetirdim. Şuşanı azad etdik! Bu, böyük Qələbədir! Bu gün şəhidlərimizin, Ulu Öndərin ruhu şaddır! Gözün aydın olsun Azərbaycan! Gözünüz aydın olsun dünya azərbaycanlıları!".

Ölkə Prezidenti İlham Əliyevin xalqa müraciətində səsləndirdiyi bu sözlər hər birimizdə böyük sevinc və qürur hisləri yaratdı. Bu böyük qələbə ilə Azərbaycan xalqını dünyaya qürurlu xalq kimi tanıtdı. Bu gün tək Qarabağ yox, işğal altında olan bütün torpaqlarımız geri qaytarıldı. Azərbaycanın ərazi bütövlüyü bərpa edildi. Bu, tarixin böyük qələbəsi idi. Bu qələbənin isə bir şəriksiz müəllifi var – Ali Baş Komandanımız, Azərbaycan Prezidenti İlham Əliyev.

Bəli, iki il öncə Azərbaycan Prezidenti, Ali Baş Komandan İlham Əliyev demişdir: "Gün gələcək və bu gün işğal altındakı torpaqlar azad olunandan sonra orada qaldırılacaq Azərbaycan bayrağı Azadlıq meydanına gətiriləcək və hərbi paradda göstəriləcək. Biz bu müqəddəs günü yaxınlaşdırmalıyıq və yaxınlaşdırırıq".

Bəli, o gün gəldi. Bütün bunlar Prezident, Ali Baş Komandan İlham Əliyev cənablarının, Müzəffər Ordumuzun, rəşadətli əsgərlərimizin və xalqımızın BİRLİYİ, Həmrəyliyi nəticəsində əldə edildi, 30 il qaçqınlığa, köçkünlüyə son qoyuldu. Zəfər Paradı – 10 dekabr tariximizin ən parlaq səhifəsinə çevrildi. İşğaldan azad olunan torpaqlarımızda dalğalanan üç rəngli Bayraqlarımız Azadlıq meydanına gətirilərək bütün dünyaya nümayiş etdirildi ki, Qarabağ Azərbaycandır!!!

## Qələbəmizin rəmzi: Dəmir yumruq!

Lider o şəxsiyyətdir ki, ona etimad göstərmiş xalqın maraqlarını bütün imkanları ilə müdafiə edir, reallaşdırır, cəmiyyətin enerjisinin səfərbər edilməsilə insanların taleyində əhəmiyyətli faktora çevrilir. Ötən illər ərzində Prezident İlham Əliyev atdığı bütün addımları ilə hər bir azərbaycanlının Prezidenti olduğunu isbatlayıb. Təbii fəlakətlər və müharibə zamanı çətin vəziyyətə düşmüş vətəndaşlara yardım edən, problemlərin həllinə köməklik göstərən Prezident İlham Əliyev hər addımı ilə vətəndaşın yanında olduğunu sübut edir.

Tariximizin ən böyük xilaskarlıq missiyasını isə Ulu Öndərin davamçısı, yeni dövrün yeni rəhbəri cənab İlham Əliyev yerinə yetirdi! Ulu Öndərimizin vəsiyyətlərində dediyi kimi, Onun yarımçıq qalmış işlərini başa çatdırmaqla, Azərbaycanı müasir və qüdrətli dövlətə çevirməklə, xalqın ən müqəddəs arzusunu uğurla gerçəkləşdirməklə yerinə yetirir!

Bəli, bu gün bütün dünya da şahiddir ki, Azərbaycan xalqının etimadı əsasında düz 21 ildir ki, ölkəyə rəhbərlik edən Prezident İlham Əliyev Ümummilli Lider Heydər Əliyevin bütün ümüdlərini reallaşdıraraq hər bir azərbaycanlının Prezidenti olduğunu bir daha göstərməkdədir.

**"BİZİM QƏLƏBƏNİN RƏMZİ DƏMİR YUMRUQ İDİ, ARTIQ BİZDƏ QILINC VAR".** Bu fikri dövlət başçımız İlham Əliyev ICESCO-nun Baş direktoru Salim bin Məhəmməd əl-Malikin rəhbərlik etdiyi nümayəndə heyəti ilə görüşü zamanı bildirib.

Göründüyü kimi, 30 illik Qarabağımızın həsrətinə 44 gün ərzində davam edən Vətən Müharibəsinə, məhz Ali Baş Komandanımız, Prezident İlham Əliyev cənablarının möhkəm, diplomatik siyasəti – dəmir siyasəti ilə nail olduqsa, bu gün artıq bizdə qarşısında tab gətirə bilməyən qılıncımız da var!. Bütün bu uğurlara, məhz dövlət başçımızın Ulu Öndərimiz Heydər Əliyev siyasəti, ata vəsiyyəti ilə getməsidir.

Ulu Öndər Heydər Əliyevin "İnanıram ki, mənim axıra çatdıra bilmədiyim taleyüklü məsələləri, planları, işləri sizin köməyiniz və dəstəyinizlə İlham Əliyev başa çatdıra biləcək. Mən ona özüm qədər inanıram və gələcəyinə böyük ümidlər bəsləyirəm", - vəsiyyətini reallaşdıran Prezident İlham Əliyev: "Azərbaycanı qüdrətli dövlətə çevirmək üçün ən başlıcası, ölkədə Heydər Əliyevin siyasəti davam etdirilməlidir. Bu gün yüksək

kürsüdən çıxış edərkən mən Azərbaycan xalqına söz verirəm ki, bu siyasətə sadiq qalacağam, heç vaxt bu yoldan dönməyəcəyəm, Heydər Əliyevin siyasətini davam etdirəcəyəm", - deyərək son 17 illik Prezidentlik fəaliyyətinin nəticəsidir ki, son 30 il ərzində həsrətində olduğumuz Qarabağa, haqq və şərəf işimiz olan, Azərbaycan Respublikamızın suverenliyi və ərazi bütövlüyümüzə və nəhayət Qələbə Zəfərimizə nail olduq!

“Şuşasız Qarabağ, Qarabağsız Şuşa yoxdur” deyən Ulu Öndər Heydər Əliyevin bu arzusunu da bu gün Prezident İlham Əliyev “Şuşasız işimiz yarımçıq qalar” deyərək reallaşdırdı: "Mən bu gün Ulu Öndər Heydər Əliyevin məzarını ziyarət etdim, onun ruhu qarşısında baş əydim. Ürəyimdə dedim, xoşbəxt adamam ki, ata vəsiyyətini yerinə yetirdim. Şuşanı azad etdik! Bu, böyük Qələbədir! Bu gün şəhidlərimizin, Ulu Öndərin ruhu şaddır! Gözün aydın olsun Azərbaycan! Gözünüz aydın olsun dünya azərbaycanlıları!".

Azərbaycan Prezidenti İlham Əliyev xalqa müraciətində Şuşanın işğaldan azad edilməsinin əhəmiyyətindən danışarkən dediyi fikirlər tariximizə əbədi olaraq yazıldı: "Bu gün biz bir daha bütün dünyaya sübut edirik ki, biz böyük xalqıq, biz məğrur xalqıq! Biz yenilməz xalqıq! Biz döyüş meydanında düşmənə yerini göstəririk! Böyük fəxarət və qürur hissi ilə bəyan edirəm ki, Şuşa şəhəri işğaldan azad edildi! Şuşa bizimdir! Qarabağ bizimdir!".

**Budur, Azərbaycan Prezidenti, Ali Baş Komandanımızın diplomatik siyasəti! Budur, xalqının Prezidenti olmaq! Budur, Liderlik missiyası!**

Bu gün bütün Azərbaycan xalqı, bütün türk dünyası fəxr edir, sevinir. Çünki tarixi qələbəmizi reallaşdıran, dövlətimizi daha firavan gələcəyə aparan Prezidentimiz, Ali Baş Komandanımızın dəmir yumruq siyasətinin nəticəsidir ki, artıq bizdə bu gün qılınc da var! Qarabağ Azərbaycandır!

## Xalqın çətin anlarının Prezidenti

Ölkə rəhbəri İlham Əliyev Ümummilli Liderin əsasını qoyduğu siyasi kursu müasir dövrün çağırışlarına uyğun daha da inkişaf etdirərək hər bir azərbaycanlının Prezidenti olduğunu sübut etməkdədir.

Bu gün Ulu Öndər Heydər Əliyevin axıra çatdıra bilmədiyi taleyüklü məsələləri, planları, işləri xalqın birliyi və dəstəyi ilə Prezident İlham Əliyev başa çatdıraraq Azərbaycanı qüdrətli dövlətə çevirməklə yanaşı, işğalçı Ermənistanın işğalı altında olan doğma torpaqlarımızı – Qarabağı özümüzə qaytardı.

Dahilərin dediyi kimi, xalqları dünyada məşhurlaşdıran təkcə onların zəngin təbii sərvətləri və maddi mədəniyyət inciləri deyil, həm də dünya siyasətində mühüm rol oynayan fenomen şəxsiyyətləridir. Bu gün Azərbaycan xalqı xoşbəxtdir ki, belə nadir şəxsiyyətlərdən biri, müasir müstəqil Azərbaycan dövlətinin banisi Ulu Öndər Heydər Əliyev güclü dövlət yaratmaqla yanaşı, özündən sonra çoxşaxəli islahatların varisliyini uğurla təmin edə biləcək peşəkar lider də yetişdirib. “Mən ona özüm qədər inanıram və gələcəyinə böyük ümidlər bəsləyirəm” deyən Ulu Öndər Heydər Əliyevin xalqımıza özünün layiqli davamçısı kimi təqdim etdiyi İlham Əliyevin prezidentlik fəaliyyətinin qısa təhlili belə bu fikrin təxmin deyil, qəti qənaət olduğunu sübut edir. Ümummilli Liderin müəyyən etdiyi strategiyanı uğurla həyata keçirən və yeni dövrün ruhuna uyğun zənginləşdirən Prezident İlham Əliyevin ölkəyə rəhbərlik fəaliyyətini diqqətlə nəzərdən keçirdikdə onun dövrün çağırışlarına çevik reaksiya verən, yüksək erudisiyaya və idarəetmə bacarığına malik, xalqına və dövlətinə qəlbən bağlı lider olduğu bir daha təsdiqini tapır. Prezident İlham Əliyevin rəhbərlik etdiyi Azərbaycan bu gün dünyanın siyasi sistemində özünəməxsus yeri ilə seçilir. Onunla hesablaşırlar, ona hörmət və ehtiramla yanaşırlar.

### *Xilaskarlıq missiyası – Qarabağ Azərbaycandır!*

Ərzində Prezident İlham Əliyev atdığı bütün addımları ilə hər bir azərbaycanlının Prezidenti olduğunu təsdiqləyib. Bədbəxt hadisələr, müharibə zamanı çətin vəziyyətə düşmüş vətəndaşların yanında olan, onlara kömək edən, problemlərini həll edən Prezident İlham Əliyev hər

əməli ilə vətəndaşın yanında olduğunu sübut edir.

Tariximizin ən böyük xilaskarlıq missiyasını isə Ulu Öndərin davamçısı, yeni dövrün yeni rəhbəri cənab İlham Əliyev yerinə yetirdi! Ulu Öndərimizin vəsiyyətlərində dediyi kimi, onun yarımçıq qalmış işlərini başa çatdırmaqla, Azərbaycanı müasir və qüdrətli dövlətə çevirməklə, xalqın ən müqəddəs arzusunu – Qarabağ Azərbaycandır! həqiqətini reallaşdırdı, 30 illik torpaq həsrətinə son qoydu.

Bəli, 30 il idi deyirdik ki, gün gələcək, torpaqlarımızı, doğma ata-baba yurdlarımıza qayıdacağıq. Qayıtdıq, Ulu Öndərimiz! Qaytardı varisiniz, Qalib Liderimiz, Prezidentimiz, hər bir azərbaycanlının Prezidenti İlham Əliyev cənabları qaytardı Qarabağı! Xalqımızın ən böyük ağrısı, sağalmaz yarasına Xilaskar Sərkərdəmiz İlham Əliyev məlham qoydu! BMT təhlükəsizlik şurası qəbul etdiyi dörd qətnaməni yerinə yetirə bilmədi, ATƏT-in Minsk qrupu uğursuz fəaliyyəti, digər beynəlxalq qurum və təşkilatlar beynəlxalq hüququn norma və prinsiplərini, ədaləti təmin etməkdə acizlik göstərdi, Ermənistan isə sülhdən boyun qaçırdı.

Ancaq belə bir mürəkkəb məqamda həm dünya miqyaslı nüfuzlu siyasi xadim, həm mahir diplomat, həm də qətiyyətli sərkərdə kimi meydana girən Prezident İlham Əliyev işğal altındakı torpaqlarımızı düşməndən azad etdi!

### *"Bizim yumruğumuz bizim birliyimizdir!"*

Bəli, "Bizim yumruğumuz bizim birliyimizdir!", – deyən Prezident, Silahlı Qüvvələrin Müzəffər Ali Baş Komandanı İlham Əliyev çıxışlarında dəfələrlə bildirib ki, haqq-ədalət bizim tərəfimizdədir, beynəlxalq hüquq bizim tərəfimizdədir, güc də bizim tərəfimizdə olmalıdır: "Biz bu torpaqlara Azərbaycan xalqının, şəhidlərimizin canı, qanı bahasına, qəhrəmanlarımızın şücaəti hesabına qayıtmışıq. Biz güc toplamalı idik və toplayırdıq. Mən son 17 il ərzində xalqa müraciət edərkən dəfələrlə deyirdim ki, biz daha güclü olmalıyıq, daha qüdrətli ordu qurmalıyıq. Bu gün dünyada güc amili həlledici rol oynayır. Haqq-ədalət bizim tərəfimizdədir, beynəlxalq hüquq bizim tərəfimizdədir, güc də bizim tərəfimizdə olmalıdır. Məhz gücümüzün yetərli dərəcədə olmaması nəticəsində Azərbaycan 1990-cı illərin əvvəllərində işğala məruz qalmışdır. Biz güc toplayırdıq, güclənirdik. Mən deyirdim ki, hər gün hər bir Azərbaycan vətəndaşı bu

müqəddəs günü, bu zəfər gününü öz əməyi, zəhməti, Vətənə olan sədaqəti ilə yaxınlaşdırmalıdır”.

Bu gün məhz o gücün, birliyin nəticəsidir ki, işğalçı Ermənistanın çirkin niyyətlərini alt-üst etdi. Ali Baş Komandanımız İlham Əliyev cənablarının yerli və xarici televiziya kanallarına verdiyi müsahibələrində, xalqa müraciətlərində səsləndirdiyi hər bir bəyanatda 30 ilə yaxın müddətdə dünya dövlətlərinin siyasi iradə ortaya qoymamalarının yol açdığı sual doğuran və dəqiq cavabını axtaran məqamlar öz əksini tapıb. Real həqiqətlər bir daha bu gerçəkliyə işıq salır ki, zaman keçdikcə baş verən hadisələrin mahiyyəti daha dərindən dərk olunur, haqqın, ədalətin maraqların arxasında necə əridiyi aydın görünür. Bu gün dünyaya edilən "həqiqətə həqiqət gözü ilə baxaq" çağırışı erməniləri və onların havadarlarını narahat etsə də, unudulmamalıdır ki, beynəlxalq hüquq normaları və prinsipləri deyilən məfhum mövcuddur ki, onlara böyüklüyündən, kiçikliyindən asılı olmayaraq bütün dövlətlər əməl etməli, yanaşmalarında əsas götürməlidirlər.

Ancaq bu gün Azərbaycanın uğurlarının kölgəsində alışıb-yananlar – AXCP sədri, satqın, cinayətkar Əli Kərimli, Milli Şuranın sədri Cəmil Həsənli kimi antimilli ünsürlər hələ də həyasızcasına dövlətə, xalqa, Azərbaycanın uğurlu inkişafına qara yaxaraq elə zənn edirdilər ki, bu əxlaqsızlıqları ilə xalqın dəstəyini bəlkə “qazanacaqlar”.

Ancaq anlamırlar ki, 28 ildir ki, “müxalifət” adı ilə bu dövlətə, xalqa, Azərbaycanın uğurlarına qara yaxanlar elə zənn edirdilər ki, bəlkə bu əxlaqsızlıqları ilə xalqın dəstəyini “qazandılar”. Ancaq onların bu “arzusu” “qaşınmayan yerdən qan çıxarmaqla” xalqın nifrətini birə-on artırır.

Prezident İlham Əliyev yanvarın 27-də Rəşad Nəbiyevi nəqliyyat, rabitə və yüksək texnologiyalar naziri təyin olunması ilə əlaqədar videoformatda qəbul edərkən çıxışı zamanı torpaqlarımızı satanların – AXC-Müsavat cütlüyü olduğunu bir daha bildirdi: "Şuşanın 1992-ci il mayın 8-də itirilməsi böyük faciə idi. Bu faciənin günahkarları AXC-Müsavat cütlüyüdür. Hamı bunu bilməlidir, heç kim bunu unutmamalıdır. O vaxt Azərbaycanda hakimiyyət uğrunda mübarizə gedirdi. AXC-Müsavat cütlüyü hakimiyyətə can atırdı, o vaxtkı hakimiyyəti yıxmaq üçün bu təxribatı törətdi, Şuşanı faktiki olaraq düşmənə təhvil verdi. O vaxt Azərbaycan

müdafiə naziri AXC-Müsavat cütlüyünün törəməsi idi, onların quyruqlarından idi. Şuşanı satan birinci o olmuşdur. Sonra da demişdi ki, mənim günahım yoxdur. Necə sənin günahın yoxdur, satqın, xain. Demişdi ki, Şuşa əldən getsə, başıma güllə çaxacağam. Bu günə qədər də bu gülləni çaxmayıb öz satqın başına. AXC-Müsavat cütlüyü öz çirkin niyyətlərinə çatıb. Şuşa və ondan bir neçə gün sonra Laçın rayonunun işğal altına düşməsi nəticəsində o vaxtkı hakimiyyət kənarlaşdırılıb və hərbi çevriliş nəticəsində AXC-Müsavat hakimiyyətə gəlib. Ondan sonra Şuşanı unudub, Şuşanı faktiki olaraq ermənilərə bağışlayıb və sonra digər xəyanət törədib - 1993-cü ilin aprel ayında Kəlbəcəri düşmənə təhvil verib. Günahsız, əliyalın insanları orada tək qoyub, xilas edə bilməyib, qoruya bilməyib. Ondan sonra da nə edib?! Fərarilik edib, qaçıb. Ali Baş Komandan fərari, dövlət katibi fərari, parlamentin sədri fərari, digər fərarilər qaçıb gizləndilər, biri Kələkidə, biri xaricdə. Əgər müharibə dövründə Ali Baş Komandan qaçırsa, bunun adı fəraridir, başqa adı yoxdur. Hamı bunu bilməlidir, heç kim bunu unutmamalıdır".

Bəli, Azərbaycan xalqı heç nəyi unutmayıb! Onu da unutmayıb ki, əgər Heydər Əliyev xalqın tələbi ilə hakimiyyətə gəlməsəydi, dövlətçilik əldən gedəcəkdi.

Bunu xalqa müraciətində Prezident İlham Əliyev bildirmişdi. Demişdi ki, öz laxlamış hakimiyyətini saxlamaq üçün vətəndaş müharibəsi başlamışdılar: "Bunu heç kim unutmasın! Bilməyənlər bilsinlər və gənc nəsil bunu bilsin, kim bizi bu bəlaya saldı? Kim bu bəlanın səbəbkarıdır? Kim bir milyon insanın ağır vəziyyətə düşməsinin səbəbkarıdır? O vaxtkı Azərbaycan Xalq Cəbhəsi hakimiyyəti".

Bu gün bu uğurlu siyasətə qara yaxmağa çalışan, yalan və manipuliyasiyalarla insanların fikirlərini dəyişdirməyə can atan məkrli xarici qüvvələr və nüfuzdan düşmüş radikal müxalifətin anti-Azərbaycan təbliğatı mənasız və əsassızdır. Bütün bunları xalqımız görür və öz Prezidentinin yanındadır. Çünki ölkə Prezidentinin də qeyd etdiyi kimi: “Biz haqq-ədalət tərəfindəyik. Biz tarixin ən şərəfli anlarını yaşayırıq. Azərbaycan xalqı qədim xalqdır. Bizim tariximizdə bir çox şərəfli anlar olub, hadisələr olub, qələbələr olub. Onların sırasında bugünkü hadisələr xüsusi yerdədir. Biz ədaləti bərpa edirik, ərazi bütövlüyümüzü bərpa edirik, Azərbaycan xalqının ümidlərini doğrulduruq və bundan sonra da doğruldacağıq. Biz

haqlıyıq, biz zəfər çalacağıq! Qarabağ bizimdir, Qarabağ Azərbaycandır!”.

Hər bir azərbaycanlı üçün onun torpağı, bayrağı müqəddəsdir, qeyrətidir, namusudur. Kiçik yaşlı azərbaycanlıdan tutmuş yaşlısına qədər hər kəs bayrağını daim əlində və başının üzərində tutar, himnini oxuyanda həyəcanlanar, qürrələnər. Amma Əli Kərimli, Gültəkin Hacıbəyli, Cəmil Həsənli, Sevinc Osmanqızı, Vidadi İskəndərli, Arif Məmmədov, Qənimət Zahid kimi bandit, vətənşüvənlər erməni qoltuğuna sığınmaqla, tula payına görə mənliklərini alçatmağı üstün tuturlar. Daha doğrusu, üzələrinə tüpürsələr də, o biri üzlərini çevirən alçaq və mənəviyyatsızlardır.

Bundan sonra isə söz xalqındır. Əsgərimizə, dövlətimizə şər atanlar yığımına xalq sözünü deməli, onlara yerini göstərməklə yanaşı, əlbəttə ki, hüquq-mühafizə orqanları da belə məsələlərə biganə qalmamalıdır. Vətən, dövlət, xalq xainləri, düşmənə işləyən bu satqınlar yığnağı hüquqi çərçivədə də cavablarını almalıdırlar. Çünki xalqımızın və dövlətimizin maraqlarına qarşı çıxmaq Vətənə xəyanətdən başqa heç nə deyil! İnanırıq ki, Vətənə və dövlətə qarşı xəyanət yolu tutan bu satqın və naqis xəyanətkarlar gec-tez öz layiqli cəzalarını alacaqlar!

## Şuşa Bəyannaməsi – müttəfiqlik zirvəsi

Bu gün Ulu Öndər Heydər Əliyevin “Bir millət, iki dövlət” kəlamı sadəcə olaraq, kəlam deyil, bu, gerçəklikdir. Artıq bu reallıq bütün sahələrdə sübuta yetirilməkdədir. Hər zaman da bu belə olacaq. Azərbaycan-Türkiyə "Bir millət, iki dövlətdir!". Bu birliyin növbəti ən parlaq və ən şanlı səhifəsi 15 iyun 2021-ci ildə Azərbaycan Prezidenti İlham Əliyev və Türkiyə Prezidenti Rəcəb Tayyib Ərdoğan müttəfiqlik haqqında Şuşa Bəyannaməsini imzalamaqla iki qardaş dövlətin münasibətlərinin ən yüksək zirvədə olduğunu bir daha dünyaya nümayiş etdirdi.

***Dost və qardaş ölkə arasında imzalanan müttəfiqlik zirvəsi***

15 iyun Milli Qurtuluş Günündə Şuşa Bəyannaməsinin iki qardaş – Azərbaycan-Türkiyə arasında imzalanması növbəti tarixi hadisə olmaqla yanaşı, həm də bu qardaşlığın ən yüksək səviyyədə olduğunu bir daha dünyaya nümayiş etdirdi. İunun 15-də Azərbaycan üçün çox önəmli bir tarixdə – Milli Qurtuluş Günündə, Qars müqaviləsindən yüz il sonra iki dost və qardaş ölkə arasında imzalanan müttəfiqlik münasibətlərinə dair Şuşa Bəyannaməsi.

Azərbaycan Prezidenti İlham Əliyev cənabları görüş zamanı bu səfərin və bu günün tarixi əhəmiyyətli olduğunu vurğulamışdı: “Bu gün tarixi gündür. Türkiyə Prezidentini Qarabağ torpağında salamlayırıq. Əziz Qardaşım Azərbaycanda dəfələrlə olub. Ancaq ilk dəfə Qarabağ torpağında, Şuşada biz bir yerdəyik. Bu səfərin tarixi əhəmiyyəti var”.

Dövlətimizin başçısı, həmçinin Şuşa Bəyannaməsini müttəfiqlik bəyannaməsi adlandırmışdır: "Bu gün müttəfiqlik haqqında imzalanmış birgə Bəyannamə əlaqələrimizi ən yüksək zirvəyə qaldırır. Bəyannamənin adı öz-özlüyündə hər şeyi deyir. Biz bu gün keyfiyyətcə yeni əlaqələr qurmuşuq və bu bəyannamədə göstərilən bütün müddəalar bizim gələcək işbirliyimizin təminatıdır”.

Türkiyə Prezidenti Rəcəb Tayyib Ərdoğan da bu bəyannamənin iki qardaş ölkə arasında münasibətlər üçün yol xəritəsi adlandırmışdır: “Şuşa Bəyannaməsi yeni dövrdə Türkiyə-Azərbaycan münasibətləri üçün yol xəritəsini müəyyənləşdirir. Türkiyə və Azərbaycan arasında imzalanan Şuşa Bəyannaməsi bir çox məsələləri əhatə edir. Bundan sonra gələcəkdə bir

çox addımları atarkən burada artıq sadəcə iki ölkəni deyil, bütün bölgəni əhatə edən bir qətiyyət əksini tapacaq".

Bəli, Şuşa Bəyannaməsi iki qardaş ölkənin maraqlarının qorunması üçün çox ciddi bir addımdır. Ulu Öndər Heydər Əliyevin söylədiyi: "Bir millət, iki dövlət" – şüarı, Böyük Atatürkün dilindən səslənən "Azərbaycanın sevinci bizim sevincimiz, kədəri bizim kədərimizdir" – kəlməsi bir daha öz təsdiqini tapdı və bu böyük hadisə, tarixi məqam iki qardaş dövlətin münasibətlərinin gələcək inkişafında da çox mühüm rol oynayacaq.

Bir sözlə, Şuşa Bəyannaməsi Azərbaycan-Türkiyə tarixinin qızıl səhifəsi, böyük qələbələrin davamı, strateji bir yoldur, bölgədə sabitliyin təminatına yönəlik bir addımdır, Azərbaycan-Türkiyə qardaşlığının növbəti rəmzidir.

Azərbaycan Prezidenti İlham Əliyev Şuşada mətbuata bəyanatında Türkiyənin müharibə dövründə Azərbaycana dəstəyindən danışarkən bir daha bildirdi ki, Türkiyə kimi müttəfiqi olan Azərbaycan İkinci Qarabağ savaşında bundan ruhlanaraq tarixi missiyanı yerinə yetirdi, ədaləti bərpa etdi, ərazi bütövlüyünü bərpa etdi.

Türkiyə Prezidenti Rəcəb Tayyib Ərdoğan Şuşa Bəyannaməsinin imzalanmasının tarixi əhəmiyyətini xüsusi vurğulayaraq bir daha bildirdi ki, Türkiyə ilə Azərbaycan arasındakı bu bəyannamə artıq təkcə iki ölkəni deyil, bölgəni əhatə edən bir qətiyyətli sənəddir və Qarabağın yenidən inkişaf etdiyi günləri yaxın vaxtlarda hamımız birlikdə görəcəyik: "Qarabağ əvvəlki ehtişamına və öz kimliyinə qovuşacaq. Buna heç şübhəmiz yoxdur. Füzuli, Cəbrayıl, Zəngilan, Qubadlı, Laçın, Şuşa, Kəlbəcər, Ağdam, Xocavənd kimi Qarabağın qədim yaşayış məntəqələrinin yenidən inkişaf etdiyi günləri yaxın vaxtlarda hamımız birlikdə görəcəyik".

Bəli, bu gün Azərbaycanın mədəniyyət paytaxtı Şuşamızda "sevinci və kədəri bir" olan, "bir millət, iki dövlət"in prezidentlərinin mətbuata birgə bəyanatları, dövlət liderlərinin bölgəmizə və dünyaya verdikləri mesajlar bir daha bu birliyin, müttəfiqliyin sarsılmaz və əbədi olacağının göstəricisidir.

Azərbaycan Prezidenti İlham Əliyev cənablarının dediyi kimi, bu birliyi bizi birləşdirən bir çox amillər təmin edib: "İlk növbədə, tarix, mədəniyyət, ortaq etnik köklər, dilimiz, dinimiz, milli dəyərlərimiz və maraqlarımız, xalqlarımızın qardaşlığı".

Bəli, bu gün dünya miqyasında Azərbaycan ilə Türkiyə unikal əməkdaşlıq, müttəfiqlik nümunəsi göstərir. İmzalanmış Bəyannamə tarixə əsaslanır. Dövlət başçımız bildirmişdir: "Bəyannamədə xalqlarımızın böyük liderləri, öndərləri Mustafa Kamal Atatürk və Heydər Əliyevin kəlamları əksini tapıb. XX əsrin əvvəllərində Mustafa Kamal Atatürk demişdir ki, "Azərbaycanın sevinci sevincimiz, kədəri kədərimizdir". XX əsrin sonlarında Heydər Əliyev demişdir ki, "Türkiyə və Azərbaycan bir millət, iki dövlətdir". Bu tarixi kəlamlar bizim üçün, fəaliyyətimiz üçün əsas faktordur. Biz bu vəsiyyətə sadiqik, XXI əsrdə azad edilmiş Şuşada müttəfiqlik Bəyannaməsini imzalayarkən əcdadlarımıza sadiqliyimizi nümayiş etdiririk və gələcək nəsillərə yol göstəririk".

Ulu Öndər Heydər Əliyevin "Bir millət, iki dövlət" kəlamı sadəcə olaraq, kəlam deyil, bu, gerçəklikdir. Artıq bu reallıq bütün sahələrdə sübuta yetirilməkdədir. Hər zaman da bu belə olacaq. Dövlət başçımızın dediyi kimi: "Haqq işimizi davam etdiririk, Türkiyə kimi qardaş ölkə yanımızdadır, hər zaman birlikdəyik".

## ZƏFƏR PARADI

10 dekabr, 2020-ci il Zəfər Paradı. Bu parad Prezidentimizin diplomatik siyasətinin, Güclü Ordumuzun və rəşadətli əsgərlərimizin şücaəti nəticəsində əldə olunan Qələbəsidir! Qarabağ bizimdir, Qarabağ Azərbaycandır!

Böyük mütəfəkkir Viktor Hüqo vaxtilə yazırdı: "Əsl Liderin ömrünün yarısı Vətənə, digər yarısı da xalqa xidmət etməkdən ibarətdir". Bu gün müstəqil Azərbaycanı güclü edən, onu sabitlik məkanına çevirən əsas amil də məhz xalqımızın ölkə Prezidenti cənab İlham Əliyev tərəfindən uğurla davam və inkişaf etdirən Heydər Əliyev ideyalarına olan sonsuz sədaqətidir. Məhz elə buna görədir ki, 18 il əvvəl "Mən hər bir Azərbaycan vətəndaşının prezidenti olacağam" məramı ilə Prezident İlham Əliyevin həyatı xalqına və Vətəninə həsr olunmuş əsl lider ömrüdür. Cənab İlham Əliyev Ulu Öndərimizin "Xalq dövlət üçün yox, dövlət xalq üçün olmalıdır" fikirlərini reallığa çevirərək bir daha sübut etdi ki, o, məhz Vətəninin, xalqının rifahı üçün yaşayan Liderdir.

Prezident İlham Əliyev xalqa müraciətində də bildirib ki, biz döyüş meydanında, siyasi müstəvidə, istənilən formatda gücümüzü göstərmişik, müstəqilliyimizi göstərmişik: "Bu müharibə bütün dünyaya Azərbaycan xalqının nə qədər böyük xalq olduğunu göstərdi – yenilməz xalq, dəmir iradəli xalq, müzəffər xalq, müzəffər ordumuz. Biz xalqımızla, ordumuzla fəxr edirik".

10 dekabr Zəfər Paradı Prezident İlham Əliyev cənablarının nəyi necə və nə zaman etməyi özünün yaxşı bildiyini bir daha nümayiş etdirdi. Məhz bu səbəbədən də dekabrın 10-da keçirilən Zəfər Paradı xalqımızın birliyinin, Müzəffər Ordumuzun gücünün, qəhrəman əsgər və zabitlərimizin öz Ali Baş Komandanı, Prezident İlham Əliyev ətrafında birliyinin dünyaya nümayişinin reallığıdır.

Rusiyalı siyasi ekspert, "Nasionalnaya oborona" jurnalının baş redaktoru İqor Korotçenko "Telegram" kanalında yazıb: "Yerevanda Paşinyan və müxalifət bir-biri ilə münasibətlərini aydınlaşdırır, Bakıda isə möhtəşəm Qələbə paradı hazırlayırlar". "Paradı dünyanın aparıcı siyasətçilərinin onluğuna daxil olan İlham Əliyev qəbul edəcək. Bax, tarix belə yaradılır!".

Göründüyü kimi, qalib lider, Ali Baş Komandan Prezident İlham Əliyev "Dəmir yumruq" siyasəti ilə Güclü Ordumuzun rəşadətli əsgər və zabitlərinin igidliyi ilə 30 illik həsrətə 44 gün ərzində son qoydu. Bax, əsl lider olmaq, əsl siyasətçi və xalqın Prezidenti olmaq budur! Zəfər Paradı Ordumuzun qüdrəti ilə yanaşı, Azərbaycan-Türkiyə qardaşlığını dünyaya nümayiş etdirdi.

Azərbaycan Prezidenti, Ali Baş Komandan İlham Əliyev cənabları Zəfər Paradında çıxışı zamanı bildirdi: "Bu gün tarixi bir gündür. Bu gün Azadlıq meydanında Zəfər Paradı keçirilir. Mən çox şadam ki, bu paradda mənim dəvətimi qəbul edərək Türkiyə Cümhuriyyətinin Cümhurbaşqanı, əziz qardaşım Rəcəb Tayyib Ərdoğan iştirak edir. Eyni zamanda, Türkiyədən gəlmiş böyük nümayəndə heyəti, türk əsgər və zabitləri iştirak edirlər. Bu, bir daha bizim birliyimizi, dostluğumuzu və qardaşlığımızı göstərir". Göründüyü kimi, Türkiyə bizim xoş günümüzdə də, çətin günümüzdə də bir yerdə olduğunu, sevincimizlə, çətin günümüzlə şərik olduğunu göstərib, "Bir millət, iki dövlət" sözdə yox, reallıqda görünməkdədir.

Türkiyə Prezidenti Rəcəb Tayyib Ərdoğan da çıxışında deyib ki, Türkiyə olaraq Azərbaycan ilə münasibətlərimizdə özümüzə hər zaman böyük Lider Heydər Əliyevin "Bir millət, iki dövlət" şüarını rəhbər tutduq. Qazi Mustafa Kamal Atatürkün dəqiq ifadəsi ilə Azərbaycanın kədərini kədərimiz, sevincini sevincimiz bildik. Bu anlayışla Qarabağı otuz il boyunca sinəmizdə yara etdik. Bu gün də bu yaranın sağalmasının sevincini paylaşmaq, bu şanlı zəfəri birlikdə qeyd etmək üçün aranızdayıq.

10 dekabr Zəfər Paradı, həqiqətən də tarixi günüdür. Çünki hər ilin son ayı olan dekabrın 31-i Dünya Azərbaycanlılarının həmrəylik gününü qeyd edirdik və bununla yanaşı 30 il idi ki, düşmənin işğal etdiyi torpaqlarımızın, evindən, yurdundan qaçqın düşmüş soydaşlarımızın yurd, torpaq həsrətini də çəkirdik. Bir daha "Dağlıq Qarabağ" problemi olmayacaq! Bu problemə NİDA! qoyuldu. Və 10 dekabrda Zəfər Paradı dekabr ayına daxil olan ən böyük tarixi günlərdəndir. Çünki bu Qələbə 30 il düşmən işğalında olan torpaqlarımızın azad olunduğu və həsrətində olduğumuz Qələbə paradı idi. Bu, Ali Baş Komandanımız, Prezident İlham Əliyev cənablarının həm siyasət, həm də döyüş meydanında diplomatik siyasətinin, Müzəffər Şanlı Ordumuzun, igid əsgər və zabitlərimizin qanı töküldüyü Qarabağ Azərbaycandır! Nəhayət, bu Zəfər Paradı işğaldan azad

olunan torpaqlarda dalğalanan üç rəngli Bayrağımızın nümayiş olunduğu Zəfər Paradıdır.

Azərbaycan Prezidenti yaralı əsgərləri ziyarəti zamanı bildirib ki, dövlət həmişə sizin yanınızdadır: “Mən sizi təbrik etmək istəyirəm. Çünki siz gənc yaşlarınızda böyük qəhrəmanlıq, şücaət göstərib, Vətən uğrunda şərəflə vuruşub öz adlarınızı Azərbaycan tarixinə yazdırırsınız. Eyni zamanda, sizi belə vəziyyətdə görmək mənim üçün, hamımız üçün çox ağırdır. Amma əmin ola bilərsiniz ki, sizin sağlamlığınız üçün nə lazımsa, biz onu da edəcəyik. Bizim bütün xəstəxanalarda, hərbi hospitallarda hazırda müalicə alan hər bir insan xüsusi qayğıya layiqdir və bütün həkimlər, nəinki həkimlər, bizim bütün xalqımız sizə dəstək olmalıdır. Siz əmin ola bilərsiniz ki, dövlət sizin yanınızda olacaq”.

Bax, budur xalq-iqtidar-ordu birliyi və bu birliyin təcəssümü qalibiyyətdir! Bu gün Azərbaycan Prezidentinin siyasəti qalib gəldi! Çünki Azərbaycan haqq yolundadır və apardığı mübarizədə də qalib gəldi, tarixi ədaləti, ərazi bütövlüyümüzü bərpa etdi.

Prezidentimiz, Ali Baş komandanımız İlham Əliyev cənablarının dediyi kimi: "Bu dövrlə bağlı müraciətlərimi yenə də hər bir Azərbaycan vətəndaşının arzuladığı sözlərlə yekunlaşdırmaq istəyirəm: Cəbrayıl bizimdir! Füzuli bizimdir! Zəngilan bizimdir! Qubadlı bizimdir! Ağdam bizimdir! Kəlbəcər bizimdir! Laçın bizimdir! Şuşa bizimdir! Qarabağ bizimdir! Qarabağ Azərbaycandır! Eşq olsun Azərbaycan xalqına! Yaşasın Azərbaycan! Xalqımı, bütün türk dünyasını Zəfər bayramımız, Qələbə Paradımız, Azərbaycan Silahlı Qüvvələrinin tarixinə, hərb tariximizə yaddaşlardan silinməyəcək şanlı bir səhifə kimi yazılacaq Qarabağ Azərbaycandır! – günlərimizi təbrik edirəm!”.

Bütün xalqımızı, bütün Türk dünyasını Qələbə Zəfərli paradımız münasibətilə təbrik edirəm! QƏLƏBƏ ZƏFƏRLİ PARADIMIZIN YOLU UĞURLU OLSUN!

## Praqa görüşü – Prezident İlham Əliyevin diplomatik qələbəsi!

***Azərbaycanın maraqları dövlət başçımız tərəfindən layiqincə qorundu***

Məlum olduğu kimi, Praqada Prezident İlham Əliyevin Fransa Respublikasının Prezidenti Emmanuel Makron, Avropa İttifaqı Şurasının Prezidenti Şarl Mişel və Ermənistan Respublikasının baş naziri Nikol Paşinyanla dördtərəfli görüş keçirilib. Eyni zamanda, bu görüş əvvəlkilərdən daha fərqliliyi, xüsusi ştrixləri ilə fərqləndi və yadda qaldı. Daha dəqiq desək, rəsmi Bakının bu görüşə qədər əldə etdiyi diplomatik uğurlarının nəticəsi olaraq bir sıra mühüm razılaşmalara gəlindi və son razılaşmalar Azərbaycana qarşı müəyyən təzyiq cəhdlərinə baxmayaraq reallaşdırıldı. Daha dəqiq desək, həm də belə bir nəticəyə də gəlmək olar ki, Fransanın dövlət başçısı Emmanuel Makronun Ermənistanın baş naziri Nikol Paşinyana göstərdiyi açıq dəstəyinin, həmçinin Azərbaycana qarşı təzyiq tətbiq etməklə istəklərinə nail olacaqlarının qarşısını məhz Prezident İlham Əliyevin siyasi iradəsi, qətiyyəti aldı. Bəs əldə edilən uğurlar nədən ibarətdir?

Fransa hətta ömrünü başa vurmuş ATƏT-in Minsk qrupunun həmsədr ölkələrindən biri olmasına baxmayaraq daim özünün ermənipərəst siyasətini yürüdüb və açıq-aşkar erməni işğalına, təcavüzünə müxtəlif vasitələrlə don geyindirməyə cəhdlər göstərib. Məhz bu baxımdan, sonuncu Brüssel görüşündə də Parisin İrəvana dəstək göstərəcəyini bəri başdan müəyyən etmək elə də çətinlik yaratmırdı. Eyni zamanda, Fransanın ənənəvi ermənipərəst siyasətini nəzərə alsaq, Praqada keçirilən dördtərəfli görüşdə Azərbaycan üçün müxtəlif tələ və hiylələrin hazırlandığını güman etmək olardı. Əbəs deyil ki, Nikol Paşinyan Emmanuel Makronun da iştirak etdiyi görüşdə özünü qətiyyətli hiss edir, Fransa tərəfi də Ermənistanı dəstəklədiyini heç də gizlətmirdi.

Belə bir uğursuz əminliyə daha bir səbəb isə sentyabrın 12-14-də müəyyən olunmamış sərhəddə məhz Ermənistanın silahlı təxribatı nəticəsində baş vermiş məlum insidentdən yararlanmaq cəhdi oldu. Ancaq bu cəhd də puça çıxdı - Prezident Əliyevin qətiyyəti və prinsipiallığı buna imkan vermədi! Demək olar ki, 5 saatdan artıq çəkən və 2 hissədən ibarət

olan görüşdə Azərbaycana qarşı hər hansı bir formada təzyiq cəhdinin qarşısı alındı. Bununla da Makron-Paşinyan cütlüyünün planları iflasa uğradıldı.

Daha bir mühüm məqam sərhədlərin delimitasiyasının həyata keçirilməsi ilə əlaqəli razılaşmanın əldə olunmasıdır. Məlum oldu ki, sərhədlərin delimitasiyası üzrə komissiyanın iclasının tezliklə keçirilməsi razılaşdırılıb. Qeyd etmək olar ki, bu məsələdə də Fransa öz maraqlarını erməni maraqları ilə eyniləşdirib. Belə ki, Aİ və Fransa Azərbaycan ərazilərini də əhatə edəcək birgə sərhəd monitorinq missiyası yaradaraq bundan regiona daxil olmaq üçün istifadə etmək istəyirdilər. Amma öz suverenliyinə dəyər verən Azərbaycan buna qəti etiraz etdi. Azərbaycanın qətiyyətli mövqeyindən sonra belə razılaşdırıldı ki, Aİ missiyası yalnız Ermənistan ərazisində olacaq. Azərbaycan isə öz maraqlarına uyğun şəkildə missiya ilə əməkdaşlıq edəcək, sərhəd missiyası etimad quruculuğu və sərhədlərin delimitasiyasına töhfə və dəstək verəcək.

Beləliklə, növbəti dəfə Azərbaycanın maraqları Prezident İlham Əliyev tərəfindən layiqincə qorundu. Ermənistan isə bu sərhəd missiyasına razılıq verməklə suveren dövlət olmadığını bir daha nümayiş etdirdi. Onu da qeyd edək ki, Ermənistanın bu addımı həm də uzun illər ona himayədralıq etmiş, ayaqda saxlamış Rusiyaya qarşı da yeni və ciddi addımdır. Söz yox ki, Moskva İrəvanın bu qərarını cavabsız qoymayacaq.

Onu da qeyd edək ki, bəyanatda Zəngəzur dəhlizi ilə bağlı məsələnin gündəlikdə olmaması onunla bağlıdır ki, bu məsələ 2020-ci il 10 noyabr bəyanatı ilə tənzimlənir və bu, hər zaman aktualdır, gündəmdədir və onun reallaşdırılması istiqamətində işlər davam etdirilir. Azərbaycan bütün imkanlardan istifadə etməklə Ermənistanı öz öhdəliklərinin icrasına məcbur edir və bu proses məntiqi sonluğa kimi davam etdiriləcək. İrəvan isə, ilk növbədə, Praqa görüşündən ağıllı və doğru nəticə çıxarmalıdır.

## Uğurlarımızın zirvəsi-tarixi Zəfərimiz

15 oktyabr 2003-cü il. Bu təqvim həm Cənubi Qafqazın ən böyük siyasi qüvvəsi olan Yeni Azərbaycan Partiyasının, həm də müasir Azərbaycanın dövlətçilik tarixinin şanlı səhifələrindən biri kimi yaddaşlara yazılan, xalqın öz liderinə səs verdiyi tarixi gündür. Bəli, müasir Azərbaycan dövlətinin siyasi yüksəlişinin növbəti mərhələyə keçid etməsindən, möhtərəm cənab İlham Əliyevin ilk dəfə prezident seçilməsindən 19 il ötür. 2003-cü ilin 15 oktyabr tarixində demokratik qaydada keçirilən seçkilərdə səsvermə hüququna malik olan vətəndaşların 71.5%-i (3,046,401 vətəndaş) iştirak edərək, Yeni Azərbaycan Partiyasının namizədi, partiya Sədrinin birinci müavini, Azərbaycan Respublikasının Baş naziri İlham Əliyev olmuşdur. Azad, ədalətli və şəffaf şəkildə keçirilən seçkilərdə İlham Əliyev ümumi seçicilərin 2 milyon 438 min 787 nəfərin səsini qazanaraq, Azərbaycan Respublikasının Prezidenti seçilmişdir. Bu, ilk növbədə, xalqın müasir Azərbaycan dövlətinin qurucusu, ümummilli lider Heydər Əliyevə olan inamının göstəricisi idi. Çünki dahi şəxsiyyət seçkilərdən öncə xalqa müraciət edərək "O, yüksək intellektli, praqmatik düşüncəli, müasir dünya siyasətini və iqtisadiyyatını gözəl bilən, enerjili və təşəbbüskar bir şəxsiyyətdir. İnanıram ki, mənim axıra çatdıra bilmədiyim taleyüklü məsələləri, planları, işləri sizin köməyiniz və dəstəyinizlə İlham Əliyev başa çatdıra biləcək. Mən ona özüm qədər inanıram və gələcəyinə böyük ümidlər bəsləyirəm” dedikdə, özünün alternativsiz siyasi kursunu davam etdirə biləcək ünvanı göstərmişdi. Ulu öndər tam əmin idi ki, müstəqil Azərbaycanın işıqlı gələcəyi üçün məyyənləşdirdiyi inkişaf konsepsiyasını məhz cənab İlham Əliyev uğurla davam etdirərək reallığa çevirə bilər.

Bəli, dahi lider Heydər Əliyev bilirdi ki, liderlik bacarığı elə siyasətçilərə məxsusdur ki, onlar xalqının, dövlətinin milli maraqlarını qorumaqla yanaşı, həm də öz ölkəsini davamlı şəkildə inkişaf etdirir, yorulmadan irəliyə doğru apara bilir. Bu mənada ölkəmizə uzun müddət dünya siyasətinin fenomeni, bütün həyatını canından artıq sevdiyi doğma xalqına həsr etmiş Heydər Əliyev kimi dahi şəxsiyyət xalqa müraciətində ona özü qədər inandığını və Azərbaycanın gələcəyinə böyük ümidlər bəslədiyinin nəticələrini bu gün bütün dünya görür. Bu gün ümummilli

liderimiz Heydər Əliyevin ideyaları, müəyyənləşdirdiyi prioritetlər, dövlətçiliyimizin hərtərfli inkişaf konsepsiyası onun layiqli davamçısı, möhtərəm Prezident İlham Əliyev tərəfindən uğurla davam etdirilir. Bütün bunların sayəsində illərdir ki, ölkəmiz intibah və çiçəklənmə dövrünü yaşayır.

Cənab İlham Əliyev 2003-cü ildə Prezident seçilərkən Azərbaycan həlli müşkül görünən bir sıra problemlərlə üz-üzə idi. O vaxt ölkə hələ yeni-yeni dirçəlirdi, işsizlik, məcburi köçkünlərin acınacaqlı halı, bölgələrin inkişafdan geri qalması, əhalinin sosial vəziyyəti ciddi narahatlıq doğururdu. Prezidentin ilk vədi bu oldu: ölkədə yüz minlərlə yeni iş yeri yaradılacaq. Ötən illər ərzində 2 milyondan çox iş yeri yaradıldı. İşsizlik səviyyəsi 40 faizdən 5 faizə endi. Ölkə Prezidenti deyirdi: "Azərbaycanda bir dənə də olsun çadır düşərgəsi qalmayacaq". Çox keçmədən axırıncı çadır düşərgəsi ləğv olundu. Ən əsas məsələ isə bütün dünyanı bürüyən COVID-19 pandemiyasıdır ki, bu gün Azərbaycan pandemiyaya qarşı mübarizədə göstərdiyi nümunə diqqətəlayiqdir. Belə ki, Azərbaycanda koronavirus pandemiyasından bir qədər əvvəl həyatın bütün sahələrinə təsir göstərən böyük islahatlar elan edildi və qısa müddətdə həyata keçirildi. Azərbaycanda bütün sahələrdə sabitlik təmin edildi, əhalinin məşğulluq problemləri müsbət həllini tapdı və sadə vətəndaşın rifah halı iqtisadi inkişafının əsas prioritetlərindən birinə çevrildi. Ölkədə qeyri-neft sektorunun inkişafı neft strategiyasının məntiqi davamı oldu.

Güclü iqtisadiyyatın hər bir ölkənin inkişafında mühüm amil olduğunu bəyan edən Prezident İlham Əliyev ölkə iqtisadiyyatında qeyri-neft sektorunun çəkisinin artırılması ilə bağlı tədbirlər gördü. Yüzlərlə səhiyyə ocağının, müalicə-diaqnostika mərkəzlərinin inşası səhiyyə sisteminin inkişafını göstərdi. Ölkədə minlərlə məktəb tikildi, təhsil müəssisələrinin maddi-texniki bazası gücləndirildi. Azərbaycanda nəqliyyat sisteminin yenidən qurulması ölkəmizin dünyaya çıxışını təmin etdi. Ölkə Prezidenti İlham Əliyevin 2003-cü ildə keçirilən andiçmə mərasimində bir daha bildirdi ki, Azərbaycanın xoşbəxt gələcəyinə inanıram: "Ancaq bütün bunları həyata keçirmək və Azərbaycanı qüdrətli dövlətə çevirmək üçün ən başlıcası ölkədə Heydər Əliyevin siyasəti davam etdirilməlidir. Bu gün yüksək kürsüdən çıxış edərkən mən Azərbaycan xalqına söz verirəm ki, bu siyasətə sadiq qalacağam, heç vaxt bu yoldan dönməyəcəyəm, Heydər

Əliyevin siyasətini davam etdirəcəyəm.”

Ölkə Prezidenti İlham Əliyev bu məsuliyyəti uğurlu addımları ilə gerçəkləşdirdi, Azərbaycana biri-birindən əhəmiyyətli uğurlar qazandırdı. Son 19 ildə Prezident İlham Əliyevin təkmil və uzaqgörən inkişaf strategiyası nəticəsində ölkəmiz dayanıqlı və davamlı iqtisadi inkişafa nail oldu. Ən əsası isə “Azərbaycanı qüdrətli dövlətə çevirmək üçün ən başlıcası, ölkədə Heydər Əliyevin siyasəti davam etdirilməlidir. Bu gün yüksək kürsüdən çıxış edərkən mən Azərbaycan xalqına söz verirəm ki, bu siyasətə sadiq qalacağam, heç vaxt bu yoldan dönməyəcəyəm, Heydər Əliyevin siyasətini davam etdirəcəyəm”, – deyən Azərbaycan Prezidenti İlham Əliyevin qalib lider olaraq bütün öhdəliklərini reallaşdırmaqdadır.

***“Şuşasız Qarabağ, Qarabağsız Azərbaycan yoxdur”***

Prezident İlham Əliyev “Dəmir Yumruq” siyasəti ilə 44 günlük Vətən müharibəsi zamanı mahir diplomat və sərkərdə qabliyyətini ortaya qoydu. 30 ilə yaxın zaman müddətində həll olunmayan qondarma "Dağlıq Qarabağ" probleminin 44 gün ərzində həll olunması ilə 2020-ci il tariximizə Qələbə ili kimi yazıldı. Böyük qələbəni al qanı ilə yazan şəhidlərimizin intiqamının alınması ilə əldə edilən zəfəri, qalibiyyəti Azərbaycan xalqına bəxş etməklə Ali Baş Komandanımız İlham Əliyev həm də həyatını Azərbaycana həsr edən, “Şuşasız Qarabağ, Qarabağsız Azərbaycan yoxdur” – deyən Ulu Öndərin arzusunu reallaşdırdı: “Mən bu gün Ulu Öndər Heydər Əliyevin məzarını ziyarət etdim, onun ruhu qarşısında baş əydim. Ürəyimdə dedim, xoşbəxt adamam ki, ata vəsiyyətini yerinə yetirdim. Şuşanı azad etdik! Bu, böyük Qələbədir! Bu gün şəhidlərimizin, Ulu Öndərin ruhu şaddır! Gözün aydın olsun, Azərbaycan! Gözünüz aydın olsun, dünya azərbaycanlıları!”.

Bu 44 gün həm də Ulu Öndər Heydər Əliyevin Prezident İlham Əliyev haqqında dediyi "Mən ona özüm qədər inanıram və gələcəyinə böyük ümidlər bəsləyirəm" fikirlərinin bir daha öz təsdiqini tapır.

Bəli, bu gün Azərbaycan Qarabağa qovuşdu, tarixi zəfərə imza atdı, şəhidlərimizin, Xocalı qurbanlarının, Gəncə, Bərdə digər şəhər və rayonlarımızda soyqırımları zamanı həlak olan günahsız insanların qisasını döyüş meydanında aldı, işğalçı Ermənistana layiq olduğu yeri göstərdi. 44 günlük Zəfər “Qarabağ Azərbaycandır və nida” -söyləyən Prezidentimiz son 19

ildə - hər zaman olduğu kimi bu dəfə də vədinə əməl etdiyinin sübutudur. Ən əsası isə, noyabrın 10-u xalqımızın tarixinə şanlı, qızıl hərflərlə yazılan tarixidir. Bəli, qarşıda bizi Zəfərimizin yaratdığı reallıqlar fonunda daha möhtəşəm uğurlar gözləyir. Bir sözlə, 15 oktyabr 2003-cü il: Prezident seçkilərindən ötən 19 ildə qazanılan uğurların zirvəsi tarixi Zəfərimizdir. Bu gün bu fikir böyük qürur hissi ilə qeyd olunur ki, Ulu Öndər Azərbaycanı müstəqilliyini itirmək təhlükəsindən xilas etdisə, Prezident İlham Əliyev torpaqlarımızın xilaskarı, ərazi bütövlüyümüzü bərpa edib, yenilməz xalq adını özümüzə qaytaran Lider kimi tarixə yazıldı. Xalqımız əmindir ki, Prezident İlham Əliyevin müdrik siyasəti sayəsində daha böyük uğurlara nail olacağıq.

## AZƏRBAYCAN-TÜRKİYƏ – “BİR MİLLƏT, İKİ DÖVLƏT!”

Türkiyədə baş vermiş dağıdıcı zəlzələ xəbərI bütün dünyanı sarsıtdı. Zəlzələ nəticəsində dünyasını dəyişənlərin yaxınlarına başsağlığı verir, yaralılara isə Allahdan şəfa diləyirəm. Tarixin sınaqlarından şərəflə çıxan Türkiyə-Azərbaycan qardaşlığı bu gün dünyaya nümunədir. Hər zaman olduğu kimi Azərbaycan xalqı və Prezident İlham Əliyev Türkiyənin yanındadır. İlk andan Prezident İlham Əliyev və digər dövlət qurumlarının rəhbərləri Türkiyəyə başsağlığı verməsi, məhz bu qardaşlığın, “Bir millət, iki dövlət” olmasının gerçəkliyidir. Dövlət başçımız telefon danışığı zamanı qardaş Türkiyə xalqına şəxsən öz adından və xalqımız adından başsağlığı çatdırdı, yaralananların tezliklə şəfa tapmasını dilədiyini bildirdi. Azərbaycan Prezidenti qeyd etdi ki, bu, böyük fəlakətdir və ölkəmiz Türkiyənin bu dərdinə şərik çıxır. Bəli, bir millət, iki dövlət... Dünyada olmayan sarsılmaz, əbədi, bir-birinə dayaq, dəstək olan iki qardaş ölkə – Azərbaycan və Türkiyə ağrı-acılarını da, xoş günlərini də birlikdə yaşayır, birlikdə kədərlənib, birlikdə sevinirlər. Elə bütün çətinliklərə qarşı da daim çiyin-çiyinə mübarizə apararaq birliklərinin gücündən doğan əzmlə qalib gəlirlər...

Birinci vitse-prezident Mehriban xanım Əliyeva da Türkiyəyə dəstək olaraq sosial şəbəkədəki hesabında paylaşım edərək Türkiyə xalqının kədərinə şərik oluğunu, kədərləri bizim də kədərimizdir yazmışdır. Bəli, bu gün həm Türkiyə, həm də Azərbaycan xalqını sarsıdan çox acı günləri yaşayırıq. Qardaş Türkiyəyə Allah özü kömək olsun. Azərbaycanın Türkiyə ilə əsl qardaş, etibarlı dost olduğunu əyani şəkildə nümayiş etdirir.

### *Qardaş köməyi*

İstər xoş günlərdə, istərsə də çətin məqamlarda Azərbaycan daim qardaş Türkiyənin, Türkiyə isə Azərbaycanın yanında olur. Bu sarsılmaz birliyin qüdrətinə 44 günlük şanlı Vətən müharibəsində bütün dünya bir daha şahid oldu. Tarixi torpaqlarımızın işğalçılardan azad edilməsi üçün qalxdığımız Vətən savaşında qardaş ölkə Türkiyə haqq işimizi müdafiə edərək Qarabağın azadlığa qovuşdurulmasında Azərbaycana həm mənəvi, həm də siyasi dəstək oldu. Həmin dövrdə nə qədər beynəlxalq təzyiqlərlə

qarşılaşsa da, qardaş ölkə bu mövqeyindən bir addım da geri çəkilmədi, daim Azərbaycanın yanında oldu.Və bu gün Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin "bir millət, iki dövlət" və Türkiyə Cümhuriyyətinin qurucusu Mustafa Kamal Atatürkün "Azərbaycanın sevinci bizim sevincimiz, kədəri bizim kədərimizdir" kəlamları tarixin ən dar məqamlarında, ən çətin günlərində belə öz sözünü deyir. İlk yardıma yetişən ölkə, qardaşını dar gündə qoymayan Azərbaycan dövləti bu dəfə də çətin günündə Türkiyənin yanındadır və öz yardımını edir.

Ölkə başçısının tapşırığına əsasən, qardaş ölkəyə artıq bütün yardımlar edilir. Başqa cür də ola bilməz, bu, bizim qardaşlıq borcumuzdur. Çünki biz Türkiyə ilə bir millət, iki dövlətik, sevincimiz də, kədərimiz də eynidir. Azərbaycan hər zaman qardaş Türkiyənin yanındadır və bundan sonra da olacaq. Çünki Azərbaycan-Türkiyə birliyi əbədi və sarsılmazdır. Qırx dörd günlük İkinci Qarabağ müharibəsində bu birliyin ən yüksək zirvədə olduğunu bir daha gördük. Eyni zamanda, iki dost, qardaş ölkə arasında müttəfiqlik sənədinin 15 İyun - Milli Qurtuluş Günündə Qarabağımızın tacı, musiqi beşiyimiz Şuşada imzalanması dünyaya bu birliyin, həmrəyliyin gələcəyi ilə bağlı bir çox məqamları çatdırdı. Vətən müharibəsində dünyaya "Azərbaycan tək deyil" mesajını ünvanlayan Türkiyə Prezidenti Rəcəb Tayyib Ərdoğan Şuşadan "Bizim gücümüz Azərbaycanın gücü, Azərbaycanın  gücü də bizim gücümüzdür" bəyan etdi.

Budur qardaş dayağı, budur çətin günün sınağından çıxmaq. Budur - bir millət, iki dövlət münasibəti. Doğrudur, bu gün Türkiyə kimi bir güclü dövlətin Azərbacanla bir olması çox dövlətlərin qısqanclığına səbəb olub. Ancaq bir məqamı anlamaq lazımdır ki, Azərbaycan-Türkiyə illərin sınağından çıxmış, bu birlik möhkəmlənmişdir. Bu birliyi isə heç bir qüvvə sındıra bilməz!

Prezident İlham Əliyevin də çıxışlarında dəfələrlə vurğuladığı kimi, dünya miqyasında ikinci belə ölkələr tapılmaz ki, iki ölkə bir-birinə bu qədər yaxın olsun, belə arxa-dayaq dursun. Tarixən var olan və möhkəm özüllər üzərində qurulan bu qardaşlıq körpüsü gündən-günə daha da möhkəmlənir.

Xalq şairi Bəxtiyar Vahabzadənin bu qardaşlıq birliyini ifadə etdiyi şeirində olduğu kimi:

Bir ananın iki oğlu,
Bir amalın iki qolu.
O da ulu, bu da ulu, –
Azərbaycan – Türkiyə.

Bir sözlə, qardaş Türkiyə hər zamankı kimi, Azərbaycanın yanındadır, Azərbaycan da hər zaman bütün məsələlərdə qardaş Türkiyənin yanındadır.

## Münhen Konfransı – Azərbaycan Prezidentinin növbəti diplomatik qələbəsi

**Hər ilin fevral ayında Almaniya Federativ Respublikasının ərazisinə görə ən böyük regionu olan Bavariya bölgəsinin inzibati mərkəzi Münxen şəhərində təşkil edilən Münxen Təhlükəsizlik Konfransı beynəlxalq təhlükəsizlik məsələlərinin müzakirə olunduğu dünyanın ən aparıcı forumu sayılır və qlobal səviyyədə ən vacib, aktual problemlər üzrə diplomatik təşəbbüslər üçün platforma rolunu oynayır.**

Konfransın missiyası dövlət və hökumət başçıları, siyasətçilər, parlamentarilər, araşdırma mərkəzləri, özəl sektor, QHT-lər, media və beynəlxalq təhlükəsizlik sahəsində ixtisaslaşan təşkilat və mütəxəssislər arasında davamlı və qeyri-rəsmi dialoq yaratmaqla etimad qurmaq, qlobal və regional problemlərin, münaqişələrin həllinə töhfə verməkdir. Ən əsası isə Münxen Təhlükəsizlik Konfransı faktların dünya ictimaiyyətinə çatdırılmasında da vacib platformadır.

Azərbaycan Prezidenti İlham Əliyev cənablarının fevralın 17-19-da Avropa məkanında vacib siyasi diskussiya platforması sayılan Münxen Təhlükəsizlik Konfransının növbəti iclasına dəvət olunan az sayda dövlət başçıları sırasında olması onun Lider kimi şəxsiyyətinə böyük hörmətin göstəricisi, eyni zamanda, ölkəmizin enerji təhlükəsizliyi kimi qlobal miqyaslı aktual mövzuda və Cənubi Qafqazın təhlükəsizliyinin təmin olunmasında aparıcı rolunun nümayişidir. Bu gün real faktordur ki, Azərbaycan dünya üçün ən vacib ölkələrdən birinə çevrilib. Xüsusilə də Avropanın enerji təhlükəsizliyini təmin edən ölkədir. Azərbaycan dünyanın ən etibarlı logistika mərkəzinə çevirilib, dünyanın ən etibarlı söz sahiblərindəndir. Və bu gün dünyada iqtisadi böhran hökm sürür, ərzaq təhlükəsizliyi mövcuddur, bunların fonunda Prezident İlham Əliyevin düşünülmüş, düzgün yürüdülmüş siyasəti nəticəsində illər əvvəl həyata keçirilən meqaenerji layihələri sayəsində bu gün dünyanı, xüsusilə Avropanı enerji böhranından çıxarmaq üçün Azərbaycan ən etibarlı ölkədir.

Fevralın 17-də Münxen Təhlükəsizlik Konfransı çərçivəsində “Boru arzuları: Gələcəyə uyğun enerji təhlükəsizliyi” mövzusunda dəyirmi masada çıxış edən Azərbaycan Prezidenti İlham Əliyev ölkəmizin Avropanın

enerji təhlükəsizliyinə verdiyi töhfədən danışaraq bildirdi ki, ötən il Azərbaycanın qaz təchizatının artırılması qısamüddətli perspektivdə Avropanın enerji təhlükəsizliyinə verilən töhfə idi. Orta və uzunmüddətli perspektivdəki hədəf isə Azərbaycan tərəfindən irəli sürülən Cənub Qaz Dəhlizinin genişləndirilməsidir. Prezident İlham Əliyev qeyd etdi ki, 2027-ci ilədək TAP-la qaz nəqlinin indiki 11 milyard kubmetrdən 20 milyard kubmetrə, TANAP-la isə 16 milyard kubmetrdən 31 milyard kubmetrə çatdırılması nəzərdə tutulur. Azərbaycanla Avropa İttifaqı arasında əməkdaşlıqda bərpaolunan enerjinin xüsusi rolunun olduğunu deyən Prezident İlham Əliyev ölkəmizin son dövrlər bu sahədə bir sıra vacib addımlar atdığını diqqətə çatdırdı. Dövlətimizin başçısı qeyd etdi ki, Azərbaycanda bu istiqamətdə artıq bir sıra layihələr həyata keçirilir, həmçinin 25 qiqavatadək enerji istehsalı ilə bağlı müxtəlif sənədlər imzalanıb. Bu isə Azərbaycanın istehsal etdiyi yaşıl enerjinin daxili istehlakla yanaşı, Avropaya ixrac edilməsinə də imkan verəcək ki, bu da orta və uzunmüddətli perspektivdə Avropanın enerji təhlükəsizliyinə töhfə olacaq. Prezident İlham Əliyev vurğuladı ki, Azərbaycan bundan sonra da Avropanın enerji təhlükəsizliyində vacib rol oynamağa davam edəcək.

Azərbaycan və dünya ictimaiyyəti Münxen Təhlükəsizlik Konfransı çərçivəsində bir daha Azərbaycan Prezidenti İlham Əliyevin Ermənistanın baş naziri Nikol Paşinyanı, necə deyərlər, daşdan keçən tutarlı faktlarla çıxılmaz vəziyyətə və aciz duruma salınmasının şahidi oldu. Belə ki, Prezident İlham Əliyev Nikol Paşinyana dəfələrlə belə tarixi dərs keçsə də, hələ də nə düşüncəsində, nə də siyasi sahədə bir irəliləyiş olmayıb.

Prezident İlham Əliyev beynəlxalq tədbirlərdə, çıxışlarında, müsahibələrində dəfələrlə vurğulayır ki, Azərbaycanda artıq "Dağlıq Qarabağ" adında inzibati ərazi vahidi yoxdur. Ermənistan 2020-ci il noyabrın 10-da kapitulyasiya aktına imza atmağa məcbur oldu. Beləliklə, Ermənistan öz qoşunlarını Azərbaycanın digər ərazilərindən – Ağdam, Laçın və Kəlbəcərdən çıxarmağa məcbur edildi. Azərbaycan BMT Təhlükəsizlik Şurasının qətnamələrinin icrasını özü təmin etdi və bu, BMT-nin təsis edildiyi vaxtdan bu günə qədər dünyada ilk belə haldır.

Azərbaycanın 30 illik münaqişəni 44 gündə hərbi-siyasi yollarla həll edilərək, ərazi bütövlüyümüzün, tarixi ədalətin bərpa olunmasına nail olduq. Bu Ali Baş Komandanımız, Azərbaycan Respublikasının

Prezidenti, Qalib Liderimizin “Dəmir yumruq” siyasəti ilə Dağlıq Qarabağ münaqişəsinə son qoyuldu.

“Bu gün Dağlıq Qarabağ münaqişəsi keçmişdə qaldı, Azərbaycanda artıq “Dağlıq Qarabağ” adında inzibati ərazi vahidi yoxdur”, deyən Prezident İlham Əliyev bildirdi: "Prezidentin 2021-ci il 7 iyul tarixli Fərmanı ilə biz Qarabağ və Şərqi Zəngəzur iqtisadi zonalarını yaratmışıq. Fürsətdən istifadə edərək, mən BMT-yə üzv dövlətləri və BMT Katibliyini ərazilərimizə istinad edərkən hüquqi cəhətdən mövcud olmayan, siyasi baxımdan qərəzli və manipulyasiya xarakterli adların istifadəsinə yol verməməyə çağırıram".

Prezident İlham Əliyevin Dağlıq Qarabağın Azərbaycana məxsus olması ilə bağlı söylədiyi, təkzib olunmayan faktlara əsaslanan tarixi həqiqətlər qarşısında Paşinyanın əsl erməni xislətinə xas olan eramızdan əvvəlki dövrə mücərrəd və dolayı ekskursu və digər sayıqlamaları beynəlxalq auditoriyanı və dünya ictimaiyyətini çaşdırmaq cəhdindən başqa bir şey deyildi. Əgər Paşinyan həqiqətən də Dağlıq Qarabağın ermənilərə məxsus olduğunu təsdiq edən hər hansı bir fakta, sənədə malik olsaydı, mütləq şəkildə bunu açıqlayardı.

Azərbaycan Prezidenti İlham Əliyev Münhendə keçirilən “Dağları aşmaq? Cənubi Qafqazda təhlükəsizliyin qurulması” mövzusunda keçirilən plenar iclasda çıxışında bildirdi ki, artıq “Dağlıq Qarapbağ” ifadəsi etibarlı deyil: "Diqqətinizə çatdırım ki, "Dağlıq Qarabağ" ifadəsi daha etibarlı deyil. Ümumiyyətlə, bu, rus sözləridir. "Naqorno" sözünün mənası "dağlıq" deməkdir".

Dövlətimizin başçısı, həmçinin Paşinyana mesajını da ünvanladı: "Mən də deyə bilərəm ki, Ermənistan Azərbaycan ərazisinin 20 faizini işğal edib, beynəlxalq hüququ pozub və 27 il ərzində BMT Təhlükəsizlik Şurasının qətnamələrini yerinə yetirməyib. Onlara qarşı da heç bir sanksiyalar da tətbiq edilməyib".

Azərbaycan Prezidenti, həmçinin söyləyib ki, biz döyüşməyə məcbur olduq: “Biz gözləyirdik ki, BMT Təhlükəsizlik Şurası öz qətnamələrinə hörmət edəcək. Lakin biz gördük ki, heç bir irəliləyiş yoxdur. Ümumi bir fikir yaranmışdı ki, bu münaqişə dondurulub. Beləliklə, biz sübut etdik ki, münaqişə dondurulmayıb. Biz döyüşməyə məcbur olduq. Ləyaqətimizi, ərazi bütövlüyümüzü, ədaləti bərpa etmək və BMT Təhlükəsizlik Şurasının

qətnamələrini yerinə yetirmək üçün 3 min insanın həyatını qurban verməli olduq".

Dövlətimizin başçısı vurğulayıb ki, bu gün 1 milyon azərbaycanlını evsiz-eşiksiz qoyulması, 67 məsciddən 65-nin dağıdılması, yadplanetlilərin əməli deyil. Bunu bizim torpağı işğal edən qonşularımız törədiblər, onlar bu torpağı murdarlayıblar. İndi biz onları artıq oradan qovandan sonra onlar ədalətli olmağa çağırırlar. Onlar, – bizim ərazilərimizi 30 il ərzində işğal edənlər, – bizi işğalçılıqda təqsirləndirirlər. Dövlətimizin başçısı onu da əlavə edib ki, 2020-ci il noyabr tarixli üçtərəfli Bəyanatın faktiki olaraq Ermənistanın kapitulyasiya aktı olmasını unutmaq lazım deyil.

Bu yerdə erməni siyasətçi, "Erməni Milli Konqresi"nin sədr müavini Levon Zurabyan Paşinyanın Münhendəki boşboğazlığı haqda dediyini xatırlatmaq istərdim: "Münhen konfransında Paşinyanla İlham Əliyev arasında gedən debata dəhşətlə baxdım. Ermənistan liderlərinin Levon Ter-Petrosyandan başlayaraq Robert Köçəryana, Serj Sarkisyana və nəhayət Nikol Paşinyana qədər təkamülünü müşahidə etsəniz, Ermənistanın növbəti liderinin pitekantrop (Yava adasında yaşayan meymuna bənzər insan) olacağı fikrini rədd etmək çətindir".

Levon Zurabyan onu da bildirib ki, "İlham Əliyev Ruben Vardanyan Qarabağı təmsil etdiyi müddətdə ermənilərlə danışıq aparmayacağını deyəndə Paşinyan susdu və Laçın dəhlizinin blokadasının olmamasını təkzib etmək üçün bircə tutarlı arqument gətirə bilmədi. Ancaq İlham Əliyevin Qarabağda 64 məscidin dağıdılması ilə bağlı açıqlamasına cavab vermək qərarına gələndə məlum oldu ki, kaş ki, Paşinyan bu ittihama ümumiyyətlə cavab verməyəydi. O, bu məlumatı təkzib etmədi. Dedi ki, sovetlər dövründə Azərbaycanda 1560 məscid dağıdılıb. Beləliklə, Paşinyan ona ayrılan vaxtı belə boşboğazlığa sərf etdi. Bir sözlə, Paşinyanın dünən Münhen Təhlükəsizlik Konfransındakı çıxışı dəhşətli reallıqları üzə çıxardı. Ermənistanın biabırçı kapitulyasiyasının acınacaqlı təcəssümü Münhendə oturmuşdu və məlum oldu ki, pis diplomatiya nəticəsində də nəyisə itirəcəyik", deyə o, qeyd edib.

Göründüyü kimi, Azərbaycan Prezidentinin həmin debatda Nikol Paşinyana verdiyi dərs, təkcə Ermənistanın deyil, bütövlükdə dünyanın hər yerində təşkilatlanmış, qlobal media resurslarında öz şəbəkələrini yaratmış, vahid mərkəzdən idarə olunan erməniliyin və onların çoxsaylı

himayədarlarının uzun illərdən bəri dövlətimizə qarşı apardıqları siyasətin dünyanın gözü qarşısında darmadağın edilməsi kimi tarixə düşdü və Prezident İlham Əliyevin şəxsində liderin, dövlət başçısının öz xalqının maraqlarını necə məharətlə, qətiyyətlə müdafiə etməsinin bariz nümunələrindən biri kimi qeyd olunmaqdadır.

Çünk Prezident İlham Əliyev 3 il bundan əvvəlki konfransda "Qarabağ Azərbaycandır və nida işarəsi" dedi və yerinə yetirdi və bu gün də, sözü ilə əməlinin bir olduğunu bütün dünyaya nümayiş etdirdi – Azərbaycanda artıq "Dağlıq Qarabağ" adında inzibati ərazi vahidi yoxdur.

Bəli, Qalib liderimiz, Prezident İlham Əliyev yenə də sözü və əməli ilə tarix yazdı. Onun cəsarətli çıxışı həm Paşinyana, həm erməni diasporuna, həm də onların havadarlarına olan xəbərdarlıq idi. Bu, dünya erməniliyinin əsrlərdir dünyanı aldatmaq siyasətini ifşa edən addım olmaqla yanaşı, informasiya müharibəsində Ermənistanın mövqelərinə endirilmiş sarsıdıcı zərbə oldu.

Bir sözlə, istər 3 il öncə, istərsə də 2023-cü il fevralın 17-dən 19-nə kimi keçirilən Münxen Təhlükəsizlik Konfransı, həmçinin İkinci Vətən müharibəsində sarsılmaz zərbələr alaraq acınacaqlı vəziyyətə düşən Ermənistan Azərbaycan Prezidenti İlham Əliyevin "Dəmir yumruq" siyasəti ilə Güclü Azərbaycan Ordusunun rəşadətli əsgər və zabitlərinin qəhrəmanlığı ilə cəsarət ilə Azərbaycanın qarşısında diz çökdü. Və bütün bu nailiyyətlər bir daha Prezident İlham Əliyevin dünya siyasətindəki yüksək nüfuzunu təsdiq etəklə, Münxen Təhlükəsizlik Konfransı Azərbaycan diplomatiyasının növbəti zirvəsi oldu.

## Azərbaycanın COP29-a evsahibliyi etməsi Prezidentin növbəti qələbəsidir

Son 20 ildə Azərbaycan Müzəffər Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi altında çox mühüm tarixi uğurlara imza atmış, eyni zamanda, ölkəmiz beynəlxalq və regional əhəmiyyətli çoxsaylı tədbirlərə ev sahibliyi etmişdir. Həm ölkəmizin paytaxtı Bakı şəhərində, həm digər regionlarımızda keçirilən tədbirlərdə yüksək səviyyəli təşkilatçılıq diqqəti cəlb etməklə zəngin təcrübə formalaşmışdır. Belə ki, Azərbaycanın BMT-dən sonra dünyada ikinci böyük beynəlxalq təşkilatına - Qoşulmama Hərəkatına sədrlik etməsi ölkəmizin dünya birliyində qazandığı böyük nüfuzundan xəbər verir. Qeyd edək ki, Qoşulmama Hərəkatına sədrliyi və belə mötəbər tədbirlərə ev sahibliyi etmək ölkəmizin multilateralizmə və qlobal həmrəyliyə verdiyi önəmin göstəricisidir. Məhz Qoşulmama Hərəkatına 3 illik sədrliyi 2022-ci ildə bitməli olan Azərbaycanın Hərəkata sədrliyi bir il uzadıldı. Ötən 4 il ərzində ölkəmizin BMT-dən sonra ikinci böyük siyasi təsisat olan Qoşulmama Hərəkatına sədrliyi kifayət qədər uğurlu və əksər üzv dövlətlər tərəfindən nümunəvi sədrlik olaraq təqdir edilməkdədir. Göründüyü kimi, Qoşulmama Hərəkatına üzv dövlətlərin yekdilliklə Azərbaycanın sədrlik müddətinin daha bir il uzadılması barədə qərarı Prezident İlham Əliyevin həyata keçirdiyi xarici siyasətin uğuru, dünyadakı nüfuzunun daha bir göstəricisi və onun şəxsiyyətinə verilən yüksək dəyərin ifadəsidir.

Dekabrın 9-da Şərqi Avropa regional qrupu Azərbaycanın 2024-cü ildə COP-29-a ev sahibliyi etməsi Prezident İlham Əliyevin uğurlu xarici siyasəti nəticəsində ölkəmizin beynəlxalq səviyyədə nüfuzunun günbəgün artdığını sübut edir. Eyni zamanda, son vaxtlar Azərbaycana qarşı çirkin kampaniya aparan bəzi dairələrə tutarlı cavabdır. Dövlət başçısı bir daha bu spekulyasiyaları alt-üst etdi və Azərbaycanın müsbət imicinin üzərinə kölgə sala bilməyəcəklərini sübuta yetirdi. Dövlətimizin başçısı bu təşəbbüsü ilə Azərbaycanın qüdrətini bir daha dünyaya göstərdi və beynəlxalq aləmdə böyük etimad qazandığını nümayiş etdirdi. Ölkəmiz qlobal problemlərdən biri olan iqlim dəyişmələrinə qarşı səyləri səfərbər etmək və bu mübarizəyə töhfə verməklə dünyanın diqqət mərkəzində

olacaq. Qeyd edək ki, COP29 beynəlxalq konfrans kimi məsuliyyətli bir tədbirdir və bu tədbirin keçirilməsinə az vaxt qalsa da, hazırlıq işləri yüksək səviyyədə təşkil olunur. Dekabrın 15-də BMT-nin İqlim Dəyişikliyi üzrə Çərçivə Konvensiyasının Tərəflər Konfransının 29-cu sessiyasının – COP29-un gələn il ölkəmizdə keçirilməsi ilə əlaqədar Prezident İlham Əliyevin sədrliyi ilə keçirilən müşavirdə qeyd etdiyi kimi ölkəmiz növbəti böyük uğura imza atıb. Nüfuzlu, qlobal xarakterli tədbirin məhz Bakıda keçirilməsinə dair qərar Azərbaycana növbəti dəfə böyük etimad və böyük hörmət göstərilməsinin təsdiqidir: "Biz buna layiqik, biz apardığımız siyasət nəticəsində dünya miqyasında çox güclü mövqelərə sahib olmuşuq. Azərbaycana beynəlxalq aləmdə olan hörmət günbəgün artır və biz bu hörməti öz əməlimizlə, işimizlə, siyasətimizlə qazanmışıq. Bizim müstəqil siyasətimiz, prinsipial mövqeyimiz, beynəlxalq hüquqa bağlılığımız, sədaqətimiz və eyni zamanda, ölkə ərazisində suverenliyin bərpa edilməsi bizə olan hörməti daha da artırdı".

Ölkəmizin başçısı, həmçinin vurğulayıb ki, bu hadisənin önəmi ondadır ki, bu qərar antiterror tədbirlərindən iki ay yarım sonra qəbul olunmuşdur və beləliklə, bir daha bütün dünya ictimaiyyəti Azərbaycana öz dəstəyini ifadə etmişdir. Prezident bildirib ki, Bakıda COP 29 konfransının keçirilməsi beynəlxalq aləmin hər bir üzvünün razılığı ilə mümkün olmuşdur. Prezident İlham Əliyevin rəhbərliyi ilə dünya miqyasında xüsusi əhəmiyyətə malik ölkəyə çevrilib. 2024-cü ildə Bakı ekoloji və iqlim məsələlərinin həll olunduğu qlobal mərkəzə çevriləcək. COP29 konfransında 190-dan çox ölkədən nümayəndənin Azərbaycanda bir araya gəlməsi gözlənilir. Azərbaycanda BMT-nin İqlim Dəyişikliyi üzrə Çərçivə Konvensiyasının Tərəflər Konfransının əvvəlki təşkilatçılarını üstələmək, nəticədə iqlim və ekoloji çağırışların həllində təsirli nəticələr əldə etmək üçün bütün ilkin şərtlər var. Azərbaycan hökumətinin ekoloji siyasəti və qlobal istiləşmə ilə mübarizə üzrə fəal tədbirləri digər regionları və ölkələri də analoji tədbirlər həyata keçirməyə sövq edir. Bu, böyük bərpa edilməsi bizə olan hörməti daha da artırdı".

Bəli, müşavirədə dövlət başçımızın söylədiyi kimi, BMT-nin İqlim Dəyişikliyi üzrə Çərçivə Konvensiyasının Tərəflər Konfransının 29-cu sessiyasının Azərbaycanda keçirilməsinə dünya birliyinin dəstək verməsi ölkəmizin beynəlxalq arenada qazandığı etibar, hörmət və nüfuzdan irəli

gəlir. Azərbaycan özünü beynəlxalq birliyin ləyaqətli üzvü kimi aparır və ev sahibliyi etdiyi bütün beynəlxalq tədbirləri yüksək səviyyədə həyata keçirir.

Prezident İlham Əliyev müşavirədə müstəqil Azərbaycanın paytaxtı Bakının iki həftə ərzində dünyanın mərkəzi olacağını vurğulayaraq bildirmişdir ki, COP29 bu vaxta qədər keçirilmiş tədbirlərlə müqayisəyə gəlmir: "Hətta Avropa Oyunlarını xatırlasaq, o vaxt 5 min idmançı və onları müşayiət edən təqribən 3 min qonaq gəlmişdir. Ancaq COP29-da 10 minlərlə xarici nümayəndə ölkəmizə gələcək, iki həftə ərzində Bakı dünyanın mərkəzi olacaq. Müəyyən ehtimallara görə, təqribən 70-80 min xarici qonaq bu müddət ərzində ölkəmizdə olacaq". Bir sözlə, Prezident İlham Əliyevin bu təşəbbüsü də əvvəlkilər kimi ölkəmizin qüdrətini bütün dünyaya nümayiş etdirdi. Və bu gün Azərbaycan, dövlət başçımızın söylədiyi kimi: “Apardığımız siyasət nəticəsində dünya miqyasında çox güclü mövqelərə sahib olmuşuq”. Bu, reallıqdır və bütün dünya bunu bir daha görəcək.

## SPECA-nın Zirvə görüşünün Bakıda keçirilməsi Prezident İlham Əliyevin qlobal müstəvidə qələbəsidir

Azərbaycanın yüksək səviyyəli mötəbər tədbirlərə uğurla ev sahibliyi etməsi dövlətimizin beynəlxalq aləmdə gündən-günə artan nüfuzundan xəbər verir. Xüsusilə, son illər Azərbaycanın regionda aparıcı aktora çevrilməsi, dünyada artan nüfuzun onun beynəlxalq təşkilatlarla əlaqələrində və onların fəaliyyətində fəal iştirakına gətirib çıxarıb. Artıq dünya dövlətləri Azərbaycanı etibarlı, mühüm tərəfdaş, sözü imzası qədər dəyərli olan ölkə kimi qəbul edirlər. Təsadüfi deyil ki, BMT, Avropa İttifaqı, NATO, İslam Əməkdaşlıq Təşkilatı və digər nüfuzlu təşkilatlar Azərbaycanla əməkdaşlığı strateji prioritet kimi müəyyənləşdiriblər. Bu gün Azərbaycan bir sıra beynəlxalq qurumlarda, sadəcə üzv dövlət kimi təmsil olunmur, eyni zamanda, bir çox qərarların qəbulunda və icrasında yaxından iştirak edir. Qeyd edək ki, Azərbaycan Qoşulmama Hərəkatına 4 il sədrlik etməklə bir ilkə imza atıb. Belə bir mötəbər quruma rəhbərlik etmək, dünya ölkələrində ağır nəticələrə səbəb olan pandemiya ilə mübarizədə bütün dövlətləri birləşdirməyə çalışmaq Azərbaycan Prezidentinin humanist və uzaqgörən siyasətinin göstəricisidir.

Cari ilin noyabr ayında İqtisadi Əməkdaşlıq Təşkilatının 27-ci Toplantısının Şuşada keçirilməsi, ardınca “Qadınların hüquqlarının inkişaf etdirilməsi və səlahiyyətlərinin artırılması” mövzusunda beynəlxalq konfransa ev sahibliyi etməsi Azərbaycanın dünüya miqyasında layiqli yer tutmasının göstəricisidir. Və bu tədbirlərin ardınca, beynəlxalq tədbirlərin məkanına çevrilən Bakıda noyabrın 24-də BMT-nin Mərkəzi Asiya Ölkələrinin İqtisadiyyatları üçün Xüsusi Proqramı olan SPECA-nın 25-ci ildönümünə həsr edilmiş Zirvə görüşünə ev sahibliyi etməklə Azərbaycanın iqtisadi gücünün, inkişafının, qonaqpərvərliyinin, multikultural dəyərlərinin, sabitlik adası kimi əmin-amanlığın hökm sürdüyü məkan olduğunu bir daha təsdiqləyir. Qeyd edim ki, Azərbaycan Mərkəzi Asiya ölkələri ilə əməkdaşlığa xüsusi önəm verməsinin təsdiqidir ki, Prezident İlham Əliyev son iki il ərzində Mərkəzi Asiya dövlətlərinə 10-dan çox səfər edib. Xüsusi olaraq vurğulamaq istərdim ki, bu gün Azərbaycanın SPECA-dakı rolunun xüsusi olması da məhz Prezident İlham Əliyevin

apardığı uğurlu xarici və daxili siyasətin nəticəsidir. Zirvə görüşündəki çıxışlardan da aydın göründü ki, bu dövlətlərin Azərbaycana münasibəti dostyanadır, onlar Azərbaycanı siyasi dialoq ölkəsi kimi qəbul edir, iqtisadi islahatların aparıldığı və ciddi nəticə verdiyi bir dövlət kimi görürlər.

Prezident İlham Əliyev Zirvə görüşündəki çıxışında bildirib ki, SPECA yarananda üzv ölkələr dövlət müstəqilliyinin ilk addımlarını atırdılar: "Qarşımızda bir çox problemlər, çağırışlar durmuşdu. Son 25 ildə əsas çağırışlar arxada qalıb, biz dövlət suverenliyimizi möhkəmləndirmiş, beynəlxalq aləmin dəyərli üzvlərinə çevrilmiş və iqtisadi cəhətdən sürətlə inkişaf etmişik. Ölkələrimizi birləşdirən daha bir amil var, o da siyasi sabitlikdir. Sabitlik olmadan heç bir iqtisadi inkişafdan söhbət gedə bilməz". Doğrudan da, belədir. Prezidentin qeyd etdiyi kimi, bu gün dünyanın müxtəlif bölgələrində müharibələrin, münaqişələrin, qanlı toqquşmaların geniş vüsət aldığı bir vaxtda bizim ölkəmizdə sülh, sabitlik və əmin-amanlığın hökm sürməsi, inkişafın, quruculuq proseslərinin uğurla getməsi dövlətimizin və xalqımızın böyük uğurudur.

Dövlətimizin başçısı çıxışında bir daha dünyaya sülh mesajları verdi. Bildirdi ki, Azərbaycan uzun illər, hətta bu gün də ikili standartlar siyasətindən, haqsızlıqdan əziyyət çəkən ölkə kimi çalışır ki, dünyada ədalət bərpa edilsin. İmperialist və müstəmləkəçi siyasət yürüdən ölkələr bu siyasətdən əl çəkməlidir: "Qoşulmama Hərəkatının təməl sənədlərində əks olunduğu kimi, biz Fransa hökumətini Yeni Kaledoniya xalqının və Fransanın dənizaşırı icma və ərazilərindəki digər xalqların hüquqlarına hörmət etməyə çağırırıq. Fransanın Avropadan kənarda idarə etdiyi ərazilər fransız müstəmləkə imperiyasının iyrənc qalıqlarıdır. Biz, həmçinin Fransanı Afrika, Cənub-Şərqi Asiya və digər ərazilərdə Qoşulmama Hərəkatının üzvü olan ölkələrə qarşı müstəmləkə keçmişinə, qanlı müstəmləkə cinayətlərinə, eləcə də soyqırımı aktlarına görə üzr istəməyə və məsuliyyətini etiraf etməyə çağırırıq".

Prezident çıxışı zamanı müstəqilliyimizin ilk illərində ölkəmizin beynəlxalq səviyyədə tanınan ərazilərinin təxminən 20 faizinin Ermənistan tərəfindən işğal edildiyini, işğalçı ölkənin həyata keçirdiyi etnik təmizləmə siyasəti nəticəsində bir milyondan artıq azərbaycanlının öz dədə-baba yurdlarından qovulduğunu bildirdi. Qeyd etdi ki, Azərbaycanın suveren ərazilərində Ermənistan silahlı qüvvələrinin 15 minə yaxın hərbi

kontingentinin təxribatlarına cavab olaraq və "boz zona"ya son qoyulması məqsədilə bu il sentyabrın 19-20-də biz Qarabağda antiterror tədbirləri keçirdik. Cəmi bir gün ərzində 1992-ci ildə xalqımıza qarşı soyqırımının törədildiyi Xocalı şəhəri də daxil olmaqla, bütün ərazilərimiz üzərində suverenliyimizi tam bərpa etdik və Azərbaycan ərazisində təcavüzkar separatizmə son qoyduq: "Bu tarixi Qələbə münasibətilə Azərbaycanı təbrik edən bütün ölkələrə təşəkkürümü bildirirəm". Dövlətimizin başçısı onu da bildirib ki, hazırda işğaldan azad olunmuş ərazilərdə genişmiqyaslı bərpa-quruculuq işləri həyata keçirilir, "Böyük Qayıdış" Proqramı çərçivəsində 2026-cı ilin sonuna qədər 140 min keçmiş məcburi köçkün öz doğma evlərinə qayıdacaq.

Bir sözlə, Bakıda Prezident İlham Əliyevin sədrliyi ilə yaradılmasının 25-ci ildönümündə SPECA-nın Zirvə görüşünün indiki mürəkkəb geosiyasi situasiyada təşkili Azərbaycanın və şəxsən Prezident İlham Əliyevin qlobal müstəvidə qələbəsi, qlobal əhəmiyyətli təklifləri Azərbaycanın liderlik mövqeyini bir daha möhkəmləndirib və dünyada nüfuzu getdikcə artan, regionda aparıcı aktora çevrilən Azərbaycan təşəbbüsləri ilə qarşıdakı dövrdə də dünya siyasətində söz sahibliyinin təmin edilməsinə öz töhfəsini verəcək. Dövlət başçımızın söylədiyi kimi: "Çıxışımın sonunda dövlət və hökumət başçılarına dəvətimi qəbul edib Zirvə görüşündə iştirak etdiklərinə görə bir daha təşəkkür edir və Zirvə görüşünün əlaqələrimizə yeni təkan verəcəyinə əminliyimi bildirirəm".

## Azərbaycan qadınının ləyaqət və alilik simvolu

**Mehriban Əliyeva – Varlığı və fəaliyyəti ilə ölkəsinə ucalıq şərəfi gətirən dəyərli Azərbaycan xanımı**

*"Həyatda hər bir kəsin yerini və taleyini tarix müəyyən edir. Odur ki, nə böyük, nə də kiçik rollar olmur. Öz həyat kitabını yazmağa ancaq sənin şəxsi, dərk edilmiş məsuliyyətin imkan verir".*

**Mehriban Əliyeva, Birinci vitse-prezident, Heydər Əliyev Fondunun prezidenti**

Respublikanın ictimai-siyasi, mədəni və sosial həyatında aparıcı qüvvəyə malik olan Azərbaycan qadını həm də dünya miqyasında beynəlxalq cəmiyyətin nüfuz sahibinə çevrilib. Onun qadın gözəlliyi, qadın idarəsi, saflığı və sədaqəti, əlbəttə ki, xalqımızın çoxəsrlik milli-mənəvi dəyərləri sistemində formalaşıb. Bütün sahələrdə əməyi olan Azərbaycan xanımı dövlətin inkişafında, dövlətçilik ənənələrinin möhkəmlənməsində əvəzsiz, müstəsna rola malikdir. Bu gün müasirimiz olan Heydər Əliyev Fondunun prezidenti, Azərbaycanın birinci xanımı, UNESCO və ICESCO-nun xoşməramlı səfiri, Birinci vitse-prezident Mehriban xanım Əliyeva, məhz Azərbaycanın ictimai-siyasi və mədəni həyatında əhəmiyyətli rola malikdir. Azərbaycanda baş verən nəhəng sıçrayışlarda, ölkənin simasının gündən-günə dəyişməsində, dünyanın nüfuzlu dövlətləri sırasında layiqli yer qazanmasında, bütün bəşəriyyəti ağuşuna alan koronavirusa qarşı mübarizədə Prezident İlham Əliyev cənabları ilə birgə fəaliyyət göstərən Mehriban xanım Əliyevanın danılmaz fəaliyyəti, genişmiqyaslı layihələri öz uğurlu nəticəsini verib. Onun həyata keçirdiyi layihələr yerli əhəmiyyətli sosial problemlərin həllinə, xüsusi qayğıya ehtiyacı olan insanlara kömək məqsədi daşıyır.

İnsanların yaradıcı potensialının, bilik və bacarıqlarının aşkara çıxarılmasına, qabiliyyətlərini göstərməsinə, inkişaf etdirməsinə yardım edir. Azərbaycan mədəniyyətinin geniş təbliği, sağlam mənəvi dəyərlərin qorunması ilə bağlı aparılan işlər, uşaq və gənclərin hərtərəfli biliklərə malik vətəndaş kimi yetişdirilməsi istiqamətində önəmlidir. Azərbaycan həqiqətlərini dünya ictimaiyyətinə çatdırmaq, uşaq müəssisələrinin infrastrukturlarını, səhiyyə və tibbi təsisatları inkişaf etdirmək istiqamətində

böyük mahiyyət daşıyan addımlar Mehriban xanım Əliyevanın humanizm prinsiplərinə söykənir.

Öz varlığı ilə məmləkətinə şərəf gətirən Azərbaycanın birinci xanımının fəaliyyəti Azərbaycan haqqında olan təsəvvürlərin ciddi şəkildə dəyişilməsi ilə nəticələnib. Azərbaycan haqqında olan təsəvvür, insan haqqında olan təsəvvür onun layihələri əsasında tamam fərqli bir şəkildə meydana çıxdı. Bütün dünyaya müstəqil dövlətdə yaşayan qadın obrazının lazımi şəkildə təqdiminə nail oldu. Öz peşəkarlığı, dünya arenasında baş verən hadisələrə yanaşması ilə humanist insan obrazını canlandırdı. Azərbaycan mədəniyyətinin dünya mədəniyyətinin tərkib hissəsinə daxil olmasında atdığı addımlar çox əhəmiyyətli hadisədir. UNESCO-nun, ICESCO-nun, eləcə də digər beynəlxalq nüfuzlu mədəniyyət təşkilatlarının elə bir tədbiri yoxdur ki, orada Azərbaycanın milli-mənəvi dəyərlərindən, mədəniyyətindən, qədim folklorundan söz açılmasın. O, tarixi həqiqətləri, tarixi faktları, dünyanın nüfuzlu təşkilatlarının iştirakı olan tədbirlərdə qonaqlara çatdıraraq, maraqlı faktlar əsasındakı çıxışları ilə ölkə həyatında baş verən hadisələrin təbliğinə nail olub. Eyni zamanda, onun humanizminin nəticəsi olaraq Azərbaycan əhalisinin sağlamlığı, xoşbəxtliyi geniş bir sferanı əhatə edib. Belə ki, ahıllara, qocalara, uşaqlara qayğı ilə yanaşmaq məsuliyyəti çox dəyərli Mehriban xanımın fəaliyyətində özünü təsdiqləyib.

Mehriban xanım Əliyeva tərəfindən yaradılan Heydər Əliyev Fondunun genişmiqyaslı fəaliyyəti nəinki Azərbaycanda, onun hüdudlarından kənarda belə əks-səda doğurub. Fond görkəmli siyasi xadim Heydər Əliyevin ölməz ideyalarını dəstəkləyərək, ölkənin sosial-iqtisadi, mədəni tərəqqisi, sivil dünya birliyinə inteqrasiyası, xalqın maddi rifahının yaxşılaşması naminə fəaliyyətini davam etdirir. Bu yol Heydər Əliyevin müəyyən etdiyi, işləyib hazırladığı siyasətin öyrənilməsinə, təbliğinə və bu ideyaların həyata keçirilməsinə doğru yönəlib.

Hər bir azərbaycanlı üçün fərəhlidir ki, Azərbaycanın birinci xanımı Mehriban Əliyevanın fəaliyyəti beynəlxalq səviyyədə diqqətdədir. Onun gördüyü işlər cavabsız qalmamış, dünya dövlətləri, nüfuzlu təşkilatlar tərəfindən müxtəlif adlara, mükafatlara layiq görülmüşdür. Mesenatlıq və xeyriyyəçilik fəaliyyətinə görə, təhsil və mədəniyyət müəssisələrinin dəstəklənməsinə, Rusiya və Azərbaycan xalqları arasında dostluğun

möhkəmləndirilməsində sanballı töhfələrinə görə Rusiyanın **"Yüzilliyin mesenatları"** Beynəlxalq Xeyriyyə Fondunun **"Yaqut Xaç"** ordeninə, sivilizasiyalararası dialoq daxil olmaqla, müxtəlif sahələrdə genişmiqyaslı və fədakar fəaliyyətinə, qayğıya ehtiyacı olan uşaqlara diqqətinə, onların yaşayış şəraitinin yaxşılaşmasına, təhsilə, həmçinin, islam aləmində görülən işlərə böyük dəstəyinə görə İSESKO-nun xoşməramlı səfiri adına layiq görülüb. Genişmiqyaslı xeyriyyəçilik fəaliyyətinə, bəşəriyyətin ali ideallarına xidmət sahəsində yüksək nailiyyətlərinə görə **"Qızıl ürək"** beynəlxalq mükafatı, Mərhum Polşa prezidenti Lex Kaçinski tərəfindən Azərbaycanla Polşa arasında dostluq münasibətlərinin inkişafındakı xidmətlərinə görə **"Xidmətlərə görə"** Böyük Komandor Xaçı ordeni, Fransanın eks-prezidenti Nikolya Sarkozinin sərəncamı ilə **"Şərəf Legionu"** ordeninin zabit dərəcəsi ilə təltif edilməsi və digər belə mükafatlar Onun fəaliyyətinin real qiymətidir.

Fəaliyyətinə görə təqdim olunan mükafatların davamı olaraq onun Pakistanın nüfuzlu **"Daily times"** qəzeti və Qadın Könüllülər Təşkilatının **"Humanizm simvolu-2012-ci ilin adamı"** elan edilməsi də bəşəri, humanizm prinsiplərini yüksək tutmasına söykənir. Mehriban xanım bu ada Heydər Əliyev Fondunun 2012-ci ildə Pakistanın bütün əyalətlərində keçirdiyi humanitar aksiyalara, o cümlədən, təhsil və səhiyyə sahəsində işlərə görə layiq görülüb. Qeyd edək ki, Mehriban xanım Əliyevanın təşəbbüsü və dəstəyi ilə Pakistanda bir sıra layihələr gerçəkləşib. Belə ki, 2007-ci ildə Pakistanın zəlzələdən zərər çəkən Müzəffərabad şəhərində qızlar məktəbi tikilib, həmin məktəb əsaslı təmir edilib, orada yenidənqurma işləri aparılıb. Bu və ya digər gördüyü işlər onu **"Humanizm simvolu-2012-ci ilin adamı"** elan edib. Mehriban xanım Əliyeva qarşıya qoyduğu məqsədə doğru daim addımlayır. Özünü, özünün kimliyini gördüyü işlərlə təsdiqləyir və fərdi dəyərlərini ortaya qoyaraq həyat missiyasını gerçəkləşdirir, Azərbaycan tarixinə silinməz izləri, əməlləri ilə həkk olunur. Bu gün gözəl Bakımızda Beynəlxalq Muğam Mərkəzinin yaradıldı, Azərbaycanın qədim musiqisi olan əsrarəngiz muğam musiqisinin UNESCO-nun qeyri-maddi irs siyahısına salındı. Mehriban xanımın rəhbərliyi ilə hazırlanan və məşhur muğam ustalarının valehedici ifalarının toplandığı **"Qarabağ xanəndələri"** albomu bu gün bütün dünyada onu sadəcə bircə dəfə dinləyənləri cazibəsindən buraxmır, heyran qoyur.

Mehriban xanım Əliyevanın UNESCO xətti ilə keçirilən tədbirlər çərçivəsində Azərbaycanın Ermənistan tərəfindən işğal olunmuş ərazilərinə, həmin ərazilərdə Azərbaycan xalqına məxsus tarixi, mədəni və dini abidələrin dağıdılmasına toxunmayan bir çıxışını belə xatırlamaq çətindir. O, Azərbaycan həqiqətlərinin dünyaya çatdırılması istiqamətində böyük işlər görür. Dünyanın demək olar ki, bir çox dillərində **"Azərbaycan həqiqətləri"** adlı kitablar nəşr olunub ki, burada Qarabağın tarixi, Ermənistanın Azərbaycan ərazilərini işğal etməsi, Xocalıda törətdikləri soyqırım, erməni terror təşkilatlarının dinc azərbaycanlılara, türk insanına qarşı vəhşilikləri barədə geniş məlumatlar öz əksini tapır. Bundan başqa Heydər Əliyev Fondu Ermənistanın Xocalı şəhərində törətdiyi soyqırımı dünya ictimaiyyətinə çatdırmaq üçün bir neçə dildə film də hazırlamışdır. Dünyanın bir çox ölkələrində fondun dəstəyi ilə Xocalı soyqırımının ildönümündə böyük tədbirlər keçirilir, Xocalı soyqırımını anladan foto və **"Xocalı uşaqların gözü ilə"** adlı rəsm sərgilər nümayiş olunur. Həmin dövrdə bu soyqırımla bağlı dünyanın kütləvi informasiya vasitələri jurnalistlərinin şahidi olduqları materiallardan, onların məqalələrindən ibarət sərgi də dünya ictimaiyyətinin diqqətinə çatdırılır. Mehriban Əliyevanın rəhbərlik etdiyi fond erməni yalanlarını, Azərbaycan həqiqətlərini, Ermənistanın işğal etdiyi ərazilərdə törətdiyi vəhşilikləri bütün insanlığa məxsus olan dini, tarixi və mədəni abidələrin dağıdılmasını özündə əks etdirən çoxlu sayda kitablar nəşr etdirərək təkcə Azərbaycana deyil, dünya ictimaiyyətinə doğru məlumatların çatdırılması istiqamətində böyük işlər görür.

Ümumiyyətlə, Mehriban xanım Əliyevanın keçdiyi həyat yoluna nəzər saldıqda qısa zaman ərzində gördüyü böyük işlər insanı valeh edir. Bu, sadəcə **SEÇİLMİŞLƏRƏ** verilən bir istedad, ağıl və güc sayəsində mümkündür. Bütün bu əhəmiyyətli faktorlar isə Mehriban xanım Əliyevanın xarizmasında mövcuddur. Bu ali mövcudluq Azərbaycanın adının daha da uca tutulmasında müstəsna rol oynayır.

## Nəcib və xeyirxah missiyanın daşıyıcısı

***Mehriban Əliyeva: "Mən əminəm ki, cəmiyyətdə bütün ağır, çətin problemləri xeyirxahlıqla, insansevərliklə, mərhəmətlə həll etməyə çalışmaq lazımdır"***

Öz müdrikliyi, nüfuzu və zəkası, eləcə də incəlik və qətiyyəti ilə Vətəninin, millətinin qeyrətini çəkən, onun inkişafı naminə fədakarcasına mübarizə aparan Azərbaycan qadınları əsrlər boyu buraxdıqları izlərlə bu gün də şanlı tariximizdə yaşamaqdadırlar. Tarix boyu sübut olunmuşdur ki, Azərbaycan qadını cəmiyyətdə yalnız ailə mühiti ilə məhdudlaşmayıb, o cümlədən, ictimai həyatda da daim fəal olduqlarından layiqli mövqeyə sahiblik edib.

***Səmərəli fəaliyyət, yorulmaz missiya***

Ümumiyyətlə, Mehriban xanım Əliyevanın ictimai-siyasi fəaliyyətinə diqqət yetirsək, bu kimi əhəmiyyətli məqama layiq olan şəxs məhz Mehriban xanım Əliyevadır. Çünki, o, fəaliyyəti müddətində gördüyü bütün işləri və reallaşdırdığı nəhəng layihələri ilə həmin məqamı kifayət qədər təsdiqləmiş olur. Bütün sahələrdə əməyi olan Azərbaycan xanımı dövlətçilik ənənələrinin möhkəmlənməsində əvəzsiz, müstəsna rola malikdir.

Mehriban xanım Əliyevanın ali dəyərlərə söykənən, Azərbaycan xalqı və dövlətinin maraqlarını əks etdirən fəaliyyətindən bəhs edərkən, ilk növbədə, onun rəhbərlik etdiyi Heydər Əliyev Fondunun ölkəmizin inkişafına verdiyi töhfələrə, sərgilədiyi çoxşaxəli fəaliyyətə diqqət yetirmək gərəkdir. Məlum olduğu kimi, 2004-cü il may ayının 10-da fəaliyyətə başlayan Heydər Əliyev Fondu yaradılarkən Ümummilli Lider Heydər Əliyevin zəngin irsini öyrənməyi, təbliğ etməyi, onun Azərbaycanın sosial-iqtisadi və mədəni tərəqqisinə yönəlmiş genişmiqyaslı fəaliyyəti barədə gələcək nəsillərdə əyani təsəvvür yaratmağı, dahi şəxsiyyətin müəllifi olduğu beynəlxalq layihələrin həyata keçirilməsini dəstəkləməyi, həmçinin, Azərbaycanın mədəniyyətinin və tarixinin dünyada daha geniş tanıdılması ilə bağlı aparılan işlərə kömək göstərməyi qarşısına məqsəd qoyub. Bu gün tam əminliklə deyə bilərik ki, Mehriban xanım Əliyevanın rəhbərlik etdiyi Heydər Əliyev Fondu Ulu Öndərin ideyalarını böyük

əzmlə və sədaqətlə həyata keçirir. Bir sözlə, Heydər Əliyev Fondunun fəaliyyəti ölkənin ictimai həyatının bütün sahələrini əhatə edir. Xüsusi olaraq, Fondun dəstəyi ilə 2007-ci ildən başlayaraq hər il müxtəlif ölkələrdə Xocalı faciəsinə həsr olunmuş konfranslar, tədbirlər keçirilir, bu istiqamətdə xüsusi təbliğat aparılır. Aksiyalarda "Xocalı soyqırımı" filmi, ermənilərin Xocalıda törətdikləri vəhşilikləri əks etdirən fotoşəkillər, müxtəlif illərdə xarici ölkələrin nüfuzlu nəşrlərində Xocalı faciəsi haqqında dərc edilmiş materiallar, “Qarabağ həqiqətləri” adlı bukletlər və “Azərbaycana qarşı müharibə: mədəni irsin hədəfə alınması” kitabı təqdim olunur.

Xüsusilə Fondun vitse-prezidenti Leyla Əliyevanın təşəbbüsü ilə yaradılan "Xocalıya ədalət!" beynəlxalq kampaniyası bu istiqamətdə atılan ən önəmli addımlardandır. Təsadüfi deyil ki, məhz bu kampaniyaya start veriləndən sonra bir sıra ölkələrin parlamentləri Xocalı soyqırımının tanınması ilə bağlı qərarlar qəbul edib, ayrı-ayrı dövlətlərdə Xocalı soyqırımı abidələri qoyulub.

Mehriban xanım Əliyevanın çoxşaxəli fəaliyyətindən bəhs edərkən onun Azərbaycan mədəniyyətinin inkişafı üçün göstərdiyi xidmətləri xüsusi olaraq vurğulamaq lazımdır. Çünki Azərbaycanın birinci xanımı ölkəmizin müstəqilliyinin ilk dövrlərindən etibarən milli mədəniyyətimizin qorunması və inkişafı istiqamətində geniş fəaliyyət göstərir. Bundan başqa, xüsusi olaraq vurğulamaq lazımdır ki, Azərbaycan mədəniyyətinin dünyada təbliğində, eləcə də, mədəniyyətlərarası dialoqun genişləndirilməsində Heydər Əliyev Fondunun BMT-nin ən mötəbər qurumlarından olan UNESCO ilə əlaqələri xüsusi yer tutur. Mehriban xanım Əliyevanın UNESCO ilə əməkdaşlıq çərçivəsindəki fəaliyyəti müxtəlif ölkələrlə mədəni əlaqələrin gücləndirilməsi, sivilizasiyalararası dialoqun genişləndirilməsi yönündə mühüm nailiyyətdir. Bu məqamda qeyd edək ki, məhz Prezident İlham Əliyevin və UNESCO-nun və ICESCO-nun xoşməramlı səfiri Mehriban xanım Əliyevanın səmərəli fəaliyyətinin nəticəsi olaraq muğam və aşıq sənəti, tar ifaçılıq sənəti, eləcə də, Azərbaycan xalçası UNESCO-nun qeyri-maddi mədəni irs siyahısına daxil edilib.

Onu da qeyd edək ki, bütün dünya, o cümlədən Azərbaycan Respublikası COVID-19 pandemiyası ilə hərtərəfli mübarizə dövrünü yaşayır. Azərbaycan xalqı və dövləti də tarixi sınaq qarşısındadır. Möhrərəm

Prezidentimiz cənab İlham Əliyevin fors-major vəziyyətdə nümayiş etdirdiyi unikal idarəçilik mədəniyyəti, operativ reaksiya qabiliyyəti, preventiv, ardıcıl və sistemli qərarlar qəbul etmək məharəti "taclı virus müharibəsi"ndə taktiki qələbəmizi təmin etmiş və strateji zəfər üçün münbit şərait yaratmışdır. Bu mübarizədə situativ qərarların qəbulu, mərhələli sərtləşmə və yumşalma tədbirlərinin sinxron yerdəyişməsinin tətbiqi insanlarımızın həyatının qorunması kimi ali məqsədə xidmət etməkdədir.

Azərbaycan xalqı xoşbəxtdir ki, insanlıq, ləyaqət, səmimiyyət, mərhəmət, nəciblik və şəfqət kimi ali insani dəyərlərin daşıyıcısı olan ölkəmizin Birinci vitse-prezidenti Mehriban xanım Əliyeva ali rəhbərimizin gücünə güc qatır, onun insanların rifahı naminə gördüyü müstəsna fəaliyyəti misilsiz xidmətləri ilə zənginləşdirir. Mərhəmətli Mehriban xanım Əliyeva dəfələrlə ölkə vətəndaşlarına həm Birinci vitse-prezident, həm də bir ana olaraq müraciət edərək, onların sağlamlığının hər şeydən dəyərli olduğunu vurğulamış, eyni zamanda, insanlara mənəvi dəstək olaraq böyük inam hissi ilə bildirmişdir: "Əminəm ki, müdrük xalqımızın ən gözəl xüsusiyyətləri, ruh yüksəkliyi və mərdlik, mərhəmət və şəfqət, inam və məhəbbət sayəsində biz birlikdə bu ciddi çağırışın öhdəsindən gələcəyik. Sizə can sağlığı və uzun ömür arzulayıram!".

Ölkəmiz təkcə bütün dünyanı hədəfə alan COVID-19 pandemiyası ilə sınağa çəkilməmişdir, eyni zamanda ötən ilin 27 sentyabr tarixində faşizm və terrorizm ideologiyasını dövlət siyasəti səviyyəsinə yüksəldən Ermənistanın növbəti və iri miqyaslı hərbi təxribatının hədəfinə çevrildi. Başlanan Vətən müharibəsində müzəffər Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi altında şanlı ordumuz 44 gün ərzində Emənistan rəhbərliyini kapitulyasiya aktını imzalamağa məcbur etdi. Nəticədə bölgədə yeni tarixi reallıqlar formalaşmışdır. Ərazi bütövlüyümüz bərpa edilmiş, beynəlxalq hüququn uzun müddət ərzində Ermənistan tərəfindən məhəl qoyulmayan prinsipləri işlək vəziyyətə gətirilmişdir. İşğaldan azad olunmuş bütün torpağlarımızın bərpası və yenidənqurulması mərhələsi başlanmışdır. Həm Vətən müharibəsi, həm də ondan sonrakı tarixi mərhələlərdə ölkəmizin Birinci vitse-prezidenti Mehriban Əliyeva Prezident İlham Əliyevin ən yaxın məsləkdaşı olaraq Ermənistanın insanlıq əleyhinə hərbi cinayətləri ilə bağlı dəfələrlə beynəlxalq ictimaiyyətə müraciətlər et-

mişdir. Eyni zamanda, Birinci vitse-prezident Mehriban Əliyeva soydaşlarımızı müqəddəs torpaqlarımızın işğaldan azad olunduğu tarixi dövrün qürurlu vətəndaşları olaraq, həmin torpaqların, xüsusilə də təkrarsız və bənzərsiz Şuşa şəhərinin bərpası və cənnətə çevrilməsi kimi növbəti tarixi vəzifənin icrası naminə daha da səfərbər olmağa və bu taleyüklü prosesə konkret töhfələr verməyə dəvət etmişdir. Bu, zamanın çağırışıdır!

### *Böyük zəhmətlərə söykənən önəmli təltiflər*

Hər bir azərbaycanlı üçün fərəhlidir ki, Azərbaycanın birinci xanımı Mehriban xanım Əliyevanın fəaliyyəti beynəlxalq səviyyədə diqqətdədir. Onun gördüyü işlər cavabsız qalmamış, dünya dövlətləri, nüfuzlu təşkilatlar tərəfindən müxtəlif adlara, mükafatlara layiq görülmüşdür.

Bunların sırasında "Heydər Əliyev" ordeni və Heydər Əliyev mükafatı (Azərbaycan Respublikası), "Şərəf legionu" ordeni (Fransa Respublikası), "Xidmətlərə görə" Böyük Komandor Xaçı Ordeni (Polşa Respublikası), "Hilal-e Pakistan" ali ordeni (Pakistan İslam Respublikası), "Sreten" ordeni (Serbiya Respublikası), "Macarıstanın Xidmətlərə görə Komandor Xaçı" ordeni (Macarıstan Respublikası), "Həştərxan vilayəti qarşısında xidmətlərinə görə" ordeni (Rusiya Federasiyası), UNESCO-nun "Qızıl Motsart" medalı, BMT-nin Ümumdünya Əqli Mülkiyyət Təşkilatının qızıl medalı, Krans Montana Forumunun qızıl medalı və "Prix de la Fondation" mükafatı, Avropa Olimpiya Komitəsinin Ali Ordeni, Küveyt Dövlətinin Fəxri diplomu, Dünya Səhiyyə Təşkılatı İcraiyyə Komitəsinin "Ana, uşaq və ailənin sağlamlığının qorunması və möhkəmləndirilməsində müstəsna xidmətlərinə görə" mükafatı, "Qızıl ürək" beynəlxalq mükafatı, Beynəlxalq Olimpiya Akademiyasının "Olympic Excellence" xüsusi fəxri mükafatı, Türk-Alman Dostluq Federasiyasının fəxri mükafatı, Rusiya Federasiyasının İ.M.Seçenov adına Birinci Moskva Dövlət Tibb Universitetinin Fəxri professoru, Bolqarıstanın Müqəddəs Kiril və Mefodi adına Veliko Tırnovo Universitetinin Fəxri doktoru adını, habelə Rusiya Federasiyasının Prezidenti Vladimir Putinin imzaladığı fərmanla "Dostluq" ordenini göstərmək olar. (7) Misilsiz və fədakar zəhmətə verilən bu mükafatlar nə qədər dəyərli olsa da, hörmətli Mehriban xanım üçün ən qiymətli mükafat ümumxalq sevgisi və məhəbbətidir. Elə məhz bu səbəbdəndir ki, birinci xanım xalqa müraciətlərinin sonunu "Sizin Mehriban" ifadəsi ilə

yekunlaşdırır. Bu ifadə Mehriban xanımım adı ilə harmoniyada yaşadığını, xalqı ilə səmimi ünsiyyətdə və ülviyyətdə olduğunu təsdiqləyir.

Çoxşaxəli fəaliyyətində yorulmaq bilmiyən Mehriban xanım Əliyeva hər gördüyü işdən ilhamlanır, yeni bir layihənin icrası qarşıya qoyulur. Azərbaycanınn birinci xanımı demişdir: “İnsan gördüyü işin haqlı, xeyirli və lazımlı olduğuna daxilən inandıqda həvəslə işləyir, fiziki yorğunluq isə mənəvi məmnunluqla ödənilir”.

Prezident İlham Əliyev və onun ən yaxın məsləkdaşı olan Birinci vitse-prezident Mehriban Əliyevanın münaqişənin həlli yolları ilə bağlı mövqeyi dəyişməzdir. Həmin mövqeyə görə, Azərbaycan dövləti münaqişənin beynəlxalq hüquq prinsipləri əsasında, ölkəmizin ərazi bütövlüyü çərçivəsində və Qarabağ ermənilərinə respublikamızın hüdüdları daxilində ən yüksək muxtariyyət statusu verilməsi yolu ilə həllini dəstəkləyir. Azərbaycan üçün bu çərçivədən kənarda hər hansı bir həll yolu qəbuledilməzdir. Münaqişənin həlli ilə bağlı bu yanaşma tərzi Azərbaycanın prinsipial mövqeyinin ifadəsidir.

Mehriban xanım Əliyevanın çoxşaxəli fəaliyyəti xalqa xidmət, millli və ümumbəşəri dəyərlərə hörmət nümunəsi olmaqla humanizm və vətənpərvərlik prinsiplərinə əsaslanır.

Bax, belə bir mühitdə dünyagörüşü formalaşan, milli-mədəni düşüncəsi zənginləşən Mehriban xanım Əliyeva öz səmərəli, çoxşaxəli, zəngin fəaliyyəti ilə Azərbaycanda qadın hərəkatını canlandıraraq, tarixdə yeni bir mərhələnin əsasını yaradıb. Bununla həm də Azərbaycan qadınının cəmiyyətdəki yeri, nüfuzu, işgüzarlığı, dövlətə layiqli xidmət missiyası barədə beynəlxalq aləmə dövlətimizin bu sahədəki mövqeyni çatdırıb.

Beləliklə, Mehriban xanım Əliyeva müxtəlif dövrlərdə müdrikliyi və qəhrəmanlığı ilə seçilən Azərbaycan qadınlarının şərəfli ənənələrini yaşadaraq, zənginləşdirib, mədəniyyətin, incəsənətin, elmin bir sıra sahələrində ilklərə imza ataraq, sivil işgüzarlığı, intellektual potensialı ilə beynəlxalq ictimaiyyətdə böyük nüfuz qazanıb.

Azərbaycan Respublikasının Birinci vitse-prezidenti xanım Mehriban Əliyeva dövlət müstəqilliyimizin möhkəmləndirilməsi, milli maraqların qorunmas və ölkəmizin ərazi bütövlüyünün bərpası naminə bütün imkanların səfərbər edilməsi, vətəndaş həmrəyliyinin, xalq-iqtidar birliyi-

nin sarsılmazlığının təmin edilməsində yüksək təşkilatçılıq və təşəbbüskarlıq bacarıqlarına malikdir. İstər 2016-cı ilin 4 günlük Aprel döyüşləri zamanı, istərsə də Azərbaycanın Zəfər tarixi olan 44 günlük Vətən müharibəsi dövründə Mehriban xanım Əliyevanın fəaliyyəti müstəsna əhəmiyyətə malikdir. Vətən müharibəsi günlərində Ali Baş Komandan İlham Əliyevdən yeni qələbə müjdələri, Mehriban Əliyevanın sosial şəbəkələrdəki paylaşımları qəhrəman əsgər və zabitlərimizin, bütövlükdə xalqımızın ruh yüksəkliyini artırmışdır.

Bu gün isə işğaldan azad edilmiş doğma torpaqlarımıza Prezident İlham Əliyevin səfərləri, həmin yerlərin bərpası ilə bağlı görüləcək işlər haqqında xoş xəbərləri də xalqımız Mehriban xanım Əliyevadan gözləyir. Mehriban xanım Əliyeva isə bu məlumatları böyük səmimiyyət və sevinclə xalqımızla bölüşərək dövlətimizin və xalqımızın bütövlüyünü daha da möhkəmləndirir. Bir sözlə, Mehriban Əliyevanın xalqının təhlükəsiz və xoşbəxt gələcəyi üçün həyata keçirdiyi bütün layihələr millətimizin uğur tarixinin bünövrəsini möhkəmləndirir.

Bütün Azərbaycan xalqı inanır ki, müasir Azərbaycan tarixinin banisi, Ümummilli Lider Heydər Əliyevin siyasi kursunun layiqli davamçısı, ölkə Prezidenti cənab İlham Əliyevin ən yaxın silahdaşı, xalqımızın sevimlisi Mehriban xanım Əliyeva xeyriyyəçilik, insansevərlik, mərhəmət, Azərbaycan xalqının mentalitetinə, mədəniyyətinə, düşüncəsinə, əsrlərdən bəri formalaşan ənənələrimizə xas olan ən gözəl keyfiyyətləri bundan sonra da davam etdirməyə çalışacaq. Çünki Mehriban xanım Əliyeva xalqımızın firavanlığı və qüdrətli dövlətimizin tərəqqisini naminə çoxşaxəli fəaliyyəti ilə Prezident İlham Əliyevin və ona inanan, böyük ümidlər bəsləyən insanların etimadını doğrultmağı bacarıb.

## Şəfqət, humanist, mərhəmət, xeyirxahlıq və nəcib əməllər sahibi

Keçdiyi mənalı ömür yolu, yüksək humanizmi, xeyirxahlığı və nəcibliyi, bənzərsiz ictimai fəaliyyəti ilə nəinki Azərbaycanda, eləcə də dünyada yüksək ehtiram sahibi olan ölkəmizin birinci xanımı - Birinci vitse-prezident Mehriban Əliyeva tariximizin şanlı salnaməsinə öz dəst-xətti ilə daxil olan, xeyirxah əməlləri ilə xalqının sevimlisinə çevrilən Heydər Əliyev Fondunun prezidenti olaraq Azərbaycan qadınına xas olan ən gözəl xüsusiyyətləri özündə cəmləşdirən nəciblik missiyasını şərəflə yerinə yetirir.

Birinci vitse-prezident Mehriban Əliyeva deyir: "Şəfqət, mərhəmət, humanizm, səxavət, xoş əməllər etmək, köməyə ehtiyacı olanın yanında olmaq kimi keyfiyyətlər həmişə bizim ən mühüm həyati dəyərlərimiz olmuşdur və bu gün də belədir".

Bəli, bu gün bütövlükdə dünyanın, insanlığın bəlkə ən çox ehtiyac duyduğu məsələ şəfqət, xeyirxahlıq və mərhəmətdir. Xeyirxahlığına, yüksək bacarığına, diqqət və qayğısına görə hamının hörmətini, məhəbbətini qazanmış Mehriban xanım Əliyevanın ölkəmizin ictimai-siyasi və mədəni həyatındakı rolu, mühüm xidmətləri danılmazdır. Əlbəttə ki, bu xeyirxahlıqdan, nəcib əməllərdən, sosial layihələrdən danışarkən Mehriban Əliyevanın 2004-cü ildən bəri rəhbərlik etdiyi Heydər Əliyev Fondunun fəaliyyətini xüsusi qeyd etməmək mümkün deyil. Artıq 19 ildir ki, əsasında mərhəmət, şəfqət, xeyirxahlıq kimi ali dəyərlər dayanan Heydər Əliyev Fondu öz prinsiplərinə sadiq qalaraq, təhsil, səhiyyə, mədəniyyət, idman, elm və texnologiya, ekologiya, sosial və digər sahələrdə müxtəlif layihələr həyata keçirir. Ümumiyyətlə, Mehriban xanım Əliyevanın ictimai-siyasi fəaliyyətinə diqqət yetirsək bu kimi əhəmiyyətli məqama layiq olan şəxs, məhz Mehriban xanım Əliyevadır. Çünki O, fəaliyyəti müddətində gördüyü bütün işləri ilə, reallaşdırdığı nəhəng layihələri ilə həmin məqamı kifayət qədər təsdiqləmiş olur.

Belə ki, fevralın 6-da Türkiyədə baş verən dəhşətli zəlzələ nəticəsində çoxlu sayda insan tələfatının olması ölkəmizdə də böyük kədərlə qarşılandı. Qardaş ölkədən gələn acı xəbər Azərbaycan xalqını və dövlətini dərin kədərə boğdu. Azərbaycan Prezidenti İlham Əliyev fevralın 6-da Türkiyə Prezidenti Rəcəb Tayyib Ərdoğana zəng edərək, Türkiyədə

baş vermiş zəlzələ nəticəsində çoxsaylı insan tələfatı və dağıntılarla bağlı xəbərin Azərbaycanı çox sarsıtdığını bildirdi. Prezident İlham Əliyev Türkiyə xalqına şəxsən öz adından və xalqımız adından başsağlığı çatdırdı, yaralananların tezliklə şəfa tapmasını dilədiyini bildirdi. Azərbaycan Prezidenti onu da vurğuladı ki, Azərbaycan və Türkiyə hər zaman bir-birinin yanındadır. Bu, bir daha iki qardaş ölkənin liderlərinin həmrəyliyinin, "bir millət, iki dövlət" olduğunun nümayişi idi: "Mən əziz qardaşım, cənab Prezidentə telefonla başsağlığı vermək üçün zəng edəndə dedim ki, bütün varlığımızla biz Sizinlə bir yerdəyik və bilirsiniz ki, durmadan heyətlər göndərilir. Eyni zamanda, həkimlər, xilasedicilər, könüllülər göndərilir və göndəriləcəkdir. Çox böyük bəladır, böyük faciədir. Günahsız insanlar həlak olublar, yaralanıblar. Bilirsiniz ki, Azərbaycan hər zaman olduğu kimi, ilk dəqiqələrdən, ilk saatlardan qardaş Türkiyənin yanında idi və öz dəstəyimizi, öz həmrəyliyimizi həmişə olduğu kimi nümayiş etdirmişik. Əgər bu acı faciənin fəsadlarının aradan qaldırılmasına bir balaca kömək edə bilmişiksə, bunu özümüz üçün şərəf bilirik. Hər zaman Türkiyə də bizim yanımızdadır, yaxşı günlərdə, çətin günlərdə".

Elə həmin gün Azərbaycanın Birinci vitse-prezidenti Mehriban xanım Əliyeva da sosial mediada paylaşım edərək Türkiyənin cənub-şərqində baş vermiş güclü zəlzələnin nəticələri barədə xəbərləri dərin kədər hissi ilə qarşıladığını bildirdi. Faciə zamanı həlak olanlara rəhmət diləyən, onların doğmalarına və yaxınlarına dərin hüznlə başsağlığı verən, yaralananların və xəsarət alanların tezliklə şəfa tapmasını arzulayan Mehriban xanım Əliyeva "Türkiyə xalqının kədəri bizim kədərimizdir. Uca Tanrıdan bütün Türkiyə xalqına güc və səbir diləyirəm!", – deyə qardaş Türkiyəyə dəstəyini ifadə etdi. Türkiyə Prezidenti Rəcəb Tayyib Ərdoğanın xanımı Əminə Ərdoğan Azərbaycanın Birinci vitse-prezidenti Mehriban Əliyevaya zəlzələdəki çoxsaylı insan tələfatı ilə bağlı başsağlığına görə təşəkkür etdi.

MEHRİBAN XANIMIN GÖSTƏRİŞİ İLƏ BAŞLAYAN YARDIM KAMPANİYASI AZƏRBAYCANIN HƏR ZAMAN TÜRKİYƏNİN YANINDA OLDUĞUNU BİR DAHA SÜBUT ETDİ

Dünyada olmayan, sərhəd tanımıyan sarsılmaz, əbədi, bir-birinə dayaq, dəstək olan iki qardaş ölkə - Azərbaycan və Türkiyə...Xalqlarımız ağrı-acılarını da, xoş günlərini də birlikdə yaşayır, birlikdə kədərlənib,

birlikdə sevinirlər. Elə bütün çətinliklərə qarşı da daim çiyin-çiyinə mübarizə apararaq birliklərinin gücündən doğan əzmlə qalib gəlirlər.

Bəli, dünya iki qardaş ölkə arasındakı münasibətlərin təmənnasız olduğunu bir daha gördü. 44 günlük Vətən müharibəsində Azərbaycan Türkiyəyə necə güvənirdisə, bu gün Türkiyənin ən çətin günündə də respublikamız qardaş ölkənin yanındadır və kədərinə şərik çıxır. Belə ki, zəlzələnin baş verdiyi ilk gündən insanlarımız isti geyim və yataq dəstlərindən tutmuş maliyyə yardımına qədər əllərindən gələn hər şeylə qardaşlarına dəstək oldular və bu gün də olurlar.

Mehriban xanım Əliyevanın ifadə etdiyi kimi, Azərbaycan xalqı hər zaman birlik və həmrəylik nümayiş etdirir, bir-birinə kömək etməyə hazır olmaq, əl-ələ verərək çətinliklərdən və sınaqlardan birlikdə üzüağ çıxmaq Azərbaycan xalqının ən gözəl xüsusiyyətlərindən biridir. Yüksək mənəvi-əxlaqi dəyərləri, şəfqət, xeyirxahlığı, humanizm prinsiplərinə sədaqəti ilə seçilən Birinci vitse-prezidenti, Heydər Əliyev Fondunun prezident Mehriban xanım Əliyevanın göstərişinə əsasən başladılan yardım kampaniyası Türkiyə-Azərbaycan qardaşlığının əbədi səhifələrindən birinə çevrildi.

Mehriban xanım Əliyevanın göstərişinə əsasən, Türkiyənin zəlzələ bölgəsinə növbəti humanitar yardım təyyarəsi yola düşdü. Budəfəki humanitar yardıma faciədən zərər çəkmiş şəxslər üçün zəruri olan əlavə avadanlıqlar, o cümlədən qızdırıcısı olan çadırlar, generatorlar, istilik radiatorları, çöl üçün qızdırıcılar, dizel yanacaqlı kaloriferlər, həmçinin axtarış-xilasetmə işlərinə dəstək məqsədi ilə ləvazimat və avadanlıqlar daxildir.

Xatırladaq ki, Azərbaycanın birinci xanımının göstərişinə əsasən, fevralın 9-da Türkiyəyə Heydər Əliyev Fondunun ilk humanitar yardım təyyarəsi göndərilib. Fondun qardaş ölkəyə ezam olunan əməkdaşları zəlzələdən zərər çəkmiş şəxslər üçün müxtəlif dərman preparatları, tibbi ləvazimat və avadanlıqlar, isti geyimlər çatdırıb.

Türkiyənin ölkəmizdəki səfirliyinin zəlzələ bölgəsinə yardım göstərilməsi məqsədi ilə Azərbaycan vətəndaşlarına çağırışına qoşulan Heydər Əliyev Fondunun "Regional İnkişaf" İctimai Birliyi fevralın 8-dən humanitar kampaniyaya start verib. Bu kampaniya çərçivəsində vətəndaşlardan toplanan humanitar yardımlar da Heydər Əliyev Fondunun dəstəyi ilə zəlzələ bölgəsinə çatdırılır.

Mehriban Əliyeva Türkiyədəki zəlzələdən zərər çəkənlərə humanitar yardımla bağlı deyir: “Əziz həmvətənlər! Hər zaman birlik və həmrəylik nümayiş etdirərək bir-birinə kömək etməyə hazır olmaq, əl-ələ verərək çətinliklərdən və sınaqlardan birlikdə üzüağ çıxmaq Azərbaycan xalqının ən gözəl xüsusiyyətlərindən biridir. Qardaş Türkiyədə baş vermiş dəhşətli zəlzələnin ilk saatlarından Türkiyə xalqına göstərdiyiniz dəstək xalqlarımız arasında qardaşlıq, dostluq münasibətlərinin. qarşılıqlı sevginin sarsılmazlığının, möhkəmliyinin, əbədiliyinin növbəti əyani sübutudur”.

Qeyd edək ki, zəlzələ bölgəsinə səfər edən Türkiyə Prezidenti Rəcəb Tayyib Ərdoğan Qaziantep hava limanında qardaş ölkəyə humanitar yardım aparan Fond əməkdaşları ilə görüşüb. Baş vermiş faciə ilə əlaqədar Heydər Əliyev Fondunun prezidenti Mehriban Əliyevanın başsağlığını çatdıran Fondun nümayəndəsi bu günlərdə bütün Azərbaycan xalqının, ölkənin bütün təşkilatlarının qardaş ölkə üçün zəruri yardımların göstərilməsi naminə səfərbər olduğunu bildirib.

Azərbaycan dövləti və xalqının Türkiyədəki faciə ətrafında səfərbər olmasına görə təşəkkürünü bildirən Rəcəb Tayyib Ərdoğan deyib: “İlham qardaşıma, Mehriban bacıma öz adımdan, millətim adımdan çox təşəkkür edirəm!”.

Azərbaycanda xalqının zəlzələ qurbanları üçün humanitar yardıma qoşulmasından, göndəriləcək yardımlar barədə məlumatlı olduğunu deyən Rəcəb Tayyib Ərdoğan Vətən müharibəsi zamanı Türkiyənin Azərbaycanın yanında olduğu kimi, indi də belə çətin gündə Azərbaycanın Türkiyənin yanında olduğunu bildirib. “Öz adımdan, ailəm və xalqımız adından minnətdarlıqlarımı çatdırıram. Biz tək bu gün deyil, ölənədək birlikdə olacağıq. Bir millət, iki dövlət olaraq yola davam edəcəyik!”

Biz bir millət iki dövlət olaraq yola davam edəcəyik!. Hər bir azərbaycanlı da Mehriban xanım Əliyevanın qardaş ölkəyə xitabən dediyi “Türkiyə, səninləyik!” sözlərinə həmrəydir və bu həmrəylik, qardaşlıq əbədi davam edəcək. Və yardım kampaniyası da Azərbaycanın hər zaman Türkiyənin yanında olduğunu, Türkiyə-Azərbaycan dostluğunu, sarçılmaz qardaşlığının göstəricisidir. Və bu kimi zəlzələlər, dağıntılar Türk xalqını sarsıda bilməz. Dostlarının, qardaşlarının dəstəyi ilə, xalqının birliyi ilə, iqtidarının səyi ilə Türkiyə yenə də ayaqda duracaq!!!

# Ən uca zirvələrə layiq LİDER XANIM

**MEHRİBAN ƏLİYEVA: "İllər ötdükcə, qarşımıza yeni ideya və planlar çıxdıqca, məqsədlərimiz xaraktercə dəyişir, amma əsas amalımız – Azərbaycan xalqına xidmət etmək amalı dəyişməz olaraq qalır və qalacaqdır"**

Onu hamı sevir... Vətəninə və xalqına sonsuz məhəbbətinə görə... .Çünki bütün sahələrdə öz əməlləri ilə xalqımızın dərin etimadını qazanmış Birinci vitse-prezident Mehriban xanım Əliyevanın həyata keçirdiyi fəaliyyət, gördüyü işlər ən gözəl nümunələrdir.

Bəli, xalq onu sevir və ona inanır. Ona görə ki, Mehriban xanım Əliyevanın sayəsində cəmiyyətin sosial həyatında xeyriyyəçilik ənənələri canlanıb. Mehriban xanım Əliyevanın ali dəyərlərə söykənən, Azərbaycan xalqı və dövlətinin maraqlarını əks etdirən fəaliyyətindən bəhs edərkən, ilk növbədə, onun rəhbərlik etdiyi Heydər Əliyev Fondunun ölkəmizin inkişafına verdiyi töhfələrə, sərgilədiyi çoxşaxəli fəaliyyətə diqqət yetirmək gərəkdir. Məlum olduğu kimi, 2004-cü il may ayının 10-da fəaliyyətə başlayan Heydər Əliyev Fondu yaradılarkən Ümummilli Lider Heydər Əliyevin zəngin irsini öyrənməyi, təbliğ etməyi, onun Azərbaycanın sosial-iqtisadi və mədəni tərəqqisinə yönəlmiş genişmiqyaslı fəaliyyəti barədə gələcək nəsillərdə əyani təsəvvür yaratmağı, dahi şəxsiyyətin müəllifi olduğu beynəlxalq layihələrin həyata keçirilməsini dəstəkləməyi, həmçinin, Azərbaycanın mədəniyyətinin və tarixinin dünyada daha geniş tanıdılması ilə bağlı aparılan işlərə kömək göstərməyi qarşısına məqsəd qoyub.

Bu gün tam əminliklə deyə bilərik ki, Mehriban xanım Əliyevanın rəhbərlik etdiyi Heydər Əliyev Fondu Ulu Öndərin ideyalarını böyük əzmlə və sədaqətlə həyata keçirir. Bir sözlə, Heydər Əliyev Fondunun fəaliyyəti ölkənin ictimai həyatının bütün sahələrini əhatə edir. Xüsusi olaraq, Fondun dəstəyi ilə 2007-ci ildən başlayaraq hər il müxtəlif ölkələrdə Xocalı faciəsinə həsr olunmuş konfranslar, tədbirlər keçirilir, bu istiqamətdə xüsusi təbliğat aparılır. Aksiyalarda "Xocalı soyqırımı" filmi, ermənilərin Xocalıda törətdikləri vəhşilikləri əks etdirən fotoşəkillər, müxtəlif illərdə xarici ölkələrin nüfuzlu nəşrlərində Xocalı faciəsi haqqında dərc edilmiş materiallar, "Qarabağ həqiqətləri" adlı bukletlər və "Azərbaycana qarşı müharibə: mədəni irsin hədəfə alınması" kitabı təqdim olunur.

Xüsusilə Fondun vitse-prezidenti Leyla Əliyevanın təşəbbüsü ilə yaradılan "Xocalıya ədalət!" beynəlxalq kampaniyası bu istiqamətdə atılan ən önəmli addımlardandır. Təsadüfi deyil ki, məhz bu kampaniyaya start veriləndən sonra bir sıra ölkələrin parlamentləri Xocalı soyqırımının tanınması ilə bağlı qərarlar qəbul edib, ayrı-ayrı dövlətlərdə Xocalı soyqırımı abidələri qoyulub.

Bəli, bu gün Azərbaycan xalqı xoşbəxtdir ki, insanlıq, ləyaqət, səmimiyyət, mərhəmət, nəciblik və şəfqət kimi ali insani dəyərlərin daşıyıcısı olan ölkəmizin Birinci vitse-prezidenti Mehriban xanım Əliyeva ali rəhbərimizin gücünə güc qatır, onun insanların rifahı naminə gördüyü müstəsna fəaliyyəti misilsiz xidmətləri ilə zənginləşdirir.

### *Layiqli xidmət nümunəsi*

“Qadınlar dövlətimizin, dövlətçiliyimizin, müstəqilliyimizin, bu günümüzün, gələcəyimizin dayağıdır". Ulu Öndərimiz Heydər Əliyevə məxsus olan bu dəyərli fikri müstəqil Azərbaycanın həyatında qadınların roluna dövlət səviyyəsində verilən yüksək qiyməti əks etdirir.

Möhtərəm Prezidentimiz cənab İlham Əliyev də qadınların cəmiyyətin inkişafındakı rolunu qiymətləndirərək qeyd edir ki, “Tariximizin hər bir dövründə qadınlarımız cəmiyyətin sarsılmaz mənəvi dayağı olmuş, ölkəmizin bu günkü simasının müəyyənləşməsi üçün böyük fədakarlıqlar göstərmişlər”.

Məhz bu gün Mehriban xanım Əliyevanın Azərbaycan Respublikasının Birinci vitse-prezidenti olaraq fəaliyyət göstərməsi dövlət başçımızın qadınların cəmiyyətin inkişafındakı rolunu qiymətləndirməsinin təsdiqidir. Prezident İlham Əliyevin təşəbbüsü ilə ölkəmizdə həyata keçirilən Konstitusiya islahatları ilə bağlı 2016-cı il sentyabrın 26-ı tarixində baş tutan referendumun nəticələrinə görə Azərbaycanda Birinci vitse-prezidentlik institutu yaradıldı. Prezident İlham Əliyevin islahatlar kursunun təzahürü kimi qiymətləndirilən bu təşəbbüs Azərbaycanın müasir demokratik simasının yeni və mütərəqqi əlamətidir. 2017-ci il fevralın 21-də Prezident İlham Əliyevin imzaladığı Sərəncama əsasən Mehriban Arif qızı Əliyevanın Azərbaycan Respublikasının Birinci vitse-prezidenti təyin olunması xalqımız tərəfindən böyük sevinc hissi ilə qarşılandı. Birinci vitse-prezident kimi ilk çıxışı zamanı Mehriban xanım Əliyeva qeyd etmişdir: "Mən əminəm ki, vəzifədən asılı olmayaraq, insan öz yolunu, peşəsini seçəndə hər hansı bir

işinə, əməyinə vicdanla yanaşmalı, qarşısına aydın məqsədlər qoyub, bu məqsədlərə nail olmağa çalışmalı, söz və işlərində bütöv olmalıdır… Mən sizi əmin edirəm ki, gələcək fəaliyyətimi məhz bu prinsiplər əsasında qurmağa çalışacağam. Ölkəmizin və xalqımızın maraqlarını hər şeydən üstün tutacağam, Azərbaycana layiqincə xidmət etməyə çalışacağam".

Bu gün Mehriban xanım Əliyevanın Azərbaycanın Birinci vitse-prezidenti kimi fəaliyyəti göz qabağındadır. Mehriban xanım mütəmadi olaraq cəmiyyətin ən həssas təbəqələrinin problemlərini həll etməyə, ana nəvazişinə ehtiyac duyan uşaqları sevindirməyə, zəngin mədəniyyətimizi təbliğ etməyə, müxtəlif istiqamətlərdə yeni layihələr reallaşdırmağa böyük səy göstərir. Həmçinin, parlamentin deputatı olduğu zamanlar mütəmadi olaraq seçicilərlə görüşən, daim onların qayğıları ilə maraqlanan, sosial problemlərinin həlli istiqamətində tədbirlər görən Mehriban xanım Əliyeva ədalət, humanizm və insanpərvərlik ideyalarını rəhbər tutaraq ümummilli lider Heydər Əliyevin anadan olmasının 84 illiyi, 2009-cu ildə Novruz bayramı, 2013-cü ildə Heydər Əliyevin 90 illik yubileyi və 2016-cı ildə Respublika Günü münasibətilə amnistiya aktlarının qəbul edilməsi təşəbbüsü onun uğurlu fəaliyyətinin göstəricisidir.

Eyni zamanda, Mehriban xanım Əliyeva YAP-ın Sədr müavini kimi yüksək siyasi potensiala malik olduğunu da əməli fəaliyyətində təsdiqləyib. Belə ki, 2004-cü ildən Yeni Azərbaycan Partiyası Siyasi Şurasının üzvü, 2013-cü ildən partiyanın Sədr müavinidir. 2005 və 2010-cu illərdə Azərbaycan Respublikasının Milli Məclisinə keçirilən seçkilərdə namizədliyi Yeni Azərbaycan Partiyası tərəfindən 14 saylı Xəzər ikinci seçki dairəsindən irəli sürülmüş Mehriban Əliyeva müvafiq olaraq 92,12% (23106 səs) və 94,49% (31797 səs) səs toplayaraq Milli Məclisin deputatı seçilib.

Həmçinin, Mehriban xanım Əliyeva həm də həyat yoldaşına sədaqətli, arxa-kömək olan, üç gözəl, yüksək intellektə, əxlaqa malik övladlara sahib olan bir anadır. Vətən müharibəsində müzəffər Ali Baş Komandan, Prezident İlham Əliyevin rəhbərliyi altında şanlı ordumuz 44 gün ərzində Erməनistan rəhbərliyini kapitulyasiya aktını imzalamağa məcbur etdi. Həm Vətən müharibəsi, həm də ondan sonrakı tarixi mərhələlərdə ölkəmizin Birinci vitse-prezidenti Mehriban xanım Əliyeva Prezident İlham Əliyevin ən yaxın məsləkdaşı olaraq Ermənistanın insanlıq əleyhinə hərbi cinayətləri ilə bağlı dəfələrlə beynəlxalq ictimaiyyətə müraciətlər etmişdir. Eyni

zamanda, Birinci vitse-prezident Mehriban Əliyeva soydaşlarımızı müqəddəs torpaqlarımızın işğaldan azad olunduğu tarixi dövrün qürurlu vətəndaşları olaraq, həmin torpaqların, xüsusilə də təkrarsız və bənzərsiz Şuşa şəhərinin bərpası və cənnətə çevrilməsi kimi növbəti tarixi vəzifənin icrası naminə daha da səfərbər olmağa və bu taleyüklü prosesə konkret töhfələr verməyə dəvət etmişdir. Bu, zamanın şağırışıdır!

Bir millət, iki dövlət olan Azərbaycan-Türkiyə həmişə xoş və kədərli günlərdə bir-birilərinə dəstək olan bu qardaşlıq dünyada görünməyən, sərhəd tanımayan qardaşlıqdır. Məhz fevralın 6-da Türkiyədə baş verən dəhşətli zəlzələ zamanı Azərbaycan hər zaman olduğu kimi, ilk dəqiqələrdən, ilk saatlardan qardaş Türkiyənin yanında oldu. Azərbaycan Prezidenti İlham Əliyev elə ilk dəqiqədə Türkiyə Prezidenti Rəcəb Tayyib Ərdoğana zəng edərək, Türkiyədə baş vermiş zəlzələ nəticəsində çoxsaylı insan tələfatı və dağıntılarla bağlı xəbərin Azərbaycanı çox sarsıtdığını bildirdi və vurğuladı ki, Azərbaycan və Türkiyə hər zaman bir-birinin yanındadır. Bu bir daha iki qardaş ölkənin liderlərinin həmrəyliyinin, "bir millət, iki dövlət" olduğunun nümayişi idi. Elə həmin gün Azərbaycanın Birinci vitse-prezidenti Mehriban xanım Əliyeva da "Türkiyə xalqının kədəri bizim kədərimizdir. Uca Tanrıdan bütün Türkiyə xalqına güc və səbir diləyirəm!", – deyə qardaş Türkiyəyə dəstəyini ifadə etdi.

Çoxşaxəli fəaliyyətində yorulmaq bilməyən Mehriban xanım Əliyeva hər gördüyü işdən ilhamlanır, yeni bir layihənin icrası qarşıya qoyulur. Azərbaycanınn birinci xanımı Mehriban Əliyeva demişdir: "İnsan gördüyü işin haqlı, xeyirli və lazımlı olduğuna daxilən inandıqda həvəslə işləyir, fiziki yorğunluq isə mənəvi məmnunluqla ödənilir".

Bir sözlə, Mehriban xanım Əliyeva öz səmərəli, çoxşaxəli, zəngin fəaliyyəti ilə müxtəlif dövrlərdə müdrikliyi və qəhrəmanlığı ilə seçilən Azərbaycan qadınlarının şərəfli ənənələrini yaşadaraq, zənginləşdirib, mədəniyyətin, incəsənətin, elmin bir sıra sahələrində ilklərə imza ataraq, sivil işgüzarlığı, intellektual potensialı ilə beynəlxalq ictimaiyyətdə böyük nüfuz qazanıb. Azərbaycan xalqı inanır ki, müasir Azərbaycan tarixinin banisi, Ümummilli Lider Heydər Əliyevin siyasi kursunun layiqli davamçısı, ölkə Prezidenti cənab İlham Əliyevin ən yaxın silahdaşı, xalqımızın sevimlisi Mehriban xanım Əliyeva xeyriyyəçilik, insansevərlik,

mərhəmət, Azərbaycan xalqının mentalitetinə, mədəniyyətinə, düşüncəsinə, əsrlərdən bəri formalaşan ənənələrimizə xas olan ən gözəl keyfiyyətləri bundan sonra da davam etdirməyə çalışacaq. Çünki Mehriban xanım Əliyeva Prezident İlham Əliyevin həyata keçirdiyi mütərəqqi islahatların, daxili və xarici siyasətin ən böyük dəstəkçisi və dövlət başçısının ən sadiq silahdaşıdır.

## Vətəninə və xalqına xidmət Birinci vitse-prezident Mehriban Əliyevanın həyat amalıdır

**MEHRİBAN ƏLİYEVA: "Gündəlik fəaliyyətimizdə insansevərlik, mərhəmət, qarşılıqlı hörmət, mehribanlıq unudulmamalıdır. Əksinə, məhz bu mənəvi dəyərləri uca tutaraq ən yüksək qələbələr əldə etmək, ən böyük zirvələrə qalxmaq olar"**

2017-ci il fevralın 21-də Prezident İlham Əliyevin imzaladığı Sərəncama əsasən Mehriban Arif qızı Əliyevanın Azərbaycan Respublikasının Birinci vitse-prezidenti təyin olunması xalqımız tərəfindən böyük sevinc hissi ilə qarşılandı. Birinci vitse-prezidenti kimi ilk çıxışı zamanı Mehriban xanım Əliyeva qeyd etmişdir: "Mən əminəm ki, vəzifədən asılı olmayaraq, insan öz yolunu, peşəsini seçəndə hər hansı bir işinə, əməyinə vicdanla yanaşmalı, qarşısına aydın məqsədlər qoyub, bu məqsədlərə nail olmağa çalışmalı, söz və işlərində bütöv olmalıdır… Mən sizi əmin edirəm ki, gələcək fəaliyyətimi məhz bu prinsiplər əsasında qurmağa çalışacağam. Ölkəmizin və xalqımızın maraqlarını hər şeydən üstün tutacağam, Azərbaycana layiqincə xidmət etməyə çalışacağam".

Mehriban xanım Əliyevanın Azərbaycanın Birinci vitse-prezidenti kimi fəaliyyəti çoxşaxəlidir. O, mütəmadi olaraq cəmiyyətin ən həssas təbəqələrinin problemlərini həll etməyə, ana nəvazişinə ehtiyac duyan uşaqları sevindirməyə, zəngin mədəniyyətimizi təbliğ etməyə, müxtəlif istiqamətlərdə yeni layihələr reallaşdırmağa böyük səy göstərir.

Mehriban xanım Əliyeva yeni təyinatadək ona həvalə olunan bütün vəzifələrin öhdəsindən layiqincə gələrək özünün yüksək təşkilatçılıq qabiliyyətini nümayiş etdirdi. Bu, bir tarixi həqiqətdir ki, vətəni, xalqı üçün çalışan, təmənnasız xeyirxahlığı, humanistliyi həyat amalına çevirən şəxslərin ideyaları, xoş əməlləri gələcək nəsillər üçün nümunəyə çevrilir. Keçdiyi mənalı ömür yolu, yüksək humanizmi, xeyirxahlığı və nəcibliyi, bənzərsiz ictimai fəaliyyəti ilə nəinki Azərbaycanda, eləcə də dünyada yüksək ehtiram sahibi olan ölkəmizin birinci xanımı, Birinci vitse-prezident Mehriban Əliyeva tariximizin şanlı salnaməsinə öz dəstxətti ilə daxil olan belə şəxsiyyətlərdəndir. Xeyirxah əməlləri ilə xalqının sevimlisinə çevrilən Heydər Əliyev Fondunun rəhbəri Azərbaycan qadınına xas olan

ən gözəl xüsusiyyətləri özündə cəmləşdirən nəciblik missiyasını şərəflə yerinə yetirir. Mehriban xanım Əliyeva xeyriyyəçilik fəaliyyəti ilə Azərbaycanda bu sahədə sosial-fəlsəfi təməl yaratmaqla yanaşı, gələcək nəsillərə nəcib bir yolun əsas konturlarını göstərməkdədir.

"Qadının gücü, güc mənbəyi ilk baxışdan çox sadə görünən xeyirxahlıq, sevgi və mərhəmət kimi əbədi duyğulardır". Mehriban xanım Əliyevanın bu sözləri bir daha təsdiqləyir ki, amalı xeyirxahlıq və kömək etmək olan birinci xanımın çoxşaxəli fəaliyyəti cəmiyyətin həyatında müsbət dəyişikliklərin baş verməsinə yönəlib. Onun dediyi kimi: "İllər ötdükcə, qarşımıza yeni ideya və planlar çıxdıqca məqsədlərimiz xaraktercə dəyişir, amma əsas amalımız - Azərbaycan xalqına xidmət etmək amalı dəyişməz olaraq qalır və qalacaqdır".

Bu gün Prezident İlham Əliyevin dövlətçilik ideyalarından güc alan Mehriban xanım Əliyevanın humanizm və insanpərvərlik ideallarını rəhbər tutaraq reallaşdırdığı genişmiqyaslı layihələr onu xalqın sevimlisinə çevirib. Fond, eyni zamanda, Azərbaycan həqiqətlərinin dünya ictimaiyyətinə çatdırılması, ölkəmizin üzləşdiyi təcavüzkarlıq faktının ifşası istiqamətində məqsədyönlü və ardıcıl iş aparır. Fondun dəstəyilə artıq uzun illərdir ki, müxtəlif ölkələrdə Xocalı faciəsinə həsr olunmuş konfranslar, tədbirlər keçirilir, bu istiqamətdə xüsusi təbliğat aparılır. Aksiyalarda ermənilərin Xocalıda törətdikləri vəhşilikləri əks etdirən fotoşəkillər, müxtəlif illərdə xarici ölkələrin nüfuzlu nəşrlərində Xocalı faciəsi haqqında dərc edilmiş materiallar, “Qarabağ həqiqətləri” adlı bukletlər və “Azərbaycana qarşı müharibə: mədəni irsin hədəfə alınması” kitabı təqdim olunur. Fondun vitse-prezidenti Leyla Əliyevanın təşəbbüsü ilə yaradılan "Xocalıya ədalət!" beynəlxalq kampaniyası bu istiqamətdə atılan ən önəmli addımlardandır. Təsadüfi deyil ki, məhz bu kampaniyaya start veriləndən sonra bir sıra ölkələrin parlamentləri Xocalı soyqırımının tanınması ilə bağlı qərarlar qəbul edib, ayrı-ayrı dövlətlərdə Xocalı soyqırımı abidələri qoyulub.

Bundan əlavə, Mehriban xanım Əliyeva yüz illər boyu Azərbaycanda dost və qardaş şəkildə yaşamış müxtəlif dinlərin nümayəndələrinin mədəni özünəməxsusluğunu qoruyub saxlaması, dini ayinlərini sərbəst yerinə yetirməsi üçün ibadət evlərinin bərpası və inşası işində də öndə dayanmışdır. Mərdəkan qəsəbəsindəki XVI əsrə aid "Pir Həsən" ziyarətgahında, Binə

qəsəbəsindəki "Möhsün Səlim" və "İmam Rza", Gəncədəki "Həzrəti Zeynəb", Buzovna qəsəbəsindəki "Cümə" və s. məscidlərdə əsaslı təmir və bərpa işləri həyata keçirmişdir. Davamlı olaraq ölkəmizdəki müqəddəs məkanları, dini ibadət yerlərini ziyarət edən Mehriban xanım Əliyeva bu nəcib fəaliyyəti ilə ölkəmizdə dövlət-din münasibətlərinin daha yaxşı şəkildə qurulması işinə böyük töhfə vermişdir.Birinci vitse-prezident Mehriban xanım Əliyevanın bu günə kimi fəaliyyəti ölkəmizin yüksəlişinə və beynəlxalq nüfuzunun daha da artmasına böyük töhfələr verib. Belə ki, 2021-ci il martın 5-də Yeni Azərbaycan Partiyasının yeni Nizamnaməsinə uyğun olaraq, Yeni Azərbaycan Partiyasının Sədri cənab İlham Əliyevin əmri ilə Mehriban xanım Əliyeva partiya sədrinin birinci müavini təyin edilib.

Həmçinin, Mehriban xanım Əliyevanın Birinci vitse-prezident vəzifəsində 2017-ci il martın 9-da keçirdiyi ilk müşavirədə məhz Bakı və Sumqayıt şəhərlərinin yataqxanalarında müvəqqəti məskunlaşmış qaçqın və məcburi köçkün ailələrinin köçürülməsi məsələsi müzakirə edildi. Birinci vitse-prezidentin yanında keçirilən ilk müşavirədən sonra birinci mərhələdə ən qəzalı binalarda yaşayan 4 min ailənin köçürülməsi üçün tədbirlər planı hazırlandı. Bəhs olunan müşavirədən cəmi bir neçə ay sonra isə - 2017-ci il may ayının 30-da Mehriban xanım Əliyevanın iştirakı ilə Qaradağ rayonunda 1026 məcburi köçkün ailəsi üçün inşa edilən "Ümid" yaşayış kompleksinin təməli qoyuldu. Bundan başqa, çox qısa müddətdə Abşeron rayonunun Masazır, Mehdiabad, o cümlədən Sabunçu rayonunun Ramana qəsəbələrində 470 mənzil məcburi köçkünlərə təqdim edilib. Ötən ilin mayında istifadəyə verilən "Qobu Park" yaşayış kompleksində hər biri 2 bloklu, 9 mərtəbəli, 1026 mənzilli 11 yaşayış binası inşa olunub.

Həmçinin, Mehriban xanım Əliyevanın ölkə Prezidenti İlham Əliyevlə mütəmadi olaraq işğaldan azad olunmuş torpaqlara səfəri bir daha öz Vətəninə, torpağına bağlılığın təcəssümüdür. Azərbaycan ictimaiyyəti Prezident İlham Əliyevin işğaldan azad olunmuş rayonlarımıza səfərləri ilə bağlı ilk və ən müfəssəl məlumatları məhz Mehriban xanım Əliyevanın yolboyu etdiyi çəkilişlər vasitəsilə alırdı. Eyni zamanda, bu görüntülər erməni barbarlığını, düşmənin vəhşiliyini bütün dünyaya çatdırdı. Mehriban Əliyevanın apardığı bu çəkilişlərdə Prezident İlham Əliyev

həm də Ermənistana xəbərdarlıqlar edirdi, Azərbaycanın prioritetləri ilə bağlı mühüm mesajlar verirdi.

Mehriban xanım Əliyevanın xoşməramlı fəaliyyəti həm Azərbaycanda, həm də beynəlxalq miqyasda yüksək qiymətləndirilir. Azərbaycanın ən ali dövlət mükafatı olan "Heydər Əliyev" ordeni, "Qızıl ürək" beynəlxalq mükafatı, Avropa Olimpiya Komitələrinin Ali ordeni, Fransanın "Şərəf Legionu" ordeni, İtaliyanın "Xidmətlərə görə" Böyük Xaç Kavaleri ordeni, Polşanın "Böyük Komandor Xaçı" ordeni, Rusiyanın "Dostluq" ordeni, UNESCO-nun "Qızıl Motsart" medalı... Bu, Azərbaycanın Birinci vitse-prezidentinin layiq görüldüyü mükafatların heç də tam siyahısı deyil. Mehriban xanım Əliyeva hesab edir ki, ən böyük mükafatı xalqın ona olan sevgisi, inamı və etimadıdır.

Mehriban xanım xalqın sevgisi, etimadı ilə öz ömür kitabını yazmaqda davam edir, onu ildən-ilə yeni parlaq və mənalı səhifələrlə zənginləşdirir. Bir sözlə, Azərbaycan xalqı ölkənin ictimai-siyasi həyatında fəal iştirak edən Mehriban xanım Əliyevanın ölkənin Birinci vitse-prezidenti kimi bundan sonra da bu çətin və məsuliyyətli vəzifənin öhdəsindən layiqincə gələcəyinə inanır və dəstəkləyir.

Hər bir azərbaycanlı üçün fərəhlidir ki, Azərbaycanın birinci xanımının fəaliyyəti beynəlxalq səviyyədə diqqətdədir. Onun gördüyü işlər cavabsız qalmamış, dünya dövlətləri, nüfuzlu təşkilatlar tərəfindən müxtəlif adlara, mükafatlara layiq görülmüşdür.

Çoxşaxəli fəaliyyətində yorulmaq bilmiyən Mehriban xanım Əliyeva hər gördüyü işdən ilhamlanır, yeni bir layihənin icrası qarşıya qoyulur. Azərbaycanınn birinci xanımı Mehriban Əliyeva demişdir: "İnsan gördüyü işin haqlı, xeyirli və lazımlı olduğuna daxilən inandıqda həvəslə işləyir, fiziki yorğunluq isə mənəvi məmnunluqla ödənilir".

Prezident İlham Əliyev və onun ən yaxın məsləkdaşı olan Birinci vitse-prezident Mehriban Əliyevanın münaqişənin həlli yolları ilə bağlı mövqeyi dəyişməzdir. Həmin mövqeyə görə, Azərbaycan dövləti münaqişənin beynəlxalq hüquq prinsipləri əsasında, ölkəmizin ərazi bütövlüyü çərçivəsində və Dağlıq Qarabağın ermənilərinə respublikamızın hüdüdları daxilində ən yüksək muxtariyyət statusu verilməsi yolu ilə həllini dəstəkləyir. Azərbaycan üçün bu çərçivədən kənarda hər hansı bir həll yolu qəbuledilməzdir. Münaqişənin həlli ilə bağlı bu yanaşma tərzi Azərbaycanın prinsipial mövqeyinin ifadəsidir.

Mehriban xanım Əliyevanın çoxşaxəli fəaliyyəti xalqa xidmət, millli və ümumbəşəri dəyərlərə hörmət nümunəsi olmaqla humanizm və vətənpərvərlik prinsiplərinə əsaslanır. Bax, belə bir mühitdə dünyagörüşü formalaşan, milli-mədəni düşüncəsi zənginləşən Mehriban xanım Əliyeva öz səmərəli, çoxşaxəli, zəngin fəaliyyəti ilə Azərbaycanda qadın hərəkatını canlandıraraq, tarixdə yeni bir mərhələnin əsasını yaradıb. Bununla həm də Azərbaycan qadınının cəmiyyətdəki yeri, nüfuzu, işgüzarlığı, dövlətə layiqli xidmət missiyası barədə beynəlxalq aləmə dövlətimizin bu sahədəki mövqeyni çatdırıb. Beləliklə, Mehriban xanım Əliyeva müxtəlif dövrlərdə müdrikliyi və qəhrəmanlığı ilə seçilən Azərbaycan qadınlarının şərəfli ənənələrini yaşadaraq, zənginləşdirib, mədəniyyətin, incəsənətin, elmin bir sıra sahələrində ilklərə imza ataraq, sivil işgüzarlığı, intellektual potensialı ilə beynəlxalq ictimaiyyətdə böyük nüfuz qazanıb.

Azərbaycan Respublikasının Birinci vitse-prezidenti dövlət müstəqilliyimizin möhkəmləndirilməsi, milli maraqların qorunması və ölkəmizin ərazi bütövlüyünün bərpası naminə bütün imkanların səfərbər olunması, vətəndaş həmrəyliyinin, xalq-iqtidar birliyinin sarsılmazlığının təmin edilməsində yüksək təşkilatçılıq və təşəbbüskarlıq bacarıqlarına malikdir.

Bir sözlə, Mehriban Əliyevanın xalqının təhlükəsiz və xoşbəxt gələcəyi üçün həyata keçirdiyi bütün layihələr millətimizin uğur tarixinin bünövrəsini möhkəmləndirir. Bütün Azərbaycan xalqı inanır ki, masir Azərbaycan tarixinin banisi, Ümummilli Lider Heydər Əliyevin siyasi kursunun layiqli davamçısı, ölkə Prezidenti cənab İlham Əliyevin ən yaxın silahdaşı, xalqımızın sevimlisi Mehriban xanım Əliyeva xeyriyyəçilik, insansevərlik, mərhəmət, Azərbaycan xalqının mentalitetinə, mədəniyyətinə, düşüncəsinə, əsrlərdən bəri formalaşan ənənələrimizə xas olan ən gözəl keyfiyyətləri bundan sonra da davam etdirməyə çalışacaq. Çünki Mehriban xanım Əliyeva xalqımızın firavanlığı və qüdrətli dövlətimizin tərəqqisini naminə çoxşaxəli fəaliyyəti ilə Prezident İlham Əliyevin və ona inanan, böyük ümidlər bəsləyən insanların etimadını doğrultmağı bacarıb.

## Böyük alim, qayğıkeş ana, sədaqətli həyat yoldaşı – Zərifə Əliyeva

Qayğıkeş ana, vəfalı ömür-gün yoldaşı, işini mükəmməl bilən, nursuz gözlərə işıq paylayan, Günəşin, Ayın hüsnünə, təbiətin çoxçalarlı rənglərinə, füsunkar gözəlliyinə həsrət qalan insanlara həyat eşqini qaytaran Zərifə xanım Əliyeva. İlin gözəl fəslində, 1923-cü il aprelin 28-də dünyaya gələn, 1985-ci il aprel ayının 15-də əbədiyyətə qovuşan, gözəl insan, qayğıkeş həkim Zərifə xanım Əliyeva ömür salnaməsinə xeyirxah əməllərdən başqa heç nə yazılmayan şəfqətli əllər sahibi olmaqla kamil insan kimi də hamının hörmətini qazananlardan idi. Peyğəmbərimiz buyurub ki, elm sənin məsləhətçin, mülayimlik dostun, əql bələdçin, səbr isə başçın olmalıdır. Bu keyfiyyətləri şəxsiyyətində birləşdirən Zərifə xanım kamillik nümunəsi idi.

Belə bir deyim var, xeyirxahlıq, nəciblik və saflıq yaranışdan insanlığın ən ali zinəti sayılaraq onun bu fani dünyada əbədiyaşarlığını, daim mənəvi ucalıqda dayanmasını təmin edir və xalqının işıqlı gələcəyinə xidmət edən xoşməramlı əməllərin müəllifinə çevrilirlər. Bəli, Zərifə xanım Əliyeva da yüksək daxili mədəniyyəti, incə qəlbi, elmə sədaqəti, insanlara münasibətdə məsuliyyəti ilə qədirbilən xalqımızın yaddaşında həmişə yaşayır, daim böyük ehtiramla anılır. Qismətinə belə xoşbəxt tale yazılan, qaranlıq gözlərə nur paylayan, həyatın gözəlliklərindən zövq alan, oftalmologiya elmində xüsusi dəst-xətti ilə iz qoyan akademik Zərif xanım Əliyeva əməlləri ilə əbədiyaşarlılıq qazananlardan biri idi. Sağlığında xalqı üçün gördüyü işlərlə mənəvi ucalığa yüksələn Zərifə xanım Əliyevanın şərəfli ömür yolu hər bir Azərbaycan vətəndaşı, elm adamı, habelə tibb işçisi üçün mənəviyyat, kamillik və müdriklik məktəbidir.

Böyük filosoflar əsrlər boyu şəxsiyyət amilini tədqiq edərkən son nəticədə bu qənaətə gəliblər ki, onun yetişməsində başlıca amil məhz formalaşdığı mühitdir. Zərifə xanım da 1923-cü il aprelin 28-də Naxçıvan Muxtar Respublikası Şərur rayonunun Şahtaxtı kəndində, görkəmli dövlət və elm xadimi, bütün bilik və bacarığını xalqa xidmətə sərf etmiş tibb elmləri doktoru Əziz Əliyevin ailəsində dünyaya göz açmışdı. Zərifə xanım Əliyevanın uşaqlığının ilk illəri Naxçıvan Muxtar Respublikasının Şərur

rayonunun Şahtaxtı kəndində keçmiş, sonra ailəsi ilə birlikdə Bakıya köçmüşdür. 1942-ci ildə Bakıda orta məktəbi əla qiymətlərlə bitirmiş və elə həmin il Azərbaycan Dövlət Tibb İnstitutunun müalicə-profilaktika fakültəsinə daxil olmuşdur. Tələbəlik həyatının ilk günlərindən özünəməxsus fitri istedadı, dərin zəkası, iti məntiqi təfəkkürü, təvazökarlığı və sadəliyi ilə tələbələr arasında hörmət qazanmış, professor-müəllim heyətinin diqqətini cəlb etmişdir. Tələbəlik illərində Zərifə xanım Əliyevanın qəlbində insanların gözlərinə nur bəxş etmək kimi müqəddəs arzu baş qaldırmış, o öz gələcək fəaliyyətini tibbin oftalmologiya sahəsinə həsr etməyi qarşısına məqsəd qoymuşdur. Bilik diapazonu geniş və çoxşaxəli olan Zərifə xanım Əliyeva qısa zamanda həm həkimliyin, həm alimliyin, həm də pedaqoqluğun ən yüksək zirvəsinə yüksələ bilmişdir. Zərifə xanım həmişə bu fikirdə olmuşdur ki, həkimlə xəstənin birbaşa əlaqəsi müalicənin əhəmiyyətini yüksəldir, xəstəyə ümid verir, orqanizmin xəstəliyə qarşı müqavimətini artırır, bəzən dava-dərmandan da güclü təsir göstərir, "həkim xəstənin ən doğma adamıdır" demişdir. O, həm görkəmli alim, həm də həyat eşqi, xeyirxahlığı, nəvazişi ilə qayğıkeş ana və həyat yoldaşı, ailəsinə dayaq olan əsl insan idi. İşinin çoxluğuna, cəmiyyətdə tutduğu yüksək mövqeyə baxmayaraq, birinci növbədə ailəsinin qayğıları ilə yaşayırdı.

Hər kəsin qismətinə yazılan tale yolu olur. Hamı Tanrının qismət kimi bəxtinə yazdığı bu yolu başa vurur. Ancaq əsas odur ki, bu yolda saldığın izlərin, əməllərin əbədi qalsın. səni yaşatsın. Həyatın səndən sonrakı nəsillər üçün örnək olsun. Əfsanəyə çevrilən ümummilli lider Heydər Əliyev və Zərifə xanım Əliyevanın hamıya nümunə olan həyat və tale yolları kimi. Yüksək mənəvi keyfiyyətləri ilə, elmi, dünyagörüşü bir-birini tamamlayan insanlar əsl şəxsiyyətlər kimi cəmiyyətdə layiqli mövqe qazanırlar. Akademik Zərifə xanım Əliyeva kimi. Mehribanlıq, həssaslıq, ziyalılıq, bir sözlə, insanlığa xas bütün müsbət cəhətlər onun nəcib simasında qovuşmuşdu. Hamının dərdini, problemini özününkü hesab etməyi bacarır, ətrafındakılara hər zaman səmimiyyətlə, hörmətlə yanaşırdı. Dünyanın ən böyük azərbaycanlısı Heydər Əliyev qazandığı cahanşümul nailiyyətlərdə vəfalı ömür-gün yoldaşı Zərifə xanımın böyük töhfələrinin olduğunu daim vurğulayırdı. Bu iki dahi insanın səmimi hissləri onilliklər boyu davam edən böyük məhəbbət dastanını, sədaqət timsalını tam

ehtiva edir. Hər bir kəsə örnək olası bir ailə quran bu şəxsiyyətlər yüksək mənəviyyat, ali mərhəmət, misilsiz insanpərvərlik, dəyərli vətəndaşlıq xüsusiyyətləri ilə bir-birlərini tamamlamışlar. Zərifə xanımın vəfatı isə Heydər Əliyev üçün böyük itki olmuşdur. Həyatın keşməkeşli onillikləri-ni böyük sədaqət və sonsuz məhəbbətlə, ləyaqətlə yaşadıqlarından bu fiziki yoxluğu ümummilli liderimiz həyatın ölçüyəgəlməz sarsıntısı kimi qarşıladı. Belə ki, ulu öndərimiz Heydər Əliyev vəfalı ömür-gün yoldaşı Zərifə xanım Əliyevanı səmimi sevgi, böyük nisgil və sonsuz ehtiramla anaraq qeyd edirdi: "Zərifə xanım çox böyük alim olub. Mən hələ onunla həyat quranda o, artıq elm yolunda idi, elmlə məşğul idi. Onun elmi fəa-liyyəti məlumdur. O, çox istedadlı, çox xeyirxah, çox sadə insan idi. Mən bu barədə çox danışa bilərəm, ailəmin yaşaması, bu günlərə çatması, öv-ladlarımın tərbiyəsi üçün və həyatımda onun əvəzsiz rolu üçün mən bu gün Zərifə xanımın məzarı qarşısında baş əyirəm. On il keçsə də, onu bir dəqiqə belə unutmuram və unutmayacağam. Mənim övladlarım da bu əhvali-ruhiyyədədirlər. Onlar bu əhvali-ruhiyyə ilə tərbiyələniblər, for-malaşıblar. Ona görə də bu gün bizim üçün müqəddəs gündür... Bu gün xoşbəxt gündür. Çünki bu gün Zərifə xanım kimi böyük bir insan yer üzünə gəlib, mənim həyatımı xoşbəxt edib, mənə gözəl övladlar bəxş edib. Eyni zamanda qəmli gündür. On il keçsə də, mən bu qəmdən ayrıla bilmirəm".

Göründüyü kimi, Zərifə xanımın həyatını mənalandıran nə varsa – onun elmi, ailəsi, xeyirxahlığı, səmimiyyəti, insanlara doğma münasibəti - hamısı bu nəcib qadının ruhundan, nurundan şölələnmişdir. Və bu gün Əliyevlər ocağının yetirmələri də öz sələflərinin hər mənada şərəfli da-vamçılarıdırlar. Cənab İlham Əliyev kimi dünya miqyasında tanınan və qəbul olunan bir şəxsiyyətin qazandığı nailiyyətlərdə, şübhəsiz ki, vali-deynlərinin düzgün tərbiyəsi, övladı müdrikliklə formalaşdırmaq ənənəsi mühüm rol oynamışdır. Ölkəmizin ictimai və mədəni həyatında mühüm yer tutan Sevil xaınımın Əliyevlər şəcərəsinin adını şərəflə, ləyaqətlə ucalt-ması onun nüfuzunu daha da artırmışdır. Zərifə xanım İlham Əliyevi əziz oğlu kimi sevməklə yanaşı, onun məsuliyyətli, insanpərvər, Azərbaycana qanıyla-ruhuyla bağlı bir insan kimi formalaşmasına xüsusi önəm verir-di. Xatirələrdən də aydın görünür ki, Heydər və Zərifə Əliyevlərin ailəsin-də övlada böyük sevgi və məhəbbət bəslənilməklə bahəm, eyni zamanda müstəqil düşünmək və sərbəst qərar qəbul etmək, yeniyetmə yaşlarından

məsuliyyətə yiyələnmək, ata və ananın cəmiyyətdəki yüksək nüfuzuna deyil, məhz öz qabiliyyətinə güvənmək kimi hisslər aşılanmışdır. Bu tərbiyənin nəticəsi idi ki, bu ocağın yetirməsi Prezident İlham Əliyev indi prinsipiallığı, qətiyyəti sayəsində məmləkətini ən çətin geosiyasi labirintlərdən üzüağ çıxarır, fövqəldövlətlərin təzyiqləri qarşısında ölkəsinin maraqlarından bir addım belə geri çəkilmir və Azərbaycanı dünyanın ən dinamik inkişafda olan dövlətinə çevirir.

Zərifə xanım daim mərhəmət və nəciblik kimi ali keyfiyyətlərə sadiq insan olaraq tanınmışdır. Bu gün qürur doğuran məqam odur ki, bu ocağın dəyərli üzvü – Zərifə xanımın çox sevdiyi gəlini Mehriban xanım Əliyeva da cəmiyyətdə xeyirxahlığın ali ünvanı kimi qəbul olunur. Bu gün Mehriban xanım Əliyeva da eyni əzm və fədakarlıqla Prezident İlham Əliyevin çətin və şərəfli fəaliyyətinə nəcib və xeyirxah əməlləri ilə dəstək olur, daha qüdrətli Azərbaycan quruculuğunda ömür-gün yoldaşının ən yaxın məsləkdaşına çevrilir. Bəli, Zərifə xanım Əliyeva unudulmaz, nümunəvi bir şəxsiyyət ömrü yaşadı və bundan sonra da yaşayacaq.

## Prezident sözünü ünvanlı və qətiyyətlə deyir

Prezident İlham Əliyevin sözünə, vədinə sadiq qalan dövlət başçısı imicini qazanması bütün sahələrdə, son 21 ildə özünü dəfələrlə təsdiqləyib. Bu realllığı Azərbaycan xalqı görür və bəlkə də bu son 30 ildə bu qədər qürurlu olmamışdı – 44 gün ərzində tariximizin Zəfər Salnaməsi yazıldı, Bütövləşən Azərbaycanımıza qovuşduq. Məhz bu Böyük Qələbə Prezident İlham Əliyevin sözünə, vədinə sadiq qalan dövlət başçısı imicini qazanması bütün sahələrdə təsdiqlənməsinin reallığıdır. Bu yerdə Prezident İlham Əliyevin 2003-cü ildə keçirilən andiçmə mərasimində söylədiyi bu fikirləri bir daha yada salmaq yerinə düşər: “Mən Azərbaycanın xoşbəxt gələcəyinə inanıram. Əminəm ki, ölkəmiz bundan sonra da inkişaf edəcək, daha da güclənəcəkdir. Azərbaycanda demokratiya daha da inkişaf edəcək, siyasi plüralizm, söz azadlığı təmin olunacaqdır. Ölkəmiz müasir dövlətə çevriləcəkdir. Bütün bunları etmək üçün Azərbaycanda çox işlər görmək lazımdır. Ancaq bütün bunları həyata keçirmək və Azərbaycanı qüdrətli dövlətə çevirmək üçün, ən başlıcası, ölkədə Ümummilli Lider Heydər Əliyevin siyasəti davam etdirilməlidir. Bu gün yüksək kürsüdən çıxış edərkən, mən Azərbaycan xalqına söz verirəm ki, bu siyasətə sadiq qalacağam, heç vaxt bu yoldan dönməyəcəyəm, Heydər Əliyevin siyasətini davam etdirəcəyəm”.

### *Sözünə, vədinə sadiq olan xalqın Prezidenti*

Bəli, 21 il öncə deyilənlər bu gün öz müsbət nəticəsini verib. Ulu Öndər Heydər Əliyev: "İnanıram ki, mənim axıra çatdıra bilmədiyim taleyüklü məsələləri, planları, işləri sizin köməyiniz və dəstəyinizlə İlham Əliyev başa çatdıra biləcək. Mən ona özüm qədər inanıram və gələcəyinə böyük ümidlər bəsləyirəm", - müdrik kəlamlarını reallaşdıran Prezident İlham Əliyev: "Azərbaycanı qüdrətli dövlətə çevirmək üçün ən başlıcası, ölkədə Heydər Əliyevin siyasəti davam etdirilməlidir. Bu gün yüksək kürsüdən çıxış edərkən mən Azərbaycan xalqına söz verirəm ki, bu siyasətə sadiq qalacağam, heç vaxt bu yoldan dönməyəcəyəm, Heydər Əliyevin siyasətini davam etdirəcəyəm".

Son 30 il ərzində həsrətində olduğumuz, haqq və şərəf işimiz olan, Azərbaycan Respublikamızın suverenliyi və ərazi bütövlüyümüzə nail olduq!

“Şuşasız Qarabağ, Qarabağsız Şuşa yoxdur” – deyən Ulu Öndər Heydər Əliyevin bu arzusunu da bu gün Prezident İlham Əliyev "Şuşasız işimiz yarımçıq qalar" deyərək reallaşdırdı: "Mən bu gün Ulu Öndər Heydər Əliyevin məzarını ziyarət etdim, onun ruhu qarşısında baş əydim. Ürəyimdə dedim, xoşbəxt adamam ki, ata vəsiyyətini yerinə yetirdim. Şuşanı azad etdik! Bu, böyük Qələbədir! Bu gün şəhidlərimizin, Ulu Öndərin ruhu şaddır! Gözün aydın olsun Azərbaycan! Gözünüz aydın olsun dünya azərbaycanlıları!".

Bəli, bu həqiqətən də belədir. "Əsl siyasət konkret, real iş görməkdən ibarətdir" deyən dövlət başçısının ötən illərdə qəbul etdiyi fundamental qərarlar, imzaladığı sərəncamlar daim xalqın mənafeyindən çıxış etdiyini, habelə, verdiyi vədlərin sırf əməli fəaliyyətə, praqmatizmə söykəndiyini, gerçəkliyə adekvat olduğunu göstərmişdir. Çünki bugünkü Azərbaycan vətəndaşı həyata başqa nəzərlərlə baxır, özünə və ölkəsinin bundan da daha böyük uğurlar əldə edəcəyinə inanır. Bu inam, hər il görülən daha böyük uğurların nəticələrini gördükcə, sabaha daha böyük bağlılıqla inanır.

Ancaq təəssüf doğuran odur ki, hələ də bəzi məmurlar şəxsi ambisiyalarından əl çəkməyərək çirkin əməllərə əl atır, işğaldan azad olunan torpaqlarda dövlət başçısının dediyi kimi: "Biri filial açmaq istəyir, biri nə bilim başqa qurum açmaq istəyir. Bu, yolverilməzdir və qəbuledilməzdir".

### *"Məmurlar öz yerlərini bilsinlər, öz işləri ilə məşğul olsunlar"*

Prezident İlham Əliyev və birinci xanım Mehriban Əliyeva fevralın 1-də Abşeron Rayon Mərkəzi Xəstəxanasının yeni inşa edilən binasının açılışından sonra dövlət başçımız Azərbaycan Televiziyasına müsahibəsində bir daha məmurlara xəbərdarlıq etdi. Bildirdi ki, məmurların bu özbaşınalığı nə birincidir, nə də sonuncu: "Biri filial açmaq istəyir, biri nə bilim başqa qurum açmaq istəyir. Bu, yolverilməzdir və qəbuledilməzdir. Ona görə burada subardinasiya olmalıdır. Ucuz populyarlıq qazanmaq üçün, yaxud da ki, özünə hansısa bir ofis, yeni ofis yaratmaq üçün belə açıqlamaların verilməsi tamamilə qəbuledilməzdir və buna son qoyulmalıdır".

Ən əsası isə, İlham Əliyevin prezidentlik fəaliyyətinin 17 ili Xalq-İqtidar birliyindən qaynaqlanan inam və etibar üzərində bərqərar olub, neçə-neçə uğurlara imza atılıb, 44 gün ərzində 30 illik həsrətə son qoyaraq

Qarabağı Azərbaycana qovuşdurub. Elə müsahibə zamanı bunu bir daha deyən Qalib Prezidentimiz bildirib ki, işğaldan azad olunan torpaqlarımızda bütün işlər ardıcıllıqla aparılır: "Mən bu ardıcıllıq haqqında Azərbaycan xalqına dəfələrlə demişəm ki, biz hansı işləri görəcəyik, insanlar da bilsinlər. İlk növbədə, keçmiş məcburi köçkünlər, nə vaxt qayıda bilərlər o torpaqlara? Birinci, minalardan təmizləmə. Bu, böyük bir prosesdir. Ermənilər bizə mina sahələrinin xəritələrini vermirlər. Ona görə indi partlayışlar da tez-tez olur. Biz indi Minatəmizləmə Agentliyini yenidən formalaşdırırıq və onun fəaliyyəti daha səmərəli olacaq. Ancaq bu, müəyyən vaxt aparacaq. Mina təmizləməklə əlaqədar işlər, əlbəttə ki, başa çatmalıdır. Ondan sonra ziyanın qiymətləndirilməsi. Əgər biz ziyanın qiymətləndirilməsini etməsək, sabah təzminat davasında da uğur qazana bilmərik. Ona görə də, ilk növbədə, yerli qurumlar dağıdılmış bütün evlərin pasportlaşdırılmasını aparmalıdır".

Dövlət başçısı bir daha bildirib ki, bu işlərin görülməsi zaman tələb edir və ucuz populyarlıq dalınca qaçanların axırı isə pis olur: "Eyni zamanda, hər şey planlı şəkildə olmalıdır. Yoxsa biri oradan durub deyəcək ki, mən burada bunu tikəcəyəm, biri oradan duracaq ki, mən bunu. Kimsən sən? Sən get öz işinlə məşğul ol. Yenə də deyirəm, ucuz populyarlıq dalınca qaçanların axırı pis olur, bu, birincisi. İkincisi, qayda-qanun var ölkədə. Heç kim özbaşınalıq edə bilməz. Əgər kimsə unudur, biz onun yadına salarıq".

### *"Mən Şuşanı mədəniyyət paytaxtı elan etmişəm, məmurlar paytaxtı elan etməmişəm!"*

Görünür hələ də bu özbaşına məmurlar isti yerdə oturduqlarını zənn edirlər. Ancaq anlamırlar ki, dünya dövlətləri Azərbaycanın yeni tarixi Qələbə Salnaməsini 44 gün ərzində yazan və 30 illik həsrətə son qoyan Qalib Liderimiz, Ali Baş Komandanımız, Prezident İlham Əliyev cənablarının diplomatik siyasətinə həsəd aparırlar. Belə olan halda, dövlət başçımızın müsahibə zamanı adlarını çəkdiyi məmurlara imkan vermək olarmı ki, özbaşınalıq etsinlər?

"Mən Şuşanı mədəniyyət paytaxtı elan etmişəm, məmurlar paytaxtı elan etməmişəm! Ona görə hər kəs otursun yerində, öz işi ilə məşğul

olsun, məni də əsəbləşdirməsin", – deyən dövlət başçısının bu xəbərdarlığından sonra özlərinə sığışacaqlarmı?

"İndi Mərkəzi Bank insanlara xidmət göstərib ki, orada filial açsın? Kimin üçün filial açacaq? Özü üçün ki, gedib orada otursun, yaxud da gedəndə bunun bir iqamətgahı olsun, şəraiti olsun, oraya pullar xərclənsin və bunun insanlara hansı xeyri dəyəcək? Heç bir. Təkcə bu, deyil. Digər qurumlar da, indi mənə müraciət etmişlər. Onların hər halda ağlı çatıb mənə müraciət etməyə və mən onlara dedim ki, gedin oturun yerinizdə", - deyən dövlətimizin başçısı onların adlarını sadalayaraq deyib: "Azəravtoyol". Onun rəhbəri mənə müraciət edib ki, icazə verin, Şuşada "Azəravtoyol" qurumunun regional mərkəzini açaq. Nə üçün? Yol çəkmək lazımdır, get, yol çək. Heç kim öz hesabına yol çəkmir, dövlət büdcə ayırır. Şuşada "Azəravtoyol"un regional mərkəzinin nə işi var? İstəyir ki, özü üçün şərait yaratsın, getsin o torpağı zəbt etsin, özü üçün iqamətgah tikdirsin, onu hasara alsın, bir qarovulçu qoysun və bəli, oraya gedəndə otursun orada necə deyərlər, təbiəti seyr etsin. AZAL. Onun da rəhbəri mənə müraciət etmişdir ki, AZAL-ın hansısa qurumunu Şuşada yaratmaq istəyirlər. Bu, prinsipcə absurddur. Ona da lazımi sözləri demişəm ki, get otur yerində. Ondan sonra Dövlət Gömrük Komitəsi Şuşada Qarabağ Regional Mərkəzinin yaradılması ilə bağlı müraciət edib. Şuşada sərhəd var ki, gömrüyün regional mərkəzi olsun?

Bilirsiniz, bu adamların beyninə belə ziyanlı fikirlər gəlir və onlar da bunu tələffüz edirlər. Siyahı davam edir hələ. Fövqəladə Hallar Nazirliyi. Nazir mənə müraciət edib ki, icazə verin, orada biz Fövqəladə Hallar Nazirliyinin Qarabağ regional mərkəzini yaradaq, Şuşa şəhərində. Yenə də eyni məqsədlə, yenə də torpaq, hələ ki, orada indi heç kim yoxdur, yenə də hasar, yenə də nə bilim tikanlı məftil, iqamətgah. Dövlət Sərhəd Xidməti. Bu təklifi indi desəm yəqin ki, mənim kimi Azərbaycan xalqı da güləcək. Xidmətin rəisi mənə zəng edib deyir ki, icazə verin, biz sərhəd xidmətinin Şuşa zastavasını da yaradaq. Dedim ki, a kişi, Şuşada sərhəd var? Deyin də mənə Şuşada sərhəd var, yoxsa yox? Deyir yoxdur. Deyirəm bəs, nə zastava yaradırsan? İndi bizim o boyda sərhədimiz yaranıb, ta şimaldan cənuba qədər, Kəlbəcərdən Cəbrayıla qədər, Ermənistanla sərhəd. Cəbrayıl rayonunda İranla sərhəd, get orada yarat da. Şuşada nə işin var sənin?! Yenə də gəlim, oturum, yerləşim, iqamətgah qurum,

hamısı da dövlət hesabına, hamısı dövlət hesabına. Burada mənim bir rezidensiyam olsun. Mən bəzən bu şeyləri demirəm vətəndaşlara ki, onları iyrəndirməyim, bağışlayın sözümə görə, ifadəmə görə. Amma mənim də artıq səbrim tükənir və deyirəm ki, vətəndaşlar da bilsinlər, bu məmurlar da bilsinlər. Məmurlar öz yerlərini bilsinlər, öz işləri ilə məşğul olsunlar".

Bəli, bu gün Azərbaycan xalqı bir daha gördü ki, Azərbaycan Prezidenti daim xalqı ilə birlikdədir, onların yanındadır, bütün görülən işləri də xalqına aydın şəkildə çatdırır. Dövlət başçımızın dediyi kimi: "Mən bu ardıcıllıq haqqında Azərbaycan xalqına dəfələrlə demişəm ki, biz hansı işləri görəcəyik, insanlar da bilsinlər".

## Qüdrətli dövlət və yüksək rifah cəmiyyəti quruculuğuna xidmət edən milli prioritetlər

Hazırda ölkəmizin bütün sahələrində həyata keçirilən tədbirlər və əldə olunan real nəticələr ölkə Prezidentinin həyata keçirdiyi uğurlu sosial siyasətin sübutudur. Hər bir dövlətin əsas funksiyalarından biri əhalinin sosial müdafiəsini təşkil etmək, maddi nemətlərin ədalətli bölgüsünə nail olmaq, daxili siyasətin sosialyönümlüyünü ön planda saxlamaq, vətəndaşların sosial rifah halını yaxşılaşdırmaqdan ibarətdir. Azərbaycanda da dövlət daim öz vətəndaşına qayğı ilə yanaşır, onun rifahının yüksəldilməsini, sosial problemlərinin həllini prioritet vəzifə kimi görür və bu istiqamətdə məqsədyönlü siyasət həyata keçirir. Əslində, dövlət başçımız bu siyasətini 17 ildir ki, davam etdirir, ancaq hazırkı məqamda həmin siyasət daha aşkar görünməkdədir.

Xüsusilə də, bu gün dünyanı çalxalayan koronavirus pandemiyası bütün inkişaf etmiş dövlətləri iflic vəziyyətinə saldığı bir məqamda, Azərbaycan ilk gündən unikal tədbirlər keçirilməsi nəticəsində koronavirusla mübarizədə dünyada özünəməxsus imic formalaşdırıb - Azərbaycan modeli. Bu, reallıqdır. Azərbaycan artıq beynəlxalq aləmdə inkişaf, tərəqqi, yüksəliş simvoluna çevrilir. Bütün dünyanın etiraf etdiyi bu reallıq Prezident İlham Əliyevin fəaliyyətinə verilən haqlı və real qiymətdir. Bu, dövlət başçımızın dövlətləri və millətləri birləşdirən siyasətidir və bu siyasət Azərbaycan tərəfindən təqdim olunur, öyrənilir.

Bu baxımdan Prezident İlham Əliyev fevralın 2-də Azərbaycanın 2030-cu ilə qədər sosial-iqtisadi inkişafının başlıca prioritetlərini müəyyən edən proqram Sərəncamı- “Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər” növbəti 10 ildə sosial-iqtisadi sahədə geniş islahatların həyata keçirilməsini, əhalinin maddi rifah halının daha da yüksəldilməsini, milli iqtisadiyyatın inkişafının genişləndirilməsi və dayanıqlı iqtisadi inkişafın qorunub saxlanılmasını təmin edəcək.

Həmçinin, Sərəncamda azad olunan ərazilərin sosial iqtisadi inkişafı da nəzərdə tutulub ki, bu da, öz növbəsində, həmin yerlərin inkişafına əvəzsiz töhfələr verəcək. Beləliklə, ölkə Prezidenti cənab İlham Əliyev tərəfindən müəyyən edilmiş sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər növbəti on il ərzində Azərbaycanda müşahidə olunan sosial-iqtisadi

inkişafı tamamilə yeni, keyfiyyətcə daha yüksək mərhələyə çıxaracaq. Ən əsası isə dövlət başçımızın prezidentlik fəaliyyəti dövründə xalqımız daima öz liderinə inanıb və qarşıya qoyulan hədəflərə inamla çatıb. Nəticədə Azərbaycan Respublikasının Prezidenti, Müzəffər Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi ilə şanlı Ordumuz işğalçı Ermənistan üzərində möhtəşəm Qələbə qazanaraq, 44 gün ərzində 30 illik həsrətə son qoymaq və torpaqlarımızın işğaldan azad edilməsi ədalətin təntənəsi, eyni zamanda, hər bir azərbaycanlı üçün qürur mənbəyi oldu. Azərbaycan gücün və qüdrətin, xalq-iqtidar birliyinin, həmrəyliyin, milli iradə və əzmkarlığın sayəsində özünün ərazi bütövlüyünü və suverenliyini bərpa etdi, şəhidlərimizin qisasını aldı. Prezident İlham Əliyev rəşadətli Ordumuzun Ermənistana qarşı apardığı "Dəmir yumruq" əks-həmlə hərbi əməliyyatında – Vətən müharibəsində Qələbəmizi belə qiymətləndirib: "Azərbaycan tarixdə heç vaxt belə parlaq Zəfər əldə etməmişdir, tarixdə heç vaxt indiki qədər güclü olmamışdır. Bizim gücümüz birliyimizdədir. Biz birlik nümayiş etdirmişik, əzmkarlıq nümayiş etdirmişik, qəhrəmanlıq nümayiş etdirmişik və bunun nəticəsində dəmir yumruqla düşmənin başını əzib öz doğma torpaqlarımızı azad etmişik".

Bu gün respublikamızın qarşısında duran ən ümdə məsələ də qələbənin əbədiləşdirilməsi üçün doğma torpaqlarından köçkün düşən insanların öz yerlərinə qayıdışını təmin etməkdir. Bu mənada, Prezident İlham Əliyev cənablarının "Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər»də işğaldan azad olunmuş ərazilərə qayıdışla bağlı xüsusi bəndin yer almasının mühüm siyasi və iqtisadi əhəmiyyəti var. "Böyük Qayıdış" proqramı vətəndaşlarımızın işğaldan azad edilmiş ərazilərdə dayanıqlı məskunlaşmasında və həmin ərazilərin ölkənin iqtisadi sisteminə inteqrasiyasında körpü rolunu oynayacaq.

İlk növbədə, qeyd etmək lazımdır ki, işğaldan azad edilmiş ərazilərin ölkənin ümumi iqtisadiyyatına reinteqrasiyası, yeni beynəlxalq və regional nəqliyyat-logistika dəhlizlərinin imkanlarından faydalanmaq Azərbaycanın inkişafına böyük təkan verəcək. Bu baxımdan Cənubi Qafqazın lider dövləti olan Azərbaycanın regionda təhlükəsizliyin, sabitliyin, rifahın və qarşılıqlı faydalı əməkdaşlığın formalaşmasında, eləcə də iqtisadi və ticarət əlaqələrinin inkişaf etdirilməsində aparıcı rolu bundan sonra özünü daha qabarıq formada göstərəcək. Ölkə Prezidenti cənab

İlham Əliyevin rəhbərliyi ilə əldə olunmuş yüksək sosial-iqtisadi göstəricilər və möhtəşəm siyasi nailiyyətlər, formalaşmış milli və multikultural dəyərlər qarşıdakı illərdə dövlətimizin qüdrətinin daha da artacağına əminlik yaradır.

### *Prioritetlər islahatların davam etdiriləcəyindən xəbər verir*

Milli prioritetlərdən olan sosial təminatla bağlı islahatların, o cümlədən pensiya islahatlarının da davam etdirilməsi, minimum və orta pensiya məbləğinin artırılması da nəzərdə tutulub. Belə ki, müavinətlər daxil olmaqla sosial ödənişlərə ayrılan vəsaitlərin həcmində də artımların olması, pensiya islahatlarının aparılması həm də pensiya məbləği ilə sığorta haqqı arasındakı mütənasibliyin artırılmasını nəzərdə tutacaq ki, bu da pensiyaçıların hüquqlarının daha yaxından qorunması və onların daha çox pensiya almasına imkan yaradacaq.

Bir sözlə, növbəti 10 illik Milli Prioritetlər ölkənin sosial-iqtisadi inkişafını yeni, keyfiyyətcə daha yüksək mərhələyə çıxaracaq. Bu baxımdan Cənubi Qafqazın lider dövləti olan Azərbaycanın regionda təhlükəsizliyin, sabitliyin, rifahın və qarşılıqlı faydalı əməkdaşlığın formalaşmasında, eləcə də iqtisadi və ticarət əlaqələrinin inkişaf etdirilməsində aparıcı rolu bundan sonra özünü daha qabarıq formada göstərəcək. Dövlət başçımızın dediyi kimi: "Bu imkanlar 2030-cu ilə qədər olan mərhələdə Azərbaycanın iqtisadi suverenliyinin möhkəmləndirilməsinə və müasir həyat standartlarına əsaslanan yüksək sosial rifah cəmiyyətinə malik qüdrətli dövlətə çevrilməsinə zəmanət verir".

Sonda onu da vurğulamaq istərdim ki, Prezident İlham Əliyevin həyata keçirdiyi bütün möhtəşəm layihə və proqramlar kimi, sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər də Azərbaycan xalqının rifah səviyyəsinin yüksəldilməsinə və dövlətimizin iqtisadi-siyasi qüdrətinin artmasına dəqiq hesablanmışdır. Beləliklə də, müharibə və pandemiya dövrünün ağır sınaqlarından çıxmış milli birliyimiz növbəti illərdə də özünün bariz təzahürlərini tapacaqdır.

## Qalib Liderin səfərləri dünyaya bir mesajdır

Dünya birliyi daha gördü ki, Ulu Öndər Heydər Əliyev siyasətinin layiqli davamçısı, hər bir azərbaycanlının Prezidenti İlham Əliyev bütün sahələrdə Qalib Lider, Qalib siyasətçi, Qalib Prezidentdir. Heç vaxt yurdu-yuvası, torpağı olmayan, onun-bunun qoltuğuna sığınıb "məzlum obrazına" düşməklə, yersiz, evsiz gəlib "evli, yerli" olmaları ilə ötən ilin sentyabrın 27-də işğalçı, vandal, barbarlığı ilə başladığı təxribatlara Azərbaycan Prezidenti İlham Əliyevin "İRƏLİ!" əmri ilə Müzəffər Ordumuzun əsgər və zabitləri 44 gün ərzində son qoydu. Dünya birliyi də şahid oldu ki, Azərbaycanın bir qarış torpağı belə müzakirə mövzusu ola bilməz və işğalçı Paşinyan hakimiyyətinin yalağı, Dağlıq Qarabağdakı qondarma rejimin başçısı Araik Aratunyan kimilər sonu torpaqlarımızdan it kimi qovulmalarıdır!

Məhz Vətən müharibəsi Qələbəsinin Qalib Lideri Prezident İlham Əliyevin işğaldan azad olunmuş torpaqlarımıza tarixi səfərləri, həmin ərazilərdə aparılan quruculuq işləri çərçivəsində inşa edilən yeni strateji obyekt və müəssisələrin təməlinin qoyulması həm siyasi, həm iqtisadi, həm də mənəvi cəhətdən müstəsna əhəmiyyət kəsb etməklə yanaşı, dünyaya bir mesajdır. Cari ilin fevral ayınnı 14-də Prezidenti İlham Əliyev, Birinci xanım Mehriban Əliyeva və qızları Leyla Əliyevanın səfəri də bu baxımdan əhəmiyyət kəsb edir. Dövlət başçısı Füzuli, Zəngilan, Laçın və Cəbrayıl rayonlarında olarkən bildirmişdir: “Yenə də azad edilmiş torpaqlardayıq. Torpaqların bərpası prosesi artıq başlamışdır”.

Dövlət başçısı hər tarixi səfərlərində dönə-dönə dünyaya mesajları ilə bildirir ki, bəli, 28 ildən sonra Qarabağı işğaldan azad etdik, Qarabağa qayıtdıq. Bir daha Qarabağa bundan sonra kimsənin yiyələnə bilməyəcəyini göstərdik. Prezidentimizin "Qarabağ Azərbaycandır və nida" ifadəsi, eləcə də 44 günlük Vətən müharibəsində Onun rəhbərliyi ilə Azərbaycan xalqının və Azərbaycan Ordusunun Qələbəsi bir daha bütün dünyaya göstərdi ki, biz bir qarış torpağımızı belə heç kəsə verən deyilik. Bu, dövlətimizin, xalqımızın, ordumuzun, milli birliyimizin Qələbəsidir. Bu, haqqın və ədalətin zəfər çalmasıdır: "Heç kim bizi bu torpaqlardan tərpədə bilməz. Qarabağ bizimdir! Qarabağ Azərbaycandır!".

Dövlət başçısı səfəri zamanı onu da bildirdi ki, biz güclü iradə, cəsarət göstərərək istədiyimizə nail ola bildik: "Biz gəldiyim yolla gələrək, yol boyunca yerləşən bütün rayonları, kəndləri, şəhərləri azad edərək bax, buralara gəldik",- deyən Prezidentimiz onu da söylədi ki, Laçın rayonunun bax, bu cənub hissəsi hərbi əməliyyat nəticəsində azad edilmişdir, döyüş meydanında düşməni məğlub etdik və tarixi ədaləti bərpa etdik: «Bu bayrağın altında Azərbaycan xalqına doğma Laçın diyarından müraciət edirəm. Bizim Qələbəmiz tarixi Qələbədir. Biz tarixi ədaləti bərpa etdik. Biz öz haqlarımızı bərpa etdik, biz şəhidlərimizin qanını aldıq, biz düşməndən qisas aldıq və qayıtmışıq. İndi isə bərpa işləri gedir və gedəcək. Mən demişəm, biz bu bölgəni - Qarabağı cənnətə çevirəcəyik. Artıq bütün göstərişlər verilib. Bütün işlər görülür, planlı şəkildə görüləcək və biz bundan sonra bu torpaqlarda əbədi yaşayacağıq. Heç kim bizi bundan sonra bu torpaqlardan tərpədə bilməz. Qarabağ bizimdir! Qarabağ Azərbaycandır!".

Bəli, bu gün hər bir azərbaycanlı, Türk dünyası, həmçinin çətin günlərimizdə bizə dəstək olan, əməkdaşlıq edən dünya dövlətləri və beynəlxalq təşkilatlar, bir sözlə, Azərbaycanın ədalətin, haqqın yolunda Prezident, Müzəffər Ordumuzun Ali Baş Komandanı İlham Əliyev cənablarının 44 günlük Vətən müharibəsinin Zəfər Qələbəsini elliliklə qəbul edərək, ardıcıl olaraq ölkəmizə səfərlər etməklə erməni vandalizminin törətdiyi cinayətləri öz gözləri ilə gördülər. Ən əsası isə, Prezident İlham Əliyevin azad olunmuş torpaqlara səfərləri işğalçı ölkə ilə bərabər, bütün dünyaya bir daha sübut etdi ki, torpaqların əsl sahibi qayıdıb, Azərbaycan öz əbədi və əzəli torpaqlarını işğalçılardan azad edib. Qalib ölkənin Müzəffər Komandanı qazanılmış Qələbəyə möhürünü vurmaq üçün həmin ərazilərə tarixi səfərlərini edir. Səfər zamanı dövlətimizin başçısının avtomobili özünün idarə etməsi isə hər kəsə açıq şəkildə mesaj verdi ki, "Mən Şuşaya Qələbə yolu ilə gəlmişəm!. Azərbaycan xalqı və Prezidenti heç kəsdən və heç nədən qorxmur. Biz qalibik! Zəfər bizimdir! Qarabağ Azərbaycandır!".

Səfər zamanı bir daha növbəti mesajını verərək söylədi: "Biz hər şeyə nəzarət edirik və heç vaxt imkan verə bilmərik ki, erməni faşizmi bir daha başını qaldırsın! Ermənistanı torpaqlarımızdan it kimi qovsaq da, yenə də bu düşmən, işğalçı dövlətdə revanşist qüvvələr baş qaldırma-

ğa çalışır. Azərbaycanı növbəti təxribatlarla, növbəti müharibə ilə hədələməyə çalışırlar. Onlar anlamalıdırlar ki, biz hər şeyə diqqət yetiririk, hər şeyə nəzarət edirik və heç vaxt imkan verə bilmərik ki, erməni faşizmi bir daha başını qaldırsın», – deyə Prezident İlham Əliyev deyib ki, biz onları məhv etmişik, edəcəyik də: «Biz erməni faşizmini məhv etmişik. Düşməni öz doğma torpaqlarımızdan qovmuşuq. Onları torpaqlarımızdan rədd etmişik. Ermənistan ordusunu demək olar ki, məhv etmişik. Ermənistan ordusu yoxdur, dağılıb. Həm texnika dağılıb, həm canlı qüvvə dağılıb. Özləri etiraf edirlər ki, müharibə zamanı onların 10 min fərarisi olubdur. Azərbaycan Ordusunda bir dənə də fərari olmayıbdır. Bu, xalqımızın, Ordumuzun yüksək mənəvi ruhunun təzahürüdür. Aparılan siyasətin təzahürüdür".

Dövlət başçımızın davamlı səfərləri bütün dünyaya bir mesajdır ki, artıq bu cənnət guşələr tam mənada və əbədi olaraq Azərbaycanın nəzarətindədir, kimsə yenidən münaqişə xülyasına düşə bilməz. Dövlət başçımızın dediyi kimi: «Dünən Füzuli, Cəbrayıl, Xudafərin, sabah, birisi gün Hadrut, Xocavənd, Şuşa, Ağdam, Kəlbəcər, Laçın... Bütün Qarabağ! Bəli, biz gəlmişik, biz gəlirik, biz gələcəyik! Çünki Qarabağ bizimdir! Çünki Qarabağ Azərbaycandır! Çünki Qarabağ Azərbaycanındır!".

## Həm hərb meydanda, həm də danışıqlar masasında İlham Əliyev qətiyyəti

**Prezident İlham Əliyev: "Nə vaxt, nəyi, necə etmək lazımdır, bunu biz bilirik. Yaxın tarix dəfələrlə bunu göstərib, həm siyasi müstəvidə, diplomatik müstəvidə, eyni zamanda, döyüş meydanında..."**

Azərbaycanın qazandığı qələbələr Prezident, Ali Baş Komandan İlham Əliyevin milli maraqlarımıza söykənən müstəqil siyasətinin, beynəlxalq arenada yüksək nüfuzunun, güclü Ordumuzun, rəşadətli əsgərlərimizin və xalqın birliyinin məntiqi nəticəsidir. Böyük Azərbaycan zərrə-zərrə işğal edilsə də, ağır döyüşlərdə büdrəsə də, heç vaxt yıxılmamışdır. Dəfələrlə aramsız müharibələrə, talanlara, işğallara məruz qalan ana yurd Prezident cənab İlham Əliyevin sözləri ilə desək, heç vaxt indiki qədər qüdrətli olmamışdır.

Bəli, bunu hər bir kəs, bütün dünya görür və Azərbaycan Prezidentinin diplomatik və uğurlu siyasətinə həsəd aparırlar.

Elə feralın 26-da Prezident İlham Əliyev tərəfindən yerli və xarici media nümayəndələri üçün 4 saatdan çox davam edən mətbuat konfransında dünyanın 35-dən çox media orqanının 50-yə qədər suallarına tam əsaslandırılmış cavabı bir daha deyilənlərin reallıqlarıdır. Bu tarixi mətbuat konfransında dövlətimizin başçısının xarici media nümayəndələrinin bütün suallarını təmkinlə və ətraflı cavablandırması bir daha Azərbaycan Prezidentinin güclü xarizmatik dövlət başçısı və qətiyyətli lider olduğunun bir daha şahidi olmaqla yanaşı, həm də Azərbaycana qarşı dezinformasiya yaymaq istəyənləri yerindəcə tərksilah etdi. Azərbaycan həqiqətləri ilə yanaşı, dünya ictimaiyyətinə həm də olduqca mühüm mesajlar da çatdırıldı. Bütün dünyaya göstərdi ki, Azərbaycanın Ermənistan üzərində qələbəsi ölkəmizdə həyata keçirilən məqsədyönlü siyasətin nəticəsidir. Dövlət başçısı bildirdi ki, bu gün Ermənistanda revanşist qüvvələr hakimiyyətə gələrək əldə edilmiş razılaşmaların üstündən xətt çəkmək istədiyi halda "dəmir yumruq" hər zaman yerindədir. Bir sözlə, Azərbaycan Prezidenti bu mətbuat konfransı ilə informasiya sahəsində də Ermənistanı tam məğlub etmiş oldu.

Mətbuat konfransında dövlət başçımız bir sıra məsələlərə də aydınlıq

gətirərək, həm işğal zamanı, həm də müharibə dövründə ermənilərin törətdikləri vəhşilikləri, azərbaycanlılara məxsus müqəddəs yerlərin təhqir edilməsini jurnalistlərin diqqətinə çatdırdı və bildirdi ki, bütün bu faktları onlar öz ölkələrində işıqlandırmalıdırlar. Həmçinin, Prezident İlham Əliyev Ermənistanın baş naziri Paşinyanla qurulan təmaslar haqqında ətraflı məlumat verərək, onun ikiüzlüyünü və yalanlarını açıq şəkildə hamının diqqətinə çatdırdı. Bütün bunlarla yanaşı, dövlət başçımız Qarabağın gələcək inkişafı, görüləcək quruculuq işləri haqqında da fikirlərini bölüşdü, həmçinin, gələcəkdə regionda yerləşən dövlətlərlə sıx əlaqələrin yaradılacağını da söylədi. Bir daha vurğuladı ki, Ermənistan Azərbaycanla mehriban və qonşuluq şəraitində yaşamağa üstünlük verərsə, bu iki xalqın keçmişdə olduğu kimi gələcəkdə də bir yerdə yaşaması mümkündür. Çünki Azərbaycan hər zaman bölgədə dayanıqlı sülhün və stabilliyin təminatçısı olmuşdur.

***Qətiyyətin təntənəsi...***

Ən qürurverici o idi ki, həmin brinfiqdə iştirak edən KİV nümayəndələri, eləcə də bütün dünya mətbuatında dövlətimizin başçısının sualları yüksək diplomatik məharət, natiqlik nümayiş etdirərək, səlis, təfərrüatlı, dəqiqliklə, məntiqlə, tam əsaslandırılmış şəkildə, özü də müxtəlif dillərdə cavablandırması, sözün həqiqi mənasında, heyrət doğurmuşdu. Dövlətimizin başçısı mətbuat konfransında bir çox önəmli mesajlar da verdi və onun hər fikrini maraqla dinləyən geniş bir auditoriya var idi. Hər kəs Prezident İlham Əliyevin nə qədər uzaqgörən, müdrik bir siyasi xadim olduğunu bir daha gördü.

Tədbirdə Böyük Britaniyadan olan müstəqil jurnalistin sözləri də bir daha deyilənlərin göstəricisidir: "Cənab Prezident, bizi bura dəvət etdiyinizə görə Sizə təşəkkür edirik. Düşünürəm ki, mətbuat konfransının uzunluğuna görə Siz artıq dünya rekorduna imza atmısınız. Mən 25 ildir jurnalistika ilə məşğul oluram, ancaq hər hansı bir Prezidentin 4 dildə bu cür mətbuat konfransı aparmasının şahidi olmamışdım".

Həmçinin, KGK İdarə Heyətinin sədri Mehmet Ali Dim, Prezidentin 4 saatlıq fasiləsiz konfransla dünya rekordu qırdığını söyləyib: "Mən hələ belə bir səbirli lider görməmişəm. Bütün suallara səmimi cavab verdi. Azərbaycan xalqı çox şanslıdır. Bu cür təcrübəli və savadlı lider hər ölkədə ola bilməzdi".

Londonda fəaliyyət göstərən jurnalist, KGK baş katibinin müavini Aynur Tattersall isə dünya liderləri ilə görüşməyin ortalama yarım saatdan 1 saata qədər davam etdiyini bildirib: "25 ildir jurnalistəm, dünyanın dörd bir yanında mətbuat konfranslarını izləmişəm. Dünya liderinin hər suala jurnalistin öz dilində bu qədər uzun müddət cavab verdiyini ilk dəfədir görürəm".

Bax, budur Liderlik! Necə də qürur duymayasan. Güclü ölkənin güclü, qətiyyətli lideri olmaq budur. Bu uğurlar, əlbəttə ki, Prezident, Müzəffər Ali Baş Komandan İlham Əliyevin möhkəm iradəsi, qətiyyəti, müdrikliyi sayəsində baş verdi. Hər zaman ilklərə imza atan Prezident İlham Əliyev fevralın 26-da keçirdiyi mətbuat konfransı ilə daha bir ilkə imza atdı. Bu, Azərbaycan Prezidentinin yerli və xarici media nümayəndələri ilə dörd saatdan artıq davam edən ilk görüşü idi. Dövlətimizin başçısı bu məsələyə toxunaraq dedi: "Mən bilirəm, hərdən yerli jurnalistlər də bir növ gileylənirdilər ki, niyə Prezident Əliyev mətbuat konfransları təşkil etmir, müsahibələr vermir. Mən hesab edirəm ki, hər bir işin öz vaxtı var. Sənin vermək istədiyin bir mesaj varmı və səni dinləyəcək bir auditoriya varmı? Müharibə vaxtı 44 gün ərzində mən 30-dan artıq müsahibə verdim, çünki buna ehtiyac var idi. Mən dünyaya mesajımızı çatdırmaq istəyirdim, mən həqiqəti və mövqeyimizi dünyaya çatdırmaq istəyirdim. Hər gün mən bəyanatlar verirdim, Azərbaycan xalqına müraciətlər edirdim. Çünki buna ehtiyac var idi, xalqımızın buna ehtiyacı var idi, ordumuzun buna ehtiyacı var idi. Bilirəm ki, mənim həmin o müraciətlərim və mesajlarımın ümumi qələbəmizdə böyük rolu olmuşdur".

Beləliklə, Prezident İlham Əliyevin keçirdiyi mətbuat konfransı Azərbaycan həqiqətlərinin bir daha dünyaya çatdırılması, regionda yaranmış yeni reallıqlara və bölgənin gələcəyi ilə bağlı məqamlara aydınlıq gətirilməsi baxımdan çox uğurlu oldu. Azərbaycan Prezidenti bir daha dünyanın diqqətini özünə cəlb etdi. Bu mətbuat konfransı informasiya cəbhəsində Azərbaycanın mövqeyini daha da gücləndirdi. İnanırıq ki, 30 ildən xeyi müddətdə işğal edilən torpaqları 44 günlük Vətən müharibəsi nəticəsində xilas edən Prezident, Müzəffər Ali Baş Komandan İlham Əliyev doğma Qarabağımızı cənnətə çevirəcək və bütün dünya bu diyarı daha da yaxından tanıyacaq.

## Xalqımızın arzularını gerçəkləşdirən QALİB LİDER

Hər ili yola salanda dönüb arxaya baxırıq. Düşünürük ki, bu il xalqımızın yaddaşında nə ilə, hansı nailiyyətlərlə qalıb. Deyərdim ki, son 17 ilin uğurlarının ümumiləşdirilmiş mənzərəsi: 30 ilin həsrətinə 44 günün - zəfər tarixidir! Bu Zəfər tarixi ki Qarabağımızı bizə qaytardı! Prezident İlham Əliyevin rəhbərliyi ilə son 17 ildə həyata keçirilmiş ardıcıl və məqsədyönlü iqtisadi siyasət nəticəsində Azərbaycan bir sıra qabaqcıl ölkələrin onilliklər boyu keçdiyi inkişaf mərhələsini sürətlə adlayaraq, postsovet məkanında keçid dövrünü başa vuran ilk ölkə olmuşdur. Davos Dünya İqtisadi Forumunun hesablamalarına əsasən, Azərbaycan iqtisadiyyatı rəqabət qabiliyyətliliyinə görə dünya miqyasında 35-ci, ümumi infrastrukturun inkişafına görə isə 26-cı yerdə qərarlaşmış, ölkədə 1,9 milyon yeni iş yeri açılmış, maaşlar 5 dəfədən, pensiyalar isə 8 dəfədən çox artırılmışdır. İşsizlik səviyyəsi 5 faizə, yoxsulluq isə 49 faizdən 5 faizə endirilmişdir.

Bəşəriyyəti cənginə almış COVID-19 pandemiyası ilə mübarizədə Azərbaycan ən ciddi tədbirlər görmüş ölkələr sırasındadır. Koronavirusun ölkəmizdə yayılmasının qarşısının alınması məqsədilə Prezident İlham Əliyevin rəhbərliyi və şəxsi nəzarəti ilə səmərəli tədbirlər həyata keçirilir. Ümumdünya Səhiyyə Təşkilatı bu bəlaya qarşı mübarizədə Azərbaycanın gördüyü tədbirləri dəfələrlə yüksək qiymətləndirmiş, bu sahədə nümunəvi ölkə adlandırmışdır. Dövlət başçısının ilk gündən atdığı addımlar bütün strukturlar və eləcə də vətəndaşlar üçün nümunə olmuş, 2020-ci il iyul ayının 10-da məhz cənab İlham Əliyevin koronavirusla mübarizə ilə bağlı xüsusi təşəbbüsü dünya dövlətləri tərəfindən yekdilliklə dəstəklənmişdi.

Prezident İlham Əliyevin 17 illik prezidentlik və 2018-ci il aprelin 11-də xalq tərəfindən seçilərək rəhbərlik etdiyi Azərbaycan bu gün dünyanın siyasi sistemində özünəməxsus yeri ilə seçilir. Onunla hesablaşırlar, ona hörmət və ehtiramla yanaşırlar. Çünki Qalib liderimizin "dəmir yumruq" siyasəti ilə mümkünsüzü mümkün etdi.

Müzəffər Azərbaycan Ordusu Ali Baş Komandanımızın rəhbərliyi altında cəmi 44 günə mümkünsüzü mümkün etdi! Ermənistanın hərbi kaputilyasiyasına nail olduq! Bəşəriyyətə haqqın, ədalətin böyük dövlətlərin tapdağından qurtara biləcək bir dövlətin – Azərbaycanın var olduğunu sübut etdik. Bu ədaləti 44 gün ərzində yazan Azərbaycan xalqı,

bütün dünya azərbaycanlıları, Türkiyə dünyası bir yumruq kimi birləşərək təkcə Ermənistanın yox, bütövlükdə haqsız güclərin üstünə getdi və sübut etdi ki, haqq yolunda, ədalətin, ərazi bütövlüyümüzün bərpası uğrunda vuruşuruq. Müzəffər Azərbaycan Ordusu cəmi 44 günə hərbi yolla 28 il düşmən torpağında inləyən vətən torpaqlarını işğaldan azad etdi. Üçtərəfli bəyanata əsasən Dağlıq Qarabağın heç bir xüsusi statusu olmayacaq. Dağlıq Qarabağ Muxtar Vilayəti də tarixə qovuşdu. Bu bəyanat Ermənistanın kapitulyasiyasıdır.

Qurucu lider, müzəffər sərkərdə və xalqımızın ən böyük arzularını gerçəkləşdirən şəxsiyyət kimi adını əbədi olaraq tarixə yazan Ali Baş Komandanımız, Prezident İlham Əliyev son 17 ildə xalqımızın ən böyük arzularını gerçəkləşdirdi: Cəbrayıl, Qubadlı, Zəngilan, Füzuli, Xocavənd, Şuşa, Ağdam, Kəlbəcər, Laçınımızı və digər əraziləri təcavüzkar Ermənistanın işğalından azad etdi. 44 gün davam edən hərbi əməliyyatlar nəticəsində Azərbaycan Ordusu Ermənistanın 30 il ərzində qurduğu silahlı qüvvələrini darmadağın etdi. 44 gün ərzində Ali Baş Komandanın rəhbərliyi ilə Ordumuz bütün dünyaya öz qüdrətini, gücünü nümayiş etdirdi. Noyabrın 8-də 28 illik həsrətdən sonra Azərbaycan xalqı üçün böyük əhəmiyyət kəsb edən və rəmzi məna daşıyan Şuşa şəhəri işğaldan azad edildi. Bu qələbə xalqımızın əzmini, qəhrəmanlığını bir daha bütün dünyaya nümayiş etdirdi. Bu, Prezident İlham Əliyevin son 17 ildə həyata keçirdiyi güclü dövlət, güclü ordu strategiyasının Qələbəsidir. Azərbaycan Prezidenti, Ali Baş Komandanımız İlham Əliyev dediyi kimi: “Qarabağ Azərbaycandır və nida” ifadəsi artıq bizim qələbəmizin rəmzi idi, rəmzinə çevrildi. Bir il bundan əvvəl mən bunu demişəm. Mən fəxr edirəm ki, mənim dediyim ifadə artıq bir milli şüara çevrildi. Bu gün böyük qürur hissi ilə deyə bilərik ki, Füzuli bizimdir, Cəbrayıl bizimdir, Zəngilan bizimdir, Qubadlı bizimdir, Ağdam bizimdir, Laçın bizimdir, Kəlbəcər bizimdir, Şuşa bizimdir, Qarabağ bizimdir, Qarabağ Azərbaycandır! Eşq olsun Azərbaycan xalqına! Yaşasın Azərbaycan!"

## Uğurlu sosial siyasətin sübutu – Azərbaycan modeli

Azərbaycan Prezidenti Ümumdünya Səhiyyə Təşkilatının əsas qərarverici orqanı olan Ümumdünya Səhiyyə Assambleyasının "Pandemiyaya son qoyaraq növbəti pandemiya təhlükəsinin qarşısının alınması: birlikdə daha sağlam, təhlükəsiz və ədalətli dünyanın qurulması" mövzusuna həsr edilmiş 74-cü sessiyasında xüsusi qonaq qismində videoformatda çıxışında ölkəmizin pandemiya ilə mübarizə çərçivəsində gördüyü işlər, eləcə də beynəlxalq müstəvidə təşəbbüsləri diqqətə çatdırıb. Dövlət başçısı bildirib ki, Azərbaycan pandemiya ilə mübarizədə qlobal çağırışlarla çıxış edən nadir ölkələrdəndir.

Bəli, XXI əsrin bəlası olan koronavirus pandemiyası ilə mübarizədə Azərbaycan dünyanın ən öndəgedən ölkələri sırasındadır. Çünki hər bir dövlətin əsas funksiyalarından biri əhalinin sosial müdafiəsini təşkil etmək, maddi nemətlərin ədalətli bölgüsünə nail olmaq, daxili siyasətin sosialyönümlüyünü ön planda saxlamaq, vətəndaşların sosial rifah halını yaxşılaşdırmaqdan ibarətdir. Azərbaycanda da dövlət daim öz vətəndaşına qayğı ilə yanaşır, onun rifahının yüksəldilməsini, sosial problemlərinin həllini prioritet vəzifə kimi görür və bu istiqamətdə məqsədyönlü siyasət həyata keçirir. Əslində, dövlət başçımız bu siyasətini 18 ildir ki, davam etdirir, ancaq hazırkı məqamda həmin siyasət daha aşkar görünməkdədir.

Bu gün dünyanı çalxalayan koronavirus pandemiyası bütün inkişaf etmiş dövlətləri iflic vəziyyətinə saldığı halda Azərbaycanda ilk gündən unikal tədbirlər keçirilməsi nəticəsində bütün sahələrdə olduğu kimi, koronavirusla mübarizə tədbirlərində də ölkəmiz dünyada özünəməxsus imic formalaşdırıb – Azərbaycan modeli. Bu, reallıqdır. Azərbaycan artıq beynəlxalq aləmdə inkişaf, tərəqqi, yüksəliş simvoluna çevrilir. Bütün dünyanın etiraf etdiyi bu reallıq Prezident İlham Əliyevin fəaliyyətinə verilən haqlı və real qiymətdir. Bu, dövlət başçımızın dövlətləri və millətləri birləşdirən siyasətidir və bu siyasət Azərbaycan tərəfindən təqdim olunur, öyrənilir.

Artıq bu gün ölkəmizdə görülmüş müfəssəl tədbirlər nəticəsində karantin rejimi tədricən yumşaldılıb. Bir məqamı da vurğulamaq lazımdır ki, Azərbaycan pandemiya ilə mübarizədə qlobal çağırışlarla çıxış

edən nadir ölkələrdəndir. Hazırda bəşəriyyətin qarşısında duran bu problemin həlli məqsədilə Azərbaycan Qoşulmama Hərəkatı adından BMT-nin İnsan Hüquqları Şurasında bütün ölkələrin peyvəndlərə bərabər və universal çıxışının təmin edilməsi ilə bağlı qətnamə irəli sürüb və həmin qətnamə cari ilin mart ayında yekdilliklə qəbul olunub. Bu baxımdan, Azərbaycan inkişaf etmiş ölkələri və donor təşkilatlarını inkişaf etməkdə olan, xüsusilə ən az inkişaf etmiş ölkələrə dəstək verməyə çağırır. Bu gün pandemiya ilə mübarizədə Azərbaycan Ümumdünya Səhiyyə Təşkilatı ilə səmərəli əməkdaşlıq edir. Təsadüfi deyil ki, bu müstəvidə təşkilat Azərbaycanı nümunəvi ölkə hesab edir. Eyni zamanda, Azərbaycan Ümumdünya Səhiyyə Təşkilatına 10 milyon ABŞ dolları həcmində könüllü maliyyə dəstəyi verib. Bununla yanaşı, koronavirusla əlaqədar 30-dan çox ölkəyə humanitar və maliyyə yardımı göstərib. Bütün bunlar, ölkəmizin pandemiyaya qarşı qlobal mübarizədə verdiyi töhfələrin nümunəsidir.

Qeyd etmək istərdim ki, hər zaman humanizm prinsiplərini yüksək tutan ölkəmiz dünya əhalisinin vaksinlə ədalətli şəkildə təmin olunmasının tərəfdarıdır. Azərbaycan bəzi ölkələr tərəfindən ehtiyaclarından bir neçə dəfə artıq peyvənd əldə edilməsini və inkişaf etməkdə olan ölkələri öz əhalisini qorumaq imkanından məhrum etmələrini beynəlxalq səviyyədə pisləmişdir. Davam edən "peyvənd millətçiliyi", inkişaf etmiş və inkişaf etməkdə olan ölkələr arasında peyvəndlərə çıxışla bağlı getdikcə dərinləşən qeyri-bərabərlik narahatlıq doğurur. Beynəlxalq hesabatlara əsasən, bu günə qədər dünyada mövcud olan peyvənd dozalarının 82 faizi zəngin ölkələr tərəfindən alınmış, peyvəndlərin yalnız 0,3 faizi azgəlirli ölkələrin payına düşmüşdür. Bu gün biz yaxşı başa düşürük ki, pandemiyaya qalib gəlmək üçün qlobal həmrəylik strateji əhəmiyyətə malikdir. Azərbaycan pandemiyanın öhdəsindən gəlmək üçün həmişə güclü qlobal həmrəyliyin nümayiş etdirilməsinin tərəfdarı olmuş və bunun əhəmiyyətini təbliğ etmişdir.

Bəli, bu, hər ölkənin bacara biləcəyi məsələ deyil. Ancaq Azərbaycan Prezidenti İlham Əliyev hər zaman olduğu kimi, bu çətin günlərdə də öz vətəndaşının yanında oldu və bu gün də yanındadır. "Biz birlikdə güclüyük!" şüarı, ölkəmizdə, sözün əsl mənasında, vətəndaş-dövlət etimadının mövcudluğudur. Biz Koronavirusla Mübarizəyə Dəstək Fondunun nümu-

nəsində bunun bir daha şahidi olduq. Bundan əlavə, epidemiyanın fəsadlarından əziyyət çəkən sahibkarlar da unudulmadı, dövlətin onlara öz maliyyə dəstəyini göstərməsi bir daha təsdiq etdi ki, Azərbaycan dövləti hər bir vətəndaşının yanındadır, xalqa xidmət etmək, hər bir azərbaycanlının Prezidenti olmaq onun həyat fəlsəfəsidir, bu sevginin, qayğının, mərhəmətin bariz təcəssümüdür. Koronavirus pandemiyası şəraitində reallaşdırılan bənzərsiz sosial müdafiə tədbirləri və eləcə də bundan sonra nəzərdə tutulan genişmiqyaslı proqramlar Prezident İlham Əliyevin "Azərbaycanda həyata keçirilən siyasətin mərkəzində vətəndaş dayanır", "Azərbaycan dövləti hər zaman vətəndaşın yanındadır" fikirlərinin bariz təzahürüdür və əməli işlərlə tamamlanır. Prezident İlham Əliyevin sərəncamı ilə Azərbaycan Nazirlər Kabineti yanında Operativ Qərargahının fəaliyyətə başlaması, Koronavirusla Mübarizəyə Dəstək Fondunun yaradılması, ölkəmizə Avropa istehsalı olan laborator testlər, tibb avadanlığı və ləvazimatlar, qoruyucu vasitələr vaxtında gətirilərək tibb müəssisələrinə təhvil verilməsi, yeni laboratoriyalar formaslaşdırılması, qısa zamanda modul tipli xəstəxanaların qurulması, Prezident İlham Əliyev və Birinci vitse-prezident Mehriban Əliyevanın iştirakı ilə Azərbaycanda tibbi maskalar istehsal edən müəssisənin açılması dövlətin hər zaman öz vətəndaşının yanında olmasının təcəssümüdür.

Bizim üçün yaradılan bu unikal şansdan maksimum faydalanıb, əvvəlki günlərimizə qaldığımız yerdən davam edə bilərik. Unutmamalıyıq ki, əsrin bəlasından xilasımız vaksinasiyadan keçir. Bir sözlə, bütün bunları xalqımız görür və öz Prezidentinin yanındadır. Xalqımız möhtərəm Prezidentimiz İlham Əliyevin rəhbərliyi altında bundan sonra daha böyük nailiyyətlərə imza atacağının şahidi olacaq. İkinci qurtuluş yolu yoxdur! Qarabağ problemimizdə Qalib Nidasını qoyduğumuz kimi, pandemiyaya qarşı mübarizədə də bir olmalıyıq!

# Hərbi Zəfərdən diplomatik Qələbəyə

## İşğaldan azad olunmuş ərazilərin mina xəritələri ardıcıllıqla Azərbaycana veriləcək

44 günlük Vətən müharibəsi ilə Ermənistanın 30 illik işğalına son qoyan və Azərbaycanın ərazi bütövlüyünü bərpa edən Müzəffər Ali Baş Komandan, Prezident İlham Əliyev ölkəmizə qələbələr qazandırmaqda davam edir. Dövlət başçısının qətiyyətli siyasəti nəticəsində Azərbaycan hərbi zəfərini diplomatiya meydanında təkrarlayır. Bu dəfə də Azərbaycan liderinin prinsipial siyasəti öz bəhrəsini verdi və Ermənistan indiyədək gizli saxladığı mina xəritələrinin bir hissəsini üzə çıxarmağa məcbur qaldı. 30 il ərzində Ağdam, Füzuli və digər ərazilərdə xüsusi müdafiə sədləri quran erməni silahları qüvvələri demək olar ki, bütün ərazilərimizi minalamışdılar. Ermənistan bununla maksimum insan itkisinə nail olmağı, həmçinin Azərbaycanın Qarabağda başlatdığı yenidənqurma, bərpa işlərinə, xarici şirkətlərlə birgə həyata keçiriləcək meqalayihələrə süni əngəllər törətməyi qarşısına hədəf qoymuşdu. Lakin işğalçı Ermənistan anlamır ki, bu gün Azərbacan hərbi və siyasi şərtləri indi...

### *Qaliblər diktə edir*

Prezident İlham Əliyevin dediyi kimi: “Azərbaycanın diktəsi ilə hərəkət etməkdən başqa bir çarəsi yoxdur, bunu öz xoşları ilə etməsələr, məcburən etdirəcəyik”. Çünki Prezident İlham Əliyev nə vaxt, nəyi, necə etmək lazımdır, bunu bilir: “Nə vaxt, nəyi, necə etmək lazımdır, bunu biz bilirik. Yaxın tarix dəfələrlə bunu göstərib, həm siyasi müstəvidə, diplomatik müstəvidə, eyni zamanda, döyüş meydanında. Nəyi ediriksə, dəqiqliklə edirik”. Bu günədək aparılan siyasət, atılan addımlar, o cümlədən sentyabrın 27-dən başlayan əks-hücum əməliyyatları dövlət başçısının bu fikirlərinin tam əsaslı olduğunu təsdiq edir. İstər danışıqlar masasında, istərsə də hərb meydanında atılan hər bir düşünülmüş və dəqiq addım bizi əsas hədəfə daha da yaxınlaşdırır. Regionda yeni əməkdaşlıq imkanlarının yaranmasına baxmayaraq, İrəvan kapitulyasiya aktından sonra sülhə can atmadı və bu ölkənin hərbi-siyasi rəhbərliyi geridə qalan səkkiz ay ərzində Azərbaycandan fərqli olaraq, heç bir humanistlik nümayiş

etdirmədi. Bu amil daha çox mina xəritələrinin təhvil verilməməsində özünü göstərdi. Təəssüflər olsun ki, Ermənistanın mina təxribatları müharibədən sonra onlarla dinc sakin və hərbçinin həlak olmasına, ya da sağlamlığını itirməsinə səbəb oldu.

### *Ermənistanın dediyi yox, məhz Azərbaycanın istədiyi oldu*

Yenə də Ermənistan "ağ bayraq" qaldırdı. Ermənistanın dediyi yox, məhz Azərbaycanın istədiyi oldu. Ağdam, onun ardınca iyulun 3-də Füzuli və Zəngilanın mina xəritələri ölkəmizə verildi. Bu, Ali Baş Komandanımız, Prezident İlham Əliyev cənablarının qətiyyətli iradəsinin məntiqi nəticəsi və "Dəmir Yumruq" siyasətinin növbəti qələbəsi, zəfəridir. Ermənilər tərəfindən basdırılmış çoxsaylı minalar yüz minlərlə məcburi köçkünün işğaldan azad olunmuş rayonlara qaytarılmasına ciddi maneə yaradır. Müharibə dayanandan sonra Ermənistanın mina xəritələrini verməməsi səbəbindən yeddi ayda 100-dən çox azərbaycanlı həlak olub və ya yaralanıb. Mina xəritələrinin əldə edilməsi ilə Ermənistanın bir vaxtlar Ağdam rayonu ərazisində basdırdığı 100 mindən çox minanın yerini müəyyən etmək mümkün olacaq. Bu isə minlərlə insanın təhlükəsizliyinin təmin edilməsinə, həmçinin, Azərbaycan Prezidenti cənab İlham Əliyev tərəfindən Ağdamda əsası qoyulan yenidənqurma layihələrini və məcburi köçkünlərin qayıdışı prosesini sürətləndirilməsi, işğaldan azad edilmiş ərazilərdə quruculuq işlərinin aparılması üçün daha əlverişli zəminin yaradılmasına imkan verəcək. Bu, 30 il işğal altında saxlanılan Qarabağın azad olunması ilə nəticələnmiş Zəfərdən sonra Qalib Liderimizin növbəti qələbəsi, siyasi-diplomatik uğurdur. Azərbaycan Prezidenti İlham Əliyevin "Dəmir yumruq" siyasəti ilə digər işğaldan azad olunmuş rayonlarımızın da mina xəritələrini alacağıq. Ermənistan həmin xəritələri də ölkəmizə təhvil verməlidir. Bu, beynəlxalq hüququn tələbi olmaqla yanaşı, regionda sülhün, təhlükəsizliyin təminatı baxımından da olduqca vacibdir. Əldə olunan bu nailiyyət bir daha göstərdi ki, Azərbaycan Prezidenti İlham Əliyev işğal altındakı torpaqların düşməndən azad olunması, bərpa işlərinin sistemli görülməsi və böyük qayıdış üçün geniş bir konsepsiya həyata keçirməyə qadirdir.

Göründüyü kimi, Azərbaycan Prezidenti böyük Qələbə ilə Ermənistanı təhdid etmədi, əksinə, təcavüzkar tərəfə mehriban qonşuluğun yeganə düzgün birgəyaşayış yolu olduğunu anlatdı. Əgər Ermənistan xalqı düzgün siyasi qərar qəbul edərsə, bu ölkədəki seçkilərdən sonra region xalqları qarşılıqlı etimad yolunda birgə hərəkət edə bilərlər. Azərbaycan tərəfi mina xəritəsi müqabilində 15 erməni vətəndaşını təqdim etməklə həm humanistlik, həm də mina təhlükəsi ilə üzləşə biləcək hər bir vətəndaşımızın təhlükəsizliyinin və həyatının bizim üçün dəyərli olmasını nümayiş etdirdi.

Göründüyü kimi, bu gün Azərbaycan bir daha göstərdi ki, döyüş meydanında qalib olduğu kimi diplomatiya platformalarında da qalibdir. Çünki ədalət və beynəlxalq hüquq Azərbaycanın tərəfindədir. Bütün bu proseslərdə ölkə başçısı birmənalı şəkildə öz xarici siyasəti ilə insan haqlarının tapdanmasının qarşısını almaq və Ağdama böyük köçün başlaması üçün minalardan təmizlənməyin mühüm mərhələ olduğunu dünyaya göstərdi. Heç kimə sirr deyil ki, ermənilər indiyədək müxtəlif bəhanələr gətirərək, həmin xəritələri bir müddətdir Azərbaycana verməkdən imtina edirdilər. Məqsəd isə bəllidir; daha çox azərbaycanlı həyatını itirsin. Çünki cənab prezidentin sərəncam və tapşırıqları ilə Qarabağ indi böyük bir tikinti meydançasını xatırladır. Təsəvvür edin, yollar tikilir, körpülər salınır, bu və ya digər dövlət qurumları infrastruktur layihələri həyata keçirirlər. Bu gün Ağdamdan sonra ən böyük infrastruktur layihələrinin Füzulidə həyata keçirilməsi, Füzulinin strateji əhəmiyyət kəsb etməsi, bütün yol-nəqliyyat infrastrukturunun bu ərazidən keçməsini nəzərə alsaq, Azərbaycanın bu xəritələri əldə etməsinin hansı səviyyədə uğurlu olması heç kimdə şübhə doğurmamalıdır. Reallıq budur ki, xəritələrin verilməsindən sonra bölgədə işlər daha sürətli görüləcək və əhali tez bir müddətdə öz torpaqlarına geri qayıdacaq.

Artıq bölgədə ciddi quruculuq işlərinə başlanılıb. Füzulidə beynəlxalq aeroport tikilir, Şuşaya, Qubadlı-Laçın istiqamətində yollar çəkilir. Bir sözlə, Füzuli strateji əhəmiyyət kəsb edir, bütün yol-nəqliyyat infrastrukturu bu ərazidən keçir. Bu baxımdan, Qarabağda aparılacaq quruculuq işlərində Füzuli rayonun xüsusi yer tutacaq. Bundan başqa Zəngəzur koridorunun fəaliyyətə başlamasına hazırlıq üçün Füzuli və Zəngilan

rayonlarında avtomobil və dəmir yolları infrastrukturu yenidən qurulmalıdır. Bunun üçün isə ərazilərin minalardan təmizlənməsi vacibdir. Bu baxımdan mina xəritələrinin təqdim olunması bu prosesi də sürətləndirəcək.

Bir sözlə, Paşinyan anlamır ki, bu günə kimi Ermənistanın dediyi yox, məhz Azərbaycanın istədiyi olub və olacaq. Çünki Azərbaycan haqq yolundadır. Mina xəritələrini verilməsində də Ermənistan yenə “ağ bayraq” qaldırdı, Ermənistanın dediyi yox, məhz Azərbaycanın istədiyi oldu. Prezident İlham Əliyevin diplomatik məharəti və məqsədyönlü siyasəti nəticəsində Azərbaycan buna da nail olmağı bacarır və bundan sonra da istəyinə nail olacaq.

## Etibarlı tərəfdaşlıq, müttəfiqlik münasibətinə söykənən münasibətlər

Azərbaycan Prezidenti İlham Əliyevin Rusiyaya işgüzar səfəri, görüşdə ikitərəfli münasibətlərin, regional məsələlərin, iki ölkənin iqtisadi əlaqələrinin bu günü və perspektivləri, pandemiya ilə mübarizə məsələlərinin müzakirəsi bir daha hər iki dövlət liderlərinin ortaq mövqedən çıxış etdiyinin təsdiqidir. Xüsusilə də, səfər çərçivəsində bir neçə dəfə postmünaqişə ifadəsinin təkrarlanmasıdır ki, yəni münaqişənin bitdiyi və bundan sonra yalnız regionda sülhün, əmin-amanlığın təmin olunması istiqamətində addımların atılacağı mesajını verir. Digər mühüm amil isə, Rusiya prezidenti Vladimir Putin tərəfindən hər zaman olduğu kimi bu dəfə də "Dağlıq Qarabağ" ifadəsinin səsləndirilməməsidir. Yəni məlum olduğu kimi, Azərbaycanın inzibati ərazi bölgüsündə belə bir subyekt yoxdur və şübhəsiz ki, bu da Rusiya prezidenti tərəfindən Azərbaycanın mövcud inzibati ərazi subyektlərinə, mövcud sərhədlərinə sayğısını, həmçinin də bundan sonrakı proseslərin məhz postmünaqişə amili üzərindən həyata keçirəcəyini təsdiqləyir. Bu isə onu göstərir ki, hər iki ölkənin regional, təhlükəsizlik və digər məsələlər üzrə mövqeləri üst-üstə düşür.

Prezident İlham Əliyev çıxışlarında, müsahibələrində, görüşlərində dəfələrlə və qətiyyətlə bildirir ki, Qarabağ münaqişəsi keçmişdə qaldı: **"Mən dəfələrlə bildirmişdim ki, Dağlıq Qarabağ münaqişəsi həll olunub, Azərbaycan bunu həll edib və 30 ilə yaxın kağız üzərində olan qətnamələri yerinə yetirib və artıq münaqişə tarixdə qalıbdır".**

Bəli, Azərbaycan Dağlıq Qarabağ münaqişəsini təkbaşına həll edib, həm döyüş meydanında və ondan sonra masa arxasında. Döyüş meydanında qazanılmış Qələbə düşməni məcbur etdi ki, ağ bayraq qaldırsın və təslim olsun, kapitulyasiya aktına imza atsın. Noyabrın 10-da imzalanmış sənəd məhz Ermənistanın kapitulyasiya aktıdır. Dəfələrlə dövlətimizin başçısı vurğulayıb ki, Azərbaycan ərazisində Dağlıq Qarabağ adlı ərazi vahidi yoxdur: **"Münaqişə öz həllini tapıb və hesab edirəm ki, bu məsələyə qayıtmaq əbəsdir. Hər halda müharibədən sonra keçən dövr ərzində bunu göstərdik. Birincisi, əgər kimsə hesab edir ki, "Dağlıq Qarabağ münaqişəsi" həll olunmayıb, bu, onun öz problemidir.**

**İkincisi, bu, çox təhlükəli yanaşmadır. Əgər bu münaqişə həll olunmayıbsa, onda bu münaqişənin həlli necə olmalıdır? O deməkdir ki, noyabrın 10-da imzalanmış Bəyanat qüvvəsini itirib? Yəni, mən bunu belə başa düşə bilərəm".**

Belə bir ifadədə də var: "Tarixi həqiqətləri inkar etdikdə, reallıq hissi itirilir". Bu, həqiqətən də belədir. Görüş zamanı verilən mesajlar bir daha onu göstərir ki, münaqişə sonrası proseslər ənənəvi qaydada aparılacaq. Yəni 10 noyabr razılaşmasına alternativ hər hansı bir yol yoxdur. Bu baxımdan, Ermənistan tərəfindən atılan təxribatçı addımlar ümumi prosesin tənzimlənməsinə təsir göstərə bilməz. Çünki bu gün şərtləri qaliblər diktə edir.

Dövlətimizin başçısı ən əsas məqam olan hərbi əməliyyatlardan sonrakı təmaslar barədə bildirdi ki: "Əlbəttə, regionda münaqişədən sonrakı vəziyyət mövzusu da var. Bu məsələyə daimi diqqətinizə, çox vacib və həssas məsələlərin həllində şəxsən iştirakınıza görə Sizə təşəkkürümü bildirmək istərdim. Biz Sizinlə daim əlaqə saxlayırıq. Hərbi əməliyyatlar başa çatandan sonra ötən səkkiz ay ərzində, zənnimcə, yanvar ayında Moskvada şəxsən görüşümüz və telefon söhbətlərimiz vəziyyətin sabitləşdirilməsi işində çox mühüm rol oynayıb. Biz qətiyyətlə münaqişədən sonrakı dövrün maksimum ağrısız keçməsi əzmindəyik. Düşünürəm ki, ümumi səylərimizlə buna nail olacağıq".

Yəni bu, o deməkdir ki, Vladimir Putin Nikol Paşinyana imzalatdırdığı bəyanatların yerinə yetirilməsini təmin etməlidir. Dövlət başçımızın bir neçə dəfə "münaqişədən sonrakı dövr" ifadəsini işlətməklə bildirmək istəyir ki, Azərbaycan üçün münaqişədən sonrakı dövr sülh sazişinin imzalanması, Ermənistanın Azərbaycanın ərazi bütövlüyünün tanınması, sərhədlərin müəyyənləşməsi və Qarabağdakı fəaliyyətimizin davamı deməkdir.

### *Prezident İlham Əliyevin qətiyyətli, diplomatik "Dəmir siyasət" zirvəsinin uğurudur*

Göründüyü kimi, bütün bunlar qalib liderimiz Azərbaycan Prezidenti İlham Əliyevin qətiyyətli, diplomatik "Dəmir siyasət" zirvəsinin uğurudur.

Ancaq Nikol Paşinyan küçə dalğasında hakimiyyətə gəlməklə düşünür ki, hər yerdə hər sözü danışa bilər. Ona görə də bəzən özünü unudur, hədləri aşır və boyundan yüksək bəyanatlar verir. Belə bəyanatlardan

birini də bu yaxınlarda vermişdi: “Qarabağ Ermənistandır. Nöqtə”. Bunun cavabı verilməliydimi? Təbii ki, artığıyla verilməliydi və dəfələrlə verildi – Prezident İlham Əliyev bu cavabı verdi. Göründüyü kimi, anlamayanı anlatmaq olmur. Ermənistan baş nazirinin gerçəklik hissindən uzaq açıqlamasına toxunan Prezident İlham Əliyev özünəməxsus qətiyyətlə belə demişdir: “Qarabağ Azərbaycandır və nida işarəsi!” Prezidentin məhz “nida” sözünü ayrıca vurğulaması hər kəsin, o cümlədən bölgəmizin əsas söz sahibi olan Rusiya Prezidentinin diqqətindən yayınmadı. İlham Əliyev Ermənistan baş nazirinin məsuliyyətsiz açıqlamasına bu üsulla və məhz bu məkanda cavab verməklə, əslində, sadəcə Nikol Paşinyana deyil, ona açıq və ya gizli şəkildə himayədarlıq edənlərə də ismarıc vermiş oldu. Prezident İlham Əliyevin bu qətiyyətli bəyanatı fonunda Rusiya xarici işlər naziri Sergey Lavrovun da Ermənistanı – Nikol Paşinyanı üzəcək açıqlaması diqqətimizdən qaçmamalıdır. Ənənəvi olaraq Ermənistana meyilli birisi kimi tanınan Sergey Lavrovun belə dilə gəlib Nikol Paşinyanı üzəcək münasibət sərgiləməsi erməni baş nazirin hətta ölkəsinin dostlarını belə pis vəziyyətdə qoyan açıqlama verəcək qədər təcrübəsiz olmasının bariz örnəyidir.

Bu yerdə rusiyalı hərbi ekspert İqor Korotçenkonun görüşlə bağlı liderlərlə bağlı fikrini demək istərdim. Rusiyalı hərbi ekspert İqor Korotçenko deyir: "Putin İlham Əliyevlə görüşəndə bərabər strateji tərəfdaş kimi danışır. Paşinyana isə daim bir şey qoparmaq istəyən müftəxor kimi baxır. Məhz bütün fərq də, qoyulan hörmət də bundan ibarətdir".

Bu fərqi Rusiya prezidenti Putin sonda Azərbaycan Prezidentinə Qarabağ məsələsinin həllində göstərdiyi kompromis mövqeyə görə minnətdarlığını bildirməsi oldu. Dövlətimizin başçısının dediyi kimi: “Ötən səkkiz ay ərzində, zənnimcə, yanvar ayında Moskvada şəxsən görüşümüz və telefon söhbətlərimiz vəziyyətin sabitləşdirilməsi işində çox mühüm rol oynayıb. Biz qətiyyətlə münaqişədən sonrakı dövrün maksimum ağrısız keçməsi əzmindəyik. Düşünürəm ki, ümumi səylərimizlə buna nail olacağıq”.

Bir sözlə, Azərbaycan – Rusiya arasında etibarlı tərəfdaşlıq, müttəfiqlik münasibətinə söykənən münasibətlər qarşıdakı dövrdə daha da inkişaf vəd edir. Və Moskva səfəri zamanı verilən bəyanatlar regionda davamlı sabitlik, təhlükəsizlik, inkişaf meyillərinə ciddi töhfə verəcək.

## Bakı Bəyannaməsi – Azərbaycan-Türkiyə-Pakistan – Örnək qardaşlıq birliyi

Müdrik insanların dəfələrlə söylədiyi "Siyasətin ədalətli, siyasətçinin adil olması onu dəstəkləyənlərin sırasına baxanda məlum olur" – ifadəsi bu gün Azərbaycanda öz təsdiqini tapır. Çünki bizim dövlətin yeritdiyi siyasət də, dövlət başçımızın siyasi fəaliyyəti də dünyanın hər yerində, işğalçı Ermənistan istisna olmaqla, hamı tərəfindən dəstəklənir. Xarici siyasətimizin beynəlxalq aləmdə təqdir olunması, Siahlı Qüvvələrimizin Ali Baş Komandanının ölkənin ərazi bütövlüyünün bərpası istiqamətində nümayiş etdirdiyi qətiyyət, Milli Ordumuzun işğalçı dövlətin təxribatlarına tutarlı cavab verərək düşmənin geri çəkilməsinə nail olması və bu kimi bir sıra başqa amillər həm ölkə əhalisi, həm də dünya ictimaiyyəti tərəfindən böyük hörmət və ehtiramla qarşılanır. Çünki Azərbaycanın igid oğul və qızları Vətənin şərəfini öz qeyrətləri ilə qoruyub, qanları ilə müdafiə edirlər.

Bu, dəfələrlə sübut olunub və bunu görmüşük. Sentyabrın 27-də səhər saat 06:00 radələrində Ermənistanın növbəti təxribatı bir daha işğalçı ölkənin faşizm siyasətinin göstəricisidir.

Ötən il sentyabrın 27-dən noyabrın 9-dək 44 gün davam edən Vətən müharibəsi rəşadətli Azərbaycan Ordusunun həyata keçirdiyi əkshəmlə əməliyyatları ilə əldə edilən parlaq qələbə nəticəsində ərazi bütövlüyümüz və suverenliyimiz təmin edildi. Hazırda respublikamızın qarşısında duran ən ümdə məsələ "Böyük Qayıdış" strategiyası vətəndaşlarımızın işğaldan azad edilən ərazilərdə dayanıqlı məskunlaşmasını və həmin ərazilərin ölkənin iqtisadi sisteminə inteqrasiyasını reallaşdıracaq. Artıq bərpa-quruculuq prosesinin vahid mərkəzdən həyata keçirilməsinə başlanılıb. Prezident İlham Əliyev bütün görüşlərdə, müsahibələrində bu torpaqlarda bütün işlərin ardıcıllıqla həyata keçiriləcəyini, birincisi, keçmiş məcburi köçkünlərin doğma yurdlarına qayıdışı üçün ərazilərin minalardan təmizlənəcəyini, erməni vandallarına qarşı beynəlxalq səviyyədə təzminat davasının açılması üçün onların vurduqları ziyanın qiymətləndiriləcəyini, lazımi inventarlaşdırma, pasportlaşdırma işlərinin aparılacağını, infrastruktur layihələrinin icra ediləcəyini xatırladıb. Ən əsası isə vurğulayıb ki, böyük quruculuq işlərinə isə Azərbaycana

əsl dost olan ölkələrin dost ölkələrin dəvət olunmasıdır: "Bu müharibə, eyni zamanda, onu göstərdi ki, Azərbaycanın əsl dostları kimlərdir, hansı ölkələrdir. Əlbəttə ki, Azərbaycan şirkətləri, ilk növbədə, bu işlərdə iştirak edəcək və bizim üçün dost olan ölkələrin şirkətlərini də biz dəvət edəcəyik, daha doğrusu, artıq dəvət etmişik".

Qeyd edək ki, Azərbaycan xalqı bu dostluğu qiymətləndirən xalqdır. Çünki bu dostluq, qardaşlıq illərin dostluğu, qardaşlığıdır. Vətən müharibəsində kimin dost, kiminsə düşmən olduğunu açıq-aşkar gördük. Hətta səssiz qalmağa üstünlük verib, "nə şiş yansın, nə də kabab" deyiminə uyğun olaraq tərəflərdən heç birini incik salmamaq üçün səsləndirilən çağırışları da eşitdik. İllərlə dost, qardaş dediyimiz ölkələrin bir çoxunun düşmən qarşısında acizliyinin, qorxaqlığının şahidi olmaq bizi çox incitdi, amma nə yaxşı ki, dost, qardaş ölkələrin bir çoxu etimadı yüksək səviyyədə doğrultdu və bizi qələbəyə ilhamlandırdı. Hətta ummadığımız yerdən aldığımız dəstəklər gücümüzə güc qatdı.

***Vətən savaşının sınanmış dostları...***

Torpaqlarını azad etməsi üçün Azərbaycana ən böyük dəstəyi qardaş Türkiyə dövləti verib. Türkiyə tərəfi Prezident, XİN başçısı, Milli Müdafiə naziri, Milli İstikbarat Təşkilatı – bütün səviyyələrdə qələbə gününədək Azərbaycanla birlikdə oldu və müharibədən sonrakı proseslərdə də Azərbaycanın yanındadır. Hətta belə demək mümkündürsə, Türkiyə torpaqlarımızı geri almaqda Azərbaycanla birlikdə mübarizə apardı. Dünyada heç bir iki dövlət tapılmaz ki, bir-birinə siyasi və iqtisadi maraqdan dolayısı deyil, sırf qardaş olduqları üçün belə dəstək versin. "Bir millət, iki dövlət" meydanda da özünü açıq şəkildə göstərdi və göstərməkdədir. Pakistan, Əfqanıstan, ŞKTC, Bosniya və Hersoqovina, qonşu Gürcüstan, Ukrayna, İsrail, Macarıstan, Moldova, İran, qismən dəstək verən ölkələrdən Malayziya, Mərakeş, Səudiyyə Ərəbistanı, Özbəkistan, Qətər, Qazaxıstan, İndoneziya, Misir Azərbaycanın suverenliyi və ərazi bütövlüyünə dəstək olmaqla dost ölkə olduqlarını, istənilən separatçılıq və ya silahlı üsyan addımlarını qınadığını bildirdilər.

Bu gün Böyük quruculuq işlərinə dost ölkələrin təşviq olunması siyasəti Azərbaycanın beynəlxalq aləmdə mövqeyini daha da möhkəmləndirir. Dövlətimizin başçısı çıxışlarında dəfələrlə Qarabağın bərpası

məsələsinə toxunarkən, bu işə müharibə dövründə, habelə savaşdan sonrakı mərhələdə Azərbaycanı fəal dəstəkləyən qardaş və dost ölkələrin cəlb edilməsinin diqqətdə saxlanılacağını bildirib.

Eyni zamanda, bu gün bütün dünyaya məlumdur ki, Azərbaycana Türkiyə qədər yaxın olan ikinci qardaş ölkə Pakistandır. Bu, sözdə deyil, əməldə də sübut olunmuş bir faktdır. Təsadüfi deyil ki, uzun illər Qarabağda işğala son qoyulması ilə bağlı Türkiyədən sonra Ermənistana ən sərt təpki göstərən ikinci ölkə məhz Pakistan olub. Vətən müharibəsi zamanı da Pakistan xalqı, dövləti bütün sferalarda Azərbaycanın yanında olduğunu nümayiş etdirdi. Ötən il sentyabrın 27-si və 28-də - müharibənin ilk günlərində qardaş Pakistan Ermənistanı işğala son qoymağa, BMT Təhlükəsizlik Şurasının müvafiq qətnamələrini icra etməyə çağırdı və bir daha Azərbaycanın ərazi bütövlüyünə öz dəstəyini ifadə etdi.

Türkiyənin, Pakistanın və Azərbaycanın müttəfiqliyi isə hər üç ölkənin, eyni zamanda, bəşəriyyətin mənafeyinə xidmət edir. Bütövlükdə bu üç ölkənin son illərdə daha da möhkəmlənən çoxşaxəli əməkdaşlığı Avrasiyada yeni aparıcı güc mərkəzinin formalaşmasını şərtləndirir.

Məhz iyulun 27-də Azərbaycan Milli Məclisində imzalanan üçtərəfli Bakı Bəyannaməsi ölkələrimiz arasında strateji əməkdaşlığın gücləndirilməsində, təhlükəsizliyimizin təmin olunmasında mühüm rol oynayacaq. Şuşa Bəyannaməsi Azərbaycan-Türkiyə əlaqələri üçün çox əhəmiyyətli olan sənəd olmaqla, həm də qardaş dövlətlərimiz arasında, eyni zamanda, yol xəritəsidirsə, Azərbaycan, Pakistan və Türkiyə parlament sədrlərinin birinci üçtərəfli görüşündə imzalanan Bakı Bəyannaməsi isə ölkələrimiz arasında strateji əlaqələrin daha da möhkəmlənməsinə öz töhfəsini verəcək.

Bir sözlə, bütün bunlar, ölkələrimiz arasında əldə olunan yeni razılışmalar, imzalanan müqavilələr bir daha xalqlarımız arasındakı dostluq, qardaşlıq münasibətlərinin daha da möhkəmlənməsindən, sarsılmazlığından xəbər verir. Və örnək qardaşlıq birliyinin sarsılmazlığı olan Bakı Bəyannaməsi Azərbaycan-Türkiyə-Pakistan - dostluq, qardaşlıq prinsiplərinə söykənərək yaradılan parlamentlərarası birlik illər keçdikcə daha da möhkəmlənərək təcrübə mübadiləsinin genişlənməsi fonunda daha təkmil qanunların qəbuluna öz müsbət təsirini göstərəcək.

## Sözü imzası qədər qüvvətli olan lider!

Heç kəsə sirr deyil ki, Prezident İlham Əliyev bu günə qədər verdiyi bütün vədləri yerinə yetirib. Dövlət başçısının Qarabağla bağlı vədlərini də yerinə yetirməsinin şahidi olduq. Prezident İlham Əliyev hər zaman çıxışlarında bildirib: "Mənim sözüm imzam qədər qüvvətlidir". Bəli, Prezident İlham Əliyevin bu günə qədər verdiyi bütün vədlər artıq reallığa çevrilib. 18 il öncə deyilənlər, bu gün öz müsbət nəticəsini verib. Ulu Öndər Heydər Əliyevin **"İnanıram ki, mənim axıra çatdıra bilmədiyim taleyüklü məsələləri, planları, işləri sizin köməyiniz və dəstəyinizlə İlham Əliyev başa çatdıra biləcək. Mən ona özüm qədər inanıram və gələcəyinə böyük ümidlər bəsləyirəm"**, - müraciətini reallaşdıran Prezident İlham Əliyev **"Azərbaycanı qüdrətli dövlətə çevirmək üçün ən başlıcası, ölkədə Heydər Əliyevin siyasəti davam etdirilməlidir. Bu gün yüksək kürsüdən çıxış edərkən mən Azərbaycan xalqına söz verirəm ki, bu siyasətə sadiq qalacağam, heç vaxt bu yoldan dönməyəcəyəm, Heydər Əliyevin siyasətini davam etdirəcəyəm",** - deyərək son 18 illik Prezidentlik fəaliyyətinin nəticəsidir ki, son 30 il ərzində həsrətində olduğumuz - Qarabağ Azərbaycandır! - şüarlı haqq və şərəf işimiz olan, Azərbaycan Respublikamızın suverenliyi və ərazi bütövlüyümüzə və nəhayət, Qələbə Zəfərimizə nail olduq!

**"Şuşasız Qarabağ, Qarabağsız Şuşa yoxdur" –** deyən Ulu Öndər Heydər Əliyevin bu arzusunu da bu gün Prezident İlham Əliyev **"Şuşasız işimiz yarımçıq qalar"** deyərək reallaşdırdı: "Mən bu gün Ulu Öndər Heydər Əliyevin məzarını ziyarət etdim, onun ruhu qarşısında baş əydim. Ürəyimdə dedim, xoşbəxt adamam ki, ata vəsiyyətini yerinə yetirdim. Şuşanı azad etdik! Bu, böyük Qələbədir! Bu gün şəhidlərimizin, Ulu Öndərin ruhu şaddır! Gözün aydın olsun Azərbaycan! Gözünüz aydın olsun dünya azərbaycanlıları!".

Bəli, bu, həqiqətən də belədir. "Əsl siyasət konkret, real iş görməkdən ibarətdir", deyən dövlət başçısının ötən illərdə qəbul etdiyi fundamental qərarlar, imzaladığı sərəncamlar cənab Prezidentin daim xalqın mənafeyindən çıxış etdiyini, habelə, verdiyi vədlərin sırf əməli fəaliyyətə, praqmatizmə söykəndiyini, gerçəkliyə adekvat olduğunu göstərmişdir. Çünki bugünkü Azərbaycan vətəndaşı həyata başqa nəzərlərlə baxır,

özünə və ölkəsinin bundan da daha böyük uğurlar əldə edəcəyinə inanır. Bu inam, hər il görülən daha böyük uğurların nəticələrini gördükcə, sabaha daha böyük bağlılıqla inanır. Ancaq təəsüf doğuran odur ki, hələ də bəzi məmurlar şəxsi ambisiyalarından əl çəkməyərək çirkin əməllərə əl atır, işğaldan azad olunan torpaqlarda dövlət başçısının dediyi kimi: «Biri filial açmaq istəyir, biri nə bilim başqa qurum açmaq istəyir. Bu, yolverilməzdir və qəbuledilməzdir".

Dövlətimizin başçısı İlham Əliyev Dövlət Bayrağı Meydanının açılışında çıxış edərkən demişdi ki, gün gələcək və Azərbaycan bayrağı işğal edilmiş torpaqlarda, o cümlədən Şuşada qaldırılacaq. Prezident İlham Əliyev 2021-ci ilin yanvarın 14-ü həmin vədini yerinə yetirdi və Şuşa səfəri müzəffər Ali Baş Komandanın sözünün və əməlinin vəhdətinin növbəti nümayişi oldu. Bununla da, Azərbaycan Prezidenti, Müzəffər Ali Baş Komandan İlham Əliyev Şuşa şəhərində üçrəngli bayrağımızı qaldırdı.

Ali Baş Komandanımız çıxışlarında ərazi bütövlüyümüz bərpa ediləndən sonra Bülbülün, Natəvanın, Üzeyir Hacıbəylinin büstlərinin yenə də Şuşada qoyulacağını demişdi. Bu sözlər də artıq reallığa çevrilib və artıq həmin dahi şəxsiyyətlərin büstləri Şuşada yenidən əvvəlki yerlərinə qoyulub. Xurşidbanu Natəvanın, Üzeyir Hacıbəylinin, Bülbülün Şuşada güllələnmiş büstləri erməni vandalizminin şahidləridir. Birinci Qarabağ müharibəsi dövründə ermənilər dahi şəxsiyyətlərimizin büstlərini təhqir edəndən sonra onları əridib satmaq, pul əldə etmək üçün Ermənistana aparmışdılar. Lakin ulu öndər Heydər Əliyevin tədbirləri nəticəsində bu büstlər ermənilərdən pulla alınmışdı və artıq onlar Şuşadadırlar.

44 günlük Vətən müharibəsində əldə edilən qələbədən 8 ay keçməsinə baxmayaraq bu qısa zamanda ölkəmizin həyatında yeni dövr başlayıb. Bu gün 44 günlük Vətən müharibəsində əldə edilən qələbədən 8 ay keçməsinə baxmayaraq dövlət başçımızın dediyi kimi: “Düşməni torpaqlarımızdan qısa müddət ərzində qovduğumuz kimi Qarabağı da qısa müddətdə bərpa edəcəyik”.

Artıq işğaldan azad edilmiş torpaqlarımızda quruculuq, bərpa prosesi sürətlə, uğurla davam etməkdədir. Ən əsası isə, xalq görülən işlərin şahidi olur, Qalib Liderimizin gördüyü işləri bəyənir, dəstəkləyir. İyulun 22-də Azərbaycan Prezidenti İlham Əliyev ölkəmizin qərb bölgəsinə səfəri zamanı Azərbaycan Televiziyasına müsahibəsində işğal olunmuş

ərazilərdə görülən işlər barədə də məlumat verərək bildirmişdir ki, **"Bu boyda miqyaslı işi cəmi 8 ay ərzində görmək doğrudan da, mən hesab edirəm ki, böyük qəhrəmanlıqdır".**

Bəli, doğurdan da qəhrəmanlıqdır. Çünki sözü imzası qədər qüvvətli olan liderimiz, Prezident İlham Əliyev bu günə qədər verdiyi bütün vədləri yerinə yetirib. Məhz işğaldan azad olunmuş ərazilərimizdə bərpa və quruculuq işlərinin sürətlə aparılması nəticəsində tezliklə Qarabağı azad edən Liderimiz onu həm də cənnətə çevirəcəkdir!

***"Zəfər yolu" Qarabağın tacı olan Şuşa şəhərinə qədər uzanır***

Şuşanın düşməndən azad edilməsinin və qələbəmizin simvolu olan "Zəfər yolu"nun inşası da davam edir. Ötən il noyabr ayının 16-da təməli qoyulmuş "Zəfər yolu"nun tikintisi ilə bağlı dövlət başçımızın verdiyi sözün reallığını görürük. Dövlət başçımızın dediyi kimi, cəmi 8-9 ayda bütün bu uğurlu işlər görülüb: **"Paralel olaraq Füzuli-Şuşa magistral yolu, Horadiz-Ağbənd yolu çəkilir, 4-6 zolaqlı yoldur. Zəngilan-Qubadlı-Laçın yolu çəkilir. Bu da çox önəmli yoldur. Füzuli-Hadrut, Füzuli-Cəbrayıl yolları – bütün yollar üzrə qızğın iş gedir. Kəlbəcərə rahat çatmaq üçün Göygöldən Ömər aşırımı üzrə yol çəkilir".**

Bütün bu görülən işlərlə yanaşı, üç aeroportun tikilməsi və növbəti ardıcıl olaraq görülən işlər bir daha onu göstərir ki, Qalib liderimizin sözü ilə əməli üst-üstə düşür. Çünki dövlət başçımızın dediyi bu vədlər də artıq reallığı çevrilməkdədir. Bu gün Azərbaycan xalqı da Qalib Liderimiz Prezident İlham Əliyevin son 18 il prezidentlik fəaliyyəti dövründə bir daha gördü ki, Azərbaycan Prezidenti daima xalqı ilə birlikdədir, onların yanındadır, bütün görülən işləri də xalqına aydın şəkildə çatdırır. Dövlət başçımızın dediyi kimi: "Mən bu ardıcıllıq haqqında Azərbaycan xalqına dəfələrlə demişəm ki, biz hansı işləri görəcəyik, insanlar da bilsinlər".

## Tarixi Qələbə güclü Azərbaycan Ordusunun potensialının göstəricisidir

Güclü ordu ilə güclü dövlət anlayışı vəhdət təşkil edir. Çünki müstəqil dövlətin nüfuzu iqtisadi, siyasi, elmi potensialı ilə yanaşı, onun malik olduğu ordusunun qüdrəti ilə də ölçülür. Məhz düşmənin "yeni torpaqlar əldə etmək" arzusunu sentyabrın 27-də başlanan Vətən müharibəsi 44 gün ərzində tarixi qələbə çalması güclü Ordumuzun potensialının göstəricisidir. Bu, Ali Baş Komandanımız, Prezident İlham Əliyev cənablarının dediyi kimi: "Biz danışıqlar masasında prinsipiallıq göstərərək, eyni zamanda, güclü ordu yaradırdıq".

Bəli, Azərbaycan Prezidenti İlham Əliyev xalqa dəfələrlə etdiyi müraciətlərində bildirib ki, biz ədaləti bərpa edirik, ərazi bütövlüyümüzü bərpa edirik, Azərbaycan xalqının ümidlərini doğrulduruq və bundan sonra da doğruldacağıq: "Biz öz torpağımızda döyüşürük, vuruşuruq. Bizim ərazi bütövlüyümüz bərpa edilməlidir və biz haqq yolundayıq. Bizim əsgərimiz xilaskar əsgərdir. Çünki öz doğma dədə-baba torpağını işğalçılardan azad edir".

Məhz Müzəffər Azərbaycan ordusunun gücü, potensialıdır ki, bu gün qürurla bütün dünyada sözümüz keçərli, başımız ucadır. İnkişaf etmiş bəzi ölkələrin hərbi mütəxəssisləri də artıq Azərbaycanın təcrübəsini öyrənir. Ölkəmizin ordu quruculuğu və müdafiə sahəsində atmış olduğu addımlar təhlükəsizliyimizin təminatına əsaslanır. Ali Baş Komandanın rəhbərliyi ilə bu gün Azərbaycan Ordusu Cənubi Qafqazın ən güclü Silahlı Qüvvələrinə çevrilib. Ölkəmizin mürəkəb bir regionda yerləşməsi və təcavüzə uğraması ordu quruculuğuna xüsusi diqqəti vacid edib. Məhz Ulu öndər Heydər Əliyev tərəfindən Azərbaycanda ordu quruculuğu istiqamətində zəruri addımlar atılıb. Bu gün isə Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi ilə Silahlı Qüvvələrimiz dünyanın 50 güclü orduları sırasına yüksəlib. Bu gün 30 illik erməni işğalına məhz güclü ordumuz sayəsində son qoyuldu. Bu, Prezident İlham Əliyevin rəhbərliyi altında ölkəmizdə ordu quruculuğu sahəsində çox mühüm addımlar atılmasının nəticəsidir ki, bu gün regionda ən güclü ordu məhz Azərbaycan ordusudur. Ordumuzun xidməti yüksək səviyyədə aparmaq üçün bütün imkanlar yaradılıb. Prezidentin göstərişi ilə bütün hərbi hissələr, şəhərciklər, hərbi bazalar

faktiki olaraq yenidən qurulur. Hərbi hissələrin 90 faizində tikinti-bərpa, yenidənqurma işləri tamamlanıb. Bu gün Azərbaycan dünya miqyasında öz gücünə arxalanan və heç kimdən asılı olmayan ölkədir. Məhz Qalib Azərbaycan ordusunun rəşadəti nəticəsində ərazisi xeyli böyük olan Kəlbəcər, Ağdam və Laçın rayonları şəhid vermədən, qan tökülmədən geri qaytarılır. Şuşa şəhərinin, Kəlbəcər, Ağdam, Laçın rayonlarının, Hadrut qəsəbəsinin geri qaytarılması Dağlıq Qarabağa gedən bütün strateji yolların, yüksəkliklərin, kommunikasiya xətlərinin tamamilə Azərbaycan Silahlı Qüvvələrinin əlində olması deməkdir.

Prezident İlham Əliyev Müdafiə Nazirliyinin Mərkəzi Hərbi Klinik Hospitalında cəbhə bölgəsində ermənilərin hücumunu dəf edərkən yaralanmış və şəhid olmuş hərbçilərin ailə üzvləri ilə görüşündə də bir daha Azərbaycan ordusunun gücündən, xüsusilə də təmas xəttində öz üstünlüyünü daha da möhkəmləndirməsindən danışıb: "Erməni işğalçılarının bu təxribatlara əl atması birinci dəfə deyil. Mən dəfələrlə demişəm ki, onlar işğal olunmuş torpaqları daim öz nəzarətlərində saxlamaq istəyirlər, sülh istəmirlər, danışıqlar prosesində özlərini qeyri-səmimi aparırlar. Bütün beynəlxalq, əxlaqi normaları pozublar, mülki əhaliyə atəş açırlar. Bu hadisələrdən bir neçə gün əvvəl Ermənistan-Azərbaycan sərhədində, Qazax istiqamətində təxribat törədiblər və hərbçilərimiz həlak olub. Bu hadisələr zamanı daima bizim kəndlərimizi atəşə tuturlar, mülki əhalidən həlak olanlar var. 300-ə yaxın evə ziyan vurulub. Onların hərəkətləri budur. Azərbaycan ordusu, əsgərləri heç vaxt mülki əhaliyə qarşı vuruşmayıb, vuruşmur və vuruşmayacaq".

Dövlət başçısı çıxışlarında da dəfələrlə vurğulayıb ki, Ermənistan bu gün dərin siyasi, mənəvi, psixoloji və maliyyə böhranı içindədir: "Ölkənin inkişafı üçün heç bir resurs yoxdur. İqtisadiyyat çöküb, sənaye ölüb, insanlar ölkəni tərk edir, yəni, insan resursları da yoxdur. Ona görə də Ermənistan rəhbərliyi öz xalqını aldatmaq məqsədilə cəbhədə dövri olaraq təxribatlar törədir, atəşkəsi gündə on dəfələrlə pozur. Bu isə tələb edir ki, Azərbaycan Ordusu gündən-günə möhkəmlənsin və daha da qüdrətli olsun. Biz buna nail oluruq".

### *Azərbaycan Ordusu məğlubedilməzdir*

Prezident Ali Baş Komandan, İlham Əliyevin apardığı ardıcıl siyasətin nəticəsində bu gün ordumuza göstərilən diqqət sayəsində Silahlı Qüvvələrimiz müasir silah-sursat, döyüş texnikası, o cümlədən təyyarə, helikopter və artilleriya sistemlərinin keyfiyyəti, şəxsi heyətin sayı və döyüş əzmi baxımından düşmən ordusunu dəfələrlə qabaqlayır. Qürurverici haldır ki, bu dəfə də Silahlı Qüvvələrin bütün şəxsi heyəti qisas və qələbə hissi ilə yaşayır, torpaqlarımızı işğaldan azad etmək uğrunda müqəddəs borcunu yerinə yetirməyə qadir olduqlarını nümayş etdirdilər. Azərbaycan əsgəri yalnız öz gücü və qüvvəsinə güvənərək düşməni işğal olunmuş torpaqlardan qovmaqla ərazi bütövlüyümüzü bərpa etməyə qadir olduqlarını əzmkarlıqla nümayiş etdirdilər. Təbii ki, bütün bunlar Azərbaycan Respublikası Silahlı Qüvvələrinin Ali Baş Komandanı İlham Əliyevin tövsiyə və tapşırıqları əsasında reallaşdırılır. Bu gün böyük inam və qətiyyətlə ifadə edirik ki, Azərbaycanın ərazi bütövlüyünün təmin olunması ilə ölkə Prezidenti, Ali Baş Komandan İlham Əliyev 2020-ci ilin Qalib sərkərdəsi, Azərbaycan Ordusu ən peşəkar və döyüş ruhlu Ordu, Azərbaycan xalqı isə ən qəhrəman xalq kimi tarixə qızıl hərflərlə yazılacaq. Növbəti mərhələdə cənab İlham Əliyevin yeni-yeni hədəflərə hesablanmış strategiyasına uyğun olaraq Azərbaycan inkişaf, tərəqqi yolunda daha da böyük addımlarla irəliləyəcək.

Çünki Azərbaycan Ordusu məğlubedilməzdir, onun qarşısında düşmən çox aciz və zəifdir.

## Qarabağın yüksəlişinin təminatçısı

Ötən il Azərbaycanın şanlı tarixinə 44 günlük Vətən müharibəsi kimi düşən İkinci Qarabağ savaşı tarixi qələbəmizlə yekunlaşandan sonra xalqımız və dövlətimizin qarşısında yeni məsul vəzifə dayandı. Bu, işğaldan azad edilmiş tarixi və əzəli torpaqlarımızda quruculuq, bərpa işlərinin aparılması, yenidən Qarabağa həyatın qaytarılmasıdır. Artıq 44 günlük qələbəmizdən 7-8 ay keçməsinə baxmayaraq bu istiqamətdə genişmiqyaslı işlər görülür, əcnəbi şirkətlərlə birgə yeni iqtisadi, quruculuq layihələri hazırlanır, hətta infrastrukturun bərpası ilə bağlı bir çox ilkin tədbirlər həyata keçirilir. Təbii ki, bütün bu mənzərələrin fonunda ölkə başçısının işğaldan azad olunmuş ərazilərə mütəmadi səfərlər etməsi quruculuq və bərpa işlərinin daha operativ və effektiv şəkildə davam etdirilməsini təmin edir.

***Vaqif Poeziya günlərinin rəsmi açılışında bütün dünyaya növbəti mesaj***

«Zamanla bütün Qarabağ abadlaşacaq, buna isə heç kəs mane ola bilməz», -deyən Ali Baş Komandanımızın «Dəmir yumruq» siyasəti altında Müzəffər Ordumuzun rəşadətli əsgər və zabitlərinin şücaəti ilə torpaqlarımız işğaldan azad edildi. Hazırda Azərbaycan dövlətinin qarşısında duran prioritet məsələ işğaldan azad edilmiş ərazilərin bərpasıdır. Dövlət başçımızın hər dəfə işğaldan azad olunmuş torpaqlara səfəri bir daha göstərir ki, Prezident İlham Əliyevin rəhbərliyi ilə bütün Qarabağ abadlaşacaq, buna isə heç kəs mane ola bilməz.

Dövlət başçımızın dediyi kimi: "Çünki bu torpaqların sahibləri bizik - Azərbaycan xalqıdır". Bəli, bu torpaqların sahibi Azərbaycan xalqı olduğu üçün də ədaləti bərpa edərək öz torpaqlarımıza sahib olduq. Prezident İlham Əliyev Novruz bayramı zamanı Şuşadan xalqa müraciət edərək bildirmişdi ki, ermənilər 30 il bizim torpaqlarımızı dağıtsadıblar. Biz isə bu torpaqları bərpa edəcəyik, çünki bu torpaqların sahibləri bizik - Azərbaycan xalqıdır: "Biz Şuşanı bərpa edəcəyik, mütləq bərpa edəcəyik. Artıq bərpa işlərinə start verildi. Bu gün Şuşada olarkən artıq verdiyim tapşırıqların yerinə yetirilməsi ilə tanış oluram. Biz nəinki Şuşanı, azad edilmiş bütün torpaqları bərpa edəcəyik. Quruculuq işləri başlamışdır, infrastruktur

layihələrinə start verilmişdir. Ziyanın hesablanması aparılır, şəhərlərin baş planları hazırlanır. Birinci növbədə, Ağdam şəhərinin və Ağdam rayonunun bütövlükdə baş planı hazırlanır, onun ilkin versiyası mənə təqdim edildi. Mənim tapşırıqlarımı nəzərə almaq şərtilə indi bunun üzərində iş gedir və yaxın gələcəkdə baş plan təsdiq olunacaq. Ondan sonra bərpa işləri azad edilmiş bütün torpaqlarda başlanacaq. Ermənilər 30 il bizim torpaqlarımızı dağıdıblar. Biz isə bu torpaqları bərpa edəcəyik, çünki bu torpaqların sahibləri bizik - Azərbaycan xalqıdır".

"Gün gələcək və bu gün hələ də işğal altında olan bütün torpaqlarda Azərbaycan bayrağı qaldırılacaq". Prezident İlham Əliyev bu sözləri 3 il əvvəl, 2018-ci il aprelin 11-də keçirilən seçkilərdə ona göstərilən böyük etimada görə xalqımıza müraciətində demişdi. Prezident İlham Əliyevin çıxışlarında bu məzmunlu ifadələr çoxdur. Çünki dövlət başçısının hər bir çıxışında, görüşlərində, müraciətlərində, təbriklərində torpaqlarımızın işğaldan azad olunması məsələsi prioritet idi. İlham Əliyev hər zaman bəyan edirdi ki, danışıqlar nəticəsiz qalacağı təqdirdə güclü Azərbaycan Ordusu öz sözünü deyəcək. Artıq bu gün «gün o gün gələcək» ifadəsi reallllığa çevrilib. Xalqımız o günün mütləq yetişəcəyinə, bayram tonqallarının Qarabağda qalanacağına əmin idi. Çünki hər kəs öz rəhbərinə, Ali Baş Komandana inanırdı. 44 günlük Vətən müharibəsində qazanılan böyük Qələbə o günü yetişdirdi.

### ***Qarabağda həyat yenidən qaynayacaq***

Bəli, bu gün işğaldan azad olunmuş torpaqlar quruculuq meydanına çevrilib. Prezidentin işğaldan azad olunmuş rayonlara səfəri zamanı – "Qarabağda cənnət yaradacağıq" vədi sözü ilə əməlin bir olmasının göstəricisidir. Prezident İlham Əliyev bu günə qədər verdiyi bütün sözləri, vədləri yerinə yetirib. Necə ki, "Qarabağ Azərbaycandır və nida işarəsi" deyən dövlətimizin başçısı sözlərinə sadiq qalaraq Ermənistanın faşizm siyasətini məhv etdi, Qarabağı işğaldan azad etd, hazırda da "Qarabağda cənnət yaradacağıq" vədini addım-addım yerinə yetirməkdədir. Bir sözlə, bu gün artıq Azərbaycan Respublikasının Prezidenti azad nəfəsalan torpaqlarımızı gəzir, Qarabağın cənnətə çevrilməsi üçün tapşırıqlarını verir, işlərə nəzarət edir, yeni layihələrin həyata keçirilməsi yollarını arayıb-axtarır və bu sahədə əməli tədbirlər görür. Azərbaycan xalqı da öz

Prezidentinə inanır, güvənir və əmindir ki, qısa zaman çərçivəsində işğaldan azad olunmuş ərazilər bərpa ediləcək, böyük qayıdış başlayacaq və Azərbaycan dünyanın ən abad, gözəl, inkişaf etmiş dövlətləri sırasında olacaqdır.

Bir sözlə, bu kompleks tədbirlər onu göstərir ki, Şuşanın dirçəldilməsi sürətlə gedir və şuşalılar Şuşaya qayıdırlar. Dövlət başçımızın dediyi kimi: "Beləliklə, biz Şuşanı yenidən dirçəldəcəyik".

Qarabağ Azərbaycanındır! Qarabağ Azərbaycandır! Qarabağ cənnət məkanıdır!

## Şəhidlər əlçatmaz zirvədir

Azərbaycan Prezidentinin Sərəncamı ilə 27 sentyabrın Anım Günü kimi qeyd olunması şəhidlərimizə ən ali ehtiramın göstəricisidir. Dünyaya öz əməli ilə səs salan Qalib Liderimizin 30 illik torpaq həsrətinə, ərazi bütövlüyümüzün, haqqın, ədalətin bərpasına 44 gün ərzində «dəmir yumruq» siyasəti ilə qalib gələn yenilməz Sərkərdəmiz İlham Əliyevin mahir diplomatik bacarığı, ali rəhbər keyfiyyətləri, güclü sərkərdəlik məharəti sayəsində – Qarabağ Azərbaycandır!. Qürurumuz olan qəhrəman əsgər və zabitlərimiz torpaq, Vətən yolunda canlarından keçərək Şəhidlik zirvəsinə ucuıldılar. Şanlı bayrağımızı azad edilən torpaqlarımızda dalğalandırmış, bu yolda canlarını belə əsirgəməmiş əsgər və zabitlərimizə, bütün şəhidlərimizə dərin ehtiram əlaməti olaraq Prezident İlham Əliyev 27 sentyabr – Vətən müharibəsinin başladığı günün ölkəmizdə Anım Günü kimi qeyd olunması ilə bağlı Sərəncam imzalaması şəhid ruhlarına, şəhidlərin doğmalarına ən ali ehtiramın əlamətidir. Hələ müharibənin gedişi zamanı Prezident İlham Əliyev və birinci xanım Mehriban Əliyeva ata-ana qayğısı ilə hospitala baş çəkərək yaralı əsgərlərimizlə görüşür, onlarla söhbətləşir, müalicə şəraiti ilə maraqlanırdılar. “Mən hər zaman qazilərin yanında olacağam”, – deyən Prezident İlham Əliyev, əslində, cəmiyyətimizdə bütün müharibə iştirakçılarına olan münasibətini nümayiş etdirirdi.

Deyirlər, torpaq su ilə qarışanda palçıq, şəhid qanı ilə qarışanda isə Vətən olur. Bəli, bu 44 gün ərzində igid oğullarımız Vətən yolunda canını sipər etdi, qanları ilə bu torpağı suladı, qorudu ki, Vətən torpağında qeyrət, qəhrəmanlıq, hünər, təəssübkeşlik bitsin, göyərsin... Şəhid qanı axmayan torpaqdan Vətən olmaz, – dedilər Şəhidlərimiz. Onu da dedilər ki, bu gün biz Şəhid olmuruq, işğal olunan torpaqlarımızın azad olunmasında Şahidlik edirik. Azad olunan torpaqlarımızda üçrəngli Azərbaycan bayrağının qaldırılmasına Şahid oluruq! Çünki bu gün bu əsgərlərimiz üçün cəbhə bir ananın oğullarının, bir bacının qardaşlarının bir olduqları döyüş meydanıdır. Şəhid olan əsgərlərimiz, yurdsevər ərənlərimiz, bir an düşünmədən canını Vətən, torpaq yolunda fəda edən cəngavərlərimiz hər kəsə nəsib olmayan Tanrının, haqqın dərgahındasınız! Düşməndən qisas almağa can atan, qeyrətli, təəssübkeş, Vətənin ən layiqli oğullarısınız!

“Vətən üçün ölməyə dəyər!” – deyən əsgərlərimiz düşmən qarşısında diz çökməyən, diz çökdürən ərənlərimizsiniz.

***Qəhrəman əsgər və zabitlərimiz bizim qürur mənbəyimizdir***

Müzəffər Ali Baş Komandan, Prezident İlham Əliyev Anım Günü ilə əlaqədar xalqa müraciətində söyləyib ki, bu Qələbəni bizə bəxş edən qəhrəman əsgər və zabitlərimiz bizim qürur mənbəyimizdir və “Dəmir yumruq” yerindədir: “Erməni faşizmi məhv edilib, ancaq onun təzahürləri görünməkdədir. Bu, çox təhlükəli tendensiyadır, ilk növbədə, Ermənistan dövləti üçün. Mən bunu demişəm, bu gün Anım Günündə şəhidlərimizin əziz xatirəsi önündə bir daha deyirəm, əgər biz görsək ki, erməni faşizmi baş qaldırır, əgər biz görsək ki, xalqımıza, dövlətimizə yeni təhlükə mənbəyi yaranır, heç tərəddüd etmədən erməni faşizminin başını bir daha əzəcəyik. Bunu hər kəs bilsin! Müharibənin və Qələbənin rəmzi olan “Dəmir yumruq” yerindədir, bunu heç kim unutmasın!”

Prezident İlham Əliyev bir daha vurğulayıb ki, biz bundan sonra qalib ölkə, müzəffər xalq kimi yaşayacağıq və azad edilmiş torpaqları quracağıq, bərpa edəcəyik: “O torpaqlara artıq həyat qayıdır, insanlar qayıdır. Bu qayıdışı ən qısa müddət ərzində təmin etmək bu gün bizim başlıca vəzifəmizdir. Öz müraciətimi Qələbəmizin ayrılmaz hissəsi olan sözlərlə tamamlamaq istəyirəm: Qarabağ bizimdir! Qarabağ Azərbaycandır!”. Dövlət başçısı Anım Günü ilə əlaqədar xalqa müraciətində onu söyləyib ki, bu dərs əbədi dərsdir, bunu heç kim yaddan çıxarmasın: “44 gündən sonra - artıq Ermənistan ordusunun beli qırılandan, biz alınmaz qala sayılan Şuşanı və ardınca 70-dən çox kəndi işğalçılardan azad edəndən sonra düşmən məcbur qalıb təslim olub. Bu dərs əbədi dərsdir, bunu heç kim yaddan çıxarmasın!”.

Bəli, qeyrətli igidlər, Vətənin dar günündə düşmən qarşısına - önə çıxdınız, sinənizi sipər edib ömrünüzü bu millətin ömrünə caladınız. Doğulduğunuz torpaqdan yüzlərlə kilometr uzaqda "Öncə Vətəndir", – deyib canından keçən igid oğullarımız, sizin igidliyinizin nəticəsidir ki, bu gün bütün evlər, eyvanlar, yollar üçrəngli Bayrağımızla bəzənib. O Bayraq ki, sizin kimi oğulların sayəsində ucalır, dalğalanır. O bayraqlar ki, sizin şücaətinizin sayəsində Cəbrayıla, Qubadlıya, Füzuliyə, Zəngilana, Ağdama, Şuşaya, Kəlbəcərə, Laçına – “Qarabağ Azərbaycandır!”a yol aldı. Özünüz

də Qarabağ Azərbaycandır! uğuruna canınızı qurban verdiyiniz üçrəngli bayrağa bükülüb qəhrəman kimi qayıdırsınız elimizə, evinizə, yurdumuza, uğrunda can verdiyiniz Vətən torpağına. Bax, budur şahidlik edən oğullarımızın Şəhidliyi!. Bax, budur qeyrət, hünər! Siz Azərbaycanın rəşadətli, igid əsgərlərisiniz! Siz xilaskar əsgərlərimizin qanı ilə yoğrulan torpaqlarımızın xilaskarlarısınız. Çünki Qarabağ Azərbaycandır!

Azərbaycan Prezidentinin 27 sentyabr – Vətən müharibəsinin başladığı günün ölkəmizdə Anım Günü kimi qeyd olunması ilə bağlı Sərəncam imzalaması şəhid ruhlarına, şəhidlərin doğmalarına ən ali ehtiramın əlamətidir. Bu gün hər kəs Vətəni yolunda şəhid və qazi olanların valideynləri qarşısında baş əyir. Fəxr edirik ki, şərəflə qorudunuz Vətəni!, Şərəflə qorudunuz Vətənin qeyrətini, Vətəni bütöv etdiniz. Hər qarışı şəhid qanı ilə yoğrulan, şəhid qoxusu duyulan bu torpaq bizə ötürülən əmanətdir. Çünki bu torpaqlar Şəhidlik qanı ilə yoğrulan – Qarabağ Azərbaycandır!

## Azərbaycanın ictimai-siyasi həyatında növbəti tarixi hadisə

Zamanın sınaqlarından çıxmış, xalqın etimadını layiqincə doğrultmuş, Yeni Azərbaycan Partiyası müstəqil Azərbaycanımızın firavan gələcəyinin dünəni, bu günü və gələcəyi naminə öz fəaliyyətini göstərən siyasi partiyadır. Necə ki, Yeni Azərbaycan Partiyasının yaradıcısı, Azərbaycan xalqının xilaskarı ulu öndərimiz Heydər Əliyev demişdir: "Yeni Azərbaycan Partiyası dünənin, bu günün, gələcəyin partiyasıdır".

Azərbaycan Prezidenti, Yeni Azərbaycan Partiyasının Sədri İlham Əliyev martın 5-də partiyanın VII qurultayında çıxışı zamanı bir çox məsələlərə toxunaraq, bu qurultayın ölkəmizin ictimai-siyasi həyatında önəmli hadisə olduğunu bildirmişdir. Yeni Azərbaycan Partiyası nəinki Azərbaycanın, həmçinin Cənubi Qafqazın ən böyük siyasi partiyasıdır. Partiyamız böyük ənənələrə malikdir. VII qurultay Yeni Azərbaycan Partiyasının həyatında dönüş nöqtəsi hesab edilə bilər. Bu isə ölkəmizin Vətən müharibəsində qazandığı möhtəşəm Zəfərdən sonra yaranan yeni reallıqlardan irəli gəlir.

Gələn il Yeni Azərbaycan Partiyasının 30 illik yubileyi olacaq və partiya öz yubileyinə yeniləşmiş formatda, daha fəal qədəm qoyur. Yeni Azərbaycan Partiyası da hər zaman öz fəaliyyətini günün tələblərinə uyğun quran siyasi təşkilat olduğu üçün yaranmış yeni situasiyalar nəzərə alınaraq növbəti qurultayın çağırılmaq zərurəti yarandı. Qurultayda yeni Nizamnamənin qəbul edilməsi partiyanın yeni fəaliyyət istiqamətlərini müəyyənləşdirəcək. Partiyanın rəhbər orqanlarında təmsil olunan üzvlərin fəal olması, ümumi işə öz töhfələrini lazimi formada vermələri artıq yeni dövrün tələblərindəndir. Bu baxımdan Yeni Azərbaycan Partiyasının rəhbər strukturlarından olan Siyasi Şuranın ləğv edilməsi və əvəzində digər rəhbər orqan olan İdarə Heyətinin optimallaşdırlması çox mühüm və düzgün qərar hesab edilə bilər. Həmçinin, qurultayda yaşanan digər əlamətdar hadisə dost partiyaların Yeni Azərbaycan Partiyasına qoşulması oldu. Bu da siyasi sistemimizin təkmilləşdirilməsi istiqamətində atılan növbəti addımdır. Eyni zamanda, bu, onu göstərir ki, partiyamızın məramı, proqramı, fəaliyyəti və əldə etdiyi nailiyyətlər dost partiyalar

üçün də cəlbedicidir. Prezident İlham Əliyev İdarə Heyətinə Yeni Azərbaycan Partiyasının yeni proqramının hazırlanması və yeni dövrlə bağlı bütün məsələləri özündə ehtiva etməsi tapşırığını verdi. Yeni qəbul ediləcək proqram Yeni Azərbaycan Partiyasının gələcək fəaliyyətini və siyasi hədəflərini müəyyənləşdirəcək bir sənəd olacaq.

Azərbaycan Prezidenti İlham Əliyev YAP-nın VII qurultayında çıxışı zamanı onu da söyləyib ki, xalq Heydər Əliyevə inanırdı və onun ətrafında sıx birləşmişdi: "Eyni zamanda, müstəqilliklə bağlı Ulu Öndərin birmənalı, qətiyyətli addımları xalq tərəfindən yüksək qiymətləndirilirdi. O vaxt Azərbaycan Respublikasında Sovet İttifaqının saxlanmasına dair referendum keçirilmişdi və bu referendumun nəticələri kobudcasına saxtalaşdırılmışdı. Sanki Azərbaycan xalqı müstəqillik istəmir, sanki Azərbaycan xalqı Sovet İttifaqının tərkibində yaşamaq istəyir. Bu, absurd idi. Çünki 20 Yanvar hadisələri hələ təzə-təzə baş vermişdi, Azərbaycana qarşı edilən ədalətsizlik, Dağlıq Qarabağdan və ondan sonra ətraf bölgələrdən azərbaycanlıların qovulması, Ermənistandan azərbaycanlıların qovulması – bütün bunlar Azərbaycan xalqının qəlbində yara kimi qalmışdı".

Azərbaycan Prezident onu da söyləyib ki, o vaxt hakimiyyətdə olan AXC-Müsavat cütlüyü ancaq öz maraqlarını güdürdü: "Hakimiyyətə gəlmiş təsadüfi adamlar eynən Ermənistanda 2018-ci ildə hakimiyyətə gələn insanlarla, elə bil ki, əkiz qardaşdırlar. Təcrübəsiz, biliksiz, mədəniyyətsiz, səriştəsiz, qorxaq, fərari, daha hansı epitet qaldı. İstənilən mənfi epitet bunlara yaraşır. Bax, bunlar idi o vaxt Azərbaycanı idarə edənlər. Belə insanlara xalq tərəfindən inam ola bilərdimi? Ölkə tamamilə idarəolunmaz vəziyyətdə idi. Köhnə partnomenklatura demək olar ki, tamamilə iflic vəziyyətə düşmüşdür, hakimiyyətə qanunsuz yollarla gəlmiş AXC-Müsavat cütlüyü ölkəni talayırdı, dağıdırdı, müharibə gedə-gedə Ermənistana benzin satırdı",-deyən dövlət başçısı, həmçinin vurğulayıb ki, AXC-Müsavat cütlüyü bütün vəzifələrə rüşvət müqabilində insanlar təyin edirdilər, təsadüfi insanlar, küçədən keçənlər idi vəzifədə olanlar.

Dövlət başçısı onu da vurğulayıb ki, əgər Heydər Əliyev o vaxt hakimiyyətə gəlməsəydi, bu gün Azərbaycan bəlkə də ancaq kiminsə əlinin altında bir oyuncaq dövlət kimi, bir yarımmüstəmləkə kimi yaşaya bilərdi: "Biz bu tarixi bilməliyik, bilirik və bundan sonra öz fəaliyyətimizi bu

möhkəm təməl üzərində quracağıq, necə ki, bu vaxta qədər qurmuşuq". Dövlət başçısı çıxışı zamanı onu da bildirib ki, ordu quruculuğu hazırlığı da əsas məsələlərdən biri idi və bizim şanlı Qələbəmiz hər şeyi özü deyir: "Bütün bu hazırlıq istiqamətləri nəticədə bir nöqtədə birləşdi – 44 günlük müharibədə və bizim tarixi Qələbəmiz bizim qürur mənbəyimizdir. Bundan sonra əsrlərboyu Azərbaycan xalqı bu Qələbəni öz ürəyində, qəlbində yaşadacaq. Çoxəsrlik Azərbaycan tarixində buna oxşar parlaq Qələbə və mütləq Qələbə olmamışdır. İndi biz yeni dövrə qədəm qoyuruq".

Prezident İlham Əliyev Yeni Azərbaycan Partiyasının VII qurultayının ölkəmizin ictimai-siyasi həyatında önəmli hadisə olduğunun deyərək bildirib ki, Yeni Azərbaycan Partiyası nəinki Azərbaycanın, Cənubi Qafqazın ən böyük siyasi partiyasıdır və biz gələn il, partiyamızın 30 illik yubileyini keçirəcəyik: "Hesab edirəm ki, partiya yeniləşmiş formatda, o cümlədən rəhbər orqanlarında təmsil olunan namizədləri nəzərə alsaq daha fəal olacaq, ölkə qarşısında duran problemləri daha fəal icra edəcəkdir. Həyat dəyişir, zəmanə dəyişir. Bir daha demək istəyirəm ki, biz ən müasir təcrübəni Azərbaycanda bütün sahələrdə tətbiq etməliyik, o cümlədən siyasi islahatlar sahəsində. Əminəm ki, partiyanın rəhbər orqanlarında təmsil olunan üzvləri fəal olacaqlar, partiyamızın fəaliyyətində öz rolunu oynayacaqlar, ümumi işimizə öz töhfəsini verəcəklər ki, partiyamız bundan sonra da ölkəmizin aparıcı siyasi qüvvəsi olaraq qalsın".

Prezident İlham Əliyev ən vacib məsələ olan gənclərlə bağlı növbəti, xüsusi əhəmiyyət daşıyın fikirlərini söyləyərək bildirib ki, gənc nəslin tərbiyə edilməsi hər bir dövlət üçün xüsusi əhəmiyyət daşıyan məsələdir: "Əgər gənc nəsil tərbiyə edilməsə, əgər gənc nəslə ümumbəşəri dəyərlər aşılanmasa, o zaman gələcəkdə problemlər qaçılmazdır. Çünki biz bu gün də görürük ki, nəsillər dəyişdikcə bəzi ölkələrdə radikal qüvvələr ya hakimiyyətə gəlir, ya da ki, ildən-ilə, seçkilərdən-seçkilərə onlara verilən səslərin sayı çoxalır".

"Siyasi partiyalarda fəaliyyət göstərən gənc nəslə elə təlimat verilməlidir ki, onlar gələcək həyata hazırlıqlı olsunlar, onlar ölkəmizin müstəqilliyini hər şeydən üstün tutsunlar", – deyən dövlət başçısı istiqamət yolların açıqlayaraq bildirdi ki, hamılıqla, o cümlədən Yeni Azərbaycan Partiyasında Veteranlar Şurasına tapşırıqlarını da verməsi bir daha hər

kəsi məsuliyyətə çağırdı: «Bu Veteranlar Şurasının tərkibində tanınmış hörmətli insanlar fəaliyyət göstərəcəklər. Mən onlardan da xahiş edirəm ki, onlar da çox fəal olsunlar, bölgələrdə olsunlar, gənc nəslin nümayəndələri ilə görüşsünlər. Ölkə haqqında həqiqətləri gənc nəsil bilmir, hansı ki, 1991-1992-ci illəri görməyiblər. Bu haqda məlumat verilməlidir ki, onlar bilsinlər, biz nəyin bahasına bugünkü reallıqları əldə etmişik. Vətən müharibəsi ilə bağlı, postmüharibə dövrü ilə bağlı məlumatlar verilməli, bütün bunlar izah edilməlidir. Çünki xaricdən, oradan-burdan yalan, saxta məlumatlar gəlir və bəzi hallarda gənc insanlar buna inanırlar. Məhz o hesabat da bunun üzərində qurulur və gənc nəslimizin milli ruhda, milli-mənəvi dəyərlər ruhunda tərbiyə edilməsi ən başlıca vəzifələrdən biridir. Ənənələrimiz, dəyərlərimiz, yaşayış tərzimiz – bütün bunlar bizim sərvətimizdir, biz bunu itirə bilmərik və itirməməliyik. Ona görə gənc nəslin tərbiyə edilməsi çox önəmli məsələdir və burada milli-mənəvi dəyərlər ön plandadır. Digər önəmli məsələ isə odur ki, – Yeni Azərbaycan Partiyası həmişə bu sahədə fəal olub, bizim dövlət siyasətimiz də bu sahədə birmənalıdır, - Azərbaycanda yaşayan bütün xalqların nümayəndələri bir ailə kimi yaşayırlar və bundan sonra da bir ailə kimi yaşayacaqlar. Bu, bizim böyük sərvətimizdir. Mən də müxtəlif tədbirlərdə demişəm ki, bizim dini və etnik müxtəlifliyimiz bizim böyük sərvətimizdir”.

**“Bəzi siyasi partiyaların Yeni Azərbaycan Partiyası ilə birləşməsi partiyamızı gücləndirəcək”**

Prezident, Yeni Azərbaycan Partiyasının Sədri İlham Əliyev partiyaya qoşulan- digər siyasi partiyaların uğurlu addım olduğunu bildirib: “Mən buna şübhə etmirəm. Bizim dost partiyalarımızın bu gün partiyamıza qoşulması da bunu göstərir. Bu da çox önəmli, əlamətdar hadisədir. Bu da siyasi sistemimizin təkmilləşdirilməsi istiqamətində atılan növbəti addımdır və eyni zamanda, göstərir ki, partiyamızın həm məramı, həm proqramı, fəaliyyəti və əldə etdiyi nailiyyətlər dost partiyalar üçün də cəlbedicidir. Əminəm ki, bir neçə partiyanın Yeni Azərbaycan Partiyası ilə birləşməsi partiyamızı gücləndirəcək”.

Göründüyü kimi, ölkənin ən müxtəlif spektrini əhatə edən 6 siyasi təşkilatın dövlət və milli maraqlar naminə milli həmrəyliyin yeni inkişaf mərhələsinin təcəssümünə çevrilən YAP-a qoşulması cəmiyyətdə hakim

partiyaya olan müsbət münasibətdən, inam və etibardan irəli gəlir.

Sonda Prezident İlham Əliyev cənablarının dediyi fikirlə sözümü bitirmək istərdim: “Bir sözlə, bir çox hallarda dediyim kimi, bugünkü qurultayı da bu sözlərlə yekunlaşdırmaq istərdim: “Qarabağ bizimdir, Qarabağ Azərbaycandır!”.

## Prezidentin işğaldan azad olunmuş torpaqlara hər səfəri bir tarixdir

Azərbaycan Respublikasının Prezidenti, Müzəffər Ali Baş Komandan İlham Əliyev cənablarının 44 günlük vətən müharibəsinin zəfərlə bitən və işğaldan azad edilən bölgələrə dərhal tarixi səfərləri hər bir azərbaycanlıya böyük qürur və fəxarət hissi yaşadır. Təbii ki, zəfərdən sonra işğaldan azad olunan rayonlarına səfər Qalib komandanın öz sevincini, görüləcək işlərlə bağlı məlumatları xalqı ilə paylaşması məqsədi daşıyır. Ən əsası isə, işğalçı ölkə ilə bərabər, bütün dünya da şahidi oldu ki, torpaqların əsl sahibləri qayıdıb. Azərbaycan öz əbədi və əzəli torpaqlarını işğalçılardan azad etdi. Qalib ölkənin Müzəffər Komandanı qazanılmış Qələbəyə möhürünü vurmaq üçün həmin ərazilərə tarixi səfərlərini edib. Ən əsası isə bu səfərlər zamanı həmin ərazilərdə aparılan quruculuq işləri çərçivəsində inşa edilən yeni strateji obyekt və müəssisələrin təməlinin dövlətimizin başçısı tərəfindən qoyulması həm siyasi, həm iqtisadi, həm də mənəvi cəhətdən müstəsna əhəmiyyət kəsb etməklə yanaşı, dünyaya bir mesajdır. Bu səfərlərlə dövlət başçımız bildirir ki, biz 28 ildən sonra Qarabağı işğaldan azad etdik, Qarabağa qayıtdıq, Qarabağa sahibləndik. Ali Baş Komandanımızın dediyi kimi: “Buraya bu torpaqların sahibləri kimi qayıtmışıq, azad edilmiş bütün torpaqlarda Azərbaycan bayrağı dalğalanır”.

### *Füzulidən Şuşaya – Zəfər yolu*

Dövlətimizin başçısı İlham Əliyev, birinci xanım Mehriban Əliyeva və qızları Leyla Əliyeva martın 15-də Füzuli və Xocavənd rayonunda səfərdə olarkən Ali Baş Komandanımız bildirdi ki, yenə azad edilmiş torpaqlardayıq: “Bu gün Füzuli-Hadrut avtomobil yolunun təməlini qoyacağam. Bu avtomobil yolunun inşası azad edilmiş ərazilərin bərpası üçün böyük əhəmiyyət daşıyır. Bu, birinci layihə deyil. Artıq bir neçə yol layihəsi icra edilməkdədir. Azad edilmiş torpaqların bərpası başlamışdır. Füzulidən Şuşaya yol çəkilir - Zəfər yolu çəkilir. Eyni zamanda, Bərdə-Ağdam yolunun çəkilişi yaxın gələcəkdə icra ediləcəkdir. Horadizdən Zəngilana qədər yol çəkiləcək. Bir sözlə, müharibədən dörd ay keçməsinə baxmayaraq, böyük quruculuq işləri başlamışdır”.

Dövlət başçımızın dünyaya bir mesajı idi ki, işğaldan azad olunan torpaqlarımızda sabitlik, hərbi sahədə təhlükəsizlik etibarlı şəkildə tam təmin olunubdur. Bütün dünyaya məlumdur ki, Prezident İlham Əliyev yalnız hərb meydanında müzəffər sərkərdə deyil, diplomatik cəbhədə böyük strateq nümunəsi ortaya qoydu, informasiya müharibəsində Azərbaycanın haqq səsi oldu, cəsarətlə bütün təzyiqlərə sinə gərərək, xalqımıza qələbə sevincini yaşatdı. Bu tarixi qələbənin qazanılmasında hərbi qələbəmizin müstəsna rolu danılmazdır. Ölkəmizdə aparılan inkişaf siyasəti, xalq-iqtidar birliyi, siyasi münasibətlərin müsbət səviyyəyə qalxması, beynəlxalq nüfuzumuz, ordu quruculuğu, təbii ki, bu qələbəmizi şərtləndirdi. Bu səfərləri ilə bir daha nümayiş etdirdi ki, biz öz doğma torpaqlarımıza – Qarabağ Azərbaycanımıza qəhrəman xalq kimi, müzəffər dövlət kimi qayıtmışıq. Düşməni «dəmir yumruq» siyasətimizlə öz doğma torpaqlarımızdan qovmuşuq.

Dövlətimizin başçısı Füzuli, Ağdam, Cəbrayıl, Qubadlı, Zəngilan, Laçın, Şuşa səfərlərindən sonra Xocavəndə, keçmiş Hadrut rayonuna, qədim yaşayış məskəni olan Tuğ, Azıx, eləcə də Edili, Düdükçü kəndlərinə səfərləri və səfər zamanı yol boyu kənd və şəhərlərimizin ermənilər tərəfindən vəhşicəsinə dağıdıldığını, viran qoyulduğunu bütün dünya ictimaiyyətinə bir daha göstərdi. Azərbaycan Prezidenti ermənilərin bu ərazilərdə canlı təbiətə böyük ziyan vurduqlarını bir daha diqqətə çatdırdı: “Yenə də azad edilmiş torpaqlarda olarkən, bu dağıntıları görərkən bir daha görürük ki, mənfur düşmən bizim bütün yaşayış məntəqələrimizi yerlə-yeksan etmişdir, bizim tarixi irsimizi silmək istəmişdir. Amma buna nail ola bilmədi. Biz bu torpaqlara qayıtmışıq. Qəhrəman xalq kimi, müzəffər dövlət kimi qayıtmışıq. Düşməni öz doğma torpaqlarımızdan qovmuşuq”.

Dövlətimizin başçısı müharibədən sonra Şuşa şəhərinə ikinci səfəri Novruz bayramı ərəfəsində olması Xalq-İqtidar birliyinin, hər bir vətəndaşın Prezidenti olduğunun, həmişə xalqla birgə olduğunun bir daha göstəricisidir. Həm də azad olunmuş torpaqlardan qarşıda duran vəzifələrlə bağlı dünyaya öz mesajlarını verir. Bu baxımdan, Prezident İlham Əliyevin, birinci xanım Mehriban Əliyevanın və qızları Leyla Əliyevanın Füzuli və Xocavənd rayonlarına, Şuşa şəhərinə səfəri böyük əhəmiyyət kəsb edir.

Prezident İlham Əliyevin Şuşaya növbəti səfəri də əlamətdar oldu. Dövlətimizin başçısının xalqımızın milli bayramı olan Novruz bayramı ərəfəsində, İlaxır çərşənbədə səfər etməsinin böyük əhəmiyyəti var. "Arzuladığımız kimi, artıq bundan sonra Novruz bayramını Şuşada qeyd edəcəyik", – deyən dövlət başçımız Şuşada bərpa-quruculuq işləri ilə tanış oldu. Bütün bunlar onu deməyə əsas verir ki, Prezident İlham Əliyevin və Birinci vitse-prezident, Heydər Əliyev Fondunun prezidenti Mehriban xanım Əliyevanın xüsusi diqqəti nəticəsində Şuşa şəhəri tezliklə dirçələcək, o cümlədən tarixi, mədəni və dini abidələrimiz bərpa olunacaq, Qarabağımız cənnətə çevriləcək və yenidən münaqişə xülyasına düşənlər isə "dəmir yumruqla" üzləşəcəklər.

Şuşanın girişində Azərbaycan bayrağı dalğalanır və bundan sonra əbədi dalğalanacaqdır... Bura Azərbaycan torpağıdır, Qarabağ torpağıdır. Bundan sonra Azərbaycan xalqı burada əbədi yaşayacaq".

## “Dəmir Yumruq” yerindədir

Belə bir fikir var - lider o şəxsiyyətdir ki, ona etimad göstərmiş xalqın maraqlarını bütün imkanları ilə müdafiə edir, reallaşdırır, cəmiyyətin enerjisinin səfərbər edilməsilə insanların taleyində əhəmiyyətli faktora çevrilir. Artıq 19 ildir ki, Prezident, Müzəffər Ali Baş Komandanımız İlham Əliyev - sözü imzası qədər qüvvətli olan Qalib Lider “Dəmir yumruq” siyasəti ilə güclü Azərbaycan Ordusunun rəşadətli əsgər və zabitlərin igidliyi ilə 30 illik həsrətə 44 gündə Qələbə Zəfərini xalqına yaşatdı. 30 il həsrətində olduğumuz, ürəyimizdə qübara çevrilən, xiffətini çəkdiyimiz ata-baba torpaqlarına böyük qayıdışın arzusu, xəyalı ilə yaşadıq... Nəhayət, sentyabrın 27-də Ermənistanın növbəti hərbi təxribatı, bütün cəbhəboyu ağır artilleriyadan istifadə etməklə hücuma keçməsi və birbaşa mülki əhalini hədəfə alması nəticəsində Azərbaycan Ordusu Vətən uğrunda ölüm-dirim savaşına qalxdı. Qarabağ münaqişəsinə xalqımızın zəfəri ilə NİDA qoyuldu!. Azərbaycan torpaqları qarış-qarış, kənd-kənd işğaldan azad edildi. 44 gün ərzində 5 şəhər, 4 qəsəbə, 286 kənd, çoxsaylı strateji yüksəkliklər işğaldan azad olundu, Silahlı Qüvvələrimiz Cəbrayıl, Qubadlı, Zəngilan, Füzuli rayonlarını, Xocavəndin böyük hissəsini, Laçın rayonunun kəndlərini işğaldan azad etdi. Uzun illərdən sonra doğma torpaqlarımızda yenidən üçrəngli şanlı bayrağımız ucaldıldı. 8 noyabr isə Azərbaycan tarixinə Qələbə günü kimi düşdü. Qarabağın tacı, ölkəmizin ən dilbər guşələrindən biri, muğamımızın beşiyi Şuşa mənfur düşmən tapdağından qurtuldu. Ali Baş Komandanımız İlham Əliyev "Twitter" hesabından 71 kəndin, 1 qəsəbənin və 8 strateji yüksəkliyin işğaldan azad edilməsi ilə bağlı şad xəbəri xalqa verdi. 10 noyabr 2020-ci il tarixdəg Preziden İlham Əliyev xalqımızı böyük zəfər xəbəri ilə müjdələdi: "Bu gün ölkəmiz üçün tarixi bir gündür. Bu gün Ermənistan-Azərbaycan Dağlıq Qarabağ münaqişəsinə son qoyulur. Hesab edirəm ki, indicə imzalanmış üçtərəfli bəyanat məsələnin həlli istiqamətində son nöqtə olacaqdır".

**"Qarabağ Azərbaycandır!" reallığı 44 gündə – mümkünsüzü mümkün etdi**

Müzəffər Azərbaycan Ordusu Ali Baş Komandanın rəhbərliyi altında cəmi 44 günə mümkünsüzü mümkün etdi! Ermənistanın hərbi

kaputilyasiyasına nail olduq! Bəşəriyyətə haqqın, ədalətin böyük dövlətlərin tapdağından qurtara biləcək bir dövlətin - Azərbaycanın var olduğunu sübut etdik. Bu ədaləti 44 gün ərzində yazan Azərbaycan xalqı, bütün dünya azərbaycanlıları, Türk dünyası bir yumruq kimi birləşərək təkcə Ermənistanın yox, bütövlükdə haqsız güclərin üstünə getdi və sübut etdi ki, haqq yolunda, ədalətin, ərazi bütövlüyümüzün bərpası uğurunda vuruşuruq. Müzəffər Azərbaycan Ordusu cəmi 44 günə hərbi yolla 28 il düşmən torpağında inləyən vətən torpaqlarını işğaldan azad etdi. Üçtərəfli bəyanata əsasən Dağlıq Qarabağın heç bir xüsusi statusu olmayacaq. Dağlıq Qarabağ Muxtar Vilayəti də tarixə qovuşdu. Bu bəyanat Ermənistanın kapitulyasiyasıdır. Böyük qələbəni al qanı ilə yazan şəhidlərimizin intiqamının alınması ilə əldə edilən zəfəri, qalibiyyəti Azərbaycan xalqına bəxş etməklə Ali Baş Komandanımız İlham Əliyev həm də həyatını Azərbaycana həsr edən, «Şuşasız Qarabağ, Qarabağsız Azərbaycan yoxdur» - deyən Ulu Öndərin arzusunu reallaşdırdı: «Mən bu gün Ulu Öndər Heydər Əliyevin məzarını ziyarət etdim, onun ruhu qarşısında baş əydim. Ürəyimdə dedim, xoşbəxt adamam ki, ata vəsiyyətini yerinə yetirdim. Şuşanı azad etdik! Bu, böyük Qələbədir! Bu gün şəhidlərimizin, Ulu Öndərin ruhu şaddır! Gözün aydın olsun Azərbaycan! Gözünüz aydın olsun dünya azərbaycanlıları!".

Bu gün isə "Dəmir yumruğ"un gücü ilə "Qarabağ Azərbaycandır!" dirçəliş yolundadır. İşğaldan azad olunan ərazilərin minalardan təmizlənməsi də, məhz sözü imzası qədər qüvvətli olan Qalib Liderimiz İlham Əliyev cənablarının uğurlu diplomatiyası nəticəsidir ki, Ermənistan Ağdam, Füzuli və Zəngilan rayonlarında basdırdığı tank və piyada əleyhinə minaya dair xəritələrini Azərbaycana təhvil verib. Bu, Azərbaycan Prezidentinin həyata keçirdiyi uzaqgörən siyasətinin məntiqi nəticəsi idi. Bu, həm on minlərlə vətəndaşın, o cümlədən, minatəmizləyənlərin həyatının təhlükədən xilası deməkdir.Ən əsası isə, Azərbaycan Prezidenti İlham Əliyevin işğaldan əzad olunmuş torpaqlara davamlı səfərləri və ən əsası, bu səfərlər zamanı həmin ərazilərdə aparılan quruculuq işləri çərçivəsində inşa edilən yeni strateji obyekt və müəssisələrin təməlinin dövlətimizin başçısı tərəfindən qoyulması həm siyasi, həm iqtisadi, həm mənəvi cəhətdən müstəsna əhəmiyyət kəsb etməklə yanaşı, dünyaya bir mesajdır. İyulun 26-da Ali Baş Komandanımız Silahlı Qüvvələr Günündə Kəlbəcər və

Laçın rayonlarına səfərinin əsas səbəbini hərbçilərlə bir yerdə olduğunu deyib: "Mənim iyunun 26-da bu rayonlara səfərimin əsas səbəbi bu gün - Silahlı Qüvvələr Günündə hərbçilərlə bir yerdə olmağımdır. Mən bu gün hərbçilərlə - yeni yaradılmış komando qüvvələri ilə Ordu Gününü Kəlbəcərdə qeyd etdim. Hesab edirəm ki, bunun çox böyük rəmzi mənası var. Hərbi xidmət nöqteyi-nəzərdən bu bölgə – Kəlbəcər-Laçın zonası həm iqlim, həm relyef, həm də təbiət baxımından bəlkə də ən çətin bölgədir. Ona görə bu gün mən burada olmalı idim, Müzəffər Ordumuzla bərabər olmalı idim, hər zaman olduğu kimi..."

Prezident İlham Əliyev hərbçilərlə görüşü zamanı bildirib ki, hər il 26 iyun tarixində hərbçilərlə görüşlər əsnasında mən deyirdim ki, gün gələcək biz öz doğma torpağımıza qayıdacağıq, ərazi bütövlüyümüzü bərpa edəcəyik: «Biz şəhidlərimizin qisasını döyüş meydanında aldıq. Dəfələrlə demişdim ki, şəhidlərimizin qanı yerdə qalmayacaq. Belə də oldu. İkinci Qarabağ müharibəsi Azərbaycanın tam Qələbəsi ilə nəticələndi", deyən Ali Baş Komandan söyləyib ki, bu Azərbaycan xalqının çoxəsrlik tarixində buna bənzər parlaq zəfər olmamışdır: "Biz bütün gücümüzü səfərbər edərək düşmənə sarsıdıcı zərbələr endirib, düşməni məğlub etdik, tarixi ədaləti və ölkəmizin ərazi bütövlüyünü bərpa etdik!... Çünki nəyi demişiksə, onu da etmişik".

Ali Baş Komandan həmçinin, Ermənistandakı revanşist qüvvələrə də xəbərdarlıq etdi: "Əgər Ermənistan sərhədlərin müəyyən edilməsi işində yenə də öz köhnə taktikasına qapılsa, vaxt uzatmağa çalışsa, nəticədə özü peşman olacaq. Biz Ermənistanda baş qaldıran revanşist qüvvələrin hərəkətlərinə diqqətlə baxırıq. Onlar da bunu bilsinlər. Bax, o dağın başında mənim sözlərim yazılıb: "Dəmir yumruq" yerindədir, bunu heç kim unutmasın!". Bir sözlə, Ermənistanın düşdükləri böhrandan yeganə çıxış yolu sadə məntiqlə günü-gündən güclənən, qalib Azərbaycanın irəli sürdüyü tələbləri qəbul etməkdir. Əks halda "Dəmir yumruq" yerindədir, bunu heç kim unutmasın!".

# Yenilməz ordumuz 30 il davam edən işğala 44 gündə son qoydu

Azərbaycan Prezidenti, Müzəffər Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi ilə «Dəmir yumruq» əməliyyatı ilə 44 gün davam edən Vətən müharibəsində Azərbaycan Ordusu yüksək döyüş bacarığını nümayiş etdirərək bütün dünyaya öz gücünü, qüdrətini göstərdi. Ermənistan və havadarları tərəfindən işğal olunmuş torpaqlarımız əsgər və zabitlərimizin qanı və canı bahasına azad edildi. Bu, Prezident İlham Əliyev tərəfindən son 19 il ərzində həyata keçirilən "Güclü ordu - güclü dövlət" strategiyasının və «dəmir yumruq» siyasətinin nəticəsidir. Prezident, Ali Baş Komandan İlham Əliyev iyunun 26-da Silahlı Qüvvələr Günü münasibətilə Azərbaycan Ordusunun rəhbər və şəxsi heyətinin bir qrupu ilə görüşü zamanı bildirmişdir ki, bu qələbə zamanında ordu sahəsində görülən işlərin nəticəsidir: "Ona görə biz güclü dövlət yaratmışıq, mən son illərdə dəfələrlə demişdim və bax, həyat mənim sözümü təsdiqlədi ki, bugünkü Azərbaycan bütün tarix boyunca ən qüdrətli Azərbaycandır və çoxəsrlik tarixində heç vaxt Azərbaycan indiki qədər güclü olmamışdır. Bizim hazırlıq işlərinin aparılmasında əsas amil xalq-iqtidar birliyi olmuşdur. Çünki bizim siyasətimiz xalq tərəfindən dəstəklənir, bizim siyasətimizə böyük inam var. Müharibə və onun nəticələri bir daha Azərbaycan xalqını əmin etdi ki, bu inamı bizə Azərbaycan xalqı bəxş etmişdir. Çünki nəyi demişiksə, onu da etmişik". Dövlət başçısı çıxışı zamanı onu da bildirdi ki, biz cəsarət göstərdik, milli ruh nümayiş etdirdik və istədiyimizə nail olduq: "Bir daha demək istəyirəm ki, İkinci Qarabağ müharibəsi şanlı tarix kimi, şanlı qələbə kimi Azərbaycan tarixinə qızıl hərflərlə əbədi yazılıb. Azərbaycan bundan sonra müzəffər ölkə kimi yaşayacaq, Ermənistan bundan sonra məğlub edilmiş ölkə kimi yaşayacaq".

### *Nəyi, nə vaxt, necə etmək lazım olduğunu yaxşı bilən lider*

Bəli, bu qələbə Prezident İlham Əliyevin "nəyi nə vaxt, necə etmək lazım olduğunu bilərək, "Güclü ordu – güclü dövlət" strategiyasının və "dəmir yumruq" siyasətinin nəticəsidir. Çünki dövlət başçımız iqtisadi sahədə əldə etdiyimiz gücü Ordumuzun müasir texnologiyalarla təchiz edilməsinə və peşəkarlığının artırılmasına yönəltdi. Hərbçilərin mənzil-məişət şəraiti

yaxşılaşdırıldı, hərbçilərimiz beynəlxalq təlimlərə qatıldılar. Son 19 il ərzində Prezident İlham Əliyev iştirak etdiyi bütün beynəlxalq tədbirlərdə bəyan edirdi ki, Ermənistan Qarabağ münaqişəsinin danışıqlar yolu ilə həlli prosesinə ciddi səy göstərməsə, Azərbaycan torpaqlarını müharibə yolu ilə geri qaytaracaq. Və bunu da etdi. 2020-ci il sentyabrın 27-də başlanılan 44 günlük Vətən müharibəsində Ali Baş Komandan İlham Əliyev cənablarının "dəmir yumruğu" düşmənlərimizi acı və tarixi məğlubiyyətə düçar etdi. Noyabrın 10-da imzalanmış üçtərəfli Bəyanat Ermənistanın məğlubiyyəti haqqında kapitulyasiya aktıdır. Bu Bəyanatı imzalamaqla Dağlıq Qarabağ ifadəsi gündəmdən çıxdı və Azərbaycanda belə bir ərazi vahidi artıq mövcud deyil. Bəli, Prezident İlham Əliyevin nəyi necə və vaxt etmək lazım olduğunu çox yaxşı bildiyi siyasətin nəticəsi budur. Azərbaycan Prezidenti İlham Əliyev xalqa dəfələrlə etdiyi müraciətlərində bildirib ki, biz ədaləti bərpa edirik, ərazi bütövlüyümüzü bərpa edirik, Azərbaycan xalqının ümidlərini doğrulduruq və bundan sonra da doğruldacağıq: “Biz öz torpağımızda döyüşürük, vuruşuruq. Bizim ərazi bütövlüyümüz bərpa edilməlidir və biz haqq yolundayıq. Bizim əsgərimiz xilaskar əsgərdir. Çünki öz doğma dədə-baba torpağını işğalçılardan azad edir”.

Bir sözlə, qurucu, birləşdirici, Azərbaycan xalqının bütün istək və arzularını həyata keçirən, öz siyasətində Azərbaycan dövlətinin və xalqının maraqlarını ən ali məqsəd kimi görən və bütün qüvvəsini bu istiqamətdə səfərbər edən, xalqın birmənalı şəkildə dəstəklədiyi, etimad göstərdiyi və etibar etdiyi lider, Prezident İlham Əliyev yürütdüyü 19 illik - “Güclü ordu – güclü dövlət” strategiyasının və “Dəmir yumruq” siyasətinin doğru olduğunu Azərbaycana və beynəlxalq ictimaiyyətə sübut etdi. Və bu gün böyük inam və qətiyyətlə ifadə edirik ki, Azərbaycanın ərazi bütövlüyünün təmin olunması ilə ölkə Prezidenti, Ali Baş Komandan İlham Əliyev 2020-ci ilin Qalib sərkərdəsi, Azərbaycan Ordusu ən peşəkar və döyüş ruhlu Ordu, Azərbaycan xalqı isə ən qəhrəman xalq kimi tarixə qızıl hərflərlə yazılacaq. Növbəti mərhələdə cənab İlham Əliyevin yeni-yeni hədəflərə hesablanmış strategiyasına uyğun olaraq Azərbaycan inkişaf, tərəqqi yolunda daha da böyük addımlarla irəliləyəcək, güclü dövlətin güclü ordusu çox tezliklə, Qarabağın işğal olunmuş ərazilərimizi də geriyə qaytaracaq! Çünki Azərbaycan Ordusu məğlubedilməzdir, onun qarşısında düşmən çox aciz və zəifdir.

## 44 gündə tarix yazan Müzəffər Ali Baş Komandan

30 illik Vətən həsrəti, nisgili, arzularımız, xəyallarımız, yuxularımız, gözlədiyimiz o möhtəşəm tarixə şahidlik etmək zamanı 44 gündə gerçəyə çevrildi! 10 noyabr 2020-ci il... Prezident, Ali Baş Komandan İlham Əliyev cənablarının qətiyyətli mövqeyi, Müzəffər Ordumuzun, Azərbaycan əsgərinin rəşadəti, şücaəti, xalqımızın birliyi, həmrəyliyi nəticəsində 44 gün ərzində döyüş meydanında gücünü göstərdi, düşmənin müqaviməti qırıldı. Hər gün qəhrəman döyüşçülərimiz irəli getdi və 44 gün ərzində bircə dəfə də olmadı ki, igid hərbçilərimiz düşmən tapdağından azad etdikləri ərazilərdən bir qarış belə geri çəkilsinlər. Çünki Ali Baş Komandanın "İrəli" əmri ilə mənfur düşmən üzərinə yeriyən cəsur döyüşçülərimiz "bu yolda öldü var, döndü yox", deyərək, çıxmışdılar haqq savaşına. Azərbaycanın mərd oğulları 44 gün ərzində bəşər tarixində misli görünməmiş qəhrəmanlıq, vətənpərvərlik nümayiş etdirdilər, dünya hərb sahəsində yeni döyüş təcrübəsi yaratdılar. 10 noyabr şanlı tariximizə Zəfər günü kimi yazıldı. Güclü Ordumuzun, rəşadətli əsgərlərimizin və nəhayət, dövlət başçımızla xalqımızın bir olmağımız 30 illik həsrətimizə son qoyuldu! Budur, Azərbaycan xalqının, əsgərinin əzmi, rəhbərinə, xalqına, torpağına, Vətəninə sadiqliyi. Prezident İlham Əliyevin də bəyan etdiyi kimi, Azərbaycan cəmi 44 gün ərzində düşmən üzərində qətiyyətli Qələbə qazandı: "İkinci Qarabağ müharibəsi bizim şanlı tariximizdir. Bu Qələbə tarixdə əbədi qalacaq. Azərbaycan Silahlı Qüvvələri 44 gün ərzində düşmən ordusunu məhv edərək öz ərazi bütövlüyünü bərpa etdi."

***Ali Baş Komandanımızın ciddi mesajlarından ermənilər düzgün dərs çıxarmalıdırlar***

Prezident İlham Əliyev İsmayıllıda Azərbaycan Televiziyasına verdiyi müsahibədə son günlər Qarabağda baş verən düşmən təxribatı, işğaldan azad edilmiş torpaqlarda görülən yenidənqurma işləri, "Qisas" əməliyyatı və onun nəticələri barədə ictimaiyyətə ətraflı məlumat verərək Ermənistana ciddi mesajlar və xəbərdarlıqlarını etdi. Ali Baş Komandan İlham Əliyev bəyan etdi ki, Azərbaycan şəhidinin qanını yerdə qoymayıb və son "Qisas" əməliyyatı da bunu bir daha təsdiqlədi. Əgər düşmən növbəti təxribata əl atsa, Azərbaycan Ordusunun qarşısını heç bir

qüvvə kəsə bilməyəcək. Ermənilər sülhün tezliklə bərqərar olunması istiqamətində addımlar atmasalar... Azərbaycan Prezidentinin bu xəbərdarlığından həm Ermənistan rəhbərliyi, həm revanşist qüvvələr, həm də Qarabağda yaşayan ermənilər dərs almalıdırlar. Ermənilər bilməlidirlər ki, son "Qisas" əməliyyatı da cəza tədbiri idi. Şəhidimizin qisası alındı və ermənilərin təxribat törətmələri onlara baha başa gələcəyini bilməlidirlər. Sülhün tezliklə bərqərar olması istiqamətində addımlar atmalı, 10 noyabr Bəyanatını imzalamış dövlətlər imzalarına hörmətlə yanaşmalı, Azərbaycanın haqq səsini başa düşməlidirlər. Əks halda "Dəmir yumruğ"un təsirini unudanlar təkrar görməli olacaqla. Azərbaycan Prezidenti humanizm nümayiş etdirərək bir daha Ermənistana çıxış yolu göstərir, bu ölkəni sülhə dəvət edir.

Prezident bir daha Ermənistan rəhbərliyinə xəbərdarlıq etdi, Qarabağda yaşayan ermənilərə isə çıxış yolu göstərdi. Ya məğlub Ermənistanın vətəndaşlığında qalıb Azərbaycan torpaqlarından getməli, ya da qalib dövlətin vətəndaşlığını qəbul edib ölkəmizin ərazisində yaşamalıdırlar... Əks halda heç kim "dəmir yumruğ"u durdura bilməz: "Biz öz torpağımızda istənilən əməliyyatı istənilən zaman apara bilərik. Sadəcə olaraq, “Qisas” əməliyyatının çox təsirli, ancaq qısamüddətli olması onu göstərir ki, bizim gücümüz də yerindədir, eyni zamanda, biz yeni müharibə istəmirik. Çünki İkinci Qarabağ müharibəsi gücümüzü göstərdi və biz istədiyimizə hərbi və ondan sonra hərbi-siyasi yollarla nail olduq. Digər arzularımıza da çatacağıq, zaman gələndə onlara da çatacağıq".

Prezident müsahibəsində, həmçinin qeyd etdi ki, bu gün Ermənistanla Azərbaycan arasında gedən normallaşma prosesində Qarabağ mövzusu yoxdur. Bu gün danışıqlar masasında hər hansı bir statusdan, ümumiyyətlə, söhbət belə getmir. Müzakirə mövzusu yalnız Qarabağda yaşayan ermənilərin hüquqları və təhlükəsizliyi məsələsidir. Prezident bəyan edib ki, Qarabağda yaşayan ermənilərin hüquqları da, təhlükəsizliyi də Azərbaycan dövləti tərəfindən təmin ediləcək. Ermənilər də yaxşı bilirlər ki, İlham Əliyev verdiyi vədin, sözün hər zaman arxasında duraraq onu reallığa çevirən liderdir. Azərbaycan Prezidenti bir daha Ermənistan rəhbərliyinə mesaj göndərərək dedi ki, müharibə artıq bitib və Qarabağ münaqişəsinə son qoyulub. İndi sülh danışıqlarına başlamağın vaxtıdı. Hələ ki qarşı tərəfdən müsbət cavab alınmasa da, Azərbaycan

ümid edir ki, tezliklə bu, baş verəcək. Çünki indi diktəni qalib dövlət edir. Bir sözlə, İlham Əliyevin qətiyyətli fikirlərindən Ermənistan rəhbərliyi və revanşist qüvvələr dərs çıxarmalıdırlar. Çünki sentyabrın 27-də Ermənistanın törətdiyi təxribata adekvat cavab olaraq Ali Baş Komandan, Prezident İlham Əliyevin rəhbərliyi ilə Azərbaycan Ordusu canı-qanı bahasına Ermənistan Ordusunun məğlubedilməzliyi barədə illərdir formalaşdırılmış mifi 44 günə dağıtdığı. Bir sözlə, Azərbaycan Prezidenti, Ali Baş Komandan İlham Əliyevin qətiyyətli fikirlərindən Ermənistan rəhbərliyi və revanşist qüvvələr dərs çıxarmalı, Qalib sərkərdənin söylədiyi kimi, Ermənistan tarixi yenidən yazmaq cəhdlərindən də çəkinməlidir, çünki tarix Müzəffər Ali Baş Komandan İlham Əliyevin qüdrətli ordusu tərəfindən artıq yazılıb.

## Tariximizin qürur – iftixar səhifəsi

2020-cil il sentyabrın 27-də başlayan və 44 gün davam edən Vətən müharibəsinin möhtəşəm Qələbə ilə başa çatması tariximizin şanlı qürur-iftixar səhifəsidir. Cəmi 44 gün bəs etdi ki, Azərbaycan tarixinin son yüzilliklərdəki axını tərsinə çevrilsin və Güney Qafqaz regionunda yeni reallıq bərqərar olsun. Azərbaycan Prezidenti, Ali Baş Komandan İlham Əliyev xalqa müraciətində də dəfələrlə bildirdi ki, "status-kvo" artıq yoxdur: "Status-kvo" deyilən məsələ yoxdur. Qurtardı getdi. "Status-kvo" belə olmalıdı, elə olmalıdır. Mən dəyişdirdim status-kvonu. Bax, orada, döyüş meydanında. "Status-kvo" yoxdur. Təmas xətti – yoxdur təmas xətti, yarmışıq onu. 30 ildir qururdular bu təmas xəttini. Özü də bu bölgənin relyefi belədir ki, o, təbii istehkamdır. Biz aşağıdan yuxarı gedirik. Özü də orada beton istehkamlar qurulub – 30 il ərzində! Yarıb keçmişik! Azərbaycan əsgərinin qabağında heç kim heç nə deyə bilməz. Biz bu gün o təmas xəttini darmadağın etdik. Deyirlər, yeni təmas xətti olacaq. Olmayacaq".

Bəli, "Dəmir yumruq" birliyi ilə haqq-ədaləti bərpa etmiş Azərbaycan xalqının birlik, güc rəmzi ilə böyük qələbə, zəfər tarixini yazdı. Azərbaycan dövlətinin qüdrəti, Müzəffər Ali Baş Komandanın "Dəmir yumruğ"unun ətrafında birləşməsi ilə bütün dünyaya gücünü göstərdi. Ermənistan bu illər ərzində BMT Təhlükəsizlik Şurasının Azərbaycanın işğal altında olan bütün ərazilərindən işğalçı qüvvələrin dərhal, tamamilə və qeyd-şərtsiz çıxarılmasını tələb edən qətnamələrinə etinasızlıq göstərməsinə baxmayaraq, Azərbaycan bütün dünyaya göstərdi və sübut etdi ki, o özünün işğal altında olan torpaqlarını müstəqil şəkildə, öz gücü ilə, öz qüdrəti ilə azad etməyə qadirdir və bunu etdi! Çünki….

**Sarsılmazlıq Ordumuza, məğlubiyyət düşmənə aiddir!**

Müdrik insanların dəfələrlə söylədiyi "Siyasətin ədalətli, siyasətçinin adil olması onu dəstəkləyənlərin sırasına baxanda məlum olur" - ifadəsi bu gün Azərbaycanda öz təsdiqini tapır. Çünki bizim dövlətin yeritdiyi siyasət də, dövlət başçımızın siyasi fəaliyyəti də dünyanın hər yerində, işğalçı Ermənistan istisna olmaqla, hamı tərəfindən dəstəklənir. Xarici siyasətimizin beynəlxalq aləmdə təqdir olunması, Silahlı Qüvvələrimizin Ali

Baş Komandanının ölkənin ərazi bütövlüyünün bərpası istiqamətində nümayiş etdirdiyi qətiyyət, Milli Ordumuzun işğalçı dövlətin təxribatlarına tutarlı cavab verərək düşmənin geri çəkilməsinə nail olması və bu kimi bir sıra başqa amillər həm ölkə əhalisi, həm də dünya ictimaiyyəti tərəfindən böyük hörmət və ehtiramla qarşılanır. Çünki Azərbaycanın igid oğul və qızları Vətənin şərəfini öz qeyrətləri ilə qoruyub, qanları ilə müdafiə edirlər.

Bu dəfələrlə sübut olunub və bunu görmüşük. Sentyabrın 27-də səhər saat 06:00 radələrində Ermənistanın növbəti dəfə genişmiqyaslı təxribatı bir daha işğalçı ölkənin faşizm siyasətinin göstəricisidir. Bunu dövlət başçımız İlham Əliyevin sədrliyi ilə Təhlükəsizlik Şurasının iclasında da səsləndirib: “Bu, bir daha Ermənistan faşizminin eybəcər sifətini göstərir. Çünki dinc əhaliyə qarşı belə qəddarlıq ancaq faşist dövlətlərə aid ola bilər və bu, birinci dəfə deyil - Tovuz hadisələri, ondan sonra digər hadisələr. Xocalı soyqırımı erməni vəhşiləri tərəfindən əliyalın dinc əhaliyə qarşı törədilmişdir və bu dəfə də Ermənistanın əsas hədəfi bizim yaşayış məntəqələrimizdir. Onlar bu atəşi açmaqla istəyirlər ki, Azərbaycan ictimaiyyəti arasında, Azərbaycan vətəndaşları arasında cəbhə boyu yerləşən kəndlərdə, şəhərlərdə yaşayan insanlar arasında təşviş yaransın, panika yaransın. Bu gün səhər mən bütün cəhbəboyu bölgələrdən məlumat almışam. Tam qətiyyətlə deyə bilərəm ki, Azərbaycan vətəndaşları cəsarət göstərirlər, hər kəs öz yerindədir və ordumuza, dövlətimizə hər an dəstək verməyə hazırdırlar və bunu edirlər”.

Budur xalqımızın öz dövləti ilə birliyi, hərbi hissələrimizdə, hərbi birləşmələrimizdə ruh yüksəkliyi, ordumuza könüllü şəkildə yazılan on minlərlə insanlarımızın öz dövlətinə sadiqliyi. Məqsəd ərazilərimizin bütövlüyünün, ermənilərin yaratdığı qondarma “Dağlıq Qarabağ” probleminin həllinə nail olmaqdır.

Azərbaycan Prezidenti, Silahlı Qüvvələrin Ali Baş Komandanı İlham Əliyev Təhlükəsizlik Şurasının iclasında da Dağlıq Qarabağ məsələsinin Azərbaycanın milli məsələsi olduğunu vurğulayaraq bildirdi ki, bu məsələsinin həlli bizim tarixi vəzifəmizdir: “Mən dəfələrlə demişəm, bu gün də demək istəyirəm ki, biz bu məsələni elə həll etməliyik ki, Azərbaycan xalqı bundan razı olsun. Biz bunu elə həll etməliyik ki, tarixi ədalət bərpa edilsin. Biz bunu elə etməliyik ki, Azərbaycanın ərazi bütövlüyünü bərpa

edilsin. Mən dəfələrlə demişəm, bizə bu məsələnin, bu münaqişənin yarımçıq həlli lazım deyil. Biz öz torpağımızdayıq, bizim başqa ölkələrin torpağında gözümüz yoxdur. Amma öz torpağımızı heç kimə verən deyilik. Biz heç vaxt imkan verə bilmərik ki, Azərbaycan torpaqlarında ikinci qondarma erməni dövləti yaradılsın. Heç vaxt imkan verə bilmərik və bugünkü hadisələr bunu bir daha göstərir".

Dövlət başçımızın dediyi kimi: "Tarixi ədalət bizim tərəfimizdədir. Çünki bu, bizim doğma, dədə-baba torpağımızdır. Beynəlxalq hüquq bizim tərəfimizdədir. Bütün beynəlxalq təşkilatlar Azərbaycanın ərazi bütövlüyünü tanıyır. Bütün ölkələr Azərbaycanın ərazi bütövlüyünü tanıyır".

Bir sözlə, sentyabrın 27-dən noyabrın 10-dək davam edən Vətən müharibəsi şanlı Azərbaycan Ordusunun tarixi Zəfəri ilə başa çatdı və 44 gün davam edən İkinci Vətən müharibəsi işğala həmişəlik son qoydu. Güclü Silahlı Qüvvələrimizin əsgər və zabitləri, hərbçiləri Vətənimizin ərazi bütövlüyü naminə bir yumruq kimi birləşib, qəhrəmancasına vuruşaraq Azərbaycan Ordusunun gücünü, qüdrətini bütün dünyaya bir daha nümayiş etdirdilər. Ali Baş Komandanımız, Prezident İlham Əliyev Anım Günü ilə əlaqədar xalqa müraciəti zamanı da bildirdi ki, 44 gün ərzində bir gün də olmayıb ki, biz geriyə addım ataq: "Müharibə dövründə hamımız bir şüarla yaşayırdıq – öldü var, döndü yoxdur. Azərbaycan xalqı Azərbaycan Ordusunun arxasında möhkəm dayanaraq ordumuza əlavə güc verirdi. Günahsız insanların həlak olması, şəhər və kəndlərimizin dağıdılması Azərbaycan xalqının iradəsini qıra bilmədi. Biz hər gün irəli gedirdik, hər gün qələbə qazanırdıq, hər gün yeni uğurlar haqqında məlumatlar daxil olurdu. 44 gün ərzində bir gün də olmayıb ki, biz geriyə addım ataq". Elə bu günlərdə, sentyabrın 21-də Azərbaycan Prezidenti İlham Əliyev Laçın şəhərində Azərbaycan Bayrağını ucaltdıqdan sonra çıxışı zamanı bildirdi ki, 44 günlük Vətən müharibəsinin sonunda Ermənistan kapitulyasiya aktına imza atmağa məcbur oldu və beləliklə, Azərbaycanın tarixi Zəfəri təsdiqləndi. Bu kapitulyasiya aktının nəticəsində Ermənistan Ağdam, Kəlbəcər və Laçın rayonlarının işğal edilmiş hissəsindən öz qoşunlarını çıxarmalı idi və buna əməl etdi. Laçın və Kəlbəcər rayonlarının bir hissəsi 44 günlük Vətən müharibəsi dövründə azad edilmişdi.

Ali Baş Komandanımızın dediyi kimi, bu, tarixi hadisədir: «Laçın şəhərinin azad edilməsi həmişə tarixdə qalacaq. Bu gün Laçın şəhərində,

şəhərin mərkəzində, mərkəzi küçədə Azərbaycan Bayrağını qaldırmışam. Bu bayraq burada əbədi dalğalanacaqdır". Dövlət başçımız onu da bildirib ki, biz birləşdik və istədiyimizə nail olduq, tarixi ədaləti bərpa etdik: "Biz hərbçilərimizlə haqlı olaraq fəxr edirik və fəxr edəcəyik. Onlar əsl qəhrəmandırlar. Biz bütün xalqımızla fəxr edirik. Çünki bu 44 gün ərzində göstərilən həmrəylik, göstərilən birlik bütün dünyaya Azərbaycan xalqını çox ləyaqətli və böyük xalq kimi təqdim etdi. Bizim Qələbəmizin rəmzi olan yumruq təkcə güc rəmzi deyil, bu, birlik rəmzidir". Bir sözlə, Prezidentimizin çıxışlarında, müsahibələrində, xalqa müraciətlərində dediyi kimi: "Bu yumruq elə-belə yumruq deyil, bu, dəmir yumruqdur. Bu dəmir yumruqla düşmənin başını əzirik və əzəcəyik! Eyni zamanda, bu yumruq birliyimizin rəmzidir. Bax, bu gün Azərbaycan xalqı bu yumruq kimi birləşib! Həmişə belə olacaq! Bu birlik əbədi olacaq! Bu birlik bizə gələcəkdə də bütün vəzifələri icra etmək üçün imkan yaradacaq".

Artıq qələbəmizdən üç il ötür. Bu illər ərzində işğaldan azad olunmuş torpaqlar quruculuq meydanına çevrilib. Prezident İlham Əliyev bu günə qədər verdiyi bütün sözləri, vədləri yerinə yetirib. Necə ki, “Qarabağ Azərbaycandır və nida”- deyən dövlətimizin başçısı sözlərinə sadiq qalaraq Ermənistanın faşizm siyasətini məhv etdi, Qarabağı işğaldan azad etdi, hazırda da “Qarabağda cənnət yaradacağıq” vədini addım-addım yerinə yetirməkdədir. Budur, Ali Baş Komandanımızın diplomatik siyasətinin nəticəsi! Budur güclü Ordumuzun qüdrəti, budur mübariz, igid əsgərlərimizin rəşadəti! Bu nailiyyət və qələbələr həm də Xalq-Ordu Birliyinin, orduya olan inamın Qələbəsidir! Çünki Ali Baş Komandanın apardığı diplomatik siyasəti düzgün siyasətdir, uğurlu siyasəti haqq işidir! Çünki Qarabağ Azərbaycandır! Qarabağ cənnət məkanıdır! Bu gün Vətən müharibəsində qəhrəmancasına döyüşmüş, Azərbaycan bayrağını işğaldan azad edilən torpaqlarımızda dalğalandırmış, ölkəmizin ərazi bütövlüyü yolunda canlarını fəda etmiş əsgər və zabitlərimizə, bütün şəhidlərimizə dərin ehtiram əlaməti olaraq Prezident İlham Əliyev cənablarının 27 sentyabr tarixini Azərbaycanda Anım Günü kimi qeyd olunması ilə bağlı Sərəncamı şəhidlərin ruhuna, onların doğmalarına ali səviyyədə ehtiramın göstəricisidir. Çünki bütün bunlar Vətən müharibəsində Azərbaycan əsgərinin qazandığı Zəfərin nəticələridir. Zəfər bayramın mübarək, Azərbaycan xalqı!

# REGİONUN GÜC VƏ SÖZ SAHİBİ

“Haqq yolunda addımlayanın köməyi çox, düşməni yox olar”. Bu, həqiqətən də belədir. Bu gün hər bir xalqın dünyada tanınmasında, uğurlar əldə etməsində və təbii ki, dünyada cərəyan edən qlobal proseslərin öndə gedənlərinə çevrilməsində liderlərin xüsusi əhəmiyyəti mövcuddur. Liderlik amili elə bir şəxsiyyətlərə aid olunur ki, onlar xalqın və dövlətin maraqlarını müdafiə etməklə yanaşı, həm də inkişaf etdirir. Məhz bu kimi önəmli faktorun təhlilini apararkən, Azərbaycanın bu siyahıda birinci olması şəksizdir. Çünki Azərbaycanın inkişaf və tərəqqi, eləcə də, xalqın rifahı faktorunda Azərbaycan Prezidenti İlham Əliyev Liderliyi amili mövcuddur.

Prezident İlham Əliyev dediyi “Əldə edilmiş uğurların dünyada bərabəri yoxdur” fikri, bu gün həqiqətən də ölkəmizdə İkinci Vətən müharibəsi zamanı göründü. Bir-birinin ardınca işğal olunmuş torpaqlarımızın azad olunması, mütəmadi olaraq yeni qələbə xəbərlərinin gəlməsi hər bir azərbaycanlını sevindirirdi. 30 il arzusunda olduğumuz Qarabağ yanğısını, qələbəsinin həsrətini çəkirdik. Bu həsrətə 8 noyabr, 2020-ci il Şuşanın, 20 noyabr Ağdamımızın, 25 noyabr Kəlbəcərin, Laçının və onun ardınca digər torpaqlarımızın işğaldan azad olunduğu tarixi günləri xalqımıza Prezident, Müzəffər Ali Baş Komandan İlham Əliyev və rəşadətli əsgər və zabitlərimiz bəxş etmişdir. Yaşa Prezidentimiz! Yaşa Güclü Ordumuz! Yaşa Rəşadətli əsgər və zabitlərimiz!.

Bu gün Azərbaycan xalqı xoşbəxt xalqdır ki, 30 il Qələbə həsrətinə 10 noyabr 2020-ci ildə son qouldu və tarixi sənəd imzalandı – Dağlıq Qarabağ münaqişəsi Azərbaycanın tam qələbəsi ilə başa çatdı! Ali Baş Komandanımız yenə də xalqına tarixdə ən böyük Qələbəni - Vətən müharibəsi Azərbaycanın tam qələbəsi ilə başa çatdığı müjdəsini xalqımıza çatdırdı. Bildirdi ki, bu gün Ermənistan ilə Azərbaycan arasında çoxillik münaqişənin nizamlanması işinə nöqtə qoyulur, Azərbaycan torpaqlarının işğalına son qoyulur və saatlarla, ümumiyyətlə desək, günlərlə vaxt sərf edib mühüm mövqeləri razılaşdırmaq yolu ilə nizamlamaya nail olduq ki, mənim fikrimcə, həm Azərbaycanın, həm də Ermənistanın və region ölkələrinin xalqlarının mənafelərinə cavab verir. Deməliyəm ki, münaqişənin hərbi-siyasi yolla nizamlanması regionumuzda uzunmüddətli

sülhə, həmrəyliyə gətirib çıxaracaq, qarşıdurmaya və qan tökülməsinə son qoyacaq. Bir sözlə, artıq Qarabağ bizimdir, Qarabağ Azərbaycandır! Vəssalam, nida! başqa yol yoxdur!!! Bu yol qələbələr yoludur! Bu yol haqq yoludur! Bu yol Azərbaycanımızın ərazi bütövlüyü yoludur, ədalət yoludur, həmrəylik yoludur, azadlıq yoludur! Azərbaycan Prezidenti, Ali Baş Komandan İlham Əliyev cənablarının qətiyyətli addımları, xalqa müraciətləri cəmiyyətimizdə, dünyanın hansı nöqtəsində yaşamağından asılı olmayaraq, qəlbi Azərbaycanla döyünən hər kəsdə ruh yüksəkliyi yaratması yoludur. Və dövlət başçımız İlham Əliyev 19 illik Prezidentlik fəaliyyətində ancaq və ancaq düşmən tapdağında olan torpaqlarımızın azad edilməsi ilə bağlı yüksək tribunalarda, verdiyi müsahibələrində qətiyyətli çıxışları, söylədiyi hər söz, hər kəlmə güclü Ordumuzun, rəşadətli əsgərlərimizin və nəhayət, dövlət başçımızla xalqımızın bir olması 8 noyabr-10 noyabr tarixi günün sabahı da əvvəlki sabahlardan fərqli oldu.

Azərbaycan Prezidenti İlham Əliyev dəfələrlə Ermənistan siyasi rəhbərliyinə, erməni xalqına müraciət edərək, onları münaqişənin sülh yolu ilə həll olunmasına çağıraraq bildirirdi ki, "qan tökülmədən torpaqlarımızdan çıxın, bizim başqasının torpağında gözümüz yoxdur". Ancaq işğalçı, rəzil, mənəviyyatsız və terrorçu düşmən dövlət Ermənistan anlamadı. Dövlət başçımız dəfələrplə "düz yola gəl" dedi, yenə də qanmadı. Belə olan halda, Ali Baş Komandanımızın dediyi kimi "Çünki düşmən bizim qarşımızda acizdir. Düşmənin belini qırırıq, qıracağıq!", qırdıq da!

8 noyabrda Şuşamızın azad olması müjdəsini verən Prezident, Ali Baş Komandanımız İlham Əliyev Şuşanın azad olunduğunu və üçrəngli Dövlət Bayrağımızın dalğalandığını dedi. Şuşanın ayağı sayalı oldu. 9 noyabr qürurumuz, məsləyimiz, mənliyimiz olan Bayraq Günü zamanı 71 kəndin, 1 qəsəbə və 8 yüksəkliyin azad oluması, 10 noyabrda isə Azərbaycan Prezidenti İlham Əliyev və Rusiya Prezidenti Vladimir Putin videokonfrans formatında görüşdə yenə də Ermənistanın baş nazirinin iştirak etməməsi bir daha terrorçu dövlətin xislətinin sübutudur. Lakin buna baxmayaraq, 3 ölkənin Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin, Ermənistanın baş naziri Nikol Paşinyanın və Rusiya Federasiyasının Prezidenti Vladimir Putinin imzaladıqları Bəyanat şanlı qələbəmizdir. Bunu Prezident, Müzəffər Ali Baş Komandan İlham Əliyev xalqa müraciətində də söyləyib: "Bu bəyanat bizim şanlı qələbəmizdir. Şadam ki, bu

gün bu müjdəni Azərbaycan xalqına verirəm. Hesab edirəm ki, bu bəyanatın imzalanmasının səbəblərindən biri də dünən qeyd etdiyimiz parlaq qələbəmizdir, tarixi qələbəmizdir, Şuşanın işğaldan azad edilməsidir, Şuşa Qarabağın tacıdır! Şuşanın azad edilməsi həm böyük siyasi, həm böyük strateji, eyni zamanda, çox böyük mənəvi məna daşıyır. Biz Şuşaya qayıtdıq, biz Şuşanı qaytardıq, biz Şuşada yaşayacağıq və işğaldan azad edilmiş digər bütün torpaqlarda həyat qaynayacaq. İnsanlar o torpaqlara qayıdacaq, orada yaşayacaq, insanlarımızın 30 illik həsrətinə son qoyulur”.

Bəli, “Qarabağ Azərbaycandır və nida” şüarı qələbəmizin rəmzinə çevrildi. Azərbaycan Prezidenti xalqa müraciətində də bir daha onu vurğuladı ki, bu ifadə Qələbə rəmzinə çevrilib: “Qarabağ Azərbaycandır və nida” ifadəsi artıq bizim qələbəmizin rəmzinə çevrilib. Bir il bundan əvvəl mən bunu demişəm. Mən fəxr edirəm ki, mənim dediyim ifadə artıq bir milli şüara çevrildi. Bu gün böyük qürur hissi ilə deyə bilərik ki, Füzuli bizimdir, Cəbrayıl bizimdir! Zəngilan bizimdir! Qubadlı bizimdir! Ağdam bizimdir! Laçın bizimdir! Kəlbəcər bizimdir! Şuşa bizimdir! Qarabağ bizimdir! Qarabağ Azərbaycandır! Eşq olsun Azərbaycan xalqına! Yaşasın Azərbaycan!”

Göründüyü kimi, cəmi 44 gün bəs etdi ki, Azərbaycan tarixinin son yüzilliklərdəki axını tərsinə çevrilsin və Güney Qafqaz regionunda yeni reallıq bərqərar olsun və bu 44 gün müddətində terrorçu Ermənistanın “status-kvo”nu ürəyində qalsın. Bəli, hər gün, hər an Azərbaycan Prezidenti, Ali Baş Komandan İlham Əliyev xalqımıza qələbə sorağını verdikcə, Liderimizlə, güclü Ordumuzla, qəhrəman, igid əsgərlərimiz, həmçinin xalqımızla qürur duyuruq. Bütün bunlara Azərbaycan Prezidenti, Ali Baş Komandan İlham Əliyev cənablarının, Müzəffər Ordumuzun, Rəşadətli əsgərlərimizin və xalqımızın BİRLİYİ, Həmrəyliyi nəticəsində əldə etdik. Budur, dünya səviyyəli, cəsarətli LİDER! Budur, xalqın Prezidenti olmaq! Azərbaycan Prezidenti, Ali Baş Komandan İlham Əliyev cənablarının dediyi kimi: “Bu alçaq əməllər Azərbaycan xalqının iradəsini heç vaxt sındıra bilməz!”.

***Qərbi Azərbaycana qayıdış: tarixi ədalət ikinci dəfə bərpa olunur***

Hər ilimiz uğurlu olduğu kimi, qələbəmizin ikinci ilinin - geridə qoyduğumuz 2022-ci ilin ən yaddaqalan hadisələrindən biri də Prezident İlham Əliyevin doğum günündə – dekabrın 24-də Qərbi Azərbaycan İcmasının bir qrup üzvləri ilə görüşü oldu. Dövlət başçımız Qərbi Azərbaycandan olan ziyalılarla görüşü zamanı irəli sürdüyü Qayıdış Konsepsiyası ilə bağlı Qərbi Azərbaycan İcmasında dərhal işə başlanılıb: “Qərbi Azərbaycan bizim tarixi torpağımızdır, bunu bir çox tarixi sənədlər təsdiqləyir, tarixi xəritələr təsdiqləyir, bizim tariximiz təsdiqləyir” ifadəsi sayıla bilər. Məhz bu fikirlər Ermənistanda böyük narahatçılıq yaratmaqla yanaşı, azərbaycanlıların Qərbi Azərbaycan arzularının reallaşacağı günün heç də uzaqda olmadığını sübuta yetirdi”.

Bütün bu görülən işlər onu deməyə əsas verir ki, xalqımızın rifahı daha da yaxşılaşacaq, ölkəmizin qüdrəti yüksələrək Qarabağımız daha yenidən dirçələcək! Və ötən bir il ərzində həm siyasi, həm də iqtisadı baxımdan mühüm nailiyyətlərə imza atan Azərbaycan Prezidenti İlham Əliyevin apardığı düzgün siyasət bir daha onu göstərir ki, "2023-cü il Heydər Əliyev ili" də Azərbaycanın yüksəlişində növbəti uğurlu dövr olacaq. Növbəti il üçün əsas maliyyə planı xalqımızın rifahının daha da yaxşılaşmasını və ölkəmizin qüdrətinin yüksəlməsini, Qarabağımızın yenidən dirçələcəyini və iqtisadi inkişafın davamlılığını təmin edəcək.

Bir sözlə, bu gün böyük inam və qətiyyətlə ifadə edirik ki, Azərbaycanın ərazi bütövlüyünün təmin olunması ilə ölkə Prezidenti, Ali Baş Komandan İlham Əliyev 2023-cü ildə də yeni-yeni hədəflərə hesablanmış strategiyasına uyğun olaraq ölkəmiz inkişaf, tərəqqi yolunda daha da böyük addımlarla irəliləyəcək.

## Prezident İlham Əliyev vədinə və sözünə sadiq olan Liderdir!

**Bu reallıq həm də siyasi sistemin möhkəmləndirilməsinə doğru atılan mühüm addım olaraq qiymətləndirilə bilər**

Müstəqil Azərbaycan dövlətinin qurucusu Ulu Öndər Heydər Əliyevin müəyyən etdiyi inkişaf strategiyası sürətlə davam etdir və Azərbaycan xalqının maraqlarına xidmət edən dövlətçilik fəaliyyəti ölkəmizin qüdrətin artırır. Belə ki, azad, ədalətli və şəffaf seçkilər nəticəsində formalaşmış altıncı çağırış Milli Məclis ötən dövr ərzində bir çox uğurlara imza atıb və xüsusilə 2020-ci ilin 10 mart tarixində çıxış edən Azərbaycan Prezidenti İlham Əliyev məhz bu çıxışında bir sıra önəmli məsələlərə toxunub, əhəmiyyətli bəyanatlarını irəli sürüb.

Yeni Azərbaycan Partiyasının keçirilən seçkilər zamanı yerlərin əksəriyyətini qazandığını vurğulayan dövlətimizin başçısı deyib ki, hakim partiyanın parlamentdəki sözü kifayət qədər qiymətlidir və təsirlidir. O cümlədən, Prezident İlham Əliyevin rəhbərliyi altında partiyanın yeni konfiqurasiyasına start verilməlidir. Artıq həmin zamandan etibarən YAP özünün daha müasir standartları ilə seçilməkdədir. Təbii ki, bu reallıq həm də siyasi sistemin möhkəmləndirilməsinə doğru atılan mühüm addım olaraq qiymətləndirilə bilər. Əbəs deyil ki, ölkə rəhbərimiz çıxışı zamanı bu faktora toxunaraq vurğulayıb: "Mən hesab edirəm ki, Azərbaycanda siyasi sistemi möhkəmləndirmək, siyasi münasibətləri sağlam zəmində gücləndirmək üçün buna ehtiyac var. Əlbəttə, hesab edirəm ki, Yeni Azərbaycan Partiyası ümumi maraqlar naminə bu sahədə də çox düzgün addım atır".

Təbii ki, bu gerçəklik həm də demokratik dəyərlərin, o cümlədən, iqtidar-müxalifət münasibətlərinin dialoq mühitinə verdiyi töhfələrdən biridir. Bu gün Milli Məclisdə davam edən işlərin, qəbul edilən qərarların və hazırlanan layihələrin hər biri bilavasitə demokratik dəyərlərə söykənərək icra edilməkdədir.

O da əbəs deyil ki, dövlət başçımız eyni zamanda, Prezident Administrasiyasının nümayəndələrinin bütün siyasi qüvvələrin rəhbərləri ilə görüşlər keçirdiyini tarixi çıxışı zamanı vurğulayıb və həmin görüşlərin

nəticələrinin də ona müntəzəm olaraq məlumat verildiyini qeyd edib. Bu da sübut edir ki, ölkə rəhbərimiz daxildə də mövcud olan siyasi sistemin inkişafına şəxsən təkan verir, bu siyasətin tərəqqisi yönündə mühüm addımlar atır. Dövlət başçımız bildirib ki, bütövlükdə ilkin rəy müsbətdir: "Hesab edirəm ki, indiki genişmiqyaslı islahatlar dövründə siyasi islahatlar mütləq aparılmalıdır. Siyasi islahatlar partiyalararası geniş dialoq aparılmadan həyata keçirilə bilməz. Bir partiya – hakim partiya təkbaşına siyasi dialoq apara bilməz. Çünki dialoq üçün tərəf-müqabillər lazımdır və ilkin təəssürat müsbətdir. Bu təşəbbüs heç bir şərt qoymadan həyata keçirilir".

Bəli, islahatlar aparılır və bu islahatlar paralel olaraq çoxşaxəli yöndə gerçəkləşdirilir. Söz yox ki, bu çoxşaxəlilik növbəti illərdə də özünü göstərir. Bu baxımdan, ölkəmizdə çoxpartiyalılıq sisteminin də inkişafı diqqət mərkəzində saxlanılıb. Prezident İlham Əliyev altıncı çağırış Milli Məclisin ilk iclasındakı çıxışı zamanı bu amilə toxunub: "Əgər biz doğrudan da istəyirik ki, Azərbaycanda çoxpartiyalı sistem inkişaf etsin, – biz bunu istəyirik və iqtidar partiyası kimi bunu təqdim edirik, - onda, əlbəttə, siyasi partiyaların fəaliyyəti üçün lazım olan bütün alətlər spektri mövcud olmalıdır. Bu, hesab edirəm ki, Milli Məclisin gündəliyində duran məsələlərdən biri olacaqdır".

Təbii ki, bütün bunların təməlində dayanan reallıq 2018-ci ilin prezident seçkilərindən sonra daha çox vüsət aldı. Ölkə başçımız çıxışı zamanı da qeyd edib ki, islahatların yeni mərhələsi 2018-ci ilin prezident seçkilərindən sonra başlamışdır: "Bu islahatları mən andiçmə mərasimində, bax, bu salonda bəyan etmişdim. Biz onları ardıcıl olaraq icra edirik və bu, həyatda öz əksini tapır. Bir də onu göstərir ki, həmişə olduğu kimi, bizim sözümüzlə əməlimiz arasında heç bir fərq yoxdur. İslahatlar həm konseptual xarakter, həm də struktur xarakteri daşıyır".

Sonda daha bir faktı da qeyd etmək yerinə düşərdi. Məhz Prezident İlham Əliyevin qətiyyətli siyasəti nəticəsində və sözügedən iclasda irəli sürdüyü fikirləri əsasında bəyan olundu ki, Azərbaycan heç vaxt Ermənistanın torpaqlarımızı işğal etməsi faktı ilə barışmayacaq və belə də oldu. Həmin ərəfədə Prezident İlham Əliyev vurğulamışdı: "Tarixi ədalət bizim tərəfimizdədir, beynəlxalq hüquq da bizim mövqeyimizi dəstəkləyir. Ona görə bizim arqumentlərə qarşı Ermənistan tərəfi heç bir ciddi

arqument qoya bilmir, ancaq yalan, böhtan, tarixi saxtakarlıq və mifologiya. Bu, əslində, onların xislətidir”.

Artıq bu gün Azərbaycan böyük tədbirlərin mərkəzinə çevrilib və ölkəmiz qalib ölkə olaraq öz sözünü deməkdədir. 27 sentyabr 2020-ci ildə torpaqlarımızın azadlığı uğrunda başlayan 44 günlük Vətən müharibəsi Müzəffər Ali Baş Komandanımızın rəhbərliyi ilə zəfərlə başa çatdı. Və bu gün məhz 2020-ci ilin 10 mart tarixindəki çıxışı xatırlayarkən biz bir daha əmin oluruq ki, Prezident İlham Əliyev vədinə və sözünə sadiq olan Liderdir!

# Qalib Komandan, Qüdrətli Lider

Azərbaycanın müasir tarixi iki qüdrətli Liderin – müstəqil Azərbaycan dövlətinin qurucusu olan Ümummilli Lider Heydər Əliyevin və Vətən müharibəsinin qalibi, Qarabağın xilaskarı Prezident, Ali Baş Komandan İlham Əliyevin müdriklik, qətiyyət və qəhrəmanlıq salnaməsidir. Böyük mütəfəkkir Viktor Hüqo vaxtilə yazırdı: **"Əsl Liderin ömrünün yarısı Vətənə, digər yarısı da xalqa xidmət etməkdən ibarətdir".**

Dövlətimizin başçısı İlham Əliyevin istər yerli televiziya kanallarına və mətbuatına, istər xarici televiziya kanallarına və mətbuatına, istərsə də xalqa müraciətlərində səsləndirdiyi hər bir bəyanatda 30 ilə yaxın müddətdə dünya dövlətlərinin siyasi iradə ortaya qoymamalarının yol açdığı sual doğuran və dəqiq cavabını axtaran məqamlar öz əksini tapıb. Real həqiqətlər bir daha bu gerçəkliyə işıq salır ki, zaman keçdikcə baş verən hadisələrin mahiyyəti daha dərindən dərk olunur, haqqın, ədalətin maraqların arxasında necə əridiyi aydın görünür. Bu gün dünyaya edilən "həqiqətə həqiqət gözü ilə baxaq" çağırışı erməniləri və onların havadarlarını narahat etsə də, unudulmamalıdır ki, beynəlxalq hüquq normaları və prinsipləri deyilən məfhum mövcuddur ki, onlara böyüklüyündən, kiçikliyindən asılı olmayaraq bütün dövlətlər əməl etməli, yanaşmalarında əsas götürməlidirlər.

Prezident, Silahlı Qüvvələrin Ali Baş Komandanı İlham Əliyev xalqa müraciətində öz mövqeyini birmənalı şəkildə bildirərək demişdir: “Desin ki, mən Azərbaycanın ərazi bütövlüyünü tanıyıram, necə ki, baza prinsiplərində bu, təsbit edilib. Desin ki, mən işğal edilmiş torpaqlardan qoşunlarımızı çıxaracağam, necə ki, baza prinsiplərində bu, təsbit edilib. Desin ki, mən Azərbaycan xalqından üzr istəyirəm və desin ki, Qarabağ Ermənistan deyil. Sonuncu şərt budur ki, qrafik versin, işğal edilmiş torpaqlardan erməni silahlı qüvvələrinin çıxarılması cədvəli verilsin bizə. Onda biz əlbəttə ki, atəşkəs rejimini bərpa edəcəyik”.

Bəli, bu ancaq Qalib Komandan, Qüdrətli Lider, Azərbaycan Prezidenti İlham Əliyev cənablarının cavabıdır və dövlətimizin başçısına da yaraşan elə budur! Qüdrətli ordu, güclü iqtisadiyyat, beynəlxalq arenada önəmli mövqe, müstəqil xarici siyasət və qalib ölkə. Bu, öz tarixinin ən güclü dövrünü yaşayan Azərbaycanın bugünkü reallıqlarıdır.

Prezident İlham Əliyev “Bu gün beynəlxalq münasibətlərdə "kim güclüdür, o da haqlıdır" prinsipi üstünlük təşkil edir” fikri bir daha Ali Baş Komandanımızın güclü siyasi iradəsi və "dəmir yumruq" siyasəti ilə Dağlıq Qarabağ münaqişəsini tarixə qovuşdurdu, bölgədə yeni reallıqlar yaratdı. Bu güc sayəsində Qarabağın 30 il davam edən işğalına 44 gündə son qoymaq mümkün oldu. Biz həqiqətən tarixi günlər yaşadıq və yaşayırıq. Çoxəsrlik Azərbaycan tarixində buna bənzər şərəfli və qürurlu günlər olmayıb. Prezident İlham Əliyev bu gücə arxalanaraq 44 günlük müharibə dövründə həm də informasiya cəbhəsində xalqının, ölkəsinin maraqlarını qətiyyətlə müdafiə etdi. Xarici KİV-lərə çoxsaylı müsahibələrində praqmatik siyasətçi, hadisələri, prosesləri dəqiq qiymətləndirən, öz mövqeyini təkzibolunmaz arqumentlərlə əsaslandırmağı bacaran Lider olduğunu nümayiş etdirdi.

Bir sözlə, Prezident İlham Əliyev ata vəsiyyətini şərəflə yerinə yetirdi, xalqına, məcburi köçkünlərə verdiyi sözə sahib çıxdı, güclü Azərbaycan yaradaraq düşməni onunla hesablaşmağa vadar etdi. Azərbaycanın ərazi bütövlüyünü bərpa edən müdrik lider, böyük strateq, qalib sərkərdə kimi adını əbədi olaraq tarixə yazdırdı, 44 günlük Vətən müharibəsinin əsl qəhrəmanına çevrildi. Bəli, bir ölkənin Prezidenti, bir xalqın lideri olmaq böyük şərəfdir. Lakin xalqın sevimlisi olmaq, onun hörmət və ehtiramını qazanmaq daha böyük şərəf, daha böyük bəxtəvərlikdir.

Ali Baş Komandan İlham Əliyev, özünün qeyd etdiyi kimi, xoşbəxt insandır. Xoşbəxtdir ki, həm Prezident, həm siyasi varis, həm də oğul kimi öz üzərinə düşən bütün vəzifələri layiqincə yerinə yetirdi. Azərbaycanın yeni, şanlı tarixinin müəllifi, xalqımızın bitib tükənmək bilməyən sevinc, qürur və bəxtiyarlığının ilham mənbəyi oldu. Bu elə bir zirvədir ki, ondan yüksəyini təsəvvür etmək mümkün deyil! Və bu gün Müzəffər Ali Baş Komandan İlham Əliyevin xalqının lideri kimi əsas missiyası dövlətin və xalqın gücü ilə düşmənin viran qoyduğu işğaldan azad edilən şəhər və kəndlərimizin yenidən qurulması, öz yurd-yuvalarından didərgin düşən soydaşlarımızın evlərinə qaytarılmasıdır. Bu Qayıdış başlanıb. Bu sözü imzası qədər dəyərli və keçərli olan Azərbaycan Prezidenti İlham Əliyevin Ata vəsiyyətinə, xalqı qarşısında verdiyi sözə əməlləri ilə həyata keçirməsinin reallığıdır. Artıq bu gün yerindən, yurdundan qaçqın düşənlər

qaçqın deyillər, qalib ölkənin qalib vətəndaşlarıdır və sabaha inamla baxırlar. Çünki bizim 30 ildən sonra işğal olunan torpaqlarımızı öz Sərkərdəliyi və Qətiyyəti ilə azad edən, Ali Baş Komandanımız, Prezident dövlətimizi qalib dövlət kimi dünyaya təqdim edən bir Lideri var.

Bu yerdə rusiyalı hərbi ekspert, "Milli müdafiə" jurnalının baş redaktoru İqor Korotçenkonun Azərbaycan Prezidenti İlham Əliyevin dünya miqyasında siyasət adamı olduğunu vurğulayıb: "Rusiyalı izləyicilər, siyasi ekspertlər İlham Əliyevin çıxışını erməni rəqibi Nikol Paşinyanla müqayisə edərkən gördülər ki, Azərbaycan Prezidenti erməni həmkarından bir baş yox, deyərdim iki baş yuxarıda idi. Bu rəy İlham Əliyevin dünya miqyasında siyasətçi olmasından ibarətdir. Bunu qəbul etmək lazımdır".

Bəli, 44 günlük Vətən müharibəsi bir daha Prezident İlham Əliyev cənablarının dünya miqyasında LİDER siyasətçi olduğunu bir daha göstərdi. Dövlət başçımızın dediyi kimi: "İndi bütün ölkələr bu Vətən müharibəsinin təcrübəsini öyrənirlər. Vəsaitimiz də var. Xalq-iqtidar birliyimiz də var. Biz göstərmişik ki, böyük xalqıq, qürurlu xalqıq. Düşməni yerə vurduq. Düşmənin belini qırdıq, məhv etdik. Bu, tarixi Qələbədir. Bu Qələbə Azərbaycan tarixində əbədi qalacaq, şanlı Qələbə kimi!".

Bir sözlə, Azərbaycan qalib ölkədir və bundan sonra diktə edən tərəf də hər zaman Azərbaycan olacaq! Hər kəs həqiqəti bilməli və görməlidir. Və bu gün bir daha böyük qürur və fəxarətlə deyirəm: Cənab İlham Əliyev xalqımızın alternativsiz lideri, yeganə inam ünvanıdır, xilaskardır, qəhrəmandır. Prezident İlham Əliyevin adı xalqımız, dövlətimiz var olduqca, əsrlər boyu tarixdə ən böyük Xilaskar, Qəhrəman kimi anılacaqdır!

## Azərbaycan Liderinin cəsarətli və qətiyyətli tələbi

Bu gün Prezident İlham Əliyevin məqsədyönlü siyasi xəttinin uğurlu nəticəsi olaraq Azərbaycan lider bir ölkə kimi çıxış edir. Ölkəmiz dünyada bir çox transmilli layihələrin təşəbbüskarı və uğurlu icraçısı, etibarlı tərəfdaş kimi tanınır. Azərbaycanın 2012-ci ildə dünyanın ən mötəbər beynəlxalq təşkilatının – Birləşmiş Millətlər Təşkilatının Təhlükəsizlik Şurasının qeyri-daimi üzvü seçilməsi, 2019-cu ildə isə dünyanın ikinci ən çoxsaylı beynəlxalq təşkilat olan Qoşulmama Hərəkatına rəhbərlik etməsi gənc dövlətin beynəlxalq iştirakçılıq sahəsində yüksək fəallığının təkzibedilməz sübutudur. Dünya birliyi əyani şəkildə gördü ki, əvvəlki illərdən fərqli olaraq, Azərbaycanın sədrliyi ilə Qoşulmama Hərəkatının fəaliyyətində dinamiklik bərpa edildi, koronavirus kimi qlobal çağırışa qarşı mübarizədə bir çoxlarına örnək ola biləcək qətiyyətli mövqe ortaya qoyuldu. Prezident İlham Əliyev vurğuladı ki, Azərbaycan öz sədrliyi dövründə beynəlxalq hüququ və ədaləti müdafiə edəcək.

Bir sözlə, ötən müddət ərzində regionda aparıcı aktora çevrilən Azərbaycanın son illər dünyada artan nüfuzu onun beynəlxalq təşkilatlarla əlaqələrində və onların fəaliyyətində fəal iştirakına gətirib çıxarıb. Artıq dünya dövlətləri Azərbaycanı etibarlı, mühüm tərəfdaş, sözü imzası qədər dəyərli olan ölkə kimi qəbul edirlər. Təsadüfi deyil ki, BMT, Avropa İttifaqı, NATO, İslam Əməkdaşlıq Təşkilatı və digər nüfuzlu təşkilatlar Azərbaycanla əməkdaşlığı strateji prioritet kimi müəyyənləşdiriblər. Bu gün Azərbaycan bir sıra beynəlxalq qurumlarda, sadəcə, üzv dövlət kimi təmsil olunmur, eyni zamanda, bir çox qərarların qəbulunda və icrasında yaxından iştirak edir. Eyni zamanda, dünyanın 120 ölkəsi arasında səmərəli əməkdaşlıq əlaqələrinin qurulmasında və inkişafında mühüm siyasi platforma olan Qoşulmama Hərəkatı isə məhz Azərbaycanın sədrliyi dövründə özünün ən uğurlu dövrünü yaşayır. Belə ki, iyulun 5-də Bakı Konqres Mərkəzində Qoşulmama Hərəkatının Əlaqələndirmə Bürosunun "Qoşulmama Hərəkatı: meydana çıxan çağırışlarla mübarizədə birgə və qətiyyətli" mövzusunda nazirlər görüşü Azərbaycanın hərəkatdakı önəmini bir daha sərgiləmiş oldu.

Qoşulmama Hərəkatının nazirlərinin görüşündə Prezident İlham Əliyev çıxışında bir daha müasir dünyada hələ də ikili standartların,

ədalətsizliyin hökm sürməsi barədə həqiqətləri dünya ictimaiyyətinin nəzərinə çatdırdı. Bu gün millətlərin azadlığının, dövlətlərin suverenliyinin, ərazi bütövlüyünün qorunmasının təminatçısı olduğu BMT əslində bir neçə dövlətin maraqlarını müdafiə edən yararsız bir quruma çevrilmişdir. Dövlətimizin başçısı onu da bildirdi ki, bu gün Fransa və bir sıra ölkələr öz gözlərində tiri görmədikləri halda başqalarının gözündə tük axtarmaqla məşğuldurlar. İnsan haqlarından, demokratik dəyərlərdən ağızdolusu danışanlar, ilk növbədə, insanların azadlıq hüququna, millətlərin suverenliyinə dəstək olmalıdırlar. Bu gün elə regionumuzda baş verən hadisələrə Fransanın münasibəti göstərir ki, bu ölkənin rəhbərliyi, əslində, bəşəri dəyərlərə qiymət verməyənlərdir. Cənab Prezident bunu öz çıxışında tutarlı faktlara əsaslanaraq qeyd etdi ki, “özünü yalandan insan haqlarının və beynəlxalq hüququn müdafiəçisi kimi qələmə verən" Fransa hələ də digər ölkələrin daxili işlərinə qarışır.

Fransa qoşunlarının bu yaxınlarda Mali və Burkina-Fasodan çıxarılması onun Afrikadakı amansız neokolonializm siyasətinin uğursuzluğa məhkum olduğunu bir daha göstərdi: "Fransanın soyqırımlarla dolu hakimiyyəti dövründə 1,5 milyona yaxın əlcəzairli qətlə yetirilib. Hələ də Paris muzeyində əlcəzairli azadlıq döyüşçülərinin kəllə sümükləri müharibə qənimətləri kimi saxlanılır. Bu, utancverici və iyrənc hərəkətdir. Biz Fransa prezidenti Emmanuel Makrondan həmin qəhrəmanların qalıqlarını Əlcəzairə təhvil verməsini tələb edirik".

Prezident İlham Əliyev çıxışı zamanı Fransa hakimiyyətinə bir çox ölkələrdən üzr istəməsini tövsiyyə edib: “Fransa öz müstəmləkə keçmişinə, qanlı müstəmləkə cinayətlərinə və soyqırımı aktlarına görə Qoşulmama Hərəkatına üzv olan Afrika, Cənub-Şərqi Asiya ölkələrindən və digər ölkələrdən üzr istəməlidir. Fransa XX əsrin ikinci yarısı boyunca Əlcəzairdə və özünün dənizaşırı ərazilərində – Sakit okeanda, Fransa Polineziyasında bir neçə nüvə silahı sınağı keçirmiş və bununla da qlobal səviyyədə ətraf mühitin deqradasiyasına, yerli icmalarda ciddi sağlamlıq problemlərinə səbəb olmuşdur. Niderland kralı ölkəsinin müstəmləkə keçmişinə və qul ticarəti ilə məşğul olduğuna görə rəsmən üzr istəyib. Biz onun fransız həmkarını da həmin hərəkəti etməyə çağırırıq. Heç vaxt olmamaqdansa gec olması yaxşıdır. Əcdadları müstəmləkə siyasətinə məruz qalmış, qul kimi istifadə olunmuş, öldürülmüş, işgəncələr verilmiş

və alçaldılmış insanlardan milyonlarla insanın qarşısında üzr istənilməsi yalnız Fransanın tarixi günahının etirafı olmayacaq, həm də Fransanın əlcəzairli yeniyetmənin vəhşicəsinə öldürülməsindən sonra qarşılaşdığı dərin siyasi, sosial və humanitar böhranın nəticələrinin aradan qaldırılmasına kömək edəcək”.

Dövlət başçımız bildirib: “Əlcəzair əsilli 17 yaşlı yeniyetmənin Fransa polisi tərəfindən qətlə yetirilməsi bu ölkədə irqçiliyin və islamofobiyanın daha bir əlamətidir. Fransada, xüsusilə də mediada və internetdə müəyyən etnik azlıqlara qarşı davamlı və geniş şəkildə yayılmış irqçi, ayrı-seçkilik salan fikirlər, rəsmi şəxslər və parlamentin iki palatasının üzvləri tərəfindən irqi nifrət xarakterli çıxışlar getdikcə artmaqdadır. Bu baxımdan biz BMT-nin polisin atəş açmasını pisləyən və Fransanı “hüquq-mühafizə orqanlarında irqçilik və ayrı-seçkiliyin dərin problemlərini ciddi şəkildə həll etməyə” çağıran bəyanatını dəstəkləyirik”.

Fransanın Korsika dilinə qadağa qoyduğunu, etnik azlıqlar konsepsiyasını qəbul etmədiyini vurğulayan Azərbaycan Prezidenti bildirib: “Lakin, eyni zamanda, özünü Azərbaycandakı erməni milli azlığının müdafiəçisi kimi göstərməyə çalışır. Fransa erməni separatizmini dəstəkləyir. Fransa Azərbaycanın Qarabağ bölgəsində erməni separatizmini dəstəkləyərək, geosiyasi rəqabət, xarici hərbi mövcudluq və “Orientalizm” müstəmləkəçilik siyasəti ilə Cənubi Qafqaz regionunda da mənfur təcrübəni tətbiq etməyə çalışır. Fransa hakimiyyəti başqalarına mühazirə oxumağa cəhd etmək əvəzinə, öz ölkəsində narahatedici meyillərlə mübarizə aparmalıdır”.

Çıxışı zamanı 2020-ci ildə Azərbaycanın Ermənistanı döyüş meydanında məğlub edərək Ermənistanın 30 illik işğalına son qoyduğunu qeyd edən dövlətimizin başçısı deyib: "İşğalçı ölkə kimi Ermənistan kapitulyasiya aktını imzalamağa məcbur oldu. Bununla da Azərbaycan öz ərazi bütövlüyünü və tarixi ədaləti bərpa etdi, BMT Təhlükəsizlik Şurasının 1993-cü ildə qəbul etdiyi dörd qətnaməsinin icrasını özü təmin etdi. Azərbaycanın bu Qələbəsi beynəlxalq hüququn və ədalətin zəfəridir. Otuz il əvvəl Ermənistan Azərbaycanın beynəlxalq səviyyədə tanınan ərazilərinin təxminən 20 faizini işğal etdi, həm Ermənistanda, həm də Azərbaycanın işğal olunmuş ərazilərində etnik təmizləmə həyata keçirdi. Bunun nəticəsində bir milyondan çox azərbaycanlı qaçqın və məcburi

köçkünə çevrildi. Ermənistan 1992-ci ildə Xocalı şəhərində 613 azərbaycanlını, o cümlədən 106 qadını və 63 uşağı yalnız etnik mənsubiyyətinə görə vəhşicəsinə qətlə yetirdi. Ərazilərimiz işğaldan azad edildikdən sonra Azərbaycan indi bir sıra nəhəng çağırışlarla üz-üzədir. Keçmişdə işğal altında olmuş ərazilərdəki dağıntıların miqyasından dəhşətə gəldik. Azərbaycanın şəhər və kəndləri Ermənistan tərəfindən qəsdən dağıdılmış, talan olunmuş, bütün mədəni və dini abidələr, məscidlər təhqir olunmuş, qarət edilmişdir. Ermənistan işğal etdiyi ərazilərdə urbisid, kultursid və ekosid törətmişdir. İşğal altında olmuş ərazilərdəki 67 məsciddən 65-i dağıdılıb, qalanlarından isə donuz və inəklər üçün tövlə kimi istifadə edilib ki, bu da bütün dünya müsəlmanlarına qarşı təhqirdir. Altmış min hektar meşəlik məhv edilmiş, kəsilmiş və daşınmışdır, torpaqlarımız və çaylarımız çirkləndirilmiş və zəhərləndirilmişdir".

Lakin təəssüflər olsun ki, beynəlxalq təşkilatlar Fransa dövlətinin törətdiyi bu cinayətlər barədə səslərini belə çıxarmadılar.

Bir sözlə, Prezident İlham Əliyev yeganə dövlət başçısıdır ki, Fransa dövlətinin və dövlət başçısı Makronun təcavüzkar, işğalçı siyasət aparmağını Qoşulmama Hərəkatının tribunasından qətiyyətlə bütün dünyaya çatdırdı. Sözü imzası qədər dəyərli, güclü və keçərli olan Azərbaycan Prezidenti bir daha bildirdi ki, kapitulyasiya aktını imzaladıqdan sonra da Ermənistan məhz Fransa kimi havadarlarına arxayın olaraq öhdəliklərini yerinə yetirməkdən, xüsusən Zəngəzur dəhlizini açmaq öhdəliyindən yayınmaq istəyir. Lakin zaman indi başqadır və regionda şərtləri qalib ölkənin qalib lideri diqtə edir. Çünki Azərbaycan bu gün bir dövlət olaraq dünya birliyində öz layiqli yerini tutmuş və sözünü demişdir. Məhz Qalib Lider Prezident İlham Əliyev cənablarının son 20 ildə apardığı məqsədyönlü siyasət ölkəmizə bu imkanı qazandırmışdır. Çünki biz kimsənin torpaqlarına iddia etmirik, lakin öz azadlığımızı və suverenliyimizi təhdid edən hər bir kəsə də layiqli cavab verməyə hazırıq. Necə ki, cənab Prezident Fransa və digər erməni havadarlarının cavabını verdiyi kimi: "Fransa müstəmləkəçi keçmişinə və soyqırım aktlarına görə üzr istəməlidir".

## İnformasiya savaşının sərkərdəsi – Prezident İlham Əliyev

İnformasiya sərhəd tanımır, onun nə cəbhə xətti, nə də minalanmış əraziləri var. Tarixdən də məlumdur ki, informasiya müharibəsi düşmən mövqedə olan dövlətlərin hər zaman biri-birlərinə qarşı atdığı kəskin, təhlükəli addımlarından biri olub. Bəllidir ki, hər bir ölkə digər ölkələrlə bağlantılar yaratmağa can atır. Təbii ki, bu yolla, ilk növbədə, özünü beynəlxalq sistemdə tanıtmağa çalışır. Bu bir faktdır ki, əgər düşməni olan ölkəyə qarşı informasiya atəşi açılarsa, bu, onun beynəlxalq siyasi aləmdə nüfuzunun təhlükəyə girməsinə səbəb ola bilər. Belə ki, 44 günlük Vətən müharibəsinin başa çatmasından iki il yarım keçməsinə baxmayaraq bu gün Ermənistanla ölkəmiz arasında informasiya müharibəsi ən gərgin müstəvidə hələ də davam etməkdədir. Xatırladaq ki, 44 günlük müharibə nəinki döyüş meydanında, həm də informasiya məkanında aparıldı. Dövlət başçısı döyüşlərə komandanlıq etməklə bərabər, eyni zamanda, dünyanın ən nüfuzlu telekanallarına, mətbuat orqanlarına 35-dan çox müsahibə verdi. Bununla ermənilərin həm də informasiya manipulyasiyasına ciddi zərbə vuruldu. Qeyd edək ki, 44 günlük müharibədə məğlub olan Ermənistanın hərbi-siyasi rəhbərliyi çıxış yolunu öz xalqını yalan məlumatlarla aldatmaqda görür. 44 gün ərzində erməni və dünya ictimaiyyətinə feyk məlumatlar verən terrorçu ölkə informasiya savaşında da Azərbaycana məğlub oldu.

Əslində Paşinyan iqtidarı ilk gündən anlayırdı ki, onu ağır və rüsvayçı məğlubiyyət gözləyir. Odur ki, Azərbaycana qarşı başladığı savaşın və Bakının əks-hücum əməliyyatının ilk günlərindən sosial şəbəkələrin fəaliyyətini qadağan elədi, müharibənin gedişi ilə bağlı düzgün məlumat yayan yerli və xarici media nümayəndələrinə qarşı, sözün əsl mənasında, repressiya və təhdidlərə başladı. Azərbaycanın apardığı düzgün və ağıllı informasiya siyasəti Qarabağda baş verən həqiqətlərin dünyaya çatdırılmasına imkan verdi. Azərbaycan Prezidenti İlham Əliyev 44 gün ərzində dünyanın bütün aparıcı mediasına çoxsaylı müsahibələr verdi. Düşmən tərəfindən maliyyələşdirilən, erməni lobbisinin əlində oyuncağa çevrilən jurnalistlərin ən qərəzli suallarına belə cavab verməkdən yayınmayan

Prezident Əliyev nə dərəcədə hazırlıqlı olduğunu nümayiş etdirməklə yanaşı, Azərbaycanın haqlı olduğunu, işğala məruz qaldığını, beynəlxalq hüququn Azərbaycanın tərəfində olduğunu sübut edə bildi.

Azərbaycanın Ali Baş Komandanının intellektual cavabları ilə müqayisədə isə Paşinyan olduqca miskin durumda görünürdü. Bunu dünyanın aparıcı media nümayəndələri və ekspertlər də etiraf edirlər. Nüfuzlu siyasi rəhbərimiz Prezident İlham Əliyev cənablarına beynəlxlaq marağın yüksək olması, məhz ilk növbədə, Azərbaycan Prezidentinin nüfuzlu lider olmasından irəli gəlir. Xüsusi ilə vurğulamaq istərdim ki, son 20 il ərzində bütün sahələrdə qələbə qazanan Azərbaycan Prezidenti 44 günlük savaş zamanı dünyanın 30-a yaxın mediasına çoxsaylı müsahibələr verdi, bir çox beynəlxalq tədbirlərdə etdiyi çıxış və bəyanatları ilə Qərbin ictimai rəyində Azərbaycanın xeyrinə dönüş yarada bildi. Hətta qərəzli suallar qarşısında, sözün əsl mənasında, siyasi liderlik dərsi keçən Prezident Əliyev özünün hazırlıqlı siyasətçi olduğunu sübuta yetirməklə yanaşı, Azərbaycanın haqlı mövqeyini konkret faktlarla ortaya qoydu, bütün dünyaya çatdırdı.

***Ali Baş Komandanımızın sərrast fikirləri və mükəmməl diplomatiyası...***

Müharibədən sonra 50-dən çox yerli və xarici media nümayəndələrinin iştirak etdiyi və 4 saatdan çox davam edən mətbuat konfransında isə Prezident İlham Əliyev jurnalistlərin suallarına dörd dildə – Azərbaycan, türk, ingilis və rus dillərində cavablandırdı. Bu, Ali Baş Komandanımızın sərrast fikirləri və mükəmməl diplomatiyası idi. Ümumilikdə, Prezident İlham Əliyev müharibə dövründə xarici mediaya verdiyi müsahibələrlə yalnız döyüş meydanında deyil, informasiya müharibəsində də xarici mediada hücum diplomatiyası sərgiləyərək tarixi həqiqətlər, Dağlıq Qarabağ münaqişəsinə dair vacib hüquqi və siyasi məqamlar barədə beynəlxalq ictimaiyyəti məlumatlandırıb. Onun gərgin əməyi və uğurlu informasiya siyasəti sayəsində dünya miqyasında ictimai rəyin Azərbaycanın lehinə dəyişməsi təmin edilib. Dövlət başçısının dünyanın nüfuzlu nəşrlərinə verdiyi müsahibələrdə təkcə erməni yalanları ifşa edilməyib, anti-Azərbaycan dairələrin qarayaxma kampaniyaları da iflasa uğradılıb.

Elə iyulun 21-də Prezident İlham Əliyevin tapşırığına əsasən “Heydər

Əliyev İli" çərçivəsində və Azərbaycan Milli Mətbuatının 148-ci ildönümü ilə bağlı keçirilən Şuşa Qlobal Media Forumu öz işini başa çatdırsa da, müzakirə edilən məsələlər, ən əsası Azərbaycan Prezidentinin üç saata yaxın yerli və xarici media nümayəndələrinin suallarını cavablandırarkən Azərbaycanın, regionun gələcəyi, həmçinin dəyişən dünyada baş verən hadisələrlə bağlı söylədiyi fikirləri güclü və xarizmatik dövlət başçısı və qətiyyətli lider olduğunun bir daha göstərdi.

Prezidentin çıxışının mahiyyətində daha çox gələcəklə bağlı hədəflər öz əksini tapdı. Dövlətimizin başçısı Azərbaycanın gələcəyi ilə bağlı fikirlərini belə ifadə etdi ki, prinsip etibarilə strateji inkişaf istiqamətləri bir çox illər bundan əvvəl müəyyən edilib. Yeganə məqam odur ki, həyat öz dəyişikliklərini əlavə edir və dəyişən reallıqları planlarımıza inteqrasiya etməli oluruq. Onu da vurğulamaq istərdim ki, Prezident İlham Əliyevin söylədiyi hər bir fikir, gündəmə gətirdiyi hər bir məsələ, irəli sürdüyü təklif gələcək üçün bir ideya, istiqamətdir. Bütün dövrlər üçün informasiya mübarizəsinin vacibliyini nəzərə alsaq belə tədbirlərin, daha dəqiq desək, beynəlxalq miqyas alan forumların keçirilməsi mütləqdir. Azərbaycan Prezidenti İlham Əliyev cənabları da bu forumun müntəzəm olaraq keçirilməsini və buna birinci Şuşa Qlobal Media Forumu adının verilməsini təklif etməsi də bu məqsədə xidmət edir.

Prezident İlham Əliyev Forumda xarici media nümayəndələrinin Azərbaycanın Qarabağ iqtisadi rayonu ilə bağlı suallarına cavabında artıq hər kəsin Qarabağın Azərbaycan torpağı olduğunu qəbul etdiyini vurğuladı və bildirdi ki, Ermənistan ölkəmizə qarşı hər hansı ərazi iddialarından imtina etsə, sülh sazişinin ilin sonunadək imzalanması mümkündür. Çünki sülhün olmaması bölgə üçün heç də yaxşı ssenari deyil. Çünki sülh müqaviləsi imzalanmayacağı tədbirdə regionda sabitliyi, təhlükəsizliyi təmin etmək olmayacaq. Ali Baş Komandan Şuşadan dünyaya bəyan etdi: "İndi mən yenə də deyirəm, gəlin bu reallıqları qəbul edin, bu reallıqların dəyişməsi baş verərsə, bu yalnız və yalnız nə Ermənistan, nə də Qarabağın erməni azlığı üçün yaxşı olmayacaq".

Azərbaycan Prezidenti İlham Əliyev nüfuzlu "Euronews" telekanalına müsahibəsində regionda baş verən proseslər, münasibətlərin normallaşdırılması, sülh üçün irəli sürülən təşəbbüslər haqqında fikirlərini ətraflı şəkildə ifadə etdi. Belə ki, 44 günlük Vətən müharibəsinin başa

çatmasından sonra Azərbaycan Cənubi Qafqaz regionunun sülh və əməkdaşlıq məkanına çevrilməsi üçün səylər göstərsə də, Ermənistan hələ də qeyri-konstruktiv mövqe nümayiş etdirir. Belə ki, işğalçı ölkə 2020-ci il noyabrın 10-da kapitulyasiya aktına imza atıb, amma hələ də üçtərəfli Bəyanatın müddəalarını tam yerinə yetirmir, bu ölkə hələ də Qarabağ ərazisindən qanunsuz silahlı dəstələrini çıxarmayıb, eləcə də Azərbaycanın əsas hissəsi ilə Naxçıvan Muxtar Respublikası arasında kommunikasiyaların açılması öhdəliyinə əməl etmir. Ancaq Azərbaycan sülh sazişinin prinsiplərinə əməl edir. Və hazırda Azərbaycanla Ermənistan arasında münasibətlərin normallaşdırılması prosesində Avropa İttifaqı, ABŞ və Rusiya vasitəçilik edir. Müsahibədə real prosesləri diqqətə çatdıran dövlətimizin başçısı bir daha vurğuladı ki, Qarabağda yaşayan erməni əhali manipulyasiyanın girovu olmağa son qoymalıdır. Çünki beynəlxalq hüquq separatizmi dəstəkləmir. Bu səbəbdən, Qarabağ erməniləri öz seçimlərini etməlidirlər. Ermənistanın sülh prosesini uzatması region üçün yaxşı heç nə vəd etmir. Ona görə də rəsmi İrəvan sülhə gəlməyin nə qədər zəruri olduğunu anlamalıdır.

Bir sözlə, əvvəlki müsahibələrində olduğu kimi, "Euronews"a müsahibəsində də dövlət hər kəsə öz ciddi mesajlarını göndərmiş oldu. Beləliklə, bütün bu təhlillər belə deməyə əsas verir ki, bütün bunlar düşünülmüş strategiyanın tərkib hissəsidir və Prezident Əliyev nəyi, nə vaxt, necə deməyi öncədən planlaşdırır. Qarabağ erməniləri Azərbaycan Prezidentinin verdiyi mesajdan nəticə çıxarmalıdır.

Beləliklə, bütün dünya şahiddir ki, döyüş meydanının qalibi olan Prezident, Müzəffər Ali Baş Komandan İlham Əliyev informasiya savaşında da qalibdir. Ən mühümü odur ki, Azərbaycan Prezidenti həm də erməni təbliğatına düşmənin maraqlarını müdafiə edən informasiya məkanlarında tutarlı zərbə vurdu, Ermənistanın, dünya erməniliyinin, həm də erməni lobbisinin Azərbaycana qarşı qərəzli informasiya mühiti yaratmaq xülyası iflasa uğradı. Ancaq mənfur düşmən unutmamalıdır ki, necə ki, Azərbaycan Prezidenti cənab İlham Əliyev illərlə işğal siyasətinə son qoymaq üçün qətiyyət, iradə və prinsipiallıq nümayiş etdirdisə, indi də atdığı düşünülmüş və sistematik addımları Qarabağı qısa zaman kəsiyində dirçəldəcək, ərazilərimiz minalardan təmizləniləcək və insanların öz el-obalarına geri dönəcəklər. Budur, Ali Baş Komandanımızın diplomatik

siyasətinin nəticəsi! Budur Güclü Ordumuzun gücü, budur mübariz, igid əsgərlərimizin rəşadəti! Bu nailiyyət və qələbələr həm də Xalq-Ordu Birliyinin, orduya olan inamın Qələbəsidir! Çünki Ali Baş Komandanın apardığı diplomatik siyasəti düzgün siyasətdir, uğurlu siyasəti haqq işidir! Qarabağ Azərbaycandır! Qarabağ cənnət məkanıdır! Bir sözlə, dövlət başçımızın həm hərb meydanında, həm də informasiya savaşında bu nüfuzun qazanılması qalib ölkənin informasiya savaşının sərkərdəsi – Prezident İlham Əliyevin apardığı uğurlu xarici siyasətin nəticəsidir. Ən əsası isə informasiyalarda diqqətə çatdırılır ki, sülh, sabitlik və inkişaf tərəfdarı olan Azərbaycan mehriban qonşuluq münasibətləri üçün bütün səylərini israrla davam etdirir.

## “Dəmir yumruğ”un Zəfəri: 30 illik münaqişənin 44 günə həlli

Bu çoxlarının qeyri-mümkün hesab etdiyi xalqın 30 illik həsrətinə cəmi 44 gündə son qoyan Ali Baş Komandan, Qalib Sərkərdə, Prezident İlham Əliyevin "Dəmir Yumruq" siyasətinin Zəfəridir. Uzun illər dünya dövlətlərinin əksəriyyətinin himayə etdiyi işğalçı Ermənistan məhz Azərbaycan Prezidenti İlham Əliyev cənablarının hərbi-siyasi diplomatiyası qarşısında diz çökdü. Ulu Öndər Heydər Əliyevin layiqli varisi, Onun yarımçıq qalan arzularını gerçəkliyə çevirən Prezident İlham Əliyevin siyasi iradəsi, düşünülmüş və hərtərəfli təhlildən keçmiş siyasi strategiyası, Sərkərdəlik məharəti sayəsində Azərbaycanın bütün ərazisində suveren hüquqlarımız bərpa edildi, qalib dövlətə çevrildik, müzəffər xalq olduq, ölkəmiz bütün dünyaya yeni imicdə göründü, beynəlxalq aləm Azərbaycanı qüdrətli dövlət kimi yenidən kəşf etdi. Bu şanlı Zəfərlə Ali Baş Komandanımız, Prezident İlham Əliyev bir daha alternativsiz Lider olduğunu təsdiqlədi və hər zaman sülh tərəfdarı olduğunu dünyaya bəyan etdi.

**Qırx dörd günlük müharibənin hər bir günü qəhrəmanlıq dastanıdır**

"Dəmir yumruq" birliyi ilə haqq və ədaləti bərpa etmiş Azərbaycan xalqının birlik, güc rəmzi ilə böyük qələbə, zəfər tarixini yazdı Müzəffər Ali Baş Komandan. Azərbaycan bütün dünyaya göstərdi və sübut etdi ki, o özünün işğal altında olan torpaqlarını müstəqil şəkildə, öz gücü ilə, öz qüdrəti ilə azad etməyə qadirdir və bunu etdi! Noyabrın 10-da Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev, Rusiya Federasiyasının Prezidenti Vladimir Putinin və Ermənistanın baş naziri Nikol Paşinyanın qoşulduğu videokonfrans formatında keçirilən görüşdə birgə Bəyanat imzalandı. Bu bəyanatla işğal altında olan torpaqlarımız, o cümlədən Kəlbəcər, Ağdam və Laçının bir güllə belə atmadan qaytarılması, erməni silahlı qüvvələrinin torpaqlarımızdan çıxarılması, bütün məcburi köçkün və qaçqınlarımızın öz ata-baba yurdlarına, Dağlıq Qarabağa və onun ətraf ərazilərinə qayıtması və Naxçıvan Muxtar Respublikasına quru sahəsi ilə birbaşa yolun açılması böyük tarixi hadisədir. Bu "Dəmir yumruğ"un və

Azərbaycan Ordusunun gücü sayəsində baş verdi. 1 milyondan çox soydaşlarımızın torpaq, yurd həsrətinə son qoyuldu.

Bu gün Ermənistanın yeganə xilas yolu Azərbaycanın təklif etdiyi sülh müqaviləsini imzalamaq, əməkdaşlıq münasibətləri yaratmaqdır. Bu, həm də Ermənistanın imzasının olduğu üçtərəfli bəyanatların şərt və tələbləridir. İndi Ermənistanda bu bəyanatlardan irəli gələn şərtlərin yerinə yetirilməsi, xüsusən də Zəngəzur dəhlizinin açılması, Qarabağda qalan ermənilərin ya köçməsi, ya da Azərbaycan vətəndaşlığını qəbul etməsi qarşısıalınmaz prosesdir. Çünki Azərbaycan Prezident İlham Əliyevin irəli sürdüyü sülh modeli təkcə azərbaycan deyil, bütün region dövlətlərinin təhlükəsizliyi və inkişafı üçün açar rolunu oynayır. Və Avropa İttifaqı da Azərbaycanın müəyyənləşdirdiyi gündəliyi, reallıqları qəbul edir.

Ermənistanın baş naziri Paşinyan bunu bilməlidir ki, bütün müqavimət cəhdləri növbəti yeni zərbə ilə nəticələnəcəkdir. Ermənistan bunu nə qədər tez anlasa, bir o qədər yaxşı olar. Əgər Ermənistan bunu danışıqlar yolu ilə anlamasa, o zaman "Dəmir yumruq" yenidən işə düşə bilər. Əks halda, Ermənistanın mövcudluğu sual altında qalacaq.

## Məğlub tərəf qalibin şərtlərini qəbul etmək məcburiyyətindədir

Qalib lider Prezident İlham Əliyevin irəli sürdüyü şərtlər artıq qəbul edilir. Belə olan halda Ermənistan ağlını başına yığıb bilməlidir ki, Azərbaycan indiyə kimi nəyi diktə edibsə, o icra edilib, öhdəliklərdən qaçmaq mümkün deyil. Şərtlərə əməl etmək lazımdır və həmin şərtlərə əməl etməsə, bu, ona və Ermənistana gələcəkdə çox baha başa gələ bilər. Daha dəqiq desək, “Dəmir Yumruğ”un növbəti zərbəsi ilə qarşılaşacaqlar. Dövlət başçısı İlham Əliyevin söylədiyi kimi, 30 ilin əziyyəti, 30 ilin ümidsizliyi, 30 ilin əzabları xalqımızı sındırmadı, iradəmizə heç bir mənfi təsir göstərmədi. Əksinə, daha da bütövləşdik, daha da mətinləşdik, daha da gücləndik, özümüzü toparladıq və sonunda Zəfər bizim oldu. Bəli, üçtərəfli bəyanatın imzalanması ilə münaqişənin hərbi mərhələsi başa çatdı. Ağdam, Laçın, Kəlbəcər rayonları qan tökülmədən qaytarıldı, “status-kvo”, “Dağlıq Qarabağ” adlı ərazi vahidi ləğv edildi. Beləliklə, bu qələbənin nümayişi 10 dekabr 2020-ci ildə keçirilən Zəfər Paradında bir daha dünyaya göstərildi. Bu Paradla Qarabağ Azərbaycandır! nidasının təntənəsi, "Dağlıq Qarabağın" statusunun olmayacağının Azadlıq meydanında nümayişi, işğalçı Ermənistanın yeni erməni dövlətinin yaradılması planlarının üstündən birdəfəlik xətt çəkməsinin nümayişi idi. Çünki bu gün regionda Azərbaycanın maraqlarına cavab verən yeni siyasi reallıq yaranıb, ərazi bütövlüyümüz təmin olunub və heç bir statusdan söhbət gedə bilməz! Bu isə Azərbaycanın tam və qeyd-şərtsiz qələbəsinin əyani sübutudur. Bütün bu söylənilənlərdən belə bir qənaətə gəlmək mümkündür ki, “Nə qədər mən Prezidentəm, heç bir statusdan söhbət gedə bilməz!” deyən dövlətimizin başçısı, Ali Baş Komandan İlham Əliyev nəyi necə və nə zaman etməyi yaxşı bildiyini bir daha nümayiş etdirdi. Və "Ermənistanın hünəri varsa, tanısın "Dağlıq Qarabağ respublikası"nı. Ermənistan hakimiyyəti, tanıyın onu. Bu gün tanıyın, tanımırsınızsa, deməli qorxursunuz. Gedin, ağlınızı başınıza yığın!" – bu, Azərbaycan Prezidentinin sözü, tələbidir!

Həmişə olduğu kimi, Prezident İlham Əliyevin “Euronews” televiziyasında yayımlanan növbəti müsahibəsi həm informasiya yükü, həm də

yeni mesajlar baxımından zəngin olmaqla yanaşı, həm də istər Ermənistan rəhbərliyi, istərsə də Qərb dövlətlərinin nümayəndələri tərəfindən səsləndirilən qeyri-adekvat açıqlamalara tutarlı cavabdır. Azərbaycan Prezidenti müsahibəsində qonşularımızla formalaşan münasibətlərə də toxunaraq hələ ki, yek və ilk olaraq imzalanmış atəşkəs sazişinin, yəni, 2020-ci il 10 noyabr tarixli Bəyanatın vasitəçisi Rusiya Federasiyasının Cənubi Qafqazda sülhün təmin olunmasında rolundan danışıb, məhz Rusiya-Ukrayna müharibəsindən sonra Birləşmiş Ştatların və Avropa İttifaqının fəallaşdığını qeyd edib. İki ölkə arasında razılaşmanın əldə edilməsinə, sülh müqaviləsinin imzalanmasına mane olan amilləri göstərib. Ermənistanın hərbi-siyasi rəhbərliyinin manevrləri, xarici güc mərkəzlərinin prosesə neqativ təsirləri detallı şəkildə təsvir edilir. Həmçinin beynəlxalq təşkilatların Qarabağ münaqişəsinin kökündə dayanan "erməni separatizmi"nə ikili standartlarla yanaşmaları tənqid olunur. İkili yanaşmanı təsdiq edən sübutlar göstərilir.

Prezident İlham Əliyevin qeyd etdiyi kimi, Qarabağ erməniləri başa düşməlidirlər ki, təhlükəsizlik təminatları, hüquqlarının, o cümlədən təhsil, mədəniyyət, dini, bələdiyyə hüquqlarının təmin edilməsi ilə onlar Azərbaycan cəmiyyətinin bir hissəsi olaraq normal həyat yaşayacaqlar.

### ***Azərbaycan sülhə, sülh danışıqlarıına sadiqdir***

Göründüyü kimi, Cənab Prezidentin "Euronews" televiziyasına müsahibəsində Azərbaycanın maraqları ortaya qoyuldu və dünya ictimaiyyətinin diqqətinə çatdırıldı ki, Azərbaycan haqqında yalan informasiya yayılmasın. Laçın yolu ilə bağlı məsələlər bundan əvvəl Avropa İttifaqında müzakirə olunanda razılığa gəlindi ki, Qarabağa humanitar yardım Ağdam yolu ilə daşınsın. Bununla bağlı bütün infrastruktur, yol var, şərait yaradılıb. Azərbaycan da təsdiq edir ki, ermənilər Ağdam yolundan maneəsiz keçə bilərlər. Cənab Prezident gömrük postunu və buradan 2 mindən artıq erməninin keçdiyini də diqqətə çatdırdı. Beynəxalq Qırmızı Xaç Komitəsinin qaçaqmalçılıqla məşğul olması da dünya ictimaiyyətinin nəzərinə çatdırıldı. Komitə öz funksiyasının əvəzinə tamamən başqa işlərlə məşğul olur. Bir sözlə, Azərbaycan sülhə, sülh danışıqlarına sadiqdir və sülh danışıqları ilə bağlı mövqeyimiz aydındır, məntiqlidir, beynəlxalq hüquqa əsaslanır. Çünki Azərbaycan öhdəliklərinə sadiq ölkədir. 2020-ci il

10 noyabr tarixli üçtərəfli Bəyanatın imzalanmasından üç ilə yaxın bir vaxtın keçməsinə baxmayaraq sülh sazişinin imzalanmasının uzanması artıq beynəlxalq münasibətlər, o cümlədən qlobal informasiya təbliğatında Azərbaycanın ardıcıl və daha böyük işlər görməsini diktə edir. Azərbaycan Prezidenti İlham Əliyev onu da xatırlatdı ki, Ermənistan rəhbərliyi indiyədək digər öhdəliklərinin icrasından yayınmağa çalışsa da, sonda onları yerinə yetirməyə məcbur olub. Bu, həm də ona işarədir ki, Ermənistan bu öhdəliklərini də yerinə yetirməyə məcbur olacaq.

Bir sözlə, Ermənistan rəhbərliyi də bu mesajdan adekvat nəticə çıxararaq nəhayət bilməlidir ki, hansısa havadarına bel bağlamaq, danışıqlar masasında onların köməkliyi ilə "əlinin" güclənəcəyinə ümid etmək mənasız vaxt itkisidir. Əgər Ermənistan həqiqətən sülh istəyirsə, öhdəliklərinə tam şəkildə əməl etməli və ikitərəfli danışıqlar formatında Azərbaycanla razılığa gəlməlidir. Çünki bu gün diktəni edən Qalib ölkə Qalib Lideri Prezident İlham Əliyevdir və onun dediyi sözü imzası qədər keçərlidir. Beləliklə, Azərbaycan bölgədə davamlı sülh və sabitliyin yaranması üçün təkcə təşəbbüslə çıxış etmir, eyni zamanda, bu məsələdə öz əməli töhfəsini verir. Bu nailiyyətlər isə Prezident, Ali Baş Komandan İlham Əliyevin böyük sərkərdəlik məharəti, güclü iradəsi və qətiyyəti, nəhayət, diplomatik siyasətinin reallığıdır.

## “Dəmir yumruq” hər zaman yerində olacaq!

Müzəffər Ali Baş Komandan, Prezident İlham Əliyevin 20 sentyabr tarixində növbəti tarixi qələbəmizlə bağlı xalqa müraciəti dünyanın harasında yaşamağımızdan asılı olmayaraq bütün dünya azərbaycanlılarını qürurlandırdı. Bir daha bütün dünyaya sübut etdi ki, antiterror tədbirlərinin başlanması və bir gün ərzində uğurla başa çatması nəticəsində Azərbaycan öz suverenliyini bərpa etdi. şücaət, peşəkarlıq göstərdilər: “Dünən təxminən saat 13:00 radələrində antiterror tədbirlərinin başlanması və uğurla başa çatması nəticəsində Azərbaycan öz suverenliyini bərpa etmişdir”.

Qalib Liderimiz, Prezident İlham Əliyev müraciətində lokal antiterror tədbirlərinə başlanmasını şərtləndirən amillərə diqqəti yönəldərək bildirdi ki, bu tədbirlər nəticəsində hərbçilərimiz böyük qəhrəmanlıq, şücaət, peşəkarlıq göstərdilər: “Ağır relyef şəraitində, düşmən tərəfindən uzun illər böyük mühəndislik işləri nəticəsində istehkamların mövcudluğu şəraitində, düşmən mövqelərinin təpələrdə, əlverişli yerlərdə yerləşdirilməsinə baxmayaraq, bizim hərbçilərimiz qəhrəmanlıq, peşəkarlıq göstərmişlər və qısa müddət ərzində bütün istiqamətlər üzrə əhəmiyyətli dərəcədə hərbi uğurlar əldə etmişlər. Ermənistan dövlətinin Azərbaycan ərazisində qanunsuz yerləşdirilmiş və Ermənistan dövlətinin öhdəliyinə baxmayaraq, bu günə qədər çıxarılmamış ordunun böyük hissəsi tamamilə məhv edilmişdir. Hərbi texnika məhv edilmişdir və sıradan çıxarılmışdır”.

Dövlət başçımız xalqa müraciətində bir daha özlüyündə yaranan “Bu vəziyyətə gətirib çıxarmaq kimə xeyir gətirdi” sualına cavab olaraq bildirdi ki, İkinci Qarabağ müharibəsindən dərhal sonra biz haqlı narahatlığımızı ifadə edərək dəfələrlə Ermənistan rəhbərliyinə, onların xaricdəki havadarlarına və digər tərəflərə müraciət edərək deyirdik ki, Ermənistan silahlı qüvvələrinin Azərbaycan ərazisində qalması qanunsuzdur və buna son qoyulmalıdır: "Biz deyirdik ki, qanunsuz xunta rejimi öz əski parçasından artıq olmayan dırnaqarası bayraqlarını büküb cibinə qoyub bizim torpağımızdan çıxmalıdır. Bu, bizim suveren hüququmuzdur. Qarabağ Azərbaycan ərazisidir və bunu bütün dünya tanıyır, o cümlədən Ermənistan rəhbərliyi artıq bunu başa düşüb. Əgər vaxtilə "Qarabağ

Ermənistandır və nöqtə" deyirdisə, indi "Qarabağ Azərbaycandır" deyir və nəinki deyir, hətta bizim ərazimizin ölçülərini də dilə gətirməyi unutmur. Düzdür, bunu öz xoşu ilə etməyib, bunu "Dəmir yumruq" hesabına etməyə məcbur olub. Amma fakt göz qabağındadır. Ermənistan Qarabağı Azərbaycanın ayrılmaz hissəsi kimi tanıyandan sonra Qarabağda 30 il at oynadan kriminal rejimin hansı statusu ola bilər?! Hansı dövlət atributları ola bilər?! Hansı seçkilər ola bilər?!".

Prezident sözügedən müraciətdə onu da söylədi ki, İkinci Qarabağ müharibəsi başa çatanda, Ermənistan ağ bayraq qaldıranda, diz çökəndə, kapitulyasiya aktına imza atanda mən demişdim ki, status-kvo cəhənnəmə getdi. Ona görə bütün bu amillər bir daha onu göstərir ki, qanunsuz kriminal xunta rejimi azğınlaşıb, harınlaşıb və qudurub. Unudub ki, onlar Azərbaycan ərazisində yaşayırlar. Ona görə bizim bütün addımlarımız legitimdir, hüquqidir, ədalətlidir və bütün addımlara görə biz həm məsuliyyət daşıyırıq, həm qürur hissi keçiririk: "Hesab edirəm ki, dünən və bu gün baş vermiş hadisələr, eyni zamanda, Azərbaycanla Ermənistan arasında gedən sülh prosesinə də müsbət təsir göstərəcək".

Bəli, dövlət başçımızın müraciətində sölədiyi kimi: "O gün uzaqda deyil – Azərbaycan və Ermənistan öz aralarında olan məsələləri tənzimləyəcək, sülh müqaviləsi imzalayacaq və Cənubi Qafqaz ölkələri üçtərəfli formatda gələcək əməkdaşlıq haqqında işləməyə başlayacaqlar. Ancaq bununla bərabər, onu da bildirməliyəm ki, bizə xor baxanlar, torpağımıza göz dikənlər, uğurumuzu həzm edə bilməyənlər heç vaxt, heç vaxt unutmasınlar ki, "Dəmir yumruq" yerindədir və hər zaman yerində olacaq! Heç kim bizimlə diktat və ultimatum dilində danışa bilməz! Bunu heç kim unutmasın! Onu da unutmasın ki, Qarabağ Azərbaycandır!".

## 27 sentyabr – Qələbəyə aparan 44 günlük yolun başlanğıcıdır

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin 2 dekabr 2020-ci il tarixli Sərəncamı ilə hər il sentyabrın 27-sinin Azərbaycan Respublikasında Anım Günü kimi qeyd edilməsi qərara alınıb. Artıq, 3-cü ildir ki, xalqımız torpaqlarımızın bütövlüyü uğrunda canını fəda etmiş şəhidlərimizin xatirəsini uca tutaraq Anım Gününü qeyd edir. Vətən müharibəsində qəhrəmancasına döyüşmüş, Azərbaycan Bayrağını işğaldan azad edilən torpaqlarımızda dalğalandırmış, ölkəmizin ərazi bütövlüyü yolunda canlarını fəda etmiş əsgər və zabitlərimizə, bütün şəhidlərimizə dərin ehtiram əlaməti olaraq, Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyev 27 sentyabrı Anım Günü kimi bəyan etməklə, xalqımızı bu günün işığında bir daha birləşdirdi. Artıq 3-cü ildir ki, Anım Günü kədərdən, üzüntüdən daha çox qürur, mərdlik günü kimi qeyd edilir.

Cənab Prezident 27 sentyabr 2020-ci il tarixdə xalqa müraciətində bildirdi: "Bizim mövqeyimiz beynəlxalq hüquqa və ədalətə əsaslanır. Biz öz torpağımızda vuruşuruq. Bu gün Azərbaycan Ordusu Azərbaycan torpaqlarında düşmənə sarsıdıcı zərbələr endirir. Bu gün Azərbaycan Ordusu öz torpağında Azərbaycanın ərazi bütövlüyünü qoruyur, müdafiə edir. Erməni əsgərinin bizim torpağımızda nə işi var?! Ermənistan ordusunun bizim torpağımızda nə işi var?! Heç kəs üçün sirr deyil ki, "Dağlıq Qarabağ ordusu"nun tərkibində olan şəxsi heyətin 90 faizi Ermənistan vətəndaşlarından ibarətdir. Ermənistan işğalçı dövlətdir, bu işğala son qoyulmalıdır və son qoyulacaqdır. Biz haqq yolundayıq. Bizim işimiz haqq işidir. Biz zəfər çalacağıq! Qarabağ bizimdir, Qarabağ Azərbaycandır!".

27 sentyabrdan qələbəyə gedən yol cəmi 44 gün davam etdi. 44 gün davam edən İkinci Qarabağ müharibəsində siyasi, hərbi, diplomatik uğurları ilə beynəlxalq ictimaiyyəti heyrətləndirən Azərbaycan mənfur düşmənə layiq olduğu yeri göstərdi. Bir daha sübut olundu ki, başqasının torpaqlarına göz dikən, saxta tarix yazaraq əsassız təbliğatları ilə özünü haqlı tərəf kimi göstərməyə çalışan təcavüzkar dövlətin aqibəti "Dəmir yumruğ"un başlarına dəyərək əzilməsi, diz çökərək kapitulyasiya olmasıdır.

Azərbaycan 30 il dünyanın ikili standartlara əsaslanan siyasəti ilə üz-üzə qalsa da heç zaman haqlı mübarizəsindən geri dönmədi. Ali Baş Komandanımız ən yüksək tribunalardan erməni yalanlarını ifşa etdi, dünyaya sözün əsl mənasında tarix, hüquq və milli qürur dərsi keçdi. Təəssüflər olsun ki, əksər dünya gücləri, nüfuzlu beynəlxalq təşkilatlar bu realllıqları dərk etmək istəmədilər. Ermənistan bu dəstəyə o qədər arxalandı ki, yeni ərazilər uğrunda müharibə planları hazırladı və 2020-ci ildə mütəmadi olaraq hərbi təxribatlar törətməklə bu planını açıq-aşkar büruzə verdi. İkinci Qarabağ müharibəsi başlanmazdan əvvəl, sentyabrın 24-də BMT Baş Assambleyasının 75-ci sessiyasının ümumi debatlarında videoformatda çıxışı zamanı Azərbaycan Prezidenti İlham Əliyev bu tribunadan dünyaya Ermənistanın müharibə planı hazırladığını çatdırdı. Dünya gücləri bunu eşitsə də susmağa üstünlük verdilər.

27 sentyabr 2020-ci ildə Ermənistan silahlı qüvvələrinin müxtəlif istiqamətlərdən Azərbaycan ərazilərini raket atəşinə tutmaları İkinci Qarabağ müharibəsinin baş verməsinə səbəb oldu. İgid oğullarımız Ali Baş Komandanın "Dəmir yumruq" siyasəti ilə canları, qanları ilə Zəfər tarixini yazdılar. Bir daha sübut etdilər ki, torpağımızı 30 il bu murdar işğalçılardan xilas etmək haqqımızın, ərazi bütövlüyümüzün bərqərar olması üçün Zəfər yolunda şəhid olaraq, yenilməz, məğrur xalq olduqlarını dünyaya nümayiş etdirdilər. Qazanılan Zəfər təkcə silahın gücü deyil, Prezidentin maraqlarımıza söykənən müstəqil siyasətinin, beynəlxalq arenada yüksək nüfuzunun məntiqi nəticəsi idi. Bir daha Ali Baş Komandan, Prezident İlham Əliyevin 27 sentyabr Anım Günündə xalqa etdiyi müraciət bizi hər an Qalib xalq olaraq duyğulandırır, qürurlandırır! Bu müraciəti dinlədikcə Ali Baş Komandanımızla, şəhidlərimizlə, qazilərimizlə, Ordumuzla, bütövlükdə xalqımızla qürur duyuruq. Dövlət başçısı, Müzəffər Ali Baş Komandan İlham Əliyev müraciətində, ilk növbədə, şəhidlərimizi – canı, qanı bahasına bu qələbənin qazanılmasında iştirak etmiş əsgər və zabitlərimizi hörmət və ehtiramla andı. Əsgər və zabitlərimizin qəhrəmanlığını, igidliklərini yüksək dəyərləndirdi.

Prezident İlham Əliyev geniş və əhatəli müraciətində olduqca mühüm məqamlara toxundu, önəmli mesajlar verdi: "Dağlıq Qarabağ münaqişəsi tarixdə qaldı. Azərbaycanda “Dağlıq Qarabağ” adlı inzibati ərazi mövcud deyil və əgər kimsə "Dağlıq Qarabağ" adlı ölünü diriltmək istəyirsə,

onu öz ərazisində diriltsin, öz ərazisində "Dağlıq Qarabağ" adlı qurum yaratsın, respublika yaratsın, cəmiyyət yaratsın", "44 gün ərzində biz təkcə öz ərazi bütövlüyümüzü bərpa etmədik, təkcə düşməni torpağımızdan qovmadıq, təkcə milli ləyaqətimizi bərpa etmədik, biz erməni faşizminin başını əzdik", "44 gündən sonra – artıq Ermənistan ordusunun beli qırılandan, biz alınmaz qala sayılan Şuşanı və ardınca 70-dən çox kəndi işğalçılardan azad edəndən sonra düşmən məcbur qalıb təslim olub. Bu dərs əbədi dərsdir, bunu heç kim yaddan çıxarmasın!", "Mən demişdim, onların qanı yerdə qalmayacaq və qalmadı. Biz onların qanını aldıq! Mən demişdim ki, biz onların qisasını döyüş meydanında alacağıq, belə də oldu. Bu Qələbəni bizə bəxş edən qəhrəman əsgər və zabitlərimiz bizim qürur mənbəyimizdir. Onların qəhrəmanlığı, onların şücaəti, fədakarlığı artıq dastana çevrilib", "Bu gün Anım Günündə şəhidlərimizin əziz xatirəsi önündə bir daha deyirəm, əgər biz görsək ki, erməni faşizmi baş qaldırır, əgər biz görsək ki, xalqımıza, dövlətimizə yeni təhlükə mənbəyi yaranır, heç tərəddüd etmədən erməni faşizminin başını bir daha əzəcəyik. Bunu hər kəs bilsin! Müharibənin və Qələbənin rəmzi olan "Dəmir yumruq" yerindədir, bunu heç kim unutmasın!".

Beləliklə, Ali Baş Komandanın Anım Günü ilə bağlı etdiyi müraciətdə səsləndirdiyi cəsarətli fikirlər həm də dünya güclərinə bir çağırış oldu. Ölkə başçısı “Biz hər bir dövlətin ərazi bütövlüyünə, daxili siyasətinə hörmətlə yanaşırıq, daxili işlərinə qarışmırıq, siz də bizim kimi davranın” mesajını vermiş oldu. Və bundan sonra biz qalib ölkə, qalib xalq olaraq daim Müzəffər Ali Baş Komandanın ətrafında “Dəmir yumruq” kimi birləşəcək, çiçəklənən ölkəmizi birlikdə qoruyacağıq. Dövlət başçımızın söylədiyi kimi: "Bunu hər kəs bilsin! Müharibənin və Qələbənin rəmzi olan "Dəmir yumruq" yerindədir, bunu heç kim unutmasın!".

## Azərbaycan-Türkiyə sarsılmaz qardaşlıq birliyi

Azərbaycan Prezidenti İlham Əliyev Avropa İttifaqı, Fransa və Almaniya liderlərinin iştirakı ilə oktyabrın 5-də Ermənistanın baş naziri Nikol Paşinyanla görüşün keçirilməli olduğu İspaniyanın Qranada şəhərinə getməkdən imtina edib. Səbəb isə Fransanın destruktiv mövqeyi, eləcə də Paris və Berlinin Türkiyənin toplantısında iştirakla bağlı fikir ayrılığı olub. Belə bir şəraitdə Prezident İlham Əliyev: "Türkiyə yoxdursa..".

Bəli, bu Türkiyə və Azərbaycan liderlərinin qardaşlığı, həmrəyliyi, dar gündə, xoş gündə bir yerdə olması sarsılmaz birliyinin əyani təzahürüdür. Çünki Azərbaycan və Türkiyə münasibətləri maraqlara deyil, dəyərlərə əsaslanır. Bu sərhəd tanımayan qardaşlıq birliyidir.

Hər yerdə Azərbaycan Prezidenti İlham Əliyev və Türkiyə Prezidenti Rəcəb Tayyib Ərdoğan öz maraqları üçün min oyunlar oynayan, hər cür addımlara gedən, mənəviyyatsızlıqları sərhəd tanımayan xarici siyasi dairələrə, o cümlədən Fransa və və onun yedəyində sürünən Almaniya rəsmilərinə öz yerlərini göstərirlər. Çünki bildiyimiz kimi, Azərbaycan Prezidenti İlham Əliyevlə Ermənistan Baş naziri Nikol Paşinyan arasında görüşlər Avropa İttifaqının rəhbəri Şarl Mişelin vasitəçiliyi ilə keçirilirdi və bu görüşlərdə nisbətən müsbət atmosfer formalaşmışdı.

Fransa Prezidenti Emmanuel Makron masada oturmağa başladıqdan bu yana Brüsselin vasitəçiliyində irəliləyiş olmayıb. Şarl Mişelin Makronun təzyiqi ilə masa iştirakçılarının sayını artırması yanlış qərar idi. Və Prezident İlham Əliyevin "masada Fransa və Almaniya varsa, Türkiyə də olmalıdır" tələbi də yerində olmaqla bir daha kimi kim olduğunu onlara bir daha çatdırmış oldu.

Azərbaycan xalqı bu sarsılmaz birliyin qüdrətini 44 günlük şanlı Vətən müharibəsində gördü və bütün dünya bir daha şahid oldu. Qələbədən də sonra Türkiyə həmişə olduğu kimi, yenə də haqq işimizi müdafiə edərək Qarabağın azadlığa qovuşdurulmasında Azərbaycana həm mənəvi, həm də siyasi dəstək oldu. Həmin dövrdə nə qədər beynəlxalq təzyiqlərlə qarşılaşsa da, qardaş ölkə bu mövqeyindən bir addım da geri çəkilmədi, daim Azərbaycanın yanında oldu.

Dövlət başçımız Prezident Rəcəb Tayyib Ərdoğanın BMT Baş Assambleyasında çıxışınız zamanı Azərbaycana verdiyi dəstəyə görə sosial

şəbəkədə təşəkkürünü bildirib: “Əziz qardaşım, BMT Baş Assambleyasında çıxışınız zamanı Azərbaycana verdiyiniz dəstəyə görə təşəkkür edirəm. Hər zaman olduğu kimi, bu gün də qardaş Türkiyə Azərbaycanın yanındadır və haqq işimizdə bizə dəstək verir. Azərbaycan və Türkiyə xoş günlərdə də, kədərli anlarda da daim bir yerdədirlər. Beynəlxalq təşkilatlarda həmişə bir-birimizin haqlı mövqeyini müdafiə edirik. Şuşa bəyannaməsi ilə münasibətlərimiz strateji müttəfiqlik səviyyəsinə yüksəlib. Siz də, mən də Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin qardaşlığımızın rəmzi olan "Bir millət, iki dövlət" kəlamını daim yada salaraq Azərbaycan və Türkiyə arasında olan sarsılmaz birliyi yeni zirvələrə daşıyırıq".

Göründüyü kimi, atılan qəti addımlar Azərbaycan-Türkiyə qardaşlığı və əməkdaşlığının bütün sahələr üzrə davamlı inkişaf etdirilməsinə nail olan Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevlə Türkiyə Respublikasının Prezidenti Rəcəb Tayyib Ərdoğanın dövlətlərarası səviyyədə olduğu kimi, şəxsi münasibətlərdə də əsl qardaşlıq nümayiş etdirmələri olduqca dəyərlidir. Prezident İlham Əliyev müxtəlif beynəlxalq tədbirlərdə həmişə qardaş ölkəyə birmənalı dəstək verməyin əsl örnəyini nümayiş etdirib. İllər öncə Ermənistanın qatil rəhbəri Praqada keçirilən, Türkiyənin təmsil olunmadığı "Şərq Tərəfdaşlığı" sammitində çıxış edərək qardaş ölkənin ünvanına saxta ittihamlar, hədyanlar söyləyəndə Azərbaycan Prezidenti İlham Əliyev “Türkiyə burda yoxsa da, mən burdayam və sizin cavabınızı verəcəyəm”, söyləməklə dünyanı mat qoymuşdu, eyni zamanda, bütün Türk dünyasının ürəyini fəth etmişdi. Eyni zamanda, Türkiyənin Cümhurbaşqanı Rəcəb Tayyib Ərdoğan “Bundan sonra güclənən bir Azərbaycan, güclənən bir Türkiyə vardır”, “Türkiyə bütün imkanları ilə Azərbaycanın yanında olacaq”, mövqeyi ilə dünyaya Türk birliyi mesajını verdi.

Bir sözlə, Əliyev-Ərdoğan birliyi və həmrəyliyi, ümumiyyətlə dövlət başçılarının bir-birinə "qardaşım" deyərək müraciət etmələri həm xalqlarımız, həm də dünya birliyi üçün əsl nümunədir. Azərbaycan-Türkiyə, Türkiyə-Azərbaycan dostluq və qardaşlığı maraqlar, mənfəətlər üzərində qurulmayıb, quru sözlərdən ibarət deyil, sözdə, əməldə, konkret fəaliyyətdədir.

Bu yerdə Prezident İlham Əliyevin Türkiyənin dövlət başçısı haqqında səsləndirdiyi səmimi sözlər bir liderin digəri haqqında rəyindən də çox, bir insanın öz doğma qardaşının uğurları ilə qürur duyması qədər xoş, sevindirici və fərəhlidir. Azərbaycan Prezidenti İlham Əliyevin Türkiyə Prezidenti Rəcəb Tayyib Ərdoğan haqqında dediyi fikri bir daha demək yerinə düşər: "Rəcəb Tayyib Ərdoğan mənim qardaşımdır. Bizim çox yaxın münasibətimiz var. Həm prezidentlər kimi, həm də iki insan kimi. Ona mənim çox böyük hörmətim var. O, dünya lideridir. O, Türkiyəni böyük zirvələrə qaldırdı. Türkiyəni ucaltdı. Türkiyəni ləyaqətli, qürurlu dövlət kimi bütün dünyaya tanıtdırdı. Ona qarşı çox böyük ədalətsizliklər, haqsızlıqlar edilir, həm bəzi ölkələr tərəfindən, həm də təəssüf ki, Türkiyənin içində də bəzi siyasi qüvvələr tərəfindən... Çünki siyasi mübarizə hər yerdə var. Bir də milli məsələ var. Milli məsələdə hər hansı bir siyasi mübarizə olmamalıdır. Biz təhdid qarşısında birləşməliyik. Bu gün Türkiyəyə də hər tərəfdən hücum edirlər. Ona tab gətirmək, onun qarşısında sipər kimi dayanmaq çox böyük cəsarət tələb edir. Böyük peşəkarlıq, bilik, iradə tələb edir. Mənim qardaşım, bax, belə insandır və mən onu yaxından tanıdığım üçün bunu tam səmimiyyətlə deyə bilərəm".

Bir sözlə, bu gün tarixi sınaqlardan çıxmış güclü Azərbaycan – güclü Türkiyə liderlərinin örnək qardaşlıq birliyi bütün dünyanın diqqətindədir. Sözsüz ki, bu danılmaz faktordur ki, bütün bu qardaşlıq münasibəti ulu öndər Heydər Əliyevin söylədiyi "Azərbaycan-Türkiyə bir millət, iki dövlətdir" və böyük öndər Mustafa Kamal Atatürkün "Azərbaycanın sevinci bizim sevincimiz, kədəri bizim kədərimizdir", - kəlamları yaşadığımız günlərdə bir daha tarixiləşdi, toplumun bütün kəsimləri tərəfindən bəyənilən, uşaqdan-böyüyə hər kəsin dilinin əzbəri olan, istər sosial şəbəkələrdə, istərsə də cəmiyyət həyatının hər hansı bir sahəsində ən çox işlədilən ifadəyə çevrildi. Bu gün bu iki güclü liderlərin şad gündə, dar gündə bir-birinin yanında olması bir daha dünyaya nümayiş etdirdi ki, Azərbaycan və Türkiyə bundan sonra da bir olacaq. Çünki Azərbaycan-Türkiyə birliyi əbədi və sarsılmazdır. Artıq bu reallıq bütün sahələrdə sübuta yetirilməkdədir və bundan sonra da birlikdə addımlayaraq, növbəti parlaq qələbələrə, zəfərlərə imza atacaqlar. Və bu iki liderin uca şəxsiyyətinə, mənliyinə, mənəviyyatına, dəyərlərə bağlılığına yaraşan da elə məhz budur!

## “Dəmir yumruğun” Zəfər Günü

Azərbaycan “Dəmir yumruq” adlı 44 günlük hərbi əməliyyatla tarixinə qızıl hərflərlə Zəfər salnaməsi yazdı. 30 il işğalçı Ermənistanın əsarətində olan torpaqlarımızı Prezident, Ali Baş Komandanımız İlham Əliyevin rəhbərliyi altında Müzəffər Ordumuzun rəşadətli əsgər və zabitlərinin qəhrəmanlığı ilə işğaldan azad etdi.

Prezident İlham Əliyev xalqımıza Novruz bayramı təbrikini Şuşadan ünvanladı: “Biz bu il Novruz bayramını Şuşada, Cıdır düzündə qeyd edirik. Bu, tarixi hadisədir. 2004-cü ildən başlayaraq, hər il mən Azərbaycan xalqını Novruz bayramı münasibətilə təbrik edərkən deyirdim ki, biz öz doğma torpaqlarımıza qayıdacağıq. Deyirdim ki, biz ölkəmizin ərazi bütövlüyünü bərpa edəcəyik. Deyirdim ki, biz Novruz bayramını torpaqlarımız işğaldan azad olunandan sonra Qarabağda qeyd edəcəyik və bu gün gəldi. Bu gün biz Novruz bayramını qədim şəhərimizdə, Azərbaycanın mədəniyyət paytaxtı Şuşada qeyd edirik. Bu, tarixi hadisədir”.

Prezident İlham Əliyev 3 il əvvəl, 2018-ci il aprelin 11-də keçirilən seçkilərdə ona göstərilən böyük etimada görə xalqımıza müraciətində demişdi: "Gün gələcək və bu gün hələ də işğal altında olan bütün torpaqlarda Azərbaycan bayrağı qaldırılacaq”.

Artıq o günün – Zəfər günümüzün bir ili qarşısındayıq. Artıq bu gün bütün işğaldan azad olunmuş torpaqlarımızda üçrəngli bayraqlarımız dalğalanır. "Şuşasız Qarabağ, Qarabağsız isə Azərbaycan mövcud deyil" deyən Qalib Sərkərdəmiz, Prezident İlham Əliyev 44 gün ərzində 30 illik həsrətə son qoymaqla Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin, həm də bu torpaqların azad edilməsi istiqamətində canlarından keçən bütün şəhidlərimizin ruhunu şad etdi. Bəlkə də son 30 ildə xalqımız bu qədər qürurlu, güvəndli olmamışdı – 44 gün ərzində tariximizin Zəfər Salnaməmiz yazıldı, bütövləşən Azərbaycanımız, Qarabağ Azərbaycanımıza qovuşduq. Bu Böyük Qələbə Prezident İlham Əliyevin son 18 illik prezidentlik fəaliyyəti dövründə bütün sahələrdə sözünə, vədinə sadiq qalan dövlət başçısı imicini qazanmasının reallığıdır.

Bu yerdə Prezident İlham Əliyevin 2003-cü ildə keçirilən andiçmə mərasimində söylədiyi bu fikirləri bir daha yada salmaq yerinə düşər: "Mən Azərbaycanın xoşbəxt gələcəyinə inanıram. Əminəm ki, ölkəmiz

bundan sonra da inkişaf edəcək, daha da güclənəcəkdir. Azərbaycanda demokratiya daha da inkişaf edəcək, siyasi plüralizm, söz azadlığı təmin olunacaqdır. Ölkəmiz müasir dövlətə çevriləcəkdir. Bütün bunları etmək üçün Azərbaycanda çox işlər görmək lazımdır. Ancaq bütün bunları həyata keçirmək və Azərbaycanı qüdrətli dövlətə çevirmək üçün, ən başlıcası, ölkədə Ümummilli Lider Heydər Əliyevin siyasəti davam etdirilməlidir. Bu gün yüksək kürsüdən çıxış edərkən, mən Azərbaycan xalqına söz verirəm ki, bu siyasətə sadiq qalacağam, heç vaxt bu yoldan dönməyəcəyəm, Heydər Əliyevin siyasətini davam etdirəcəyəm".

Bəli, 8 noyabr 2020-ci il Zəfər Günü Azərbaycanın tarixinə qızıl hərflərlə yazıldı. Bu, xalq-ordu-lider vəhdəti, birliyi dəmir yumruğa çevrildi və bu yumruq 8 noyabr Zəfərini tarixə yazdı.

Bu bir ildə ən böyük Zəfər günü Prezident İlham Əliyevin təşəbbüsü və Heydər Əliyev Fondunun təşkilatçılığı ilə 29 ildən sonra Azərbaycanın mədəniyyət paytaxtı Şuşanın Cıdır düzündə keçirilən "Xarıbülbül" musiqi festivalı oldu. "Xarıbülbül" festivalının açılışı zamanı Qalib Sərkərdəmiz Prezident İlham Əliyev və Birinci vitse-prezident Mehriban xanım Əliyeva, onların ailə üzvləri də tədbirdə iştirak edərək xalq-iqtidar həmrəyliyini nümayiş etdirdilər.

Festivalın açılışındakı çıxışında bu mesajın əhəmiyyətini xüsusi vurğulayan Azərbaycan Prezidenti İlham Əliyev bildirdi: “Azərbaycanda bütün xalqlar dostluq, qardaşlıq, həmrəylik şəraitində yaşayır və bu 44 günlük müharibə bir daha onu göstərdi ki, ölkəmizdə milli birlik, milli həmrəylik vardır. Təsadüfi deyil ki, birinci festivalda Azərbaycanda yaşayan xalqların nümayəndələri çıxış edəcəklər və bir daha biz bütün dünyaya buradan – Şuşadan, qədim torpağımızdan mesaj veririk”.

### *Hər günü bir tarixi qələbə olan 44 gün*

Bəli, 44 günlük müharibədə Prezident İlham Əliyev təkcə Azərbaycanı qalib etmədi, eyni zamanda, müasir dünya siyasətində həllini gözləyən bir sıra məsələləri uğurla həll etdi. Hər şeydən əvvəl, Azərbaycan bu qələbəsi ilə BMT Təhlükəsizlik Şurasının 822, 853, 874 və 884 saylı qətnamələrini yerinə yetirərək bu təşkilatın nüfuzunu, ona olan inamı bərpa etdi. Və 44 günlük Qarabağ müharibəsinin hər günü xalqımızın tarixinə qələbə kimi yazıldı. Bu Zəfəri şəhidlərimizin canı, qanı bahasına əldə

etdik. Şəhidlərimizin əziz xatirəsinə həsr olunan, qürurumuzun təqdimatı oldu. Üçüncü dəfə Şuşaya səfər edən möhtərəm Prezidentimiz İlham Əliyev bu fikri böyük qürurla, sevinclə qeyd etdi və dedi ki, mən dünyada Şuşaya bənzər şəhər görməmişəm, bəlkə də yoxdur.

Bir sözlə, imza atdığımız bu Zəfər sayəsində Azərbaycanın ərazisi bütövləşdi və qalib xalq olaraq regionda yeni reallıq yaratdı. Amma təəssüflər olsun ki, qanı bahasına əldə etdiyimiz Böyük qələbəyə kölgə salmaq istəyən qüvvələr var. Onlar dərk etməlidirlər ki, ermənipərəst mövqelərinə görə xalqın qəzəbinə tuş gəlirlər. Çünki bu zəfərə Ali Baş Komandanın seçdiyi "dəmir yumruq" əməliyyatı ilə 44 gündə 30 ildə həlli mümkün olmayan Qarabağ Azərbaycandır reallığına nail olundu. Bu gün də dəmir yumruq yerindədir və lazım olan yerdə lazım olan vaxt yenə özünü göstərə bilər. Bu gün Azərbaycan xalqının milli qürurunun təntənəsinə çevrilən noyabrın 8-də keçirilən Zəfər Gününü bir daha Ali Baş Komandanımız, Prezident İlham Əliyev sərkərdə qətiyyəti və siyasi müdrikliklə Qarabağ Azərbaycandır!, bütövlüyümüzə nail olduğumuz tarixi, şanlı günümüz – Zəfər Günün mübarək, Azərbaycan!

## Türk dünyasının birlik arzusunu reallaşdıran lider

Hər bir xalqın dünyada tanınmasında, uğurlar əldə etməsində və təbii ki, dünyada cərəyan edən qlobal proseslərin öndə gedənlərinə çevrilməsində liderlərin xüsusi əhəmiyyəti mövcuddur. Liderlik amili elə bir şəxsiyyətlərə aid olunur ki, onlar xalqın və dövlətin maraqlarını müdafiə etməklə yanaşı, həm də inkişaf etdirir. Məhz bu kimi önəmli faktorun təhlilini apararkən, Azərbaycanın bu siyahıda birinci olması şəksizdir. Çünki Azərbaycanın inkişaf və tərəqqi, eləcə də, xalqın rifahı faktorunda Azərbaycan Prezidenti İlham Əliyev Liderliyi amili mövcuddur. Azərbaycan Prezidenti İlham Əliyev dəfələrlə çıxışlarında vurğulayıb ki, əldə edilmiş uğurların dünyada bərabəri yoxdur.

Bəli, həqiqətən də bu, danılmaz aksiomadır. Məhz bu uğurların nəticəsidir ki, ulu öndər Heydər Əliyevin təməlini qoyduğu xarici siyasət nəticəsində bu gün Azərbaycan-Türkiyə münasibətləri qardaşlıq səviyyəsinə yüksəlib. Qalib Sərkərdə, Ali Baş Komandan Prezident İlham Əliyevin "Türk Dünyasının Ali Ordeni" ilə təltif edilməsi qərarını Türkiyə, Qazaxıstan, Qırğızıstan və Özbəkistan prezidentləri imzalayıblar. Bu mükafat Azərbaycan Prezidentinin böyük şəxsiyyətinə, Türk dünyasında liderliyinə, beynəlxalq miqyasda və türkdilli dövlətlər arasında olan yüksək nüfuzuna, ən əsası Azərbaycan Respublikasının ərazilərinin işğaldan azad edilməsini və ərazi bütövlüyünün bərpasını təmin edərək Türk birliyinə mühüm töhfə verən, bölgədə davamlı sülh və sabitliyin əldə olunmasına yol açan tarixi qələbənin əldə olunmasındakı misilsiz xidmətlərinə verilən layiqli qiymətdir.

Dövlət başçımız Zirvə Görüşündə çıxışı zamanı "Türk Dünyasının Ali Ordeni" ilə təltif edilməsi ilə bağlı bildirib ki, bu, türk dövlətləri tərəfindən mənim işimə, mənim fəaliyyətimə verilən çox yüksək mükafatdır, yüksək qiymətdir: "Türk Dünyasının Ali Ordeni Qarabağın azad edilməsi işində göstərdiyim səylərə və türk birliyinin daha da güclənməsi işinə töhfələrimə görə verilir. Bu, türk dövlətləri tərəfindən mənim işimə, mənim fəaliyyətimə verilən çox yüksək mükafatdır, yüksək qiymətdir. Buna görə də mən bütün Azərbaycan xalqı adından çox dərin təşəkkürümü bildirirəm. Çünki mən belə zənn edirəm ki, bu mükafat bütün Azərbaycan xalqına verilmiş mükafatdır".

Türkiyə Prezidenti mükafatı təqdim edərkən bildirmişdi: "Hörmətli Prezident, Əziz qardaşım, Müzəffər Ali Baş Komandan İlham Əliyevin qətiyyətli rəhbərliyi ilə Qarabağda təxminən otuz il davam edən işğala 44 gündə son qoyulması təkcə azərbaycanlı qardaşlarımız üçün deyil, bütün türk dünyası üçün böyük əhəmiyyət daşımaqdadır».

Bəli, bu mükafat Azərbaycan Prezidenti İlham Əliyev cənablarının əsl siyasətinə verilən böyük dəyərdir. Çünki güclü ölkənin güclü, qətiyyətli lideri də güclü olur. Böyük mütəfəkkir Viktor Hüqo vaxtilə yazırdı: "Əsl liderin ömrünün yarısı Vətənə, digər yarısı da xalqa xidmət etməkdən ibarətdir".

"Türk Dünyasının Ali Ordeni" Ali Baş Komandan İlham Əliyevin qalib liderliyinin, beynəlxalq nüfuzunun dünyaya təqdimatıdır. Bu, həm də Azərbaycanın sədrlik dönəmində türk dünyasının birləşməsi üçün böyük səylər göstərməsinə verilən mükafatdır.

"Bugünkü Zirvə görüşünün çox böyük tarixi əhəmiyyəti var. İlk növbədə ona görə ki, biz Şuramızı təşkilata çeviririk və bu təşkilatın çox gözəl gələcəyi var. Çünki bu təşkilatın təməlində təbii müttəfiqlər yerləşir və həm tarix, həm mədəniyyət, həm bizim ənənələrimiz, bizim adət-ənənələrimiz, bax, bu birliyi diktə edir. Eyni zamanda, indiki dünyada təhlükələr hər ay, hər il yaranır və əfsuslar olsun ki, dünyanın aparıcı ölkələri bu təhlükələrə qarşı düzgün addımlar ata bilmirlər və əminəm ki, Türk Dövlətləri Təşkilatının təkcə ölkələrimiz, xalqlarımız üçün deyil, dünya üçün önəmi bundan sonra da artacaq", – deyə dövlətimizin başçısı bildirib.

Qeyd edim ki, Azərbaycan Türkdilli Dövlətlərin Əməkdaşlıq Şurası (Türk Şurası) təsis ediləndən bəri təşkilatda fəal təşəbbüskar tərəf olub. Azərbaycan ötən iki ildə Türk Şurasına sədrlik edib, bu dövrdə həm COVID-19 pandemiyasına qarşı sistemli mübarizə aparıb, həm də İkinci Qarabağ savaşında böyük Zəfər qazanmaqla hər üç məsələdə fədakarlıq göstərərək istədiklərinə nail olub. Məhz Azərbaycan Prezidenti İlham Əliyevin "Türk Dünyasının Ali Ordeni" ilə təltif olunması bütün bu işlərə, qazanılan tarixi Zəfərə verilən yüksək qiymətdir, bu mükafat bütün Azərbaycan xalqına verilmiş mükafatdır. Çünki Qarabağ Zəfəri həm Azərbaycan, həm də türk dünyası birlik istəklərinin reallaşdırdığığı dönüş nöqtəsidir. Azərbaycan 30 il davam edən ədalətsiz və hüquqsuz bir işğal 44 gün

ərzində Azərbaycan-Türkiyə qardaşlığı, birliyi dünyada analoqu olmayan və bu gün Ulu Öndər Heydər Əliyevin "Bir millət, iki dövlət" kəlamı sadəcə olaraq, kəlam deyil, gerçəkliyə çevrilən reallığı sübut etdi. Prezident İlham Əliyev noyabrın 12-də İstanbulda Türkdilli Dövlətlərin Əməkdaşlıq Şurasının VIII Zirvə görüşündə çıxışı zamanı bildirdi ki, bizi İkinci Qarabağ savaşında əldə etdiyimiz Zəfər göstərdiyimiz əzmkarlıq, iradə, rəşadətlə yanaşı bizə güc verən qardaşlıq birliyi oldu: "İkinci Qarabağ savaşında göstərdiyimiz əzmkarlıq, iradə, rəşadət bizi böyük Zəfərə gətirib çıxardı və onu da bildirməliyəm ki, bunu hər kəs görür, bizə əlavə güc verən əziz Qardaşım Rəcəb Tayyib Ərdoğanın müharibənin ilk saatlarından başlayaraq son dəqiqələrinə qədər bizə göstərdiyi dəstək və mənəvi dayaqdır. Çünki biz bu dəstəyi hiss edərək, onun sözlərinə qulaq asaraq özümüzü daha da güclü hiss etdik. Çünki hörmətli Cümhurbaşqanı demişdir ki, Azərbaycan bu savaşda tək deyil. Türkiyə Azərbaycanın yanındadır və hər zaman yanında olacaqdır və bu, bizə əlavə güc verdi".

Bəli, bu, Prezident, Ali Baş Komandan İlham Əliyevin diplomatik siyasətinin göstəricisidir, bu, "bir millət, iki dövlət" kəlamına əsaslanan monolit birliyidir. Bu, Qalib Sərkərdə İlham Əliyevin son 18 illik Prezidentlik fəaliyyəti dövründə həyata keçirilən xarici siyasətinin nəticəsidir. "Türk Dünyasının Ali Ordenə" layiq görüldüyünə görə təşəkkürünü bildirən dövlətimizin başçısı deyib: "Bu, mənim üçün böyük şərəfdir, eyni zamanda, böyük məsuliyyətdir. Mənim sevincimi ikiqat edən odur ki, bu Ali Ordeni mənə Türk Şurasına üzv ölkələrin dövlət başçıları təqdim edirlər. Onların imzası ilə və əziz qardaşım, hörmətli Cümhurbaşqanı Rəcəb Tayyib Ərdoğanın təşəbbüsü ilə bu yüksək mükafat mənə verilir".

Bir sözlə, Azərbaycan Prezidenti İlham Əliyevin "Türk Dünyasının Ali Ordeni" ilə təltif olunması tarixi hadisə olmaqla, həm də dövlətimizin başçısının Türk dünyası qarşısındakı xidmətlərinə verilən ədalətli qiymətdir. Bu mükafat Azərbaycan Prezidentinin böyük şəxsiyyətinə, Türk dünyasında liderliyinə, beynəlxalq miqyasda və türkdilli dövlətlər arasında olan yüksək nüfuzuna, ən əsası Azərbaycan Respublikasının ərazilərinin işğaldan azad edilməsini və ərazi bütövlüyünün bərpasını təmin edərək Türk birliyinə mühüm töhfə verən, bölgədə davamlı sülh və sabitliyin əldə olunmasına yol açan tarixi qələbənin əldə olunmasındakı misilsiz xidmətlərinə verilən böyük dəyərdir. Bir sözlə, Azərbaycan Prezidentinin

Türk dünyasının Ali Ordeni ilə təltif olunması tarixi Zəfərimizin təsdiqidir. Bu, bir daha sübut edir ki, Türk dünyasının birlik arzusunu reallaşdıran Qalib Sərkərdə Türk dünyasındakı liderliyinə və bütövlükdə Azərbaycan xalqına qardaş türk xalqları tərəfindən verilən yüksək dəyərin nümunəsidir. Bu Ali mükafat Prezident İlham Əliyevin Azərbaycan Respublikasının ərazilərinin işğaldan azad edilməsini və ərazi bütövlüyünün bərpasını təmin edərək türk birliyinə mühüm töhfə verən, bölgədə davamlı sülh və sabitliyin əldə olunmasına yol açan tarixi Qələbənin əldə olunmasındakı misilsiz xidmətlərinə verilən layiqli qiymətdir. Budur, Qalib sərkərdə olmaq!. Budur, türkdilli dövlətlər arasında coğrafi bağlılığın bərpa edilməsinə, bütün Türk dünyasının birlik arzusunun reallığa çevrilməsinə misilsiz töhfələr verən lider olmaq!

# Qalib Lider

30 illik işğala son qoyan, 100 illik reallıqları dəyişdirən, 250 illik məğlubiyyət sindromunu qıran, hərbi cəbhədə müharibəyə komandanlıq edən, diplomatiyada ölkəsinin maraqlarında prinsipial mövqeyindən geri çəkilməyən, informasiya cəbhəsində həqiqətlərin dünyaya çatdırılması işinin yükünü çiyinlərinə götürən Prezident İlham Əliyev son 18 il ərzində sözü ilə əməli bir olan, hər bir vətəndaşının problemini öz problemi, qayğısını öz qayğısı kimi qəbul edən, iştirak etdiyi bütün seçkilərdə xalqın mütləq əksəriyyətinin səsini, etimadını qazanan, parlaq zəkası, peşəkar idarəçilik qabiliyyəti və praqmatik yanaşması ilə xalqının Prezidenti olduğunu əməli və yorulmaz fəaliyyəti ilə sübuta yetirmişdir. Möhtərəm dövlət başçımızın keçdiyi həyat yoluna nəzər saldıqca, son 18 illik prezidentlik fəaliyyəti müddəti ərzində onun böyük uğurlarla zəngin olan siyasi addımları da təsdiq edir ki, İlham Əliyev siyasəti bir fenomenə çevrilmiş gerçəklikdir.

Xüsusilə də, Azərbaycan və onun lideri Prezident İlham Əliyev Vətən müharibəsində informasiya cəbhəsinin də lokomotivliyini üzərinə götürərək 44 gün ərzində 30-a yaxın beynəlxalq mediaya müsahibə verdi. Hər bir müsahibəsi unikal hadisəyə çevrilən Azərbaycan lideri Ermənistanın işğalçılıq siyasətini dünyanın gözü önündə ifşa edirdi. Buna paralel olaraq, cəbhədə baş verənlərlə bağlı mütəmadi olaraq xalqa məlumat verir, vətənpərvərlik ruhunu yüksəldir və cəmiyyətin qələbəyə inamını artırırdı. Azərbaycanın haqqın, ərazi bütövlüyü uğrunda apardığı Vətən müharibəsində Azərbaycan xalqının 30 illik həsrətinə 44 gün ərzində son qoymaqla bütün dünyaya sübut etdi ki, "Dağlıq Qarabağ problemi yoxdur!", Qarabağ Azərbaycanındır. Azərbaycan Prezidenti İlham Əliyevin rəhbərliyi ilə güclü iqtisadiyyat, güclü dövlət, güclü ordu, rəşadətli əsgər və zabitlərimizin gücü ilə bu qələbə Zirvəsinə nail oldu. Dünya miqyasında öz xüsusi çəkisi, yeri olan Azərbaycan Prezidenti İlham Əliyev – HAQQA, ƏDALƏTƏ GEDƏN YOLUN QALİB LİDERİ, YENİ BİR TARİX YAZAN SƏRKƏRDƏ. 44 gün ərzində Ordumuz bütün dünyaya öz qüdrətini, gücünü nümayiş etdirdi. **PREZİDENT İLHAM ƏLİYEV: "30 İLİN ƏZİYYƏTİ, 30 İLİN ÜMİDSİZLİYİ, 30 İLİN ƏZABLARI XALQIMIZI SINDIRMADI, İRADƏMİZƏ HEÇ BİR MƏNFİ TƏSİR GÖSTƏRMƏDİ".**

Bəli, həqiqətən də, Müzəffər Ordumuzun Sərkərdəsi İlham Əliyevin dediyi kimi: "30 ilin əziyyəti, 30 ilin ümidsizliyi, 30 ilin əzabları xalqımızı sındırmadı, iradəmizə heç bir mənfi təsir göstərmədi. Çünki bizim işimiz haqq işidir, biz öz torpağımızda vuruşuruq, Vətən uğrunda vuruşuruq". Bəli, Azərbaycan dövləti həmişə haqq-ədalətin, ərazi bütövlüyümüzün uğrunda vuruşub. Məhz buna görə də, Azərbaycan Ordusunun sentyabrın 27-dən başladığı zəfər yürüşü 44 gün ərzində 30 ilin həsrətinə son qoydu, avantürist Ermənistanın təcavüzkar silahlı qüvvələrini darmadağın etdi, işğal altında qalan torpaqlarımız özümüzə - əsl sahibinə qaytardı. 44 gün davam edən Vətən müharibəsi Azərbaycanın hansı imkanlara malik olduğunu bir daha dünyaya nümayiş etdirdi. Azərbaycan dünyaya göstərdi ki, böyük, yenilməz xalqdır. Ali Baş Komandanımız İlham Əliyev xalqa müraciətində bildirdiyi kimi: "Azərbaycan xalqı bu dövrdə də birlik, həmrəylik, güclü iradə göstərəcək, dağıdılmış şəhərləri, kəndləri bərpa etmək üçün əlindən gələni edəcək. Artıq istədiyimizə nail olmuşuq və bundan sonra xalqımızı təhlükəsiz və xoşbəxt həyat gözləyir".

Bu gün böyük fəxr və qürurla deyirik: Artıq torpaqlarımızın işğal günlərini deyil, işğaldan azad edildikləri tarixi qeyd edirik. Artıq "Dağlıq Qarabağ münaqişəsi" termini yoxdur! 10 noyabr 2020-ci il Prezident İlham Əliyevin qətiyyəti və rəhbərliyi sayəsində güclü Ordumuzun, rəşadətli əsgər və zabitlərimizin sayəsində çoxəsrlik tariximizin Zəfər Günü yazıldı.

### *Ata vəsiyyəti – Oğul hesabatı*

Bu böyük qələbəni, YUMRUQ KİMİ BİRLİYİ, BİZƏ BƏXŞ EDƏN SƏRKƏRDƏMİZİN rəhbərliyi, güclü ordumuz və rəşadətli əsgər və zabitlərimizin igidliyi ilə əldə edildi. Həyata keçirilən bütün bu tarixi, misilsiz işlərlə yanaşı, Prezident İlham Əliyevin qarşısında müqəddəs sayıla biləcək vəzifə – Ata vəsiyyətinin – Azərbaycanın ərazi bütövlüyünün bərpa edilməsi məsələsi dururdu. Prezident İlham Əliyev, özünün də qeyd etdiyi kimi, həyata keçirilən bütün işlərin, siyasətin, atılan hər addımın son qayəsi Qarabağ idi. Cəmi 44 gün davam edən Vətən müharibəsi Azərbaycanın böyük zəfəri ilə başa çatdı. Bu, Ali Baş Komandan İlham Əliyevin qələbəsi, Ulu Öndər Heydər Əliyevin siyasi kursunun təntənəsi idi. Bu qələbə Xalqımızın, Ordumuzun, Milli Birliyimizin, Haqqın və Ədalətin zəfəri

idi. Bu tarixi Zəfər Qələbəsi ilə Azərbaycan Prezidenti İlham Əliyev həyatını Azərbaycana həsr edən, "Şuşasız Qarabağ, Qarabağsız Azərbaycan yoxdur" – deyən Ulu Öndərin arzusunu reallaşdırıldığı qələbə idi.

Şuşanın azad edilməsi münasibətilə xalqa müraciətində Prezident İlham Əliyev bəyan etmişdi: "Mən bu gün Ulu Öndər Heydər Əliyevin məzarını ziyarət etdim, onun ruhu qarşısında baş əydim. Ürəyimdə dedim, xoşbəxt adamam ki, ata vəsiyyətini yerinə yetirdim. Şuşanı azad etdik! Bu, böyük Qələbədir! Bu gün şəhidlərimizin, Ulu Öndərin ruhu şaddır!".

Bəli, ölkə Prezidenti İlham Əliyevin xalqa müraciətində səsləndirdiyi bu sözlər hər birimizdə böyük sevinc və qürur hissləri yaradır. Bu böyük qələbə ilə Ali Baş Komandanımız, Prezident İlham Əliyev Azərbaycan xalqını dünyaya qürurlu xalq kimi tanıtdı. Bu gün tək Qarabağ yox, işğal altında olan bütün torpaqlarımız geri qaytarıldı. Azərbaycanın ərazi bütövlüyü bərpa edildi. Bu, tarixin böyük qələbəsi idi. Bu qələbənin isə bir şəriksiz müəllifi var – Ali Baş Komandanımız, Azərbaycan Prezidenti İlham Əliyev. Bəli, 3 il öncə Azərbaycan Prezidenti, Ali Baş Komandan İlham Əliyev demişdir: "Gün gələcək və bu gün işğal altındakı torpaqlar azad olunandan sonra orada qaldırılacaq Azərbaycan bayrağı Azadlıq meydanına gətiriləcək və hərbi paradda göstəriləcək. Biz bu müqəddəs günü yaxınlaşdırmalıyıq və yaxınlaşdırırıq".

Bütün bunlar Azərbaycan Prezidenti, Ali Baş Komandan İlham Əliyev cənablarının, Müzəffər Ordumuzun, rəşadətli əsgərlərimizin və xalqımızın BİRLİYİ, həmrəyliyi nəticəsində əldə edildi, 30 illik qaçqınlığa, köçkünlüyə son qoyuldu. O Zəfər Paradı – 10 dekabr tariximizin ən parlaq səhifəsinə çevrildi. İşğaldan azad olunan torpaqlarımızda dalğalanan üç rəngli Bayrağımız Azadlıq meydanına gətirilərək bütün dünyaya sübut etdi ki, Qarabağ Azərbaycandır!!! Budur, dünya səviyyəli, cəsarətli LİDER! Budur, xalqın Prezidenti olmaq! Biz də SON 20 İL: HAQQA, ƏDALƏTƏ GEDƏN YOLUN QALİB LİDERİNİ, QALİB SƏRKƏRDƏ Azərbaycan Prezidenti, Ali Baş Komandan İlham Əliyev cənablarını təbrik edir, Ona cansağlığı, davamlı uğurlar və daha böyük zirvələri fəth edən qələbələr arzulayırıq! Qarabağ Azərbaycandır!

## “Şuşa İli” – xalqımızın qəhrəmanlıq ruhunun təntənəsi

Bu gün Ali Baş Komandan, Prezident İlham Əliyevin 2022-ci ili “Şuşa İli” elan etməsi xalqa bəxş etdiyi Qarabağ Azərbaycan olmaqla, həm də hər bir azərbaycanlını qürurlandırır. Çünki bu il Şuşanın 270 illiyi böyük əhval-ruhiiyyə ilə qeyd ediləcək. Dövlət başçımız da xalqa müraciətində diqqətə çatdırdı ki, bu şanlı tarixi nəzərə alaraq və Şuşanın bərpasını sürətləndirmək məqsədilə 2022-ci il “Şuşa İli” elan edilib. Sərəncamda vurğulanır ki, strateji mövqeyi ilə seçilən Şuşa Azərbaycana qarşı hərbi təcavüzə başlamış Ermənistanın silahlı qüvvələri tərəfindən 1992-ci il mayın 8-də işğala məruz qalmışdır. İşğal dövründə şəhərdəki yüzlərlə tarix və mədəniyyət yadigarı vandalizm aktları nəticəsində dağıdılmışdır. Haqq işi naminə apardığımız 44 günlük Vətən müharibəsində rəşadətli Azərbaycan Ordusu Şuşa şəhərini 2020-ci il noyabrın 8-də işğaldan azad etdi. Ermənistanın kapitulyasiyasına yol açan Şuşa qalibiyyəti xalqımızın qəhrəmanlıq ruhunun təntənəsinə çevrilərək, tariximizə Zəfər Günü kimi həkk olundu.

Qarabağın tacı olan Şuşa xalqımız üçün müqəddəs və əziz məkandır. Təməli 1752-ci ildə Qarabağ xanı Pənahəli xan tərəfindən qoyulan və bu il 270 illiyi qeyd olunacaq Şuşa şəhəri zəngin inkişaf yolu keçmiş, Azərbaycanın və bütün Cənubi Qafqazın mədəni və ictimai-siyasi həyatında müstəsna rol oynamışdır. Çünki Şuşa alınmaz qaladır. Məhz 1992-ci il may ayının 8-də erməni təcavüzkarları tərəfindən Şuşa işğal olunsa da 2020-ci il noyabrın 8-də – 28 ildən sonra Azərbaycan Respublikasının Prezidenti, Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi ilə Müzəffər, Sarsılmaz, Şanlı Ordumuz, rəşadətli əsgər və zabitlərimizin gücü ilə 28 il həsrətində olduğumuz, Azərbaycanın ürəyi, mirvarisi, tacı, o cümlədən bütün Qafqazın mədəniyyət beşiyi olan Şuşa şəhərini düşmən işğalından azad etdi. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin noyabrın 8-də Şəhidlər Xiyabanında etdiyi müraciəti isə xalqımızın Qarabağ həsrətinə məlhəm oldu. Ali Baş Komandanın tarixi müraciətindən: “Dəfələrlə Azərbaycan xalqına müraciət edərək düşmənə yumruq göstərmişdim, yumruq göstərmişdim. Demişdim ki, bu yumruq elə belə yumruq deyil. Bu, dəmir

yumruqdur. Bu dəmir yumruqla düşmənin başını əzirik və əzəcəyik! Eyni zamanda, bu yumruq birliyimizin rəmzidir. Bax, bu gün Azərbaycan xalqı bu yumruq kimi birləşib! Həmişə belə olacaq! Bu birlik əbədi olacaq! Bu birlik bizə gələcəkdə də bütün vəzifələri icra etmək üçün imkan yaradacaq. Mən bütün bu illər ərzində – 17 il ərzində Azərbaycan xalqının dəstəyini hiss etmişəm, görmüşəm, inamını, mənə olan xoş münasibəti görmüşəm. Bu, mənə güc verir. Bu, mənim siyasətim üçün əvəzolunmaz dəstəkdir. Həmişə Azərbaycan xalqını əmin edirdim ki, mən Vətənə, doğma xalqıma ləyaqətlə, sədaqətlə xidmət edəcəyəm. Şadam ki, sözümün üstündə durmuşam. Həmişə olduğu kimi, sözümə sadiq olmuşam. Bu tarixi bir gündə Azərbaycan xalqına bu müjdəni vermək mənim həyatımda bəlkə də ən xoşbəxt günlərimdən biridir. Əziz Şuşa, sən azadsan! Əziz Şuşa, biz qayıtmışıq! Əziz Şuşa, biz səni dirçəldəcəyik! Şuşa bizimdir! Qarabağ bizimdir! Qarabağ Azərbaycandır!".

Şuşa bizimdir! Qarabağ bizimdir! Qarabağ Azərbaycanındır! Və bu gün Ali Baş Komandanımız, Prezident İlham Əliyevin 2022-ci ili "Şuşa İli" elan etməsi bir daha son 18 il prezidentlik fəaliyyəti dövründə sözü ilə əməlinin üst-üstə düşdüyünü, nəyi necə və nə zaman etməyi özünün yaxşı bildiyini bir daha nümayiş etdirir.

***"Şuşasız Qarabağ, Qarabağsız isə, ümumiyyətlə, Azərbaycan yoxdur"***

Bu tarixi xəbər həm Azərbaycanda, həm də ölkəmizin hüdudlarından kənarda yaşayan soydaşlarımız tərəfindən minnətdarlıq və məmnunluqla qarşılandı. Səbəbi isə bəllidir. Şuşa mədəniyyətimizin paytaxtı, qədim Azərbaycan torpağıdır. İllər öncə Ulu Öndər Heydər Əliyev Qarabağın tacı olan Şuşa şəhərinin hər bir azərbaycanlı üçün dəyərini qiymətləndirərkən demişdir ki, "Şuşasız Qarabağ, Qarabağsız isə, ümumiyyətlə, Azərbaycan yoxdur". Bu, Şuşanın bizim üçün nə dərəcədə dəyərli olduğunun böyük ifadəsi idi.

28 illik həsrətdən sonra Şuşa azadlığına qovuşanda isə Xilaskar, Qalib Lider İlham Əliyev Şuşanı belə dəyərləndirdi: "Şuşa təkcə şuşalılar üçün yox, bütün azərbaycanlılar üçün, vətənini, millətini sevən hər bir vətəndaşımız üçün əziz şəhərdir, əziz bir torpaqdır, əziz bir qaladır, əziz bir abidədir".

Prezidentin imzaladığı sərəncamda qeyd edilir ki, Şuşa şəhərinin ötən əsrin 70-ci illərində sürətli inkişafı Ümummilli Lider Heydər Əliyevin adı ilə sıx bağlıdır. Şəhərin inkişafına dair xüsusi qərarlar məhz Ulu Öndərin təşəbbüsü ilə qəbul edilib. Həmin vaxtdan Şuşada quruculuq işləri geniş vüsət alıb, mədəniyyət xadimlərimizin xatirəsinin əbədiləşdirilməsi istiqamətində mühüm addımlar atılıb.

Bəli, bu gün Şuşa yenidən qurulur, özü də daha möhtəşəm, daha əzəmətli. Bugünkü Şuşanın yenidən qurulması isə Azərbaycan Prezidenti İlham Əliyevin adı ilə bağlıdır. Sözsüz ki, Qayıdış Şuşadan-ən yüksəklikdən başlamalıdır, çünki hazır olan, vacib, əsas olan Şuşadır! Azərbaycanın mədəniyyət paytaxtı elan edilən Şuşada bu gün şəhərin əsl tarixi simasının bərpası yönündə nəhəng layihələr gerçəkləşdirilir. 2022-ci ili Qarabağa qayıdışın önəmli mərhələsinin başlanğıc ili kimi də qəbul edə bilərik. Bir sözlə, Prezident, Müzəffər Ali Baş Komandanımızın 2022-ci ilin "Şuşa İli" elan edilməsi haqqında sərəncamı İkinci Qarabağ müharibəsində qazandığımız qələbəni siyasi və diplomatiya müstəvisində möhkəmləndirməyə xidmət edir. İnanırıq ki, 2022-ci ilin “Şuşa İli” elan edilməsi bu doğma şəhərimizin daha da çiçəklənməsinə, tamamilə bərpa olunmasına, əvvəlki gözəlliyinin və möhtəşəmliyinin geri qaytarılmasına, yenidən Azərbaycanın mədəniyyət paytaxtına çevrilməsinə təkan verəcək.

Birinci vitse-prezident Mehriban xanım Əliyevanın Şuşa şəhərinin azad olunması münasibətilə rəsmi “İnstagram” səhifəsində etdiyi paylaşımda Azərbaycan xaqlını təbrik etməsi ilə dediyi kimi, “İllər boyu davam etmiş kədər, həsrət, faciəli hadisələrdən sonra tarixi ədalət bərpa olunur. Qoy bizim bütün uğurlarımızın və nailiyyətlərimizin, bütün qələbələrimizin qarantı olan xalq-Prezident birliyi günbəgün möhkəmlənsin! Bu gün məhz bu birlik Azərbaycanın öz gücünü nümayiş etdirməsinə imkan yaradır! Milli həmrəylik, xalqın etimadı, inamı və dəstəyi sayəsində bizim Prezidentimiz bütün mürəkkəb məsələlərin öhdəsindən uğurla gəlməyi bacarır! Qoy Uca Tanrı ordumuzu, xalqımızı, Vətənimizi və Prezidentimizi qorusun! Şuşa bizimdir! Qarabağ Azərbaycandır!".

## Liderlik örnəyi

Güclü ölkənin güclü, qətiyyətli lideri də güclü olur. Dövlətimizin başçısı İlham Əliyevin istər yerli və xarici televiziya kanallarına və mətbuatına, istəsə də xalqa müraciətlərində səsləndirdiyi hər bir bəyanatda 30 ilə yaxın müddətdə dünya dövlətlərinin siyasi iradə ortaya qoymamalarının yol açdığı sual doğuran və dəqiq cavabını axtaran məqamlar öz əksini tapıb. Real həqiqətlər bir daha bu gerçəkliyə işıq salır ki, zaman keçdikcə baş verən hadisələrin mahiyyəti daha dərindən dərk olunur, haqqın, ədalətin maraqların arxasında necə əridiyi aydın görünür. Bu gün dünyaya edilən "həqiqətə həqiqət gözü ilə baxaq" çağırışı erməniləri və onların havadarlarını narahat etsə də, unudulmamalıdır ki, beynəlxalq hüquq normaları və prinsipləri deyilən məfhum mövcuddur ki, onlara böyüklüyündən, kiçikliyindən asılı olmayaraq bütün dövlətlər əməl etməli, yanaşmalarında əsas götürməlidirlər.

**Prezident, Silahlı Qüvvələrin Ali Baş Komandanı İlham Əliyev xalqa müraciətində öz mövqeyini birmənalı şəkildə bildirərək demişdir:** "Desin ki, mən Azərbaycanın ərazi bütövlüyünü tanıyıram, necə ki, baza prinsiplərində bu, təsbit edilib. Desin ki, mən işğal edilmiş torpaqlardan qoşunlarımızı çıxaracağam, necə ki, baza prinsiplərində bu, təsbit edilib. Desin ki, mən Azərbaycan xalqından üzr istəyirəm və desin ki, Qarabağ Ermənistan deyil. Sonuncu şərt budur ki, qrafik versin, işğal edilmiş torpaqlardan erməni silahlı qüvvələrinin çıxarılması cədvəli verilsin bizə. Onda biz əlbəttə ki, atəşkəs rejimini bərpa edəcəyik".

Bu yerdə rusiyalı hərbi ekspert, «Milli müdafiə» jurnalının baş redaktoru İqor Korotçenkonun Azərbaycan Prezidenti İlham Əliyevin dünya miqyasında siyasət adamı olduğunu vurğulayıb: **"Rusiyalı izləyicilər, siyasi ekspertlər İlham Əliyevin çıxışını erməni rəqibi Nikol Paşinyanla müqayisə edərkən gördülər ki, Azərbaycan Prezidenti erməni həmkarından bir baş yox, deyərdim iki baş yuxarıda idi. Bu rəy İlham Əliyevin dünya miqyasında siyasətçi olmasından ibarətdir. Bunu qəbul etmək lazımdır. Dünən milyonlarla rusiyalı İlham Əliyevin çıxışını izlədi və ona qarşı bir daha simpatiya oyandı. Xüsusi ilə də onun çıxışındakı yüksək dəqiqlikli arqumentlər, tezislərin ardıcıllığı, münaqişənin yenidən alovlanmasının əsas səbəblərinin ifadə**

**olunması rusiyalı izləyici üçün hərbi əməliyyatlar və ümumilikdə münaqişə haqqında ətraflı məlumat oldu. Bu xüsusilə də Ermənistanın baş naziri Nikol Paşinyanın əmin olmayan çıxışı fonunda daha çox hiss olunurdu. İlham Əliyev Dağlıq Qarabağ regionunda hərbi əməliyyatların bərpa olunmasına gətirib çıxaran əsas səbəbləri ardıcıl olaraq dilə gətirdi. Bu çox mühüm məsələ idi. O bildirdi ki, İrəvanın qeyri-konstruktiv mövqeyi, danışıqlar prosesini uzatmaq arzusu və uzun müddətdir ki, Paşinyanın törətdiyi təxribatlar nəhayət geniş miqyaslı müharibəyə gətirib çıxarıb".**

Bəli, 44 günlük Vətən Müharibəsi Prezident İlham Əliyev cənablarının dünya miqyasında LİDER siyasətçi olduğunu bir daha göstərdi. Dəmir yumruğa çevrilən 44 günlük Vətən müharibəsinin Qələbə sevincimizi nümayiş etdirən ZƏFƏR PARADIMIZ bunun sübutudur. Dövlətimizin başçısı İlham Əliyevin Laçının azad edilməsi ilə bağlı xalqa müraciətində qeyd etdiyi kimi, hər kəs gücümüzü, qüdrətimizi, iradəmizi gördü. Bu dəmir yumruq onların belini qırdı, onların başını əzdi. Bu, birlik, güc yumruğudur. Bundan sonra Azərbaycan yalnız inkişaf, tərəqqi yolu ilə gedəcək. Bundan sonra da biz ordu quruculuğu işində əməli addımlar atacağıq, ordumuzu daha da gücləndirəcəyik. İradəmiz də, təcrübəmiz də var. Dövlət başçımızın dediyi kimi: **"İndi bütün ölkələr bu Vətən müharibəsinin təcrübəsini öyrənirlər. Vəsaitimiz də var. Xalq-iqtidar birliyimiz də var. Biz göstərmişik ki, böyük xalqıq, qürurlu xalqıq. Düşməni yerə vurduq. Düşmənin belini qırdıq, məhv etdik. Bu, tarixi Qələbədir. Bu Qələbə Azərbaycan tarixində əbədi qalacaq, şanlı Qələbə kimi!".**

Bu Qələbə, eyni zamanda, göstərdi ki, Azərbaycan xalqı bu vəziyyətlə heç vaxt barışmaq fikrində deyildi və bütün xalqımız, o torpaqları tərk edənlər, qayıtmaq arzusunda olanlar, o torpaqlarda heç vaxt olmayan, amma o bölgələrdən olan gənc nəslin nümayəndələri, hər kəs bir arzu ilə yaşayıb və bu arzu həyata keçirildi. Artıq müharibə arxada qaldı. Prezident İlham Əliyev Azərbaycan xalqını 2020-ci ilin qalib xalqı etdi. 18 il öncə deyilənlər, bu gün öz müsbət nəticəsini verib. Bu gün Prezident İlham Əliyevin müdrik və uzaqgörən inkişaf strategiyası nəticəsində, dayanıqlı və davamlı iqtisadi inkişafa nail olan, dünyadakı nüfuzu durmadan artan, regionun siyasi, iqtisadi və mədəni mərkəzinə çevrilən ölkəmiz bu gün müəyyən edilmiş hədəflərə doğru inamla irəliləyir, ötən

hər il bütün sahələrdə əldə olunan böyük uğurlarla tarixə düşür. Bu nailiyyətlərin əldə edilməsində müstəsna rolu olan dövlət proqramları regionların iqtisadi potensialının əhəmiyyətli dərəcədə artmasına, infrastruktur təminatının, kommunal xidmətlərin keyfiyyətinin daha da yaxşılaşmasına, müasir müəssisələrin açılmasına səbəb olmuş, Azərbaycanı bütün bölgələrində dinamik tərəqqi yaşanan bir ölkəyə çevirmişdir. Bax, budur uğurlu siyasət!

Ümumiyyətlə, Aəzərbacan Prezidenti İlham Əliyevin siyasi fəaliyyəti ilə bağlı keçirilən bütün sorğuların nəticələri həmişə yüksək rəqəmlərlə müşahidə olunur. Bütün bunlar nəyi ifadə edir? Hər şeydən əvvəl Prezident İlham Əliyevin məhz 18 illik fəaliyyətinə görə Azərbaycanda yeganə lider olduğunu sübutudur. Bu xalq-iqidar-ordu birliyinin, xalqın, ordunun öz Liderinə inamının qələbsidir. Çünki bizim yumruğumuz bizim birliyimizdir. Məhz bu siyasətin nəticəsində biz Qələbə qazandıq. Haqq, ədalət, Azərbaycanımızın bütövlüyü bərp olundu. Qarabağ Azərbaycandır!

Prezident İlham Əliyev ötən il dekabrın 24-də Şuşada, Cıdır düzündə çıxışı zamanı dediyi kimi: “Xalqımız bir amal uğrunda, bir müqəddəs ideya uğrunda birləşdi və istədiyinə nail oldu”,-deyərək bildirib ki, “Mən deyirdim ki, gün gələcək Azərbaycan bayrağı işğal edilmiş torpaqlarda, o cümlədən Şuşada dalğalanacaq və bu müqəddəs günü biz şəhidlərimizin qanı-canı bahasına yaşadıq. Allah bütün şəhidlərimizə rəhmət eləsin. Bu gün biz azad Qarabağdayıq. Bu gün biz azad Zəngəzurdayıq. Biz - bu torpaqların sahibləri bu torpaqlara qayıtmışıq və bundan sonra biz bu torpaqlarda əbədi yaşayacağıq. Azərbaycan xalqının mənim sözlərimə inamı məni daha da çox inandırırdı ki, biz buna nail olacağıq. Xalqımız birləşdi, bir amal uğrunda, bir müqəddəs ideya uğrunda birləşdi və istədiyinə nail oldu".Çünki dövlət başçısı xalqın dəstəyinə, xalqın da liderinə böyük inamı olduğu üçün 44 gün ərzində 30 illik həsrətə son qoyuldu.Qalib Liderimiz bütün çıxışlarında, müsahibələrində dönə-dönə bildirir ki, xalqın dəstəyi mənə güc verir, iradəmi möhkəmləndirir: “Xüsusilə Azərbaycan xalqına öz təşəkkürümü bildirmək istəyirəm, həm təbriklərə görə, həm də mənə göstərilən dəstəyə görə. Mən bu dəstəyi 2003-cü ildən - Prezident vəzifəsinə ilk dəfə seçiləndən bu günə qədər hiss edirəm. Bu dəstək

mənə güc verir. Bu dəstək iradəmi möhkəmləndirir. Bu dəstək nəticəsində biz hamımız – bütün Azərbaycan xalqı böyük tarixi uğurlara imza atmışıq”.

Bəli, bu Azərbaycan Prezidenti İlham Əliyev cənablarının müdrik siyasətidir. Bu "Böyük Ermənistan" xülyasına, "24 aprel" stereotipinin ağ yalanlarına 44 gün ərzində son qoyulan Qalib Liderimizin diplomatik siyasətidir. Bu, xalq-dövlət birliyinin, inamının, Ali Baş Komandanın, Azərbaycan Prezidentinin “Dəmir yumruq” siyasətinin, xalq-iqtidar-ordu birliyinin həqiqətidir. Bu qələbədə bütün şəhidlərimizin, Xocalı soyqırımı, 31 mart soyqırımı şəhidlərimizin qanı yerdə qalmadı, Azərbaycan yeni reallıq yaratdı, Ermənistanın kapitulyasiyası oldu. Azərbaycan Prezidenti, Ali Baş Komandan İlham Əliyev cənablarının dediyi kimi: “Ermənistan məğlub edilmiş ölkədir. Azərbaycan zəfər çalmış ölkədir, Siz isə öz miskin həyatınızın sonuna qədər məğlub edilmiş, qorxaq damğası ilə yaşayacaqsınız”.

Bax, budur, həqiqət! Ancaq son hadisələr göstərir ki, hətta müharibədə rüsvayçı məğlubiyyətindən sonra belə bu ölkə yenə də müstəqil siyasi qərarlar qəbul etmək imkanlarından çox uzaqdır. Bu gün Qarabağa hansısa statusun verilməsi ümumiyyətlə, mümkün deyil. Bunun heç bir siyasi və ya hüquqi əsası yoxdur. Çünki bu gün qalib lider Prezident İlham Əliyevin irəli sürdüyü şərtlər qəbul edilir Paşinyan və Ermənistan yeni reallıqları qəbul etməli, həmin reallıqlarla barışmalıdır. Çünki Azərbaycan qalib ölkədir və bundan sonra diktə edən tərəf də hər zaman Azərbaycan olacaq! Hər kəs həqiqəti bilməli və görməlidir. Və bu gün bir daha böyük qürur və fəxarətlə deyirəm: Cənab İlham Əliyev xalqımızın alternativsiz lideri, yeganə inam ünvanıdır, xilaskardır, qəhrəmandır. Prezident İlham Əliyevin adı xalqımız, dövlətimiz var olduqca, əsrlər boyu tarixdə ən böyük xilaskar, qəhrəman kimi anılacaqdır!

## “Müttəfiqlik Bəyannaməsi” regionda yeni siyasi mühit formalaşdırır

“Moskva Bəyannaməsi Azərbaycan və Rusiya arasında münasibətləri keyfiyyətcə yeni müttəfiqlik səviyyəsinə yüksəldir və qarşıda dayanan digər mühüm perspekktivləri müəyyənləşdirir”. Bu fikirləri SİA-ya “Modern ailə və inkişaf” İctimai Birliyinin sədri Zərifə Quliyeva bildirib. Onun sözlərinə görə, fevralın 22-də, Moskvaya səfər çərçivəsində Azərbaycan Prezidenti İlham Əliyev və Rusiya Prezidenti Vladimir Putin “Azərbaycan Respublikası ilə Rusiya Federasiyası arasında müttəfiqlik qarşılıqlı fəaliyyəti haqqında” Bəyannaməni imzalamaları Azərbaycanıa Rusiya arasındakı strateji əməkdaşlığı və qarşılıqlı münasibətləri daha da mütəşəkkil hala gətirdi, onu müttəfiqliyə qədər inkişaf etdirdi.

Zərifə Quliyeva əlavə etdi ki, bu uğurların təməlində dayanan daha bir mühüm amil Prezident İlham Əliyev cənablarının siyasi iradəsi və qətiyyətli siyasəti reallığı dayanır: “Əbəs deyil ki, Vətən müharibəsində əldə eidlən Zəfərdən sonra Prezident İlham Əliyev bölgədə sülh və inkişaf naminə yeni səhifənin açıldığını bəyan etdi, dövlətimizin başçısı regionda yaranmış yeni reallıqdan Ermənistanın da yararlanması üçün yeni fürsətlərin olduğunu da vurğuladı. Lakin qarşı tərəf bu fürsətdən yararlanmağı bacarmadı və elə sandı ki, regionda Rusiyanın yeganə müttəfiqi məhz İrəvandır. Lakin yalındı və bu bu gün ortada olan amillər sübut edir ki, regionda yeni çağırışlar mövcuddur və bu çağırışların mühüm tərkib hissəsindən biri də Moskva Bəyannaməsinin imzalanması ilə təsdiq olundu. Bu platforma bölgədə dayanıqlı sülh, əmin-amanlıq, təhlükəsizlik və inkişaf üçün zəmanət olmaqla, bölgə ölkələri arasında əməkdaşlığı daha da möhkəmləndirəcəkdir”.

“Bununla Rusiya-Azərbaycan münasibətlərində yeni səhifə açılır, yeni perspektivlər yaranır və hər iki ölkə arasında əlaqələr daha sürətlə inkişaf edəcək”, deyən Zərifə Quliyeva onu da qeyd edib ki, Moskva Bəyannaməsi Azərbaycan dövlətinin və xalqımızın milli maraq və mənafeyinə tam cavab verir. Belə ki, Bəyannamənin 2-ci maddəsində qeyd edilir ki, Rusiya və Azərbaycan öz milli maraqlarına uyğun və onun müdafiəsinə yönəlmiş müstəqil siyasət həyata keçirir. Bəyannamənin gələcəkdə

yarana biləcək hər bir təhlükə və təhdidin qarşısının alınmasında mühüm əhəmiyyəti var: “Prezidentimiz də Bəyannamənin əhəmiyyətini xüsusi vurğulayıb, onun siyasi, iqtisadi və humanitar sahələri əhatə etdiyini bildirib. Rusiya dünyanın ən güclü və söz sahibi olan dövlətlərindən biridir. Bir sözlə, beynəlxalq hüquq və normaları əsasında hazırlanmış Moskva Bəyannaməsi ilə Azərbaycan və Rusiya arasında münasibətləri keyfiyyətcə yeni - müttəfiqlik səviyyəsinə yüksəldir. Tərəflər arasında bərabərhüquqlu münasibətləri yüksək səviyyədə tənzimləyən bu Bəyannaməyə əsasən, münasibətlərin hər iki ölkənin müstəqilliyinə, dövlət suverenliyinə, ərazi bütövlüyünə, sərhədlərin toxunulmazlığına qarşılıqlı hörmət, bir-birinin daxili işlərinə qarışmamaq, qarşılıqlı fayda, güc tətbiq etməmək və güclə hədələməmək prinsipləri üzərində qurulmasına dair Azərbaycan və Rusiya konkret öhdəlik götürür. Ümumiyyətlə, həm Şuşa Bəyannaməsi, həm də Moskva Bəyannaməsi Azərbaycanı getdikcə dünyada artan qlobal təhlükə və təhdidlərdən müdafiə etmək üçün ali sənədlərdir. Azərbaycanın milli maraqlarının əks olunduğu əməkdaşlıq nümunələri dövlətimizin gələcəyi üçün ciddi töhfələrdir. Tükiyə ilə imzalanmış Şuşa Bəyənnaməsi kimi, Rusiya ilə imzalanmış Moskva Bəyənnaməsi də Azərbaycanın ərazi bütövlüyünə, müstəqilliyinə və təhlükəsizliyinə zəmanət verir. 44 günlük Vətən müharibəsində Qələbəmizdən sonra Cənubi Qafqazda formalaşmanın yeni siyasi əsas oyunçuları Azərbyacan, Türkiyə və Rusiyadır. Bu mənada, Azərbaycan hər iki ölkə ilə müttəfiqlik Bəyannamələrini imzalanması yeni siyasi mühitin yarandığını rəsmən təsdiq edir”.

## 11 aprel – Xalqın Prezidentinə güvənini bir daha müəyyənləşdirən tarix

Hər bir xalqın yüksəliş salnaməsində, dövlətin inkişafında dahi şəxsiyyətlərin, siyasi liderlərin çox böyük rolu olub. Həmin şəxsiyyətlərin öz xalqı, dövləti üçün misilsiz xidmətləri əsrlərin və nəsillərin yaddaşına əbədi həkk olunub. Azərbaycanı tarixin ən qüdrətli dövlətinə çevirən, xalqın 30 illik ən böyük problemi olan Dağlıq Qarabağ münaqişəsini hərb yolu ilə həll edərək adını tarixə qızıl hərflərlə yazdıran İlham Əliyev məhz belə liderlərdəndir. 11 aprel 2018-ci il tariximizin növbəti mühüm dönüş nöqtəsinə, yeni parlaq səhifəsinin ilk sətirlərinin yazıldığı günə çevrildi. 11 apreldə keçirilən prezident seçkilərində xalqımız inandığı, sevdiyi şəxsiyyətə – İlham Əliyevə yenidən möhtəşəm güvəncini nümayiş etdirərək ən ali postu ona həvalə etdi. Bu şanlı missiyanın başlanğıc mərhələsi isə 2003-cü ilin 15 oktyabrı idi. Vətəndaşlarımız İlham Əliyevi öz rəhbəri seçərək milli dövlətçilik tarixinin daha bir doğru qərarını verdi, 15 oktyabr gününü tale gününə, əsrə bərabər gününə çevirdi. O gündən keçən 18 il ərzində Prezident İlham Əliyev əslində, lider böhranının yaşandığı müasir dünyamızda öz şəxsi nümunəsi ilə yeni dövrün əsl liderinin, kamil dövlət adamının mükəmməl obrazını yaratdı və Azərbaycana rəhbərlik etdiyi illərin hər günü bu dövlətə, bu cəmiyyətə qazandırdığı nailiyyətlərlə mahiyyətcə əsrə bərabərdir. Onun hakimiyyət dövrü Azərbaycanın dinamik inkişaf, sürətli modernləşmə mənzərəsidir.

18 illik tarixi təcrübə bunu təkrar-təkrar sübuta yetirib. Prezident İlham Əliyev ölkəmizin milli mənafelərini hər zaman, hər yerdə, bütün səviyyələrdə qətiyyətlə qoruyur, müstəqil xarici siyasət yürüdür. Bütün məsələlərlə bağlı Azərbaycan Prezidentinin öz fikri, öz sözü, öz mövqeyi var! Bu, eyni zamanda Azərbaycan xalqının fikridir, sözüdür, mövqeyidir! Bütün qərarlarında o, xalqın rəyini ifadə edir, vətəndaşlarımızın dəstəyinə güvənir. "Mən hər bir Azərbaycan vətəndaşının prezidenti olacağam" – Prezident kimi ilk andiçmə mərasimində cənab İlham Əliyevin ölkə vətəndaşları qarşısındakı əsas sözü bu olmuşdu. O, 18 ilin hər günündə bu sözünü tutdu. Nəinki hər bir vətəndaşımızın, özünü Azərbaycana bağlı sanan hər kəsin ümid yerinə çevrildi. İnsanlarımızın təhlükəsizliyi, firavan

həyatı, inkişafı məramı ilə gördüyü işlərdən, atdığı ardıcıl addımlardan cəmiyyətimizin hər bir üzvü bəhrələnə bildi və bəhrələnməkdədir. 2018-ci il aprelin 11-də keçirilən prezident seçkilərində İlham Əliyevin xalqın 86,02 faizinin etimadını qazanaraq növbəti müddətə Azərbaycan Prezidenti seçilməsi məhz bu sevginin, inamın əyani təzahürü idi. Xalq növbəti dəfə İlham Əliyevi alternativsiz lider kimi qəbul edərək onu özünə rəhbər seçdi və bu günədək baş verən proseslər xalqın seçiminin nə dərəcədə doğru olduğunu göstərdi.

Bu gün ölkəmizdə gedən prosesləri izləyən və bu proseslərə vicdanla yanaşan hər bir siyasətçi etiraf edir ki, Azərbaycan cəmiyyətində demokratiyanın təməl prinsipləri mövcuddur və yaradıcılıqla inkişaf etdirilməkdədir: "Aşkarlıq, şəffaflıq, söz, mətbuat, etiqad azadlıqları Azərbaycan Konstitusiyası ilə təsbit olunmuş və dövlətimizin fəaliyyətinin prioritet cəhətlərindən biri kimi vətəndaşların həyatında əksini tapmaqdadır. Bu seçkilər həm də onu sübut etdi ki, bu gün Azərbaycanda cənab İlham Əliyevin qarşısına rəqib kimi çıxmağa, onunla seçki yarışına girməyə hazır olan siyasətçi yoxdur. Elə Cənab İlham Əliyevin 3 milyon 397 min 664 (86.03 faiz) seçicinin səsini qazanması bunu təsdiqləyən faktdır.

### *Baş sərkərdənin tarixi zəfəri*

Ən nəhayət, Prezident, Ali Baş Komandan İlham Əliyev verdiyi vədi gerçəkləşdirdi. Dörd il öncə andiçmə mərasimində Prezident bəyan etdi ki, Azərbaycan xalqı heç vaxt bu işğal faktı ilə barışmayacaq və torpaqlarımız düşmən tapdağından azad ediləcək. Buna nail olmaq üçün daha da güclü olmalıyıq və olacağıq. 2020-ci il sentyabrın 27-də əks-hücum əməliyyatları ilə başlayan Vətən müharibəsi düşmənə tarixinin ən ağır zərbəsini vurdu. Düzdür, bu savaş zamanı Azərbaycana böyük təzyiqlər də göstərildi. Ancaq qətiyyətli siyasi iradə nümayiş etdirən Prezident İlham Əliyev bütün təzyiqlərə mərdanə şəkildə sinə gərərək, öz prinsipial mövqeyindən dönmədi. Dövlət başçısı əldə olunan Qələbə zamanı xalqa müraciətində də bildirmişdir ki, Azərbaycanda bundan sonra da Heydər Əliyevin siyasətini davam etdirəcək: "Azərbaycanı qüdrətli dövlətə çevirmək üçün ən başlıcası, ölkədə Heydər Əliyevin siyasəti davam etdirilməlidir. Bu gün yüksək kürsüdən çıxış edərkən mən Azərbaycan xalqına söz verirəm ki, bu siyasətə sadiq qalacağam, heç vaxt bu yoldan dönməyəcəyəm,

Heydər Əliyevin siyasətini davam etdirəcəyəm", – deyərək son 18 illik Prezidentlik fəaliyyətinin nəticəsidir ki, son 30 il ərzində həsrətində olduğumuz Qarabağ Azərbaycandır!ımıza, haqq və şərəf işimiz olan, Azərbaycan Respublikamızın suverenliyi və ərazi bütövlüyümüzə və nəhayət, Qələbə Zəfərimizə nail olduq! Məhz hər sözü, hər vədi reallığa çevirən hər bir azərbaycanlı dünyanın harasında olmasından, harada yaşamasından asılı olmayaraq, öz dövləti, öz Prezidenti və Onun zəfərləri ilə haqlı olaraq qürur duyur, azərbaycanlı olmağı ilə fəxr edir. Çünki 28 illik "kaş ki..." arzularımız reallaşdı. Xüsusilə də, Novruz tonqallarımız arzusunda olduğumuz Şuşamızda, Cıdır düzündə qalandı. Bu xoşbəxtliyi, bu qüruru qətiyyətli Lider, müzəffər Ordu, yenilməz xalq birliyi verdi və Azərbaycanın yeni və möhtəşəm tarixini yazdı.

Müdriklərin fikirlərinə görə, «rəhbərin ən böyük qələbəsi xalqın etimadı, inamı və sevgisidir». Bəli, Azərbaycan xalqı 11 aprel prezident seçkilərində alternativsiz liderinə olan böyük inam və sarsılmaz dəstəyini bir daha nümayiş etdirdi. Bir sözlə, 2018-ci il aprelin 11-də böyük etimad göstərərək İlham Əliyevi özünə lider seçən xalq bir daha seçimində yanılmadığını gördü. Hər bir vətəndaş əmin oldu ki, Azərbaycanı tarixinin ən qüdrətli dövlətinə çevirən İlham Əliyev ölkəmizi daha parlaq gələcəyə aparacaq alternativsiz liderdir. Azərbaycan xalqı əmindir ki, onun taleyi etibarlı əllərdədir, sabahımız bu günümüzdən daha gözəl və firavan olacaqdır.

## Xalqa milli qürurunu qaytaran LİDER

2020-ci ildə 44 günlük Vətən müharibəsində əldə olunan şanlı qələbədən sonra növbəti mərhələ Qarabağın dirçəldilməsi və bölgədə tikinti-quruculuq işlərinin aparılmasıdır. Dövlət tərəfindən "Böyük Qayıdış" planına uyğun olaraq məcburi köçkünlərin doğma yurd-yuvalarına ən qısa zamanda qayıtması üçün bütün imkanlar səfərbər edilib. Həmin ərazilərdə yeni yaşayış məntəqələrinin salınması, infrastrukturun bərpası, yolların çəkilişi, məktəb, xəstəxana tikintisi sürətlə davam edir, artıq sakinlər doğma yurd-yuvalarına köçürülür.

Prezident İlham Əliyev oktyabrın 17-də "Füzuli Şəhəri Günü"ndə Füzuli şəhərinə köçmüş sakinlər və rayon ictimaiyyətinin nümayəndələri ilə görüşündə deyib: «Gənc füzulililərin öz doğma torpağına qayıtması xalqımızın böyüklüyünü göstərir».

Dövlətimizin başçısı bildirib ki, uşaqlar, yeniyetmələr, gənc nəsil bu torpaqları görməyiblər. Bu, (füzulililərin gənc nəslinin də öz doğma torpağına gəlməyə qərar verməsi – red.) xalqımızın böyüklüyünü göstərir. Onu göstərir ki, biz öz doğma diyarımıza bağlı olan xalqıq.

Bəli, qələbəmizdən keçən üç il ərzində işğaldan azad edilmiş ərazilərimizdə böyük tarixi günlərin qeyd olunması və Qalib Liderimiz, Müzəffər Ali Baş Komandan, Prezident İlham Əliyevin bu məkanlardan mesajlarını çatdırması hər birimizi qalib ölkənin qalib xalqı kimi qürurlandırır.

Qalib Liderimiz İlham Əliyev cənablarının ilk dəfə Prezident seçilməsinin 20-ci ildönümündə – istər oktyabrın 15-də Xankəndidə, Xocalıda, Ağdərədə, Xocavənddə, Əsgəranda Azərbaycan bayrağını ucaltması, istərsə də oktyabrın 17-də "Füzuli Şəhəri Günü"ndə Füzuli şəhərinə köçmüş sakinlər və rayon ictimaiyyətinin nümayəndələri ilə görüşü 20 il bundan öncə Ümummilli Liderimizin və xalqımızın ona olan inamını, etimadını doğrultdu, verdiyi bütün vədləri yerinə yetirdi. 30 il xalqımız bütün bayramlarda, tarixi günlərdə bu arzunu ifadə edirdi: "Gün gələcək üçrəngli bayrağımız Şuşada, Xankəndidə dalğalanacaq. Köçkünlərimiz öz dədə-baba yurdlarına qayıdacaq». Və bu gün arzuları gerçəkliyə çevirən Prezident İlham Əliyevin Azərbaycan Bayrağını bu məkanlarda ucaldarkən, söydaşlarımızın doğma yurdlarına qayıdarkən keçirdiyi qürur hissi

hər birimizi qürurlandırır. Dövlətimizin başçısı Xankəndidən bu mesajı ünvanladı: “Mən nəyi demişəmsə, onu da etmişəm, bunu hər kəs bilir, o cümlədən Ermənistanda da bunu bilirlər və bunu unutmasınlar. Vətən müharibəsini unutmasınlar! Antiterror tədbirlərini unutmasınlar! Əgər yenə də Ermənistanda hansısa qüvvə revanş haqqında düşünürsə, bax, bu kadrlara yaxşı baxsın”.

Son 20 il Prezidentlik fəaliyyəti ərzində Ali Baş Komandanımız “bir qarış torpağımızı belə heç kəsə verən deyilik” xəbərdarlığının bu gün Azərbaycan xalqı, bütün dünya bir daha gördü ki, Qarabağ Azərbaycandır!

«Qarabağ Azərbaycandır və nida» ifadəsi artıq bizim qələbəmizin rəmzinə çevrilib. Bir il bundan əvvəl mən bunu demişəm. Mən fəxr edirəm ki, mənim dediyim ifadə artıq bir milli şüara çevrildi»- deyən Müzəffər Ali Baş Komandan bu gün apardığı uğurlu, diplomatik siyasəti ilə sübut etdi: "Bu gün böyük qürur hissi ilə deyə bilərik ki, Füzuli bizimdir, Cəbrayıl bizimdir! Zəngilan bizimdir! Qubadlı bizimdir! Ağdam bizimdir! Laçın bizimdir! Kəlbəcər bizimdir! Şuşa bizimdir! Qarabağ bizimdir! Qarabağ Azərbaycandır! Eşq olsun Azərbaycan xalqına! Yaşasın Azərbaycan!".

Bəli, bütün dünya dövlətləri və xalqları bir daha gördü ki, 2003-cü il 15 oktyabr prezident seçkisi xalqımızın öz liderinə sevgisinin, inamının nümayişi oldu. 20 il bundan əvvəl Prezident seçilən İlham Əliyev Azərbaycan xalqının və Azərbaycan dövlətinin milli maraqlarını müdafiə edəcəyinə və ərazi bütövlüyümüzü qoruyacağına söz vermişdir: “Azərbaycan xalqı hər gün, hər saat öz müqəddəs məqsədinə doğru gedirdi. Hər gün Azərbaycan xalqı müqəddəs anı yaxınlaşdırırdı. İyirmi il bundan əvvəl Prezident kimi öz vəzifə borcunu yerinə yetirməyə başlayan dövlət başçısı İlham Əliyev qarşısına prioritet vəzifə qoymuşdur ki, Azərbaycan Bayrağı o vaxt işğal altında olan bütün ərazilərdə, torpaqlarda, şəhər və kəndlərdə qaldırılsın. Bu gün həmin qürurlu anların sevincini və xoşbəxtliyini yaşayırıq. Müzəffər Ali Baş Komandan bir daha nəyi, necə, nə vaxt etmək lazım olduğunu nümayiş etdirdi. İşğaldan azad olunmuş torpaqlarda dalğalanan üçrəngli bayrağımız qürurumuz, kimliyimiz və dünyaya ünvanlanan bu mesajımızdır ki, bu torpaqlar bizimdir və burada əbədi olacağıq. Bu gün Xankəndinin mərkəzində, Azərbaycan Gerbi, Bayrağı altında olmaq böyük xoşbəxtlikdir və tarixi hadisədir. Bu Qələbə tariximizdə əbədi olacaq. Yeni nəsillər bu Qələbə ilə əbədi və haqlı olaraq fəxr edəcəklər”.

Digər bir məqam isə dövlət başçımız İlham Əliyevin "Azərbaycan Respublikasının işğaldan azad edilmiş əraziləri üzrə şəhər günlərinin təsis edilməsi haqqında" Sərəncamına uyğun olaraq "Füzuli Şəhəri Günü"dür: Bu mühüm sənəd Zəfərimizin əbədiləşdirilməsinə və şəhər günlərinin təsis edilməsinə xidmət edir. Bu qürur günümüzdür. Bu qürur günündə Ali Baş Komandanımız Füzuli rayonuna səfəri və səfər çərçivəsində Cuvarlı, Qoçəhmədli kəndlərinin, Füzuli şəhərində idman kompleksinin, ikinci, üçüncü, yaşayış komplekslərinin, 240 yerlik uşaq bağçasının, inzibati binanın təməlini qoyması, bir sözlə, Azərbaycan xalqının onilliklər ərzində olan arzularının çin olmasının təsdiqidir.

"Füzuli indi tamamilə yenidən qurulur. Dünən burada olarkən bir neçə önəmli obyektin təməlini qoyduq. İki kəndin, uşaq bağçasının, idman kompleksinin, yeni yaşayış məhəllələrinin, inzibati mərkəzin təməli qoyuldu" – deyən dövlət başçımız bildirib ki, "aylar keçdikcə burada yaşayanların sayı da təbii ki, artacaq. Mənə dünən məlumat verildi ki, 800-dən çox insan artıq yerləşib. İlin sonuna qədər burada təqribən 2 minə yaxın insan yaşayacaq. Böyük Qayıdış Proqramımızın birinci mərhələsinin sonunda – 2026-cı ilin sonunda 22 min insan Füzuli rayonunda yaşayacaq".

Həmçinin, Prezident İlham Əliyev oktyabrın 17-də "Füzuli Şəhəri Günü"ndə Füzuli şəhərinə köçmüş sakinlər və rayon ictimaiyyətinin nümayəndələri ilə görüşündə bildirib ki, bu qələbəni bizə yaşadan qəhrəman əsgər və zabitlərimizin qəhrəmanlığının əbədi olaraq qəlbimizdə yaşayacaq: "Onların (şəhidlərin – red.) qəhrəmanlığı unudulmazdır, belə ağır coğrafi məkanda bu tarixi Qələbəni qazanmağın misli-bərabəri yoxdur".

Bəli, bu gün artıq Prezident İlham Əliyevin rəhbərliyi və qətiyyəti ilə işğaldan azad olunmuş ərazilərin bərpası istiqamətində həyata keçirilən işlər və tədbirlər, atılan addımlar Qarabağın cənnətə çevirilməsinə hədəflənmişdir. Ancaq mənfur düşmən unutmamalıdır, necə ki, Azərbaycan Prezidenti cənab İlham Əliyev illərlə işğal siyasətinə son qoymaq üçün qətiyyət, iradə və prinsipiallıq nümayiş etdirdisə, indi də atdığı düşünülmüş və sistematik addımlar Qarabağın qısa zaman kəsiyində dirçəldilməsinə istiqamətlənib. Məhz buna görə də, qaçqın və məcburi köçkünlər əmindirlər ki, onlar Cənab Prezident İlham Əliyevin həyata keçirdiyi uğurlu siyasət sayəsində doğma yurdlarına qayıdacaqlar. O gün uzaqda deyil.

Bir sözlə, sözü ilə əməli üst-üstə düşən, imzası qədər dəyərli olan Azərbaycan Prezidenti İlham Əliyevin dediyi kimi: "Bizim sözümüz imzamız qədər keçərlidir, keçərli olduğu qədər həm də dəyərlidir". Çünki Qalib Liderimiz nəyi, nə vaxt və necə etməyi özü bilir. Ali Baş Komandan, Prezident İlham Əliyevin "Füzuli Şəhər Günü"ndə Füzuliyə səfəri və səfər zamanı verdiyi mesajlar bir daha sübut edir ki, işğalçı ölkə ölkə nə qədər təxribat aparsa da, qalib liderimiz Prezident İlham Əliyev siyasətinin qətiyyətli və cəsarətli siyasəti nəticəsində Ermənistan reallıqlarla hesablaşmalıdır və istəsə də, istəməsə də yeni reallıqları qəbul etməlidir. Heç vaxt unutmamalıdır ki, "Dəmir yumruq" yerindədir. Nə qədər gec deyil, Ermənistan və onun havadarları regionun yeganə Qalib liderinin sözünə qulaq versin!

## Çoxlarının qeyri-mümkün hesab etdiyi münaqişə cəmi 44 günə həll olundu

Azərbaycanı tarixinin ən qüdrətli dövlətinə çevirən, xalqın 30 illik həsrətinə son qoyan Ali Baş Komandan İlham Əliyev xilaskar liderdir. Çünki məhz İlham Əliyevin Sərkərdəliyi ilə çoxlarının qeyri-mümkün hesab etdiyi Qarabağ münaqişəsi cəmi 44 günə həll olundu. Uzun illər dünya dövlətlərinin əksəriyyətinin himayə etdiyi işğalçı Ermənistan İlham Əliyevin hərbi-siyasi diplomatiyası qarşısında diz çökdü.

Prezident İlham Əliyev Ümummilli Lider Heydər Əliyevin 100 illik yubileyi münasibətilə Azərbaycanın mədəniyyət paytaxtı olan Şuşadan Azərbaycan xalqına müraciətində söyləyib ki, İkinci Qarabağ müharibəsindəki Qələbə bizim tarixi uğurumuzdur, tarixi Zəfərimizdir. Bu Zəfər Azərbaycan durduqca qalacaq, bizim qəlbimizdə, yaddaşımızda, kitablarda, əsərlərdə. Dövlətimizin başçısı deyib ki, bu, qəhrəmanlıq dastanıdır, bu, misli görünməmiş qəhrəmanlıqdır: "İkinci Qarabağ müharibəsi bütün dünyaya Azərbaycan xalqının əyilməz ruhunu göstərdi. Bizi qabağa aparan məhz bu idi".

Bəli, İkinci Qarabağ müharibəsindəki Qələbə bizim tarixi uğurumuzdur, tarixi Zəfərimizdir. Qələbəmizin hər ilini böyük uğurla başa vururuq. Böyük qürur hissi keçiririk ki, bu qələbə və uğurlar Azərbaycan Prezidenti, Ali Baş Komandan İlham Əliyev tərəfindən son 20 il ərzində həyata keçirilən “Güclü ordu – güclü dövlət” strategiyasının və “Dəmir yumruq” əməliyyatı ilə 44 gün davam edən Vətən müharibəsində Azərbaycan Ordusu yüksək döyüş bacarığının bütün dünyaya nümayişi idi. Bu, həm də bir daha nümayiş etdirdi ki, güclü, qüdrətli, yüz minlik ordunu heç kim dayandıra bilməz! Çünki bizim ordumuz öz gücünü paradda yox, döyüş meydanında da göstərib: “Bizim ordumuz döyüşüb, bizim ordumuz öz gücünü paradda yox, döyüş meydanında göstərib. 44 gün ərzində bir nəfər də olsun geri addım atmayıb, bir nəfər də olsun fərari olmayıb. Bizim ordumuz budur. Bizim xalqımız budur. Çünki ordu xalqın bir hissəsidir. Orduda xidmət edən xalqın övladlarıdır, bizim yetişdirdiyimiz uşaqlardır”.

Məhz qalib sərkərdəmiz 2020-ci ildə Vətən müharibəsində “Dəmir yumruq” əməliyyatı ilə cəmi 44 günə Ermənistan diz çökdürüldü, 30 illik həsrətə son qoyaraq bu gün Xankəndidə üçrəngli Bayrağımız ucalır. Xankəndidə dövlət bayrağını qürurla qaldıran Qalib sərkərdəmiz, Prezident İlham Əliyevin də dediyi kimi, bu gün bütün Azərbaycan xalqı ürəkdən sevinir, bütün Azərbaycan xalqı “Allaha şükür” deyir. Bu qüruru, sevinci bizə yaşadan, qalib Azərbaycanın memarı müzəffər Ali Baş Komandan İlham Əliyevdir. 20 il ərzində həyata keçirilən siyasətin yalnız bir amalı, məqsədi vardı - işğal faktına son qoyaraq suverenliyimizin tam bərpasıdır. Dünya Azərbaycanın gücünə, qüdrətinə şahidlik etdi.

Bu gün məğlub Ermənistan sülh müqaviləsi bağlamağa hazır olduğunu bildirərək vaxt istədi. Amma yenə də erməni məkri özünü büruzə verdi və havadarlarına arxalanan Ermənistan həm sülh müqaviləsi imzalamaqdan boyun qaçırır. Nə vaxta kimi? Nəticə nə oldu? Bu il sentyabrın 19-da Azərbaycan Silahlı Qüvvələri antiterror tədbirləri nəticəsində separatçıları 23 saat ərzində məhv etdi və qondarma qurum ləğv edildi, oktyabrın 15-də tariximizə daha bir şanlı səhifə yazıldı. Oktyabrın 15-də Müzəffər Ali Baş Komandan üçrəngli məğrur bayrağımızı Xankəndidə, Xocalıda, Xocavənd şəhərində dalğalandırdı. Bununla da Azərbaycanın suverenliyi tam təmin edildi.

Qalib sərkərdəmiz İlham Əliyev Xankəndidə bayrağımızı ucaltdıqdan sonra xalqa müraciətində dedi: “İyirmi il bundan əvvəl Prezident kimi öz vəzifə borcumu yerinə yetirməyə başlayanda qarşıma bir nömrəli vəzifə qoymuşdum ki, Azərbaycan bayrağı o vaxt işğal altında olan bütün ərazilərdə, bütün torpaqlarda, bütün şəhər və kəndlərdə qaldırılsın. Bu meydanda bu gün durmaq böyük xoşbəxtlikdir, böyük fərəhdir, qürur mənbəyidir. Mən qürur hissi ilə Azərbaycan bayrağını bu gün qaldırmışam və doğma xalqıma bir daha demək istəyirəm ki, biz bu Qələbəyə layiqik. Azərbaycan xalqı bu Qələbəni öz qanı, canı bahasına əldə etmişdir. Bu gün burada qaldırdığım bayraq burada əbədi dalğalanacaq və biz burada əbədi yaşayacağıq. Qarabağ bizimdir, Qarabağ Azərbaycandır!”

Bəli, bu gün Qalib Sərkərdə vaxtilə xalqımıza qarşı etnik təmizləmə siyasətinin başladığı meydanda dalğalanan Azərbaycan bayrağının kölgəsində xalqı qarşısında qürurla, alnıaçıq şəkildə səmimi duyğuları ilə hesabat verir. Bütün bu nailiyyətlər isə Prezident, Ali Baş Komandan

İlham Əliyevin qalib ölkənin, qalib sərkərdəlik məharəti, güclü iradəsi və qətiyyəti, nəhayət diplmatik siyasətinin reallığı, xalqımızın alternativsiz lideri, yeganə inam ünvanıdır, xilaskardır, qəhrəmandır. Prezident İlham Əliyevin adı xalqımız, dövlətimiz var olduqca, əsrlər boyu tarixdə ən böyük Xilaskar, Qəhrəman kimi anılacaqdır!

## 8 noyabr Zəfər Günü – ədalətin və bütövlüyümüzün Qələbəsi

"Güclü ölkənin güclü, qətiyyətli lideri də güclü olur. Bu gün müstəqil Azərbaycanı güclü edən, onu sabitlik məkanına çevirən əsas amil məhz xalqımızın ölkə Prezidenti, Ali Baş Komandan cənab İlham Əliyev tərəfindən uğurla davam və inkişaf etdirilən Ulu Öndər Heydər Əliyev ideyalarına olan sonsuz sədaqətidir. Məhz elə buna görədir ki, 20 il əvvəl "Mən hər bir Azərbaycan vətəndaşının prezidenti olacağam" məramı ilə Prezident İlham Əliyevin həyatı xalqına və Vətəninə həsr olunmuş əsl LİDER ömrüdür.

İlham Əliyev Ulu Öndərimizin "Xalq dövlət üçün yox, dövlət xalq üçün olmalıdır" fikirlərini reallığa çevirərək bir daha sübut etdi ki, o, məhz Vətəninin, xalqının rifahı üçün yaşayan LİDERDİR. Bu gün Prezidentimiz, Ali Baş Komandanımız İlham Əliyev cənablarının rəhbərliyi ilə rəşadətli Azərbaycan əsgəri qəhrəmancasına döyüşə-döyüşə bərkiyərək Ordumuzun gücü ilə Azərbaycan tarixinə qələbələr yazır. Bu gün böyük sevinc və qürurla hər günü bir əsrə bərabər olan 44 günlük qələbəmizin bir ilinin – 8 noyabr, 2020-ci il Zəfər Günümüzün qeyd olunduğu gündür. Bu 30 illik arzularımızın, xəyallarımızın, yuxularımızın gerçəyə çevrildiyi, Qarabağa qovuşduğumuz Qələbə tariximiz, Zəfər Günümüzdür.

Müzəffər Ordumuz 44 gün ərzində döyüş meydanında gücünü göstərdi və qəhrəmanlıqla savaşaraq qələbə qazandı. Ali Baş Komandanımızın qətiyyətli mövqeyi, Azərbaycan əsgərinin rəşadəti, şücaəti, xalqımızın birliyi, həmrəyliyi nəticəsində düşmənin müqaviməti qırıldı və 8 noyabr şanlı tariximizə Qələbə Günü kimi yazıldı. Qarabağın tacı, ölkəmizin ən dilbər guşələrindən biri, muğamımızın beşiyi Şuşa mənfur düşmən tapdağından qurtuldu. 10 noyabr gecəsi isə Azərbaycan Silahlı Qüvvələrinin Ali Baş Komandanı İlham Əliyev doğma xalqını böyük zəfər xəbəri ilə müjdələdi: "Bu gün ölkəmiz üçün tarixi bir gündür. Bu gün Ermənistan-Azərbaycan Dağlıq Qarabağ münaqişəsinə son qoyulur. Hesab edirəm ki, indicə imzalanmış üçtərəfli bəyanat məsələnin həlli istiqamətində son nöqtə olacaqdır".

Bəli, 8 noyabr Dağlıq Qarabağ münaqişəsinə nöqtə qoyulduğu gün oldu. "Qarabağ Azərbaycandır!" reallığı 44 gündə mümkünsüzü mümkün etdi. Ermənistanın hərbi kaputilyasiyasına nail olduq! Bəşəriyyətə haqqın, ədalətin böyük dövlətlərin tapdağından qurtara biləcək bir dövlətin - Azərbaycanın var olduğunu sübut etdik. Bu ədaləti 44 gün ərzində yazan Azərbaycan xalqı, bütün dünya azərbaycanlıları, bütün Türkiyə xalqı bir yumruq kimi birləşərək təkcə Ermənistanın yox, bütövlükdə haqsız güclərin üstünə getdi və sübut etdi ki, haqq yolunda, ədalətin, ərazi bütövlüyümüzün bərpası uğurunda vuruşuruq. 10 noyabrda Müzəffər Azərbaycan Ordusu cəmi 44 günə hərbi yolla 28 il düşmən torpağında inləyən vətən torpaqlarını işğaldan azad etdi. 44 gündə müzəffər Azərbaycan Ordusu dünyaya sübut etdi ki, döyüş meydanında zəfəri tanklarla, toplarla deyil, ağılla, zəkayla və bir də insan zehninin ən son nailiyyəti olan PUA-larla qazanmaq olar. Şuşa qalasının alınması əməliyyatı isə tamam başqadır. Prezident, Ali Baş Komandan İlham Əliyev xalqa müraciətində bildirdi ki, Şuşanın azad edilməsi dünya hərb tarixində xüsusi yer tutatacaq: "Şuşanın işğaldan azad edilməsi bizim gücümüzü göstərdi. Ordumuzun peşəkarlığını, hərbçilərimizin cəsarətini, qəhrəmanlığını göstərdi. Şuşanın götürülməsi çox böyük peşəkarlıq, cəsarət tələb edən əməliyyat idi. Əminəm ki, bu əməliyyat dünya hərb tarixində xüsusi yer tutacaq. Çünki bu əməliyyatı bizim qəhrəman hərbçilərimiz dağlardan, meşələrdən, cığırlardan keçərək yalnız yüngül silahlarla silahlanmış şəkildə azad ediblər. Şuşanın işğaldan azad edilməsi bizim şanlı qələbəmizdir".

Bəli, Azərbaycan əsgəri əsl qəhrəmanlıq, mərdlik, şücaət, rəşadət nümunəsi göstərdi. Düşmənin 30 il ərzində qurduğu, milyonlarla vəsait sərf etdiyi nəhəng istehkamlar qısa müddətdə darmadağın edildi, müzəffər ordumuzun tətbiq etdiyi savaş strategiyası müasir hərb tarixinə yeni örnək oldu. Belə vəiyyətdə Ermənistanın qarşısında yalnız iki yoldan birini seçmək qalırdı. Ya Ermənistan ordusunun son tör-töküntüləri də döyüş meydanında son nəfərinə qədər məhv ediləcəkdi, ya da "ağ bayraq" qaldırıb, biabırçı hərbi məğlubiyyətini etiraf edəcəkdi. Paşinyan hakimiyyəti reallığı nəhayət ki, qəbul etdi və noyabrın 10-da Ermənistan "ağ bayraq" qaldırdı, kapitulyasiya bəyannaməsini imzalamaqla Qalib Liderimiz, Prezident İlham Əliyevin ən böyük diplomatik qələbəsini

təsdiqlədi. Üçtərəfli bəyanata əsasən Dağlıq Qarabağın heç bir xüsusi statusu olmayacaq. Dağlıq Qarabağ Muxtar Vilayəti də tarixə qovuşdu. Döyüş meydanında darmadağın edilən Ermənistanın Azərbaycan Prezidentinin münaqişənin ilk günlərindən bəyan etdiyi şərtləri qəbul etməkdən başqa çıxış yolu qalmadı. Beləliklə, Paşinyan kapitulyasiya şərtlərinə razılığını verdi. Bu Azərbaycanın tam və şərtsiz qələbəsinin əyani sübutudur. Bu müddət ərzində millətimiz daim vətən həsrəti, sevgisini ürəyində daşıdı, cənab İlham Əliyevə arxalandı və qələbə qazandı. Liderimiz daim çıxışlarında "Biz Qarabağımıza qayıdacağıq, Qarabağ tarixi Azərbaycan torpağıdır" deyirdi. O, ulu öndər Heydər Əliyevə və xalqına verdiyi sözləri tutdu. Ata vəsiyyətini yerinə yetirdi. Ordumuza, eləcə də möhkəm iradəli xalqına inanaraq zəfər qazandı. Bu zəfər asan başa gəlmədi. Daim danışıqlara üstünlük verən dövlətimiz, öz hünərini döyüş meydanında da göstərdi. Bu müddət ərzində digər dövlətlər təzyiq göstərməyə, bəzi sanksiyalar tətbiq etməyə çalışsalar da Azərbaycanımızın üstünlüyünü qəbul etməyə məcbur oldular.

Ölkə Prezidenti İlham Əliyevin xalqa müraciətində səsləndirdiyi bu sözlər hər bir azərbaycanlında böyük sevinc və qürur hisləri yaratdı. Bu böyük qələbə eyni zamanda Azərbaycan xalqını dünyaya qürurlu xalq kimi tanıtdı. "Dağlıq Qarabağ Azərbaycan torpağı, beynəlxalq səviyyədə tanınan ərazimiz olmaqla yanaşı, ədalət məsələsidir, Azərbaycanın milli qürur məsələsidir",-deyən Prezidentimizə olan inamı, sevgini birə beş artırdı. “Mən ona özüm qədər inanıram və gələcəyinə böyük ümidlər bəsləyirəm”. Ulu Öndərin Prezidentimiz İlham Əliyev haqqında dediyi bu fikirlərin hər keçən gün öz təsdiqini tapdığının, hər bir azərbaycanlının Prezidenti olduğunun şahidi olur. Budur, Azərbaycan Prezidenti, Ali Baş Komandanımızın diplomatik siyasəti! Budur, xalqının Prezidenti olmaq! Budur, Liderlik missiyası! Zəfər Günümüz mübarək, Zəfərin mübarək Azərbaycan! Qarabağ Azərbaycandır!

## Qətiyyətin zirvəsi – Qarabağ Azərbaycandır!

Bu gün sözü imzası qədər dəyərli olan Ali Baş Komandan, Prezident İlham Əliyev cənablarının son 20 illik prezidentlik dövründə çoxəsrlik Azərbaycan tarixində xalqımıza Qarabağ Zəfərini bəxş edən, bizi qalib xalqa çevirən Prezidentin dediyi kimi: "Heç kim bizim iradəmizə təsir edə bilməz. Heç kim bizimlə ultimatum dili ilə danışa bilməz". Çünki Müzəffər Ali Baş Komandan, Prezident İlham Əliyevin sözü ilə əməli üst-üstə düşən, imzası qədər dəyərli olan qalib xalqın qalib Lideri nəyi, nə vaxt və necə etməyi özü bilir. Dövlət başçımızın qətiyyətinə və prinsipiallığına inanan Azərbaycan xalqının böyük əksəriyyəti şübhə etmirdi ki, Ali Baş Komandan indiyədək bütün vədlərini yerinə yetirib, dediyi sözlərə əməl edib.

30 ilə yaxın işğal altında olan torpaqlarımızı Azərbaycan Prezidenti, Ali Baş Komandan İlham Əliyev cənablarının rəhbərliyi ilə Müzəffər Azərbaycan Ordusunun qəhrəman əsgər və zabitlərin rəşadəti ilə əzad edildi, ərazi bütövlüyümüz bərpa olundu. Hazırda işğaldan azad olunmuş torpaqlarda görülən uğurlu bərpa-quruculuq işləri göz önündədir. Artıq Xarıbülbül boynunu bükməyib. Qarabağın Azərbaycana məxsusluğunu mədəniyyət müstəvisində bəyan edən "Xarıbülbül" festivalı bərpa olunub. "Şuşasız Qarabağ, Qarabağsız isə, ümumiyyətlə, Azərbaycan yoxdur" deyən Ümummilli Lider Heydər Əliyevin vəsiyyətinə uyğun hakimiyyətdə olduğu 20 il ərzində, hər gün və hər saat Şuşa başda olmaqla işğalda olan bütün əraziləri azad etmək uğrunda mübarizə aparan Prezident İlham Əliyev cənablarının 2022-ci ilin "Şuşa İli" elan edilməsi haqqında Sərəncamı da məhz tarixi hadisədir.

Qələbəmizdən ötən üç ilin hər ili, hər ayı, hər günü uğurlu, tarixi hadisələr kimi yadda qalır. Və bu gün xalqımız Ali Baş Komandanımız, Prezident İlham Əliyevin son 20 illik prezidentlik fəaliyyəti zamanı reallığa çevirdiyi bütün uğurların şahidiyik. Belə ki, 2023-cü il, 15 oktyabr tarixində Ali Baş Komandanımız İlham Əliyev prezident vəzifəsinə seçilməsinin 20-ci ildönümündə oktyabrın 15-də tarixi torpaqlarımız olan Xankəndi, Xocalı, Ağdərə, Xocavənd şəhərlərində və Əsgəran qəsəbəsində üçrəngli bayrağımızı qaldırdığı şərəfli, tarixi gün cənab Prezidentin 20 illik gərgin fəaliyyətinin zəfər zirvəsidir, xalqın öz Lideri ilə həmrəyliyinin,

birliyinin təntənəsi olmaqla bir daha xalqına verdiyi bütün vədləri yerinə yetirmək iqtidarında olmasının hesabatı idi. Son 20 ilin uğurları bir daha sübut etdi ki, onun sözü imzası qədər keçərlidir və nəyi, necə, nə vaxt etmək lazımdır yaxşı bilir. Xüsusilə də, Müzəffər Ali Baş Komandan İlham Əliyev Xankəndidə üçrəngli bayrağımızı qaldırmaqla bir əsrlik erməni saxtakarlığına son qoyulduğunu bütün dünyaya nümayiş etdirdi.

20 il öncə xalqımız etimad mandatı verərək özünə Prezident seçdiyi İlham Əliyevə inandı, güvəndi və səbirlə gözlədi. Azərbaycan Prezidenti də tam müstəqil siyasəti ilə 20 ildə Ermənistanı dünyada işğalçı dövlət kimi tanıda bildi. Məhz uzaqgörən Lider kimi Prezident İlham Əliyev ordumuzun gücünü gündən-günə artırdı. Ən müasir silahlar alındı, gənc nəslin vətənpərvərlik ruhunun yüksəlməsi istiqamətində çox mühüm işlər görüldü. Zaman yetişdi, Azərbaycanın səbir kasası daşdı və 2020-ci ildə Vətən müharibəsində İlham Əliyevin "Dəmir yumruq" əməliyyatı ilə cəmi 44 günə xalqın yurd həsrətinə son qoyuldu. Dünya Azərbaycanın gücünə, qüdrətinə şahidlik etdi.

Prezident İlham Əliyev oktyabrın 15-də Xankəndi şəhərində Azərbaycan Respublikasının Dövlət Bayrağını ucaltdıqdan sonra çıxışı zamanı bildirdi: "Bilirdik ki, biz buraya gələcəyik. Mən bunu bilirdim. Mən düz 20 il bundan əvvəl – 2003-cü il oktyabrın 15-də Azərbaycan xalqına və özümə o sözü vermişdim. Bəli, biz 20 il gözlədik, daha doğrusu 17 il", – deyən dövlətimizin başçısı xatırladaraq üç il bundan əvvəl Şuşada bizim Bayrağımızın qaldırıldığını vurğuladı: "Burada özünü "xarici işlər naziri" adlandırmış bir separatçı o vaxt belə kinayə ilə deyirdi ki, Azərbaycan Bayrağını Xankəndidə qaldırmaq istəyirsə, səfirlik açsın bizim ölkəmizdə. İndi onun da çayı orada, təcridxanada verilir. Bizim Bayrağımız isə bax, oradadır. Bu, dərs olmalıdır onlara. Əfsuslar olsun ki, mənim 20 il bundan əvvəl dediyim və ondan sonra dəfələrlə təkrar etdiyim sözlər onlara çatmadı. Onlar hesab edirdilər ki, bu, sadəcə olaraq, sözdür. Xeyr, mən nəyi demişəmsə, onu da etmişəm, bunu hər kəs bilir, o cümlədən Ermənistanda da bunu bilirlər və bunu unutmasınlar. Vətən müharibəsini unutmasınlar! Antiterror tədbirlərini unutmasınlar!".

Bəli, unutmasınlar ki, bu nailiyyətlər Prezident, Ali Baş Komandan İlham Əliyevin böyük sərkərdəlik məharəti, güclü iradəsi və qətiyyəti, nəhayət, diplmatik siyasətinin reallığıdır. Bu gün Xankəndidə dalğalanan

üçrəngli bayrağımız hər birimiz üçün xoşbəxtlik, fərəh, qürur, ləyaqət, fəxarət salnaməsidir. Dövlət başçımızın söylədiyi kimi: "Əziz həmvətənlər, bu meydanda bu gün durmaq böyük xoşbəxtlikdir, böyük fərəhdir, qürur mənbəyidir. Mən qürur hissi ilə Azərbaycan Bayrağını bu gün qaldırmışam və doğma xalqıma bir daha demək istəyirəm ki, biz bu qələbəyə layiqik. Azərbaycan xalqı bu qələbəni öz qanı-canı bahasına əldə etmişdir. Bu gün burada qaldırdığım bayraq burada əbədi dalğalanacaq və biz burada əbədi yaşayacağıq. Qarabağ bizimdir, Qarabağ Azərbaycandır!"

## Azərbaycanın misilsiz uğurlarında Prezident İlham Əliyev imzası

Bu gün xalqımız Azərbaycan Prezidenti, Ali Baş Komandan Cənab İlham Əliyevin qətiyyəti sayəsində çoxəsrlik tariximizin üçüncü ildir ki, Zəfər Gününü qürurla qeyd edir. Və günün zirvəsindən dönüb ötən 20 ilə nəzər saldıqda qururla qeyd etdiyimiz bu qələbələr, uğurlar Prezident, Ali Baş Komandan cənab İlham Əliyev tərəfindən aparılan məqsədyönlü işlərin, yürüdülən uzaqgörən siyasətinin nəticəsidir. Məhz Azərbaycan xalqı 2003-cü ildə tariximizin yeni mərhələsinin ən mühüm qərarını qəbul edərək, ölkəyə Heydər Əliyev miqyasında siyasətçidən sonra yeni lider və prezident seçərkən özünə xas müdrikliyinə əsaslanan yeganə düzgün seçimini edə bilmişdir. Bu, yeni əsrin Qalib Lideri Prezident İlham Əliyev cənablarıdır. Son 20 il ərzində, ulu öndər Heydər Əliyevin demokratik-hüquqi və dünyəvi dövlət quruculuğuna yönəldilmiş müstəqillik siyasətini qətiyyətlə həyata keçirən Prezident İlham Əliyev ölkə iqtisadiyyatında qeyri-neft sektorunun çəkisinin artırılması ilə bağlı davamlı tədbirlər gördü. Nəhəng infrastruktur layihələri həyata keçirildi. Azərbaycanda nəqliyyat sisteminin yenidən qurulması ölkəmizin dünyaya çıxışını təmin etdi. 5 ildə gördüyü işlər Onun 2008-ci il 15 oktyabr prezident seçkilərində 88,73 faiz səs qazanmasına imkan yaratdı. 2013 və 2018-ci il prezident seçkilərində də qələbəsini təkrarlaması hər bir vədini konkret əməli işdə təsdiqləməsi ilə şərtləndirdi.

Artıq bu gün Azərbaycan dünyada güclü, qüdrətli ölkə olaraq hər bir sahədə sözünü deyir. Məhz Azərbaycan Prezidentinin yürütdüyü uğurlu xarici siyasət nəticəsində ölkəmiz BMT Təhlükəsizlik Şurasının qeyri-daimi üzvü seçildi, dünyada beynəlxalq təşkilatlar Ermənistanı işğalçı dövlət kimi tanıdı. Azərbaycan Prezidentinin bu məsələdəki birmənalı mövqeyi təsdiqlədi ki, Qarabağın Azərbaycandan ayrılmaz mexanizmi yoxdur. Azərbaycanın 155 dövlətin dəstəyi ilə BMT Təhlükəsizlik Şurasına qeyri-daimi üzv seçilməsi, həmçinin 120 dövlətin təmsil olunduğu Qoşulmama Hərəkatına 2019-2023-cü ilə kimi hərəkata 4 il sədrlik etməklə bir ilkə imza atıb. Belə ki, ölkəmizin son üç ildə istər İkinci Qarabağ müharibəsi, istərsə də COVID-19 pandemiyası ilə mübarizə dövründə

qazandığı uğurlar, atdığı addımlar ona olan etimadın daha da yüksəlməsini şərtləndirdi. Atdığı addımlar ona olan etimadın daha da yüksəlməsini şərtləndirdi.Ordu quruculuğu məsələlərinin dövlət siyasətinin prioriteti kimi müəyyən olunması illər sonra öz nəticəsini göstərdi və Azərbaycan xalqı tarixi ədaləti bərpa etdi.

Dövlətimizin başçısı İlham Əliyev 44 günlük müharibə dövründə xalqa müraciətlərində, eyni zamanda, 10 noyabr Zəfər tariximiz münasibətilə xalqa təbrikində Qələbəmizdə iqtisadi və siyasi müstəqilliyin rolunu da xüsusi qeyd etmişdir. Azərbaycanın beynəlxalq münasibətlər sistemində möhkəmlənən mövqeyi, ən əsası Dağlıq Qarabağ münaqişəsinin həlli üçün möhkəm hüquqi bazanın mövcudluğu Azərbaycan Ordusunun döyüş meydanında qələbəsinə yol açdı. Azərbaycan dünyaya sübut etdi ki, beynəlxalq hüququn norma və prinsipləri mövcuddur və onların icrası üçün vahid mexanizm olmalıdır. Bu Qələbə dünyanın yeni xarici siyasətinin formalaşmasında, yeni reallıqların yaradılmasında əhəmiyyətli rol oynadı.

Dövlətimizin başçısı həmişə bildirir ki, ərazi bütövlüyümüzün bərpası bizim üçün bir nömrəli vəzifədir. Buna görə də son 20 il Prezidentlik fəaliyyəti ərzində Ali Baş Komandanımız "bir qarış torpağımızı belə heç kəsə verən deyilik" xəbərdarlığının bu gün Azərbaycan xalqı, bütün dünya bir daha gördü ki, Qarabağ Azərbaycandır! Dövlətimizin başçısı, Müzəffər Ali Baş Komandan bu missiyanı da şərəflə yerinə yetirdi. Cənab İlham Əliyev daim bildirirdi ki, mən nəyi nə zaman etmək lazım olduğunu bilirəm. Ölkə Prezidenti bütün təzyiqlərə baxmayaraq qətiyyətli mövqeyindən bir addım da belə geri çəkilmədi, işğalçı Ermənistanın baş nazirinin irəli sürdüyü 7 şərtə cavab olaraq yalnız bir şərti qoydu ki, o da torpaqlarımızdan çıxmaları idi. 300-ə qədər yaşayış məntəqəsi, 5 şəhər, 4 qəsəbə, xeyli sayda strateji yüksəkliklər işğaldan azad edildikdən sonra diz çökən Ermənistan çıxılmaz vəziyyətdə qaldı. Ya tamamilə məhv olmalı idi, ya da Bəyanata imza atıb məğlubiyyətini etiraf etməli idi.

Noyabrın 10-da imzalanan Bəyanat Azərbaycanın 30 ilə yaxın dövrdə gözlədiyi anın dünyaya təqdimatı oldu.

Böyük qələbəni al qanı ilə yazan şəhidlərimizin intiqamının alınması ilə əldə edilən zəfəri, qalibiyyəti Azərbaycan xalqına bəxş etməklə Ali Baş Komandanımız İlham Əliyev həm də həyatını Azərbaycana həsr edən,

“Şuşasız Qarabağ, Qarabağsız Azərbaycan yoxdur” – deyən Ulu Öndərin arzusunu reallaşdırdı: “Mən bu gün Ulu Öndər Heydər Əliyevin məzarını ziyarət etdim, onun ruhu qarşısında baş əydim. Ürəyimdə dedim, xoşbəxt adamam ki, ata vəsiyyətini yerinə yetirdim. Şuşanı azad etdik! Bu, böyük Qələbədir! Bu gün şəhidlərimizin, Ulu Öndərin ruhu şaddır! Gözün aydın olsun Azərbaycan! Gözünüz aydın olsun dünya azərbaycanlıları!”.

Bəli, bu gün Azərbaycan Qarabağa qovuşdu, tarixi zəfərə imza atdı, şəhidlərimizin, Xocalı qurbanlarının, Gəncə, Bərdə digər şəhər və rayonlarımızda soyqırımları zamanı həlak olan günahsız insanların qisasını döyüş meydanında aldı, işğalçı Ermənistana layiq olduğu yeri göstərdi. 44 günlük Zəfər Qələbəsi “Qarabağ Azərbaycandır və nida işarəsi” – söyləyən Prezidentimiz son 20 ildə – hər zaman olduğu kimi bu dəfə də vədinə əməl etdiyinin sübutudur. Beləliklə də, 2003-2023-cü il tariximizin inkişafla başlayıb zəfərlə davam edən ən qüdrətli mərhələsi olmaqla Azərbaycan bundan sonra da növbəti illərdə də möhtərəm Prezidentimiz İlham Əliyev cənablarının uzaqgörən siyasəti və müdrik rəhbərliyi sayəsində inkişaf edəcək və çiçəklənəcək.

## Xankəndi şəhərindəki parad Azərbaycanın qüdrətini dünyaya nümayiş etdirdi

8 Noyabr - Zəfər Günü şanlı tariximizin ən parlaq səhifələrindən biri olmaqla, Prezident, Müzəffər Ali Baş Komandan İlham Əliyevin Xankəndi şəhərində hərbi paradı qəbul etməsi bir daha Azərbaycanın gücünün dünyaya nümayiş etdirilməsidir. Uzun illər erməni separatizminin yuvasına çevrilmiş tarixi şəhərimiz olan Xankəndidə artıq üçrəngli bayrağımız dalğalanır.

Bəli, Azərbaycanı tarixinin ən qüdrətli dövlətinə çevirən, xalqın 30 illik həsrətinə son qoyan Ali Baş Komandan İlham Əliyev xilaskar liderdir. Çünki məhz İlham Əliyevin Sərkərdəliyi ilə çoxlarının qeyri-mümkün hesab etdiyi Qarabağ münaqişəsi cəmi 44 günə həll olundu. Uzun illər dünya dövlətlərinin əksəriyyətinin himayə etdiyi işğalçı Ermənistan Azərbaycan Prezidenti İlham Əliyevin hərbi-siyasi diplomatiyası qarşısında diz çökdü. Ali Baş Komandan, Prezident İlham Əliyev zəfər Günü ilə bağlı Xankəndidə keçirilən hərbi parada çıxışı zamanı bildirdi ki, üç il bundan əvvəl Qarabağın tacı olan Şuşa şəhəri işğalçılardan azad edildi: "Ondan bir gün sonra düşmən ordusu təslim oldu və ağ bayraq qaldırdı. Beləliklə, İkinci Qarabağ müharibəsi Azərbaycan dövlətinin tam Zəfəri ilə nəticələndi. Bu, tarixi hadisədir".

Qələbəmizin hər ilini böyük uğurla başa vururuq. Böyük qürur hissi keçiririk ki, bu qələbə və uğurlar Azərbaycan Prezidenti, Ali Baş Komandan İlham Əliyev tərəfindən son 20 il ərzində həyata keçirilən "Güclü ordu – güclü dövlət" strategiyasının və "Dəmir yumruq" əməliyyatı ilə 44 gün davam edən Vətən müharibəsində Azərbaycan Ordusu yüksək döyüş bacarığının dünyaya nümayişi idi. Bu, həm də bir daha nümayiş etdirdi ki, güclü, qüdrətli, yüz minlik ordunu heç kim dayandıra bilməz! Azərbaycan Prezidenti İlham Əliyev Xankəndi şəhərində keçirilən hərbi paradda çıxışında bütün işğaldan azad olunan bütün torpaqlarda Azərbaycan Bayrağını qaldıracağına söz verdiyini söyləyib: "Xalqıma söz vermişdim ki, gün gələcək Azərbaycan Bayrağı işğal altında olan bütün torpaqlarda qaldırılacaq və bu gün gəldi. İyirmi il bundan əvvəl həm seçkilər ərəfəsində, həm də andiçmə mərasimində doğma xalqıma söz vermişdim ki, gün gələcək

və biz Azərbaycanın Dövlət Bayrağını işğal altında olan torpaqların hər bir guşəsində qaldıracağıq".

Azərbaycan xalqının çoxəsrlik tarixində buna bənzər parlaq Qələbənin olmadığını diqqətə çatdıran dövlət başçımız hərbi parada çıxışı zamanı 44 gün ərzində aparılan hərbi əməliyyatlar, hərbçilərimizin şücaətinin bir qəhrəmanlıq dastanı olduğunu vurğulayaraq bildirdi ki, bu günü (Zəfər Günü – red.) bizə bəxş edən müzəffər Silahlı Qüvvələrimiz döyüş meydanında cəsarət, qəhrəmanlıq, fədakarlıq göstərərək düşməni əzəli torpaqlarımızdan qovmuşdur. Bu, böyük tarixi hadisədir: "Qırx dörd gün ərzində döyüş meydanında düşməni məğlub edərək, şəhər və kəndlərimizi azad edərək Azərbaycan əsgəri və zabiti əsl qəhrəmanlıq göstərmişdir. Hər gün biz irəli gedirdik, bir gün belə geriyə addım atmamışdıq".

Düşmən ordusunun Azərbaycan Silahlı Qüvvələrinin peşəkarlığını, fədakarlığını görərək daha böyük təşvişə düşdüyünü, onların özlərinin etirafına görə, 44 günlük müharibə zamanı Ermənistan ordusunda 12 min fərarinin olduğunu deyən dövlət başçımız qeyd edib ki, Azərbaycan Silahlı Qüvvələrinin bir nəfər də olsun hərbçisi döyüş meydanını tərk etməmişdir. Bu, Azərbaycan xalqının əyilməz ruhunu və yüksək mənəvi keyfiyyətlərini bir daha bütün dünyaya nümayiş etdirdi. Azərbaycan övladları Şuşa əməliyyatı zamanı böyük güc, peşəkarlıq və fədakarlıq göstəriblər: "Şuşa əməliyyatı, təbii ki, 44 günlük Vətən müharibəsi dövründə xüsusi yerə malikdir. Çünki çox çətin coğrafi vəziyyətdə yerləşən, alınmaz qala sayılan Şuşanı yüngül silahlarla, bir çox hallarda əlbəyaxa döyüşlər nəticəsində azad etmək böyük güc, peşəkarlıq və fədakarlıq tələb edirdi. Azərbaycan övladları bunu göstərmişlər".

Bəli, bu gün Azərbaycan Ordusu dünyanın 50 ən güclü orduları sırasındadır. Dövlət başçımızın söylədiyi kimi: "Bizim ordumuz döyüşüb, bizim ordumuz öz gücünü paradda yox, döyüş meydanında göstərib. 44 gün ərzində bir nəfər də olsun geri addım atmayıb, bir nəfər də olsun fərari olmayıb. Bizim ordumuz budur. Bizim xalqımız budur. Çünki ordu xalqın bir hissəsidir. Orduda xidmət edən xalqın övladlarıdır, bizim yetişdirdiyimiz uşaqlardır".

Məhz Azərbaycan Silahlı Qüvvələri antiterror tədbirləri nəticəsində bu il sentyabrın 19-da separatçıları 23 saat ərzində məhv etdi və qondarma qurum ləğv edildi, oktyabrın 15-də tariximizə daha bir şanlı

səhifə yazıldı. Oktyabrın 15-də Müzəffər Ali Baş Komandan üç rəngli əzəmətli bayrağımızı Xankəndidə, Xocalıda, Xocavənd şəhərində dalğalandırdı. Bununla da Azərbaycanın suverenliyi tam təmin edildi. Bütün bu nailiyyətlər isə Prezident, Ali Baş Komandan İlham Əliyevin qalib ölkənin, qalib sərkərdəlik məharəti, güclü iradəsi və qətiyyəti, nəhayət diplomatik siyasətinin reallığı, xalqımızın alternativsiz lideri, yeganə inam ünvanıdır, xilaskardır, qəhrəmandır. Budur, Ali Baş Komandanımızın diplomatik siyasətinin nəticəsi! Budur Ordumuzun gücü, budur mübariz, igid əsgərlərimizin rəşadəti! Bu nailiyyət və qələbələr həm də Xalq-Ordu Birliyinin, orduya olan inamın Qələbəsidir! Çünki Ali Baş Komandanın apardığı diplomatik siyasəti düzgün siyasətdir, uğurlu siyasəti haqq işidir!

## Prezident İlham Əliyev qətiyyəti: “Azərbaycana təsir və ya təzyiq etmək mümkün deyil”

Qarabağda 44 günlük müharibə başa çatsa da, Fransanın qərəzli mövqeyi başa çatmaq bilmir. Xatırladaq ki, Bakı ATƏT-in Minsk qrupunun həmsədr ölkəsi olaraq Fransanın daim ədalətli yanaşma ortaya qoymasını tələb edirdi. Lakin bunun əksi baş verirdi. Heç kimə sirr deyil ki, Fransa 44 günlük müharibənin ilk günündən ermənilərin maraqlarından çıxış edib, dünyanın gözü qarşısında işğalçılığa və separatizmə dəstək verirdi. Təəssüf ki, "demokratiyanın beşiyi" sayılan ölkə və onun bəzi təmsilçiləri indi də ermənipərəst mövqelərindən əl çəkmək fikrində deyillər. Onlar həmsədrlərdən biri olmaqla 28 il ərzində heç bir iş görmədilər. Azərbaycan torpaqlarının boşaldılması üçün BMT-nin Təhlükəsizlik Şurasının qətnaməsini yerinə yetirmədilər. Həmin qətnamələrin hər biri göydə qaldı. Azərbaycan Prezidenti, Müzəffər Ali Baş Komandan İlham Əliyev cənablarının rəhbərliyi ilə torpaqlarımız işğaldan azad edildikdən sonra qətnamələr yerinə yetirildi. Azərbaycan Cənubi Qafqazda yeni güc mərkəzinə çevrilib. Eyni zamanda, Cənubi Qafqazda Türkiyənin mövqeyi güclənib. Yəni burada Rusiya-Ukrayna müharibəsi getdiyi dövrdə Türkiyənin mövqeyi daha da güclənib. Xatırdadım ki, Praqada üçtərəfli görüşdə Makron özünü də bu görüşə daxil etdi. Ermənistanın baş naziri Paşinyan Azərbaycanın ərazi bütövlüyünü və suverenliyini tanıdığını bildirdi. Azərbaycan da eyni zamanda Ermənistanın ərazi bütövlüyü və suverenliyini tanıdı.

### *Terrorçulara qucaq açan Makronun ikiüzlü dəyişməyən xislətidir*

Makron yerli televiziyaya verdiyi müsahibəsində anti-Azərbaycan bəyanatlarında Rusiyanı da ittiham edib deyir ki, guya İkinci Qarabağ müharibəsi zamanında Rusiya Azərbaycana kömək göstərib. Makron burada açıq şəkildə bildirdi ki, “Ermənistan bizim bacımızdı və bizim onları tək qoymaq niyyətimiz yoxdur”. Digər bir xatırlatma: Fransa prezidenti Emmanuel Makron Brüsseldə keçirilən “Şərq Tərəfdaşlığı” sammiti çərçivəsində Ermənistanın baş naziri Nikol Paşinyanla videogörüşünü müşayiət edərkən, özünün “Twitter” səhifəsində Ermənistana dəstək olacağını qeyd edib. Fransa prezidenti "Biz erməniləri heç vaxt tərk etməyəcəyik. Biz həmişə davamlı sülhün bərqərar olması üçün həll yolları axtaracağıq. Mən

qarşıdan gələn bayramları sülh və humanitar sahədə nailiyyətlər dövrünə çevirməyə çağırıram"- yazıb. Ancaq sonradan isə Makronun vasitəçiliyi ilə Brüsseldə Azərbaycan Prezidenti İlham Əliyevlə Ermənistanın baş naziri Nikol Paşinyan arasında daha bir görüşü baş tutub. Emmanuel Makron feysbukdakı hesabında Azərbaycan Prezidenti İlham Əliyevlə görüşü ilə bağlı paylaşımda Azərbaycan dilində status yazıb: "Biz davamlı sülh üçün həll yolları tapmalıyıq. Dünən axşam Prezident Əliyevlə, sonra da baş nazir Paşinyanla birgə irəlilədik". Bu yerdə qalırsan nə deyəsən. Göründüyü kimi, bir-birindən absurd olan fikirlər və yaxud Makronun absurd bəyanatları. Makron çıxışlarında dəfələrlə vurğulayıb ki, "Azərbaycan qoşunları Ermənistan ərazisini tərk etməlidir və tərəflər tutduqları mövqelərə qayıtmalıdırlar". "Mən, həmçinin bütün əsirlərin azad edilməsi, humanitar təşkilatların regiona çıxışına qoyulan məhdudiyyətlərin götürülməsi zərurəti və mürəkkəb minalanmış zonalar məsələsi haqqında düşünürəm".

Göründüyü kimi, bir-birindən absurd olan bu cümlələri oxuyarkən Fransa liderinin "soyuq duşa" ehtiyacı olduğu hiss olunur. Onun "Azərbaycan qoşunları Ermənistan ərazisini tərk etməlidir, tərəflər tutduqları mövqelərə qayıtmalıdırlar" açıqlaması bu ölkənin liderinin nə qədər absurd nəzər nöqtəsinə malik olduğunun sübutudur. Lakin bu gün özünü ərköyün və dünyada reytinqi ayaqlar altında olan, Fransa tarixində xalq qarşısında legitimliyi ən aşağı həddə sayılan Makron bugünkü Ermənistan torpaqlarının tarixi Azərbaycan torpaqları üzərində qurulduğunu da unutmamalıdır və burnunu bu məsələyə qatmamalıdır. Çünki Azərbaycan Prezidenti, Müzəffər Ali Baş Komandan İlham Əliyev cənablarının “Dəmir yumruq” siyasəti və tabe olan yenilməz Ordumuzun rəşadətli əsgər və zabitlərinin qəhrəmanlığı ilə 30 il düşmən əlində olan torpaqlarımız işğaldan azad edilib. Və beləcə, “Dağlıq Qarabağ münaqişəsi” ifadəsi tarixə qovuşduğu halda bu gün Fransa “Dağlıq Qarabağ münaqişəsi”ni yenidən gündəmə gətirmək istəyi Ermənistanın sərsəm ritorikasını dəstəkləməkdən başqa bir şey deyil.

Fransa “Qarabağ münaqişəsi həll olunmayıb” deyirsə, buyursun, zəhmət deyilsə, rəsmi Bakıya anlatsın ki, problem necə həll olunmalıdır. Prezident İlham Əliyev sözügedən məsələ ilə bağlı deyib: “Əgər dırnaqarası Dağlıq Qarabağın statusundan söhbət gedirsə, mən demişəm,

Azərbaycan ərazisində Dağlıq Qarabağ adlı ərazi vahidi yoxdur. Ümumiyyətlə, bu söz, ifadə işlədilməməlidir. Dağlıq Qarabağ yoxdur, Qarabağ var. İyulun 7-də imzaladığım Fərman əsasında Qarabağ iqtisadi zonası yaradıldı, vəssalam. Bütün Qarabağa aid olan rayonlar orada birləşib. Şərqi Zəngəzur iqtisadi zonası yaradılıb".

"Bizim dədə-baba torpağımızdır: bütün Zəngəzur – Şərqi və Qərbi Zəngəzur. İndi Ermənistanda deyirlər ki, İlham Əliyev ərazi iddiası ilə çıxış edir. Əgər Şərqi Zəngəzur varsa, deməli Qərbi Zəngəzur da var. Bəli, Qərbi Zəngəzur bizim dədə-baba torpağımızdır. Demişəm ki, biz oraya qayıtmalıyıq. Bunu hələ on il bundan əvvəl demişəm", – deyən Ali Baş Komandan sözünə davam edərək demişdir: "Demişəm ki, bizim dədə-baba torpağımızdır, biz oraya qayıtmalıyıq və qayıdacağıq və qayıdırıq. Heç kim bizi dayandıra bilməz. Mütləq qayıdacağıq, çünki bunun başqa yolu yoxdur".

Bəli, 44 yaşlı Emmanuel Makron Fransanın ən ziddiyyətli prezidentlərindən biri, bəlkə də ən birincisidir. Fransız siyasətçilər Makron haqqında belə deyirlər: "O, hamı ilə dostdur, amma heç kimin dostu deyil".

İngilis siyasətçilərin də gəldiyi qənaət budur: "Makron erməniləri müdafiə etməyə məhkum və məcburdur, onu qorxudan əsas məsələ isə odur ki, prezident kimi birtərəfli mövqeyi sonda Fransanın ATƏT-in Minsk qurpundakı həmsədrlikdən uzaqlaşdırılması, regionda təsir imkanlarının hədsiz şəkildə azalması ilə nəticələnə bilər". Fransız siyasətçilər hesab edirlər ki, "Makronun Qarabağ məsələsindəki hazırkı mövqeyi onun ənənəvi və axına qarşı getmə instinkti (psixoloji durumu) və Fransanın maliyyə sistemindəki erməni dostlarının olması ilə bağlıdır".

Türkiyəli ekspertlər düşünürlər ki, Makron kiçik hərəkətlərdən özünə böyük düşmənlər qazana bilmək "qabiliyyətinə" malikdir. Türkiyə prezidenti Ərdoğanın beynəlxalq tədbirdə şəkil çəkdirən zaman Makronun zorla özünü sıraya soxması, salam vermək üçün uzatdığı əlinin havada qalması onu affekt vəziyyətinə sala biləcək qədər "təhlükəli" haldır. Çünki Makron dövləti yox, öz hüquqlarını və oliqarxiyanın mövqeyini qoruyur. Elə sonda Makronun dediyi fikir bir daha onun xislətini göstərir: "Biz heç vaxt erməniləri tək qoymayacağıq. Həmişə davamlı sülh üçün həll yolları axtaracağıq. Qarşıdan gələn bayramların sülh və humanitar sahədə nailiyyətlər dövrünə çevrilməsinə çağırıram".

Bəli, bu, Makronun sifəti və xislətidir. Makronun və onun kimi ikili

standartlardan çıxış edən qərəzli Qərb liderlərinin yarıtmaz mövqeyi Azərbaycanı haqq işindən yayındıra bilməyəcək. Buna əmin ola bilərsiniz! Bu gün Fransa Cənubi Qafqaz regionunu yenidən "qarşıdurma ocağı"na çevirmək yolunu seçib və bunu da xarici siyasətinin prioritet istiqaməti kimi müəyyənləşdirib. Əsas hədəf bölgədə gedən proseslərə müdaxilə edərək Azərbaycan və Ermənistan arasında sülh danışıqlarını pozmaq, öz silah-sursatını, texnikasını Ermənistana satmaqdır. Sülh barədə düşünməyən Ermənistan artıq dərk etməlidir ki, nə qədər silah-sursat olsa belə, heç bir üstünlük əldə edə bilməyəcək. 44 günlük Vətən müharibəsi dövründə Ermənistana məxsus müdafiə potensialı, hərbi birləşmələrin əksəriyyəti Azərbaycan tərəfindən məhv edilib. Eni zamanda, Fransa danışıqlarda vasitəçilik rolunu artırmağa cəhd etməklə, Rusiyanı bu regiondan çıxarmağa çalışır. Amma Fransa artıq dərk edir və unutmamalıdır ki, Azərbaycanla ultimatum, təhdid dili ilə danışmaq olmaz. Azərbaycanın təmkinli davrandığını və bu məsələlərin sonunu gözlədiyini düşünür. Fransanın Ermənistanı silahlandırması, eyni zamanda, Cozep Borelin çıxışı ilə bağlı Azərbaycan XİN-in müvafiq bəyanatları səsləndirilib. Bütün bunlar onu göstərir ki, Cənubi Qafqaz regionunda sülhün, təhlükəsizliyin, sabitliyin, əmin-amanlığın təmin olunmasında Azərbaycandan başqa maraqlı tərəf yoxdur.

Noyabrın 20-də Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev və İraq Respublikasının Prezidenti Əbdüllətif Camal Rəşid mətbuata bəyanatlarla çıxışında bildirdi ki, Ermənistanı silahlandırmaqla, hansı ki, Fransa qürur duyur və bunu ictimai şəkildə bildirir, Ermənistan yeni bir müharibəyə başlamaq qərarı versə, bu, ona kömək etməyəcək: "Nəticə eyni olacaq. Heç kəs onlara kömək etməyəcək. Üç il bundan əvvəl Fransa onlara kömək etdi? Xeyr. İki ay bundan əvvəl onlara kömək etdi? Xeyr. Onlar burada nə edə bilərlər. Heç nə. Odur ki, Ermənistan öz gələcəyini regionumuzdan uzaqda yerləşən ölkələrin ambisiyaları üzərində deyil, öz milli maraqlarına əsasən planlaşdırmalıdır".

Bir sözlə, Fransa birmənalı olaraq Cənubi Qafqazda dayanıqlı sülhü və stabilliyi istəmir və bölgəni bitmək bilməyən münaqişə məkanı, qarşıdurma müstəvisi kimi görməkdir: əks təqdirdə, Ermənistana dəstək və ondan alət qismində istifadə etməyin faydalılıq əmsalı heçə enir. Amma Emmanuel Makron məğlubiyyətə aparan oyuna başlayıb: onun fiaskosu

qaçılmaz, indi sahib olduğu mövqeləri belə, itirməsi labüddür. Ancaq Emmanuel Makron unudur ki, Azərbaycan onun hökmranlıq etdiyi hansısa Afrika ölkəsi deyil.

Bu gün kimsə Azərbaycanla hədə, təhdid dili ilə danışa bilməz. Azərbaycan özünün milli təhlükəsizliyini qorumağa, sərhədlərini möhkəmləndirməyə, düşmənə və havadarlarına cavab verməyə qadirdir və təsir göstərilə biləcək dövlət deyil. Azərbaycan Prezidenti İlham Əliyev cənabları dəfələrlə bəyan edib ki, Azərbaycan regionda sülhün, təhlükəsizliyin təmin olunması istiqamətində lazımi addımlar atır və bu siyasətini də davam etdirəcək. Azərbaycan yenidən müharibənin baş verməsini istəmir. Əgər bu, baş verərsə, yenə də əzilən tərəf Ermənistan olacaq və bu ölkə onilliklərlə özünə gəlməyəcək. Bu gün Azərbaycanla təhdid dili ilə danışmaq qəbuledilməzdir və hər hansı qeyri-dost hərəkət müsbət nəticələnməməklə yanaşı, adekvat şəkildə cavablandırılacaq. Fransa isə anlamalıdır ki, Cənubi Qafqazda söz sahibi Azərbaycandır. Odur ki, məkrli niyyətlərindən çəkinməli, həqiqətin yalnız bir üzü olduğunu görməlidir.

## Hər bir mesaj ölkəmizin ədalət və beynəlxalq hüququn yanında olmasından xəbər verir

Bu gün qalib lider Prezident İlham Əliyev irəli sürdüyü şərtlər qəbul edilir. Həmin şərtlərə əməl etməsə, bu, Ermənistana gələcəkdə çox baha başa gələ bilər. Daha dəqiq desək, “Dəmir Yumruğ”un növbəti zərbəsi ilə qarşılaşacaqlar. Ali Baş Komandanımızın söylədiyi kimi, 30 ilin əziyyəti, 30 ilin ümidsizliyi, 30 ilin əzabları xalqımızı sındırmadı, iradəmizə heç bir mənfi təsir göstərmədi. Əksinə, daha da bütövləşdik, daha da mətinləşdik, daha da gücləndik, özümüzü toparladıq və sonunda Zəfər bizim oldu. Belə olan halda bu gün ermənilər anlamalıdırlar ki, sülh onların yeganə çıxış yoludur. Havadarlarına arxalanaraq ölkəmizi təxribatlara çəkib növbəti müharibə ilə “hədələyən” revanşistlər anlamırlar ki, artıq Azərbaycan bütün gedişlərini kökündən dəyişib və bölgədə baş verən istənilən hadisəyə diqqət yetirir, hər şeyə nəzarət edir.

Qazanılan Zəfər təkcə silahın gücü deyil, Prezidentin, millətin liderinin milli maraqlarımıza söykənən müstəqil siyasətinin, beynəlxalq arenada yüksək nüfuzunun məntiqi nəticəsi idi. Prezident İlham Əliyevin əməli addımları, dünyanın nüfuzlu telekanallarına müsahibələrində Azərbaycanla bağlı həqiqətlərin beynəlxalq ictimaiyyətə onların başa düşəcəyi dildə çox böyük qətiyyətlə çatdırması, əlbəttə ki, qlobal auditoriyanın diqqətindən kənarda qalmır. Prezident İlham Əliyevin “Euronews” televiziyasına müsahibəsi zamanı səsləndirdiyi fikirlər, verilən mesajlar, indiki reallıq və qarşıdakı dövr üçün mühüm önəm kəsb edir. Sözsüz ki, bu telekanalın Prezident İlham Əliyevdən müsahibə götürməsi, dövlətimizin başçısının fikirlərinə mühüm önəm verməsi, Azərbaycanın regional və qlobal miqyasda güclənən mövqeyinin göstəricisidir. Eyni zamanda, dövlət başçımızın "Euronews" televiziyasında yayımlanan müsahibəsi həm informasiya yükü, həm də yeni mesajlar baxımından zəngin olmaqla yanaşı, həm də istər Ermənistan rəhbərliyi, istərsə də Qərb dövlətlərinin nümayəndələri tərəfindən səsləndirilən qeyri-adekvat açıqlamalara tutarlı cavabdır.

Dövlət başçısı müsahibəsində Ermənistanın işğal siyasətinin nəticələri, torpaqlarımızın öz gücümüzə azad edilməsi və Ermənistanla sülh sazişinin imzalanması perspektivləri barədə fikirlərini ifadə edərək

bildirib ki, üç ilə yaxındır ki, davam edən və iki istiqamətdə aparılan Ermənistan ilə Azərbaycan arasındakı münasibətlərin normallaşması prosesinin uzanması Ermənistanın qeyri-konstruktiv mövqeyi ilə əlaqədardır. Dövlət başçısı bildirib ki, hazırda Qarabağ məsələsi bitdikdən sonra Ermənistan bizimlə razılığa gəlməkdə daha həvəsli olacaq. Çünki suverenliyimizin bərpası və Qarabağda qeyri-qanuni separatçı rejimin ləğv edilməsi ilə Ermənistana daha cəsarətli davranmağa və ya danışıqlara getməyə mane olan əsas amil artıq mövcud deyil: “Həqiqətən də Ermənistanın hələ sentyabrın 11-də onlara təqdim olunmuş sülh sazişi layihəsinə iki ay yarım sonra cavab verməsi rəsmi İrəvan süni olaraq prosesi ləngitmək istəyindən xəbər verir. Cənab Prezident də Qarabağdakı qeyri-qanuni separatçı rejimin ləğv edilməsi ilə Ermənistana danışıqlara getməyə mane olan əsas amilin ardan qaldırıldığını xüsusi olaraq vurğulamaqla faktiki olaraq Ermənistan rəhbərliyini bundan sonra daha cəsarətli və qətiyyətli olmağa dəvət etmiş oldu”.

Prezident müsahibədə, həmçinin Qarabağdan köçən ermənilərlə bağlı fikirlərə də aydınlıq gətirməklə bir qism dövlətlərin əsassız iddialarına da cavab vermiş oldu: "Bütün dünyaya məlumdur ki, erməni sakinlər Qarabağı könüllü tərk ediblər. Onların qalıb yaşaması üçün heç bir maneə yox idi. Azərbaycan dövlətinin Qarabağ erməniləri ilə bağlı verdiyi bəyanatlar, həmçinin atdığı addımlar bunu bir daha sübut edir. Qayıtmaq istəyənlər üçün elektron qeydiyyat portalı yaradılıb. Amma bundan fərqli olaraq Qarabağ hadisələri başlayarkən soydaşlarımız Ermənistan ərazisindən məcburi şəkildə qovuldu, bir çoxu qətl edildi, əmlakları talan olundu, mədəni-dini abidələrimiz məhv edildi. Təbii ki, bu insanların da öz torpaqlarına qayıtmaq hüququ tanınmalıdır".

Dövlət başçısı bununla da beynəlxaq ictimaiyyətin diqqətini Ermənistandan qovulan azərbaycanlılar məsələsinə yönəltmiş oldu. Xüsusilə, indiki mərhələdə bu məsələnin diqqətlərdə saxlanılması olduqca önəmlidir. Ermənilərin qayıdıb yaşamasının zəruriliyini deyən dövlət başçısı bildirib ki, bu məsələdə bar-bar bağıran ayrı-ayrı dairələr Ermənistandan qovulmuş azərbaycanlıların məsələsini də öz gündəliklərinə daxil etməyə borcludurlar. Prezident İlham Əliyev, həmçinin onu da vurğulayıb ki, azərbaycanlıların 30 il əvvəl qovulması və ermənilərin iki ay əvvəl ölkəmizi tərk etmək qərarı arasında fərqin əhəmiyyəti yoxdur. Fakt,

sadəcə, ondan ibarətdir ki, bunlar qarşılıqlı olmalıdır. Yaxud da ki, biz sülh sazişində bu məsələni qeyd etmirik: "Bir sözlə, bu vaxta qədər, biz həmin məsələ ilə bağlı Ermənistandan hər hansı aydın anlaşma görmədik. Əgər Ermənistan hər iki milli azlığa eyni yanaşmanın tətbiq edilməsinə razılaşarsa və ya onu tam əks etdirməsə, onda sülh əldə oluna bilər, çünki həmin məsələ bizimlə danışıqlar aparan Ermənistan üçün əsas maneə idi. Bir sözlə, görəcəyik, bundan sonra necə olacaq. Səmimi desək, mən hazırda məntiq nöqteyi-nəzərindən sülh sazişinin imzalanmasına hər hansı ciddi maneə görmürəm".

Bir sözlə, bu gün Azərbaycan bütün dünyada sülhsevər ölkə olaraq yeganə ölkədir ki, qalib ölkə olsa da, düşməninə sülh təklif edir, regionda əmin-amanlığın, təhlükəsizliyin bərqərar olmasına çalışır. Dövlətimizin başçısının da qeyd etdiyi kimi, bizim sülh istədiyimiz ona görə deyil ki, biz zəifik və sülh axtarırıq. Xeyr, onlar bilirlər ki, biz xeyli güclüyük. Bu, ona görədir ki, biz tarixin bu qara səhifəsinin bağlanmasını istəyirik. Biz nə bu gün, nə də gələcəkdə başqa bir müharibə istəmirik. Beləliklə, bu gün Azərbaycan bölgədə davamlı sülh və sabitliyin yaranması üçün təkcə təşəbbüslə çıxış etmir, eyni zamanda, bu məsələdə öz əməli töhfəsini verir. Bu nailiyyətlər isə Prezident, Ali Baş Komandan İlham Əliyevin böyük sərkərdəlik məharəti, güclü iradəsi və qətiyyəti, nəhayət, diplomatik siyasətinin reallığıdır.

## Prezident İlham Əliyevin namizədliyinin irəli sürülməsi bütün Azərbaycan xalqının iradəsinin ifadəsidir

Bu gün xalqımız növbəti tarixi hadisənin astanasındadır. Belə ki, Prezident İlham Əliyevin Sərəncamı ilə 2024-cü il 7 fevral tarixində müstəqillik əldə etdiyimizdən bəri ilk dəfə olaraq bütün Azərbaycan ərazisində növbədənkənar prezident seçkiləri keçiriləcək. Bu, 1993-cü ildən ötən 30 ildə Azərbaycanda demokratik şəkildə baş tutacaq 7-ci prezident seçkisi olacaq. Bəli, bu gün Azərbaycan ümummilli lider Heydər Əliyevin ideyaları əsasında və Prezident İlham Əliyevin rəhbərliyi ilə tərəqqi və Zəfər yolunda inamla irəliləyərək parlaq nailiyyətlər qazanır, yeni zirvələr fəth edir. Hədəf daha güclü Azərbaycandır! Bu hədəfə isə məhz Azərbaycan Prezidenti, Müzəffər Ali Baş Komandan, Yeni Azərbaycan Partiyasının Sədri İlham Əliyevin liderliyi ilə çatmaq mümkündür. Qeyd edim ki, Yeni Azərbaycan Partiyasının İdarə Heyətinin dekabrın 15-də geniş səviyyədə keçirilən iclasında nəinki Azərbaycan, eləcə də dünya ictimaiyyəti arasında kifayət qədər reytinq qazanan Cənab İlham Əliyevin 2024-cü il fevralın 7-də Azərbaycanda keçiriləcək növbədənkənar Prezident seçkilərinə namizədliyi irəli sürüldü. YAP yekdilliklə bu qərarı təsdiqlədi. Eyni zamanda, prezidentliyə namizəd İlham Əliyevin səlahiyyətli nümayəndələri də müəyyənləşdirildi. Bir sözlə, Yeni Azərbaycan Partiyasının Sədri, Prezident İlham Əliyevin növbədənkənar prezident seçkilərində namizədliyini irəli sürməsi barədə qərar, sadəcə, YAP üzvlərinin deyil, eyni zamanda, bütün Azərbaycan xalqının istək, arzu və rəyini ifadə etdi.

Göründüyü kimi, xalqımız həmişə düzgün seçim edib və növbəti dəfə də seçimində yanılmadığına əmindir. Çünki son 20 il Prezidentlik fəaliyyəti və bu son 20 ildə xalqına verdiyi sözün nəticəsi cənab İlham Əliyevin Prezidentliyə namizədliyini şərtləndirən amillər göz qabağındadır. Belə ki, son 20 ilin uğurlarının zirvəsində dayanan ərazi bütövlüyümüzün və suverenliyimizin tam təmin edilməsi növbədənkənar prezident seçkilərinin keçirilməsini zərurətə çevirdi."Siyasi həyatımda heç vaxt olmayıb ki, mən söz verim və arxasında dayanmayım. Verdiyim bütün sözlər yerinə yetirilib. Digər tərəfdən, mən çox söz vermirəm, çünki nəticəni nümayiş etdirməyi üstün tuturam". Bu sözləri Azərbaycan

Prezidenti İlham Əliyevin Çinin CGTN televiziya kanalına müsahibəsindən bildirib.

Bəli, bu gün dövlət başçımızın qürurla dediyi sözləri qətiyyətlə gerçəkləşdirir. Artıq bu gün 33 ildən sonra dövlətimiz və xalqımız ən şərəfli günlərini yaşayır, tariximizin qürur doğuran səhifələri yazılır. İndi Şuşa da azaddır, Laçın, Kəlbəcər də, Ağdam da və digər işğal olunmuş rayonlar da. Hazırda işğaldan azad olunmuş torpaqlarımız bərpa olunur, yenidən qurulur. Qarabağın Azərbaycana məxsusluğunu mədəniyyət müstəvisində bəyan edən "Xarıbülbül" festivalı artıq bərpa olunub. Bütün bu uğurlar Qalib Liderin sözünün və əməlinin vəhdətinin nümayişidir. Qədim yunan filosofu Demokrit həmvətənlərini inandırırdı ki, söz əməlin kölgəsidir. Yəni dediyin sözün qiyməti görəcəyin əməldən asılıdır. Əlbəttə, qədim yunanlının bu kəlamı aksiomdur, yəni isbata ehtiyacı yoxdur. İnsanlar da həmişə sözlə əməlin üst-üstə düşməsinə qiymət verir, sözünün arxasında dayanan şəxsiyyəti alqışlayır və dəstəkləyirlər. Müzəffər Ali Baş Komandan İlham Əliyev cənabları da prezidentlik fəaliyyətinin 20 ili ərzində xalqına verdiyi vədləri yerinə yetirmiş güclü siyasi lider olaraq hər bir Azərbaycan vətəndaşının Prezidenti olduğunu təsdiqləyir. Və bu gün görülən işlər, hər bir azərbaycanlının Prezidenti olduğunu, sözü ilə əməlinin üst-üstə düşməsinin məntiqi sübutudur.

Prezident İlham Əliyev qələbə zəfərindən sonra bütün çıxışlarında bildirir ki, bizim əsas vəzifəmiz keçmiş köçkünləri tezliklə dədə-baba torpaqlarına qaytarmaqdır və buna da nail olacağıq. "Siz köçkün deyilsiniz, siz qayıdırsınız. Biz sizi qaytaracağıq!",-deyən Prezident İlham Əliyev qaçqınların və məcburi köçkünlərin problemlərinin həllinə xüsusi qayğı ilə yanaşır, bu məsələni daim diqqət mərkəzində saxlayır: "Məcburi köçkünlərin problemlərinin həlli Prezident kimi mənim ən başlıca vəzifələrimdən biridir. Digər tərəfdən, özəl sektor artıq sosial məsuliyyət göstərərək belə gözəl imkanlar yaradır".

Göründüyü kimi, bir qərinəyə yaxın dövrdə düşmən tapdağı altında əsir həyatı yaşayan Qarabağ və Şərqi Zəngəzurun qaranlığa qərq edilmiş hər guşəsi indi nura boyanır. Yenidən qurulub abadlaşan, dünyanın ən ecazkar məkanlarından birinə çevrilən bu yurd yerlərimizdə reallaşan möhtəşəm layihələr düşmənin bağrını yarır və Şuşanın, Kəlbəcərin, Ağdamın, Xocavəndin, Füzulinin, Zəngilanın, Cəbrayılın, Qubadlının,

Suqovuşanın timsalında zəfərimiz parlayır. Çünki bu gün Qarabağ və Şərqi Zəngəzur azaddır, Qarabağ dirçəlir, Zəngəzur dirçəlir, qürurla öz doğma torpaqlarımızı qururuq, yaradırıq. Qalib Lider, Prezident İlham Əliyev çıxışlarında, müraciətlərində də daima bildirir ki, 2003-cü ildə prezident seçkiləri ərəfəsində xalqa müraciətində demişdi ki, ona etimad göstərilərsə, Heydər Əliyev siyasətinə sadiq qalacaq. Azərbaycan xalqı İlham Əliyevə səs verərək Ulu Öndərə olan məhəbbətlərini və inamlarını göstərdi. Bir sözlə, artıq Prezident İlham Əliev cənablarının ilk prezident seçilməsindən ötən 20 il ərzində Azərbaycan sürətli inkişaf və tərəqqi yolunda uğurlu inkişaf yolunda davam etməkdədir. Hədəf isə daha güclü Azərbaycandır! Bu hədəfə isə məhz Azərbaycan Prezidenti, Müzəffər Ali Baş Komandan, Yeni Azərbaycan Partiyasının Sədri İlham Əliyevin liderliyi ilə çatmaq mümkündür.

Bu gün xalqımız şanlı zəfərin memarına alternativ görmür. Çünki Prezident İlham Əliyev bu günə qədər verdiyi bütün vədləri yerinə yetirib və Yeni Azərbaycan Partiyası İdarə Heyətinin cənab İlham Heydər oğlu Əliyevin prezidentliyə namizədliyinin irəli sürülməsi ilə bağlı qərarı xalqımız tərəfindən birmənalı olaraq dəstəklənir. Çünki Azərbaycan xalqı görülən işləri, əldə olunan nailiyyətləri hər zaman dəyərləndirir və öz seçimini məhz buna əsaslanaraq edir. Odur ki, xalqımız 2003, 2008, 2013, 2018-ci illərdə keçirilən prezident seçkilərində olduğu kimi 2024-cü il fevralın 7-də də Heydər Əliyev siyasətinin layiqli davamçısına, sabitliyə, əmin-amanlığa, tərəqqi və quruculuğa səs verəcək. Çünki cənab İlham Əliyev Azərbaycan xalqının böyük etimad göstərdiyi və rəğbət bəslədiyi alternativsiz liderdir və xalqımız əmindir ki, bu zəfərlərin davamı gələcək, Cənab İlham Əliyevin rəhbərliyi ilə Azərbaycan qarşıdakı illərdə də hərtərəfli inkişaf edəcək və inamla öz hədəflərinə çatacaq, yeni-yeni uğur zirvələrini fəth edəcək.

## Diplomatik müstəvidə tarixi qələbə

Dövlət o zaman güclü və qüdrətli, ən əsası, sözün əsl mənasında, müstəqil olur ki, onun gələcəyini düşünən, atdığı hər addımda dövlət maraqlarını öndə saxlayan Lideri vardır. Məhz bu gün Azərbaycanın müstəqil dövlət kimi mövcudluğu, dünya birliyində layiqli yer tutması, sözünün imzası qədər əhəmiyyəti, sabitlik diyarı kimi nüfuz qazanaraq bütün sahələrdə inkişafı, bir sözlə, yeniliyə əsaslanan inkişaf modeli liderlik amili ilə birbaşa bağlıdır. Hər bir dəyərləndirmə, hadisələrə düzgün qiymət bu günün fonunda keçilən yolun təhlilini bir tələb kimi qarşıya qoyur. Bu gün sözü imzası qədər dəyərli olan Ali Baş Komandan, Prezident İlham Əliyev cənablarının son 20 illik prezidentlik dövründə çoxəsrlik Azərbaycan tarixində xalqımıza Qarabağ Zəfərini bəxş edən, bizi qalib xalqa çevirən Prezidentin dediyi kimi: "Heç kim bizim iradəmizə təsir edə bilməz. Heç kim bizimlə ultimatum dili ilə danışa bilməz". Çünki bu qələbə, uğurlu nəticələr məhz Müzəffər Ali Baş Komandan, Prezident İlham Əliyevin "Güclü ordu – güclü dövlət" strategiyasının konsepsiyanın nəticəsidir. Bu üç mühüm güc – iqtisadi, siyasi, hərbi güc və onların vəhdəti Azərbaycanın Vətən müharibəsinin başlıca hərəkətverici qüvvəsi oldu. Bir sözlə, ötən illər həm də onu göstərdi ki, Prezident İlham Əliyev sözü imzası qədər dəyərli olan qurucu, birləşdirici, Azərbaycan xalqının bütün istək və arzularını həyata keçirən, öz siyasətində Azərbaycan dövlətinin və xalqının maraqlarını ən ali məqsəd kimi görən, bütün qüvvəsini bu istiqamətdə səfərbər edən, xalqın birmənalı şəkildə dəstəklədiyi, etimad göstərdiyi və etibar etdiyi liderdir.

Bir sözlə, sözü ilə əməli üst-üstə düşən, imzası qədər dəyərli olan Azərbaycan Prezidenti İlham Əliyev dediyi kimi: "Bizim sözümüz imzamız qədər keçərlidir, keçərli olduğu qədər həm də dəyərlidir".

Azərbaycan Prezidenti, Ali Baş Komandan İlham Əliyev dəfələrlə çıxışlarında bildirir: "Mən nəyi, nə vaxt və necə etməyi özüm bilirəm". Çünki dövlət başçımızın qətiyyətinə və prinsipiallığına inanan Azərbaycan xalqının böyük əksəriyyəti şübhə etmirdi ki, Ali Baş Komandan indiyədək bütün vədlərini yerinə yetirib, dediyi sözlərə əməl edib. 30 ilə yaxın işğal altında olan torpaqlarımızı Azərbaycan Prezidenti, Ali Baş Komandan İlham Əliyev cənablarının rəhbərliyi ilə Müzəffər Azərbaycan Ordusu

işğaldan azad etdi.

"Biz artıq bu doğma diyarımızda əbədi yaşayacağıq", – deyən Prezident, Ali Baş Komandan İlham Əliyev üç il ərzində Qarabağın dirçəlişi yolunda bir çox dövlətlərin 10 il ərzində görə bilmədiyi işləri reallaşdırıb. Bu gün işğaldan azad olunmuş torpaqlarda görülən uğurlu bərpa-quruculuq işləri göz önündədir. Artıq Xarı bülbül boynunu bükməyib. Qarabağın Azərbaycana məxsusluğunu mədəniyyət müstəvisində bəyan edən "Xarıbülbül" festivalı bərpa olunub. "Şuşasız Qarabağ, Qarabağsız isə, ümumiyyətlə, Azərbaycan yoxdur" deyən Ümummilli Lider Heydər Əliyevin vəsiyyətinə uyğun hakimiyyətdə olduğu 20 il ərzində, hər gün və hər saat Şuşa başda olmaqla işğalda olan bütün əraziləri azad etmək uğrunda mübarizə aparan Prezident İlham Əliyev cənablarının 2022-ci ilin "Şuşa İli" elan edilməsi haqqında Sərəncamı tarixi hadisədir.

"Zamanla bütün Qarabağ abadlaşacaq, buna isə heç kəs maneə ola bilməz" - bu, Qalib Liderin bütün dünyaya mesajı idi. Azərbaycan dövlətinin qarşısında duran prioritet məsələ işğaldan azad edilmiş ərazilərin bərpasıdır. Dövlət başçımızın hər dəfə işğaldan azad olunmuş torpaqlara səfərləri bir daha göstərir ki, Prezident İlham Əliyevin rəhbərliyi ilə dövlətimizin işğaldan azad olunmuş əraziləri qısa zaman kəsiyində bərpa etməsi üçün önündəki yeganə maneə zamandır. Zamanla bütün Qarabağ abadlaşacaq, buna isə heç kəs maneə ola bilməz. Çünki dövlət başçımızın söylədiyi kimi: "Bu torpaqların sahibləri bizik - Azərbaycan xalqıdır".

Bəli, bu torpaqların sahibi Azərbaycan xalqı olduğu üçün də haqqı, ədaləti, ərazi bütövlüyümüzü bərpa edərək öz torpaqlarımıza sahib olduq. Prezident İlham Əliyev 2020-ci il noyabrın 8-də Şəhidlər xiyabanında xalqa etdiyi müraciəti isə xalqımızın Qarabağ həsrətinə məlhəm oldu. Ali Baş Komandanın tarixi müraciətindən: "Dəfələrlə Azərbaycan xalqına müraciət edərək düşmənə yumruq göstərmişdim. Demişdim ki, bu yumruq elə belə yumruq deyil. Bu, dəmir yumruqdur. Bu dəmir yumruqla düşmənin başını əzirik və əzəcəyik! Eyni zamanda, bu yumruq birliyimizin rəmzidir. Bax, bu gün Azərbaycan xalqı bu yumruq kimi birləşib! Həmişə belə olacaq! Bu birlik əbədi olacaq! Bu birlik bizə gələcəkdə də bütün vəzifələri icra etmək üçün imkan yaradacaq".

Qalib Sərkərdə çıxışlarında dəfələrlə vurğulayıb ki, bütün illər ərzində Azərbaycan xalqının dəstəyini hiss etmişəm, görmüşəm, inamını,

mənə olan xoş münasibəti görmüşəm: "Bu, mənə güc verir. Bu, mənim siyasətim üçün əvəzolunmaz dəstəkdir. Həmişə Azərbaycan xalqını əmin edirdim ki, mən Vətənə, doğma xalqıma ləyaqətlə, sədaqətlə xidmət edəcəyəm. Şadam ki, sözümün üstündə durmuşam. Həmişə olduğu kimi, sözümə sadiq olmuşam. Bu tarixi bir gündə Azərbaycan xalqına bu müjdəni vermək mənim həyatımda bəlkə də ən xoşbəxt günlərimdən biridir. Əziz Şuşa, sən azadsan! Əziz Şuşa, biz qayıtmışıq! Əziz Şuşa, biz səni dirçəldəcəyik! Şuşa bizimdir! Qarabağ bizimdir! Qarabağ Azərbaycandır!"

Mənfur düşmən unutmamalıdır ki, "siyasi gücümüzü artırdıq, bu gün Azərbaycanla hesablaşırlar. Ən azı regional təhlükəsizlik və inkişaf məsələlərində Azərbaycanın razılığı olmadan heç bir təşəbbüs həyata keçirilə bilməz. Deyirəm, ən azı regional, amma, eyni zamanda, bu gün dünya miqyasında bir çox məsələlərdə Azərbaycanın mövqeyi önəmli mövqe kimi sayılır", – deyə dövlətimizin başçısı qeyd edib. Çünki bu gün diktə edən tərəf qalib Azərbaycandır, Qalib Lider Prezident İlham Əliyev cənablarıdır: "Mənim sözüm qətidir, bunu hər kəs bilir, həm Azərbaycanda, həm dünyada, o cümlədən Ermənistanda. Nəyi deyiriksə, onu da edirik. Bir dənə də olsun sözümüz, necə deyərlər, havada qalmayıb, bu söz də havada qalmayacaq. Əgər mən deyirəmsə ki, amnistiyaya baxmaq olar, bu fürsəti də qaçırmasınlar. Onlar bir çox fürsətləri qaçırıblar, bir çox fürsətləri və hər dəfə, necə deyərlər, gərək onların başından vuraydıq ki, özlərinə gəlsinlər".

Dövlətimizin başçısı illərlə işğal siyasətinə son qoymaq üçün qətiyyət, iradə və prinsipiallıq nümayiş etdirdisə, indi də atdığı düşünülmüş və sistematik addımları Qarabağı qısa zaman kəsiyində dirçəldəcək, ərazilərimiz minalardan təmizləniləcək və insanların öz el-obalarına geri dönəcəklər. Çünki Qarabağ Azərbaycandar! Qarabağ cənnət məkanıdır! Bir sözlə, bütün bu nailiyyətlər isə Prezident, Ali Baş Komandan İlham Əliyevin böyük sərkərdəlik məharəti, güclü iradəsi və qətiyyəti, nəhayət, diplomatik siyasətinin reallığıdır.

## PREZİDENT İLHAM ƏLİYEV:
## “Biz onlara sübut etdik ki, Qarabağ Azərbaycandır!”

Lider o şəxsiyyətdir ki, ona etimad göstərmiş xalqın maraqlarını bütün imkanları ilə müdafiə edir, reallaşdırır, cəmiyyətin enerjisinin səfərbər edilməsilə insanların taleyində əhəmiyyətli faktora çevrilir. Bəli, məhz 2003-cü ilin 15 oktyabr tarixində demokratik qaydada keçirilən seçkilərdə səsvermə hüququna malik olan vətəndaşların əksəriyyətinin Yeni Azərbaycan Partiyasının namizədi, partiya Sədrinin birinci müavini, Azərbaycan Respublikasının Baş naziri İlham Əliyev cənablarına səs verməklə bir daha xalqın düzgün seçim etdiyini təsdiqlədi. Azad, ədalətli və şəffaf şəkildə keçirilən seçkilərdə İlham Əliyev ümumi seçicilərin 2 milyon 438 min 787 nəfərin səsini qazanaraq, Azərbaycan Respublikasının Prezidenti seçildi. Prezident seçilən cənab İlham Əliyev 31 oktyabr tarixində andiçmə mərasimində bu vədini də vermişdi: "Mən bu gün bu yüksək kürsüdən əziz Prezidentimiz cənab Heydər Əliyevə müraciət edərək deyirəm: Əziz Prezident, əsəriniz olan müasir Azərbaycanı gücləndirəcəyik, zənginləşdirəcəyik, hərtərəfli inkişaf etdirəcəyik, Sizin yolunuzla yeni qələbələrə doğru gedəcəyik".

Cənab İlham Əliyevin ilk dəfə Prezident seçildiyi vaxtdan bizi 20 illik zaman ayırır. 20 il zaman baxımından qısa dövr olsa da, uğurların, Azərbaycanın təqdimatına edilən əlavələrin miqyasına və onların zirvəsində dayanan Zəfərimizə diqqət yetirdikdə böyük qürur hissi keçiririk. Çünki bu gün sözü imzası qədər dəyərli olan Ali Baş Komandan, Prezident İlham Əliyev cənablarının son 20 illik prezidentlik dövründə çoxəsrlik Azərbaycan tarixində xalqımıza Qarabağ Zəfərini bəxş edən, bizi qalib xalqa çevirən xalqın Prezidentin dediyi kimi: “Heç kim bizim iradəmizə təsir edə bilməz. Heç kim bizimlə ultimatum dili ilə danışa bilməz”. Çünki Müzəffər Ali Baş Komandan, Prezident İlham Əliyevin sözü ilə əməli üst-üstə düşən, imzası qədər dəyərli olan qalib xalqın qalib Lideri nəyi, nə vaxt və necə etməyi özü bilir. Dövlət başçımızın qətiyyətinə və prinsipiallığına inanan Azərbaycan xalqının böyük əksəriyyəti şübhə etmirdi ki, Ali Baş Komandan indiyədək bütün vədlərini yerinə yetirib, dediyi sözlərə əməl edib. 30 ilə yaxın işğal altında olan torpaqlarımızı Azərbaycan Prezidenti, Ali Baş Komandan İlham Əliyev cənablarının rəhbərliyi ilə Müzəffər Azərbaycan Ordusunun

qəhrəman əsgər və zabitlərin rəşadəti ilə əzad edildi, ərazi bütövlüyümüz bərpa olundu. Və bu gün işğaldan azad olunmuş torpaqlarda görülən uğurlu bərpa-quruculuq işləri göz önündədir.

Qarabağın Azərbaycana məxsusluğunu mədəniyyət müstəvisində bəyan edən “Xarıbülbül” festivalı bərpa olunub. “Şuşasız Qarabağ, Qarabağsız isə, ümumiyyətlə, Azərbaycan yoxdur” deyən Ümummilli Lider Heydər Əliyevin vəsiyyətinə uyğun hakimiyyətdə olduğu 20 il ərzində, hər gün və hər saat Şuşa başda olmaqla işğalda olan bütün əraziləri azad etmək uğrunda mübarizə aparan dövlət başçımız ata vəsiyyətini yerinə yetirdi. Bu gün xalqımız Prezident, Ali Baş Komandanımız İlham Əliyevin son 20 illik prezidentlik fəaliyyəti zamanı reallığa çevirdiyi bütün uğurların şahididir. Belə ki, 2023-cü il, 15 oktyabr tarixində cənab İlham Əliyev prezident seçilməsinin 20-ci ildönümündə oktyabrın 15-də tarixi torpaqlarımız olan Xankəndi, Xocalı, Ağdərə, Xocavənd şəhərlərində və Əsgəran qəsəbəsində üçrəngli bayrağımızı qaldırdığı şərəfli, tarixi gün cənab Prezidentin daha xalqına verdiyi bütün vədləri yerinə yetirmək iqtidarında olmasının hesabatı idi. Son 20 ilin uğurları bir daha sübut etdi ki, onun sözü imzası qədər keçərlidir və nəyi, necə, nə vaxt etmək lazımdır yaxşı bilir. Xüsusilə də, Müzəffər Ali Baş Komandan İlham Əliyev Xankəndidə üçrəngli bayrağımızı qaldırmaqla bir əsrlik saxtakarlığa son qoyulduğunu bütün dünyaya nümayiş etdirdi.

***Prezident İlham Əliyevin stadionda topa ilk toxunuşu bir daha dövlət başçımızın dünyaya növbəti mesajı***

Məhz dekabrın 21-də xalqımız, eləcə də dünya ictimaiyyəti Prezident, Ali Baş Komandan İlham Əliyevin böyük sərkərdəlik məharəti, güclü iradəsi və qətiyyəti, nəhayət diplomatik siyasətinin nəticəsində daha bir tarixi hadisənin şahidi oldu. Prezident İlham Əliyev və Birinci vitse-prezident Mehriban xanım Əliyeva Xocavənd, Xocalı rayonlarına və Şuşaya səfərlərindən sonra Xankəndidə keçirilən "Qarabağ" və MOİK komandaları arasında Azərbaycan Kubokunun 1/8 final mərhələsinin oyununu izlədilər. Prezident, Ali Baş Komandan İlham Əliyevin stadionda topa ilk toxunuşu bir daha dövlət başçımızın dünyaya növbəti mesajıdır. Çünki Qalib Liderimiz nəyi, necə, nə vaxt etmək lazımdır, bunu özü bilir. Prezident və Birinci xanımın birlikdə işğaldan azad edilmiş topaqlarımızı qarış-qarış

gəzmələri, sürətlə davam etdirilən yenidənqurma, abadlıq və tikinti-bərpa işləri ilə şəxsən tanış olmaları, Xankəndi şəhər stadionunda Azərbaycanın futbol komandalarının yarışını azərbaycanlı azarkeşlərlə, o cümlədən şəhid övladları ilə birlikdə tam təhlükəsiz izləmələri, eyni zamanda, soydaşlarımızın ata-baba yurdlarına qayıtmaları dünyaya bir daha bəyan etdi ki, Qarabağ Azərbaycandır!

Prezident İlham Əliyev dekabrın 21-də futbol üzrə Azərbaycan Kubokunun 1/8 final mərhələsində Ağdamın "Qarabağ" və Bakının MOİK komandaları arasında Xankəndi stadionunda keçirilən oyundan əvvəl çıxışında deyib ki dörd il bundan əvvəl bu stadionda bəziləri "Qarabağ Ermənistandır və nöqtə" demişdilər. Biz onlara sübut etdik ki, Qarabağ Azərbaycandır!

### *Bugünkü yarış tarixdə əbədi qalacaq...*

Tarixi gün olan 21 dekabr Xankəndi stadionunda keçirilən futbol üzrə Azərbaycan Kubokunun 1/8 final mərhələsinin oyunu tarixdə əbədi qalacaqdır.Həmin görüşdə iştirak edən Prezident İlham Əliyev Xankəndi stadionunda futbol üzrə Azərbaycan Kubokunun 1/8 final mərhələsində Ağdamın "Qarabağ" və Bakının MOİK komandaları arasında keçirilən oyunun fasiləsində 2023-cü ilin idman yekunları ilə bağlı təşkil olunmuş mərasimdə idman ictimaiyyətinin təltif edilmiş nümayəndələri ilə görüşdə bildirib: "Yarışlar çox olub. Ancaq bugünkü yarış tarixdə əbədi qalacaq, həm xalqımız üçün, dövlətimiz üçün, dünya üçün... Biz tarix yazmışıq, yazırıq və bu gün dediyim kimi, Xankəndi cəmi üç ay bundan əvvəl azad edilmişdir, ancaq artıq Xankəndi - Azərbaycan şəhəri olan Xankəndi yaşayır və dirçəlir".

Qeyd edək ki, Azərbaycan Prezidenti həmişə olduğu kimi, bu il də idmançılarımızı sevindirib. Belə ki, dekabrın 20-də Prezident İlham Əliyev Azərbaycanda idmanın inkişafında xidmətləri olan bir qrup şəxsin təltif edilməsi haqqında Sərəncam imzalayıb. Ölkə başçısı bu yüksək mükafatların Xankəndidə verilməsinin tam ədalətli olduğunu bildirib. İşğal olunmuş torpaqların böyük hissəsinin üç il əvvəl İkinci Qarabağ müharibəsi nəticəsində azad edildiyini vurğulayan dövlətimizin başçısı bildirib ki, Qarabağın tacı olan Şuşa şəhərində Azərbaycan Bayrağı qaldırıldı. Üç ay bundan əvvəl – sentyabrın 19-20-də Xankəndi, Xocalı, Əsgəran, Xocavənd, Ağdərə rayonları da işğalçılardan azad edildi. Oktyabrın 15-də bütün bu şəhərlərdə

Azərbaycan Bayrağını ucaltdım. Noyabrın 8-də Xankəndinin mərkəzi meydanında Zəfər paradı keçirildi. Bu gün isə bu gözəl idman bayramını biz birlikdə qeyd edirik. Bundan sonra bu torpaqlarda Azərbaycan Bayrağı əbədi dalğalanacaq. Biz azərbaycanlılar burada əbədi yaşayacağıq.

Xankəndi stadionunda keçirilən futbol oyunu dövlətimizin başçısının vurğuladığı kimi, "Oyunun nəticələrindən asılı olmayaraq qalib bəllidir. Qalib Azərbaycan xalqıdır, Azərbaycan dövlətidir. Bugünkü oyunda "Qarabağ" və Mərkəzi Ordu İdman Klubunun qarşılaşması təbii ki, böyük rəmzi məna daşıyır".

***Qarabağ-ordu-xalq birliyi bizim zəfərimizin əsas mənbəyidir***

“Bütün başqa şəhərlər kimi bu gün Ağdam şəhəri də yenidən qurulur. O cümlədən bir neçə aydan sonra Ağdam şəhərində “İmarət” stadionunun yenidən inşasına başlanılacaq”. Bu fikri Prezident İlham Əliyev dekabrın 21-də futbol üzrə Azərbaycan Kubokunun 1/8 final mərhələsində Ağdamın “Qarabağ” və Bakının MOİK komandaları arasında Xankəndi stadionunda keçirilən oyundan əvvəl çıxışında deyib.

"Bugünkü oyunun nəticələrindən asılı olmayaraq qalib bəllidir. Qalib Azərbaycan xalqıdır, Azərbaycan dövlətidir. Bugünkü oyunda "Qarabağ" və Mərkəzi Ordu İdman Klubunun qarşılaşması təbii ki, böyük rəmzi məna daşıyır. Qarabağ-Ordu-Xalq birliyi bizim Zəfərimizin əsas mənbəyidir", – dövlət başçısı vurğulayıb.

Bir sözlə, ötən 20 ildə Azərbaycan xalqı həmişə öz liderinə güvənib və inanıb, ona arxa-dayaq olub. Prezidentimiz həmişə böyük fəxrlə deyir ki, bu uğurların əsasında məhz ölkədəki sağlam ictimai-siyasi mühit, xalqla iqtidarın birliyi dayanır. Bu gün qürurla deyə bilərik ki, Vətən müharibəsi günlərində Ordumuzun qüdrətini artıran xalq-ordu birliyi, "Dəmir yumruq" Azərbaycan xalqının birliyinin rəmzi, Zəfərimizin əsas mənbəyidir. Çünki bu zəfərlər və nailiyyətlər Prezident, Ali Baş Komandan İlham Əliyevin böyük sərkərdəlik məharəti, güclü iradəsi və qətiyyəti, nəhayət diplomatik siyasətinin reallığıdır. 2024-cü il fevralın 7-də keçirilən növbədənkənar prezident seçkilərində də öz Prezidenti ilə hər zaman birlik və həmrəylik nümayiş etdirən xalqımız bu seçkilərdə də müdrik dövlət başçımızın xarici və daxili siyasətini, eləcə də bütün digər təşəbbüslərini ən fəal şəkildə dəstəklədiklərini ifadə edəcəklər.

## Qürurla verilən vəd qətiyyətlə gerçəkləşdirilir

**“Siyasi həyatımda heç vaxt olmayıb ki, mən söz verim və arxasında dayanmayım. Verdiyim bütün sözlər yerinə yetirilib. Digər tərəfdən, mən çox söz vermirəm, çünki nəticəni nümayiş etdirməyi üstün tuturam”.**

Azərbaycan Prezidenti İlham Əliyev bu fikirləri Çinin CGTN televiziya kanalına müsahibəsində bildirib. Bəli, bu gün dövlət başçımızın qürurla dediyi sözləri qətiyyətlə gerçəkləşir. Artıq bu gün - 33 ildən sonra dövlətimiz və xalqımız ən şərəfli günlərini yaşayır, tariximizin qürur doğuran səhifələri yazılır. İndi Şuşa da azaddır, Laçın da, Kəlbəcər də, Ağdam da və digər işğal olunmuş rayonlar da. Hazırda işğaldan azad olunmuş torpaqlarımız bərpa olunur, yenidən qurulur. Bu gün görülən işlər, hər bir azərbaycanlının Prezidenti olduğunu, sözü ilə əməlinin üst-üstə düşməsinin məntiqi sübutudur.

Prezident İlham Əliyev qələbə zəfərindən sonra bütün çıxışlarında bildirib ki, bizim əsas vəzifəmiz keçmiş köçkünləri tezliklə dədə-baba torpaqlarına qaytarmaqdır və buna da nail olacağıq. "Siz köçkün deyilsiniz, siz qayıdırsınız. Biz sizi qaytaracağıq!", – deyən Prezident İlham Əliyev qaçqınların və məcburi köçkünlərin problemlərinin həllinə xüsusi qayğı ilə yanaşır, bu məsələni daim diqqət mərkəzində saxlayır, Böyük qayıdış üçün Qarabağ və Şərqi Zəngəzurda mükəmməl həyat şəraiti yaradır. Deyilənləri təsdiqləyən amil 2023-cü ilin iyun ayında dövlət büdcəsinə edilmiş dəyişikliklərdən sonra xərclər 3 milyard manat artırılaraq 36 milyard manata çatdırılmasıdır ki, bu da müstəqil Azərbaycanın tarixində rekord göstəricidir. Xərclərə əlavə edilən 3 milyard manatın təqribən 1,8 milyardlıq hissəsinin Qarabağ və Şərqi Zəngəzurda aparılan quruculuq işlərinə ayırlması isə belə bir həqiqətin növbəti təsdiqi oldu ki, işğaldan azad edilmiş ərazilərin bərpası Azərbaycanın milli prioritetidir.

Sözsüz ki, bütün bu quruculuq işlərinin təməlində Azərbaycan xalqının maraqları dayanır. Azərbaycan Prezidenti çıxışlarında, müraciətlərində də daim bildirib ki, 2003-cü ildə prezident seçkiləri ərəfəsində seçicilərlə görüşündə demişdi ki, ona etimad göstərilərsə, Heydər Əliyev siyasətinə sadiq qalacaq. Və Azərbaycan xalqı İlham Əliyevə səs verərək Ulu Öndərə olan məhəbbətlərini və inamlarını göstərdi. Artıq Prezident

İlham Əliev cənablarının ilk prezident seçilməsindən ötən 20 il ərzində Azərbaycan sürətli inkişaf və tərəqqi yolunda uğurla davam etməkdədir. Hər bir vədin konkret əməli işi ilə təsdiqləyən Azərbaycan Prezidenti İlham Əliyevin Qələbəmizin Zəfərindən ötən üç il ərzində işğaldan azad edilmiş ərazilərimizə səfərləri çərçivəsində təməlqoyma mərasimində iştirak etdiyi yeni sosial obyektlərin say tərkibinə, icrasına başlanan infrastruktur layihələrinə, imzalanan fərman və sərəncamlara, təsdiqlənən Dövlət proqramlarına diqqət yetirmək kifayətdir.

Prezident İlham Əliyev bu günə qədər verdiyi bütün vədləri yerinə yetirib. Çünki sözü imzası qədər qüvvətli olan liderdir! Belə ki, üç il bundan öncə tarixi Zəfərə imza atılması, bu il sentyabrın 19-da rəşadətli Ordumuzun bir günlük antiterror tədbirləri nəticəsində suverenliyimizin tam təmin olunması dövlətimizin qətiyyətinin, Müzəffər Ali Baş Komandan İlham Əliyevin böyük səylərinin, xalqımızın həyata keçirilən siyasətə inamının və Prezidentin ətrafında sıx birliyinin təqdimatıdır. Ali Baş Komandanımız tarixi Zəfərimizə qədər hər bir çıxışında əminliklə bildirirdi ki, üçrəngli bayrağımız Qarabağda, Xankəndidə, Şuşada dalğalanacaq. Bəli, artıq bu gün işğaldan azad olunan torpaqlarımızda üç rəngli bayrağımız dalğalanır.

Prezident İlham Əliyev oktyabrın 15-də – dövlət başçısı seçilməsinin 20 ilinin tamamında Xankəndidə Azərbaycan Bayrağını təntənəli şəkildə ucaltdı. Biz bunu bir vaxtlar heç xəyalımıza da gətirə bilməzdik. Prezident İlham Əliyevin müdrikliyi və qüdrəti onun mümkünsüz görünəni reallığa çevirməsi, xalqımızın ən böyük arzu və istəyini həyata keçirməsidir. Dekabrın 21-də isə Xankəndi şəhər stadionunda son 30 ildə ilk dəfə olaraq Azərbaycan komandaları arasında keçirilən və dünyaya mesaj mənasında mühüm əhəmiyyət kəsb edən futbol oyununda Prezident İlham Əliyevin bir daha vurğuladığı kimi, bu torpaqlarda Azərbaycan Bayrağı əbədi dalğalanacaq. Biz azərbaycanlılar burada əbədi yaşayacağıq!".

Bir sözlə, Prezident İlham Əliyevin xalqa verdiyi vədləri bütünlüklə yerinə yetirilib. Hazırda Azərbaycan tarixinin ən qüdrətli, sabit və güvənli dövrünü yaşayır. 20 il ərzində müəyyən olunmuş bütün vəzifələri icra etməklə, bütün hədəfləri reallaşdırmaqla Prezident İlham Əliyev dövlətin və xalqın əsl Lideri olduğunu sübut edib. Son 20 ildə Azərbaycan xalqı

həmişə öz liderinə güvənib və inanıb, ona arxa və dayaq olub. Prezidentimiz həmişə böyük fəxrlə deyir ki, bu uğurların əsasında məhz ölkədəki sağlam ictimai-siyasi mühit, Xalqla iqtidarın birliyi dayanır. Bu qarşılıqlı inam sayəsində Prezident İlham Əliyev xalqı bundan sonra da öz arxasınca zirvədən-zirvəyə, qələbədən-qələbəyə aparacaq. Bəli, bu gün Azərbaycan xalqı da Qalib Liderimiz Prezident İlham Əliyevin son 20 il prezidentlik fəaliyyəti dövründə bir daha gördü ki, dövlətimizin başçısı daim xalqı ilə birlikdədir, onların yanındadır, bütün görülən işləri də xalqına aydın şəkildə çatdırır. Bu günün reallıqları onu göstərir ki, qələbəmizdən ötən üç il ərzində həm siyasi, həm də iqtisadi baxımdan mühüm nailiyyətlərə imza atan – sözü imzası qədər qüvvətli olan lider Prezident İlham Əliyevin apardığı düzgün siyasət nəticəsində çox qısa zamanda Qarabağın yenidən dirçələcəyinə, qarşıdakı növbəti 2024-cü ildə də işğaldan azad edilmiş rayonlarımıza, bütün Qarabağa yeni nəfəs veriləcək, bu torpaqlarda həyat qaynayacaq, dünya Azərbaycan xalqının quruculuq əzminin şahidi olacaq. Beləliklə də, 2003-2023-cü il tariximizin inkişafla başlayıb zəfərlə davam edən ən qüdrətli mərhələsi olmaqla Azərbaycan bundan sonra növbəti illərdə də möhtərəm Prezidentimiz İlham Əliyev cənablarının uzaqgörən siyasəti və müdrik rəhbərliyi sayəsində inkişaf edəcək və çiçəklənəcək.

## Misilsiz uğurlara imza atan Qalib ölkənin Qalib Lideri

2024-cü il fevralın 7-də ilk dəfə olaraq bütün ölkə ərazisində keçiriləcək növbədənkənar prezident seçkilərində, Azərbaycan xalqı artıq işğal və separatizm problemi olmadan, eləcə də müstəqillik tarixinin ən güclü dövrünü yaşayaraq siyasi iradəsini ortaya qoyacaq. Yeni Azərbaycan Partiyası tərəfindən növbədənkənar prezident seçkiləri üçün cənab Prezident İlham Əliyevin namizədliyini irəli sürülməsi Azərbaycan Respublikası Konstitusiyasının 101-ci maddəsinin I bəndinə əsasən Prezident üçün konstitusional hüquqdur və dünya praktikasında qəbul edilmiş siyasi təcrübədir.

Qeyd edək ki, ölkəmizin tarixində ilk dəfə olaraq 2018-ci ildə hakim Yeni Azərbaycan Partiyası növbədənkənar prezident seçkilərinin keçirilməsi təşəbbüsü ilə çıxış etdi. Həmin təşəbbüsə uyğun olaraq fevralın 5-də Prezident İlham Əliyev "Növbədənkənar Azərbaycan Respublikası Prezidenti seçkilərinin elan edilməsi haqqında" Sərəncam imzaladı. Sərəncama əsasən seçkilər 2018-ci il aprelin 11-nə təyin edildi. Prezident İlham Əliyev 2018-ci il aprelin 18-də Milli Məclisdə andiçmə mərasimində çıxışı zamanı bildirdi ki, təməlini Heydər Əliyevin qoyduğu yol yeganə düzgün yoldur və Azərbaycanın müstəqillik tarixi bunun əyani sübutudur: "Hər bir sahə üzrə bizim konkret proqramlarımız, planlarımız var. Həm beynəlxalq məsələlərlə, həm bölgələrimizin möhkəmləndirilməsi, siyasi-iqtisadi islahatların dərinləşməsi, sosial siyasət, ordu quruculuğu ilə bağlı bizim konkret proqramlarımız var. Güclü siyasi iradə, böyük maliyyə resurslarımız var. Xalq-iqtidar birliyi var... Hamımızın amalı ondan ibarətdir ki, ölkəmiz daha da güclənsin, daha da qüdrətli dövlətə çevrilsin, Azərbaycan vətəndaşları daha da yaxşı yaşasınlar”.

Bəli, artıq 2018-ci il aprelin 11-də keçirilən prezident seçkilərindən ötən 5 il ərzində qalib Liderimizin verdiyi sözlər əməlləri ilə həyata keçirilməkdədir. Son illərin uğurlu nəticələrinə əsaslanaraq birmənalı şəkildə deyə bilərik ki, 2024-cü il fevralın 7-də baş tutacaq Müstəqil Azərbaycanın tarixində ilk dəfə olaraq növbəti 2024-cü il fevralın 7-də keçiriləcək növbədənkənar prezident seçkiləri artıq ölkəmizin istisnasız bütün ərazilərində, o cümlədən, işğaldan azad edilmiş Xankəndidə, Şuşada, Xocalıda, Laçında, Kəlbəcərdə, Cəbrayılda, Zəngilanda, Füzulidə və digər rayonlarda

keçiriləcək. Bu, Azərbaycan xalqının öz Prezidentinin rəhbərliyi ilə əldə etdiyi ən böyük tarixi nailiyyətidir. Bütün bu ərazilərdə müqəddəs bayrağımızı, öz xalqına söz verdiyi kimi, şərəflə ucaldan Prezident atdığı müdrik addımları, verdiyi düşünülmüş qərarları ilə nəyi nə zaman və necə etməyin lazım olduğunu hər kəsdən daha yaxşı bildiyini dəfələrlə nümayiş etdirib. Üç il bundan öncə Azərbaycanın parlaq Zəfərlə başa vurduğu 44 günlük Vətən müharibəsi, eləcə də 2023-cü ilin sentyabrın 19-20-də isə uğurlu antiterror əməliyyatları ilə Azərbaycan beynəlxalq qanunlarla təsbit olunmuş ərazilərində suverenliyini, ərazi bütövlüyünü tam bərpa etdi. Bir sözlə, beynəlxalq vasitəçilərin uzun illər edə bilmədiklərini və yaxud etmək istəmədiklərini Azərbaycan özü reallığa çevirdi. Bütün bunları nəzərə alaraq tam əminliklə bir daha deyə bilərik ki, 2024-cü il 7 fevral seçkilərinin ən şərəfli və qürurlu anı ondan ibarətdir ki, 30 il əvvəl evlərindən didərgin salınan azərbaycanlıların bir hissəsi daha müvəqqəti məskunlaşdıqları bölgələrdə deyil, böyük quruculuq və abadılıqla bərpa olunuan, cənnət məkana çevrilən öz doğma torpaqlarında – Zəngilanda, Laçında, Şuşada, Füzulidə, Cəbrayıldа və azad olunmuş digər yerlərdə səs verəcəklər. Çünki dövlət başçımızın xalqa müraciətində söylədiyi kimi: “Azərbaycan öz suverenliyini bərpa etdi”.

Bu gün Azərbaycan xalqı sözlə ifadə edilməsi mümkün olmayan misilsiz qələbə sevinci, yüksək fəxarət duyğuları, hədsiz fərəh, qürur hissləri yaşayır. Bu zəfərlə biz Ermənistanın ərazilərimizin 20 faizinin 30 illik işğalına son qoyduq. Torpaqlarımızı azad etməklə həm də bütün dünyada yenidən tanındıq, özü də bu dəfə qalib dövlətin Qalib sərkərdəsinin xalq birliyi ilə. Yenilməz, rəşadətli Azərbaycan Ordusunun misilsiz qəhrəmanlığı nəticəsində 44 gün ərzində ərazi bütövlüyümüz bərpa edildi.

44 günlük Vətən müharibəsində Azərbaycan dövləti qətiyyətli qələbə qazandı, işğalçını əzəli torpaqlarımızdan “iti qovan kimi qovdu”. Eyni zamanda, bütün Azərbaycan xalqı Prezidentimizin ətrafında “dəmir yumruq” kimi birləşərək, sözün əsl mənasında, böyük və qəhrəman xalq olduğunu bir daha sübut etdi, misilsiz birlik, həmrəylik nümayiş etdirdi və cəmiyyətimizdə mövcud olan Xalq-Lider-Ordu birliyini daha yüksək səviyyəyə qaldırdı.

Xalq öz Liderinə ürəkdən inandı və Ali Baş Komandan İlham Əliyev Azərbaycan xalqının etimadını əməli fəaliyyəti və şanlı zəfəri ilə doğrultdu.

Möhtərəm Prezidentimiz öz qətiyyəti, sarsılmaz iradəsi, cəsarəti, Azərbaycana edilən bütün təzyiqlərə məharətlə sinə gərməsi və son dərəcə mürəkkəb, çətin müharibə şəraitində hərbi meydanda, siyasi arenada, informasiya müharibəsində parlaq qələbələr qazanaraq xalqına söz verdiyi kimi sona qədər getdi, Azərbaycanın ərazi bütövlüyünü bərpa etdi və Vətən torpağı uğrunda şəhid olan bütün oğul-qızlarımızın qisasını aldı.

Əminliklə deyə bilərik ki, Prezident İlham Əliyev öz adını milli tariximizin son 200 ildə ən şanlı və müzəffər sərkərdəsi kimi Azərbaycan xalqının yaddaşına qızıl hərflərlə əbədi həkk etdi və Xalq-Dövlət-Ordu birliyi ilə bütün dünyaya gücünü göstərdi və sübut etdi. İşğal altında olan torpaqlarımız, o cümlədən Kəlbəcər, Ağdam və Laçının bir güllə belə atmadan qaytarıldı. 1 milyondan çox soydaşlarımızın torpaq, yurd həsrətinə son qoyuldu. Dövlət başçımızın söylədiyi kimi: "Bizim qələbəmizin rəmzi olan yumruq təkcə güc rəmzi deyil, bu, birlik rəmzidir". Sözü imzası qədər dəyəyərli və keçərli olan Müzəffər Ali Baş Komandan, Prezident İlham Əliyev cənabları da prezidentlik fəaliyyətinin 20 ili ərzində xalqına verdiyi vədləri yerinə yetirmiş güclü siyasi lider olaraq hər bir Azərbaycan vətəndaşının Prezidenti olduğunu təsdiqləyir. Hər bir vədin konkret əməli işi ilə təsdiqləyən Prezident İlham Əliyevin Qələbəmizin Zəfərindən ötən üç il ərzində işğaldan azad edilmiş ərazilərimizə səfərləri çərçivəsində təməlqoyma mərasimində iştirak etdiyi yeni sosial obyektlərin say tərkibinə, icrasına başlanan infrastruktur layihələrinə, imzalanan Fərman və sərəncamlara, təsdiqlənən Dövlət proqramlarına diqqət yetirmək kifayətdir. Prezident İlham Əliyev bu günə qədər verdiyi bütün vədləri yerinə yetirib.

“Mən ona özüm qədər inanıram və gələcəyinə böyük ümidlər bəsləyirəm” – ulu öndərin Prezidentimiz İlham Əliyev haqqında dediyi bu fikirlərin hər keçən gün öz təsdiqini tapdığının, hər bir azərbaycanlının Prezidenti olduğunun şahidi olur. Bu gün Azərbaycan Qarabağa qovuşdu, tarixi zəfərə imza atdı, şəhidlərimizin, Xocalı qurbanlarının, Gəncə, Bərdə digər şəhər və rayonlarımızda soyqırımları zamanı həlak olan günahsız insanların qisasını döyüş meydanında aldı, işğalçı Ermənistana layiq olduğu yeri göstərdi. Bu qələbəni, zəfəri bizə yaşadan isə ulu öndər Heydər Əliyev siyasi kursunun layiqli davamçısı ölkə Prezidentimiz, Ali Baş Komandanımız İlham Əliyevin qətiyyəti, siyasi iradəsi, güclü ordumuz,

rəşadətli əsgər və zabitlərimizdir. İnanırıq ki, 2024-cü il 7 fevralda keçiriləcək növbədənkənar prezident seçkilərində də xalqımız düzgün seçim edəcək və Azərbaycanı tarixinin ən qüdrətli dövlətinə çevirən alternativsiz liderini seçəcək.

## Sözü imzası qədər dəyərli olan Lider

**Prezident İlham Əliyevə ünvanlanan təbrik məktubları ölkə Liderinin beynəlxalq miqyasda nüfuzunun artmasının təzahürüdür**

Ulu öndər Heydər Əliyevin siyasi kursunu son 20 il müddətdə bütün sahələrdə uğurla davam etdirən Prezident İlham Əliyevin təkmil, yenilikçi siyasətinin nəticəsində Azərbaycanın istər daxildə, istərsə də beynəlxalq münasibətlər sistemində qazandığı uğurlar beynəlxalq aləmdə də yüksək dəyərləndirilir.

Xüsusilə də, dünya liderlərinin, tanınmış ictimai-siyasi xadimlərin, nüfuzlu beynəlxalq təşkilatların rəhbərlərinin Prezident İlham Əliyev cənablarına ad günü münasibətilə ünvanlanan təbrik məktublarında ifadə edilən fikirlərdə Azərbaycanın yüksək beynəlxalq nüfuza malik olması, regionun lider dövləti olaraq bir sıra mühüm beynəlxalq təşəbbüslərin müəllifi kimi tanınması, səmərəli tərəfdaşlıq münasibətləri ilə beynəlxalq güclər sistemində özünə layiqli yer tutması diqqətə çatdırılır. Bütün bunlarla yanaşı, respublikamızın beynəlxalq münasibətlərdə oynadığı önəmli rol, qlobal iqtisadi və humanitar layihələrdə liderliyi önə çəkilir, dünya ölkələrinin təhlükəsizlik, enerji və demokratik idarəetmə məsələlərində uğurlu səyləri yüksək qiymətləndirilir. Xüsusilə, dünyada BMT Baş Assambleyasından sonra ən böyük beynəlxalq təsisatı olan Qoşulmama Hərəkatı Azərbaycan Prezidenti İlham Əliyev cənablarının 2019-cu ildən etibarən üç il müddətinə sədrliyi dövründə gördüyü işlərə, irəli sürdüyü təşəbbüslərə və təsisatın fəaliyyətinin genişləndirilməsi, beynəlxalq aləmdə nüfuzunun artması istiqamətində atdığı addımlara görə ölkəmizə etimadın göstəricisi kimi Hərəkata sədrliyi daha bir il uzadıldı.

Dövlətimizin başçısının Qoşulmama Hərəkatının sədri kimi beynəlxalq müstəvidə davamlı və ardıcıl şəkildə irəli sürdüyü təşəbbüs və təkliflər daim həm Hərəkat, həm də digər ölkələrin geniş dəstəyini qazanıb. Ölkəmizin Hərəkata sədrliyinin ilk illəri COVID-19 pandemiyası ilə əlaqədar dünyanı sarsıdan qlobal səhiyyə böhranı dövrünə təsadüf etsə də, Azərbaycan özünün sədrlik gündəliyini çevik və effektiv şəkildə yeni reallığa uyğunlaşdırdı. Prezident İlham Əliyevin təşəbbüsü ilə Qoşulmama Hərəkatı pandemiya ilə mübarizədə qlobal lider rolunu öz üzərinə götürdü və dünya ictimaiyyətini bu təhdidlə mübarizədə səfərbər etdi. 2020-ci ilin

mayında Hərəkatın COVID-19 ilə mübarizəyə həsr edilən liderlər səviyyəsində onlayn sammitinin keçirilməsi bu istiqamətdə atılmış ilk addımlardan biri idi. Sammitdə Prezident İlham Əliyev BMT Baş Assambleyasının pandemiya ilə mübarizəyə həsr edilən xüsusi sessiyasının keçirilməsini təklif etdi. Bu təklif 150-dən çox ölkə tərəfindən dəstəkləndi və 2020-ci ilin dekabrında xüsusi sessiya uğurla baş tutdu. Beləliklə, məhz Azərbaycanın sədrliyi dövründə Qoşulmama Hərəkatının beynəlxalq aləmdə nüfuzu daha da yüksəldi, onun beynəlxalq gündəlikdə duran qlobal məsələlərin həllində rolu daha da artdı.

Bu faktı da vurğulamaq istərdim ki, bu gün Azərbaycan müxtəlif istiqamətlər üzrə bir çox beynəlxalq tədbirlərə ev sahibliyi edir və bu tədbirlər ölkəmizin tanınması, onun mədəniyyəti, tarixi haqqında məlumatların əldə olunması, iqtisadi imkanlar, gələcək layihələrin və əməkdaşlıq perspektivlərin dəyərləndiriləsi baxımından xüsusi əhəmiyyət daşıyır. Xüsusilə də, Beynəlxalq aləmin hər bir üzvünün razılığı BMT-nin İqlim Dəyişikliyi üzrə Çərçivə Konvensiyasının Tərəflər Konfransının 29-cu sessiyasının Bakıda keçirilməsi ölkəmizin alternativ enerjiyə keçiddə öz imkanlarını nümayiş etdirmək üçün mühüm platformadır. Əlbəttə ki, bu səbəbsiz deyil. Bu Prezident İlham Əliyevin həyata keçirdiyi siyasət nəticəsində, onun prinsipial mövqeyi sayəsində əldə olunur. Bu faktı xüsusi olaraq qeyd etmək istərdim ki, Ermənistan Azərbaycanın xeyrinə COP29 sessiyasına ev sahibliyi etmək üçün öz namizədliyini geri götürdü. Çünki Azərbaycanın irimiqyaslı beynəlxalq tədbirlərə ev sahibliyi etməkdə böyük təcrübəsi var. COP29-un gələn il ölkəmizdə keçirilməsi ilə əlaqədar beynəlxalq tədbirə hazırlıqla bağlı Prezident İlham Əliyevin sədrliyi ilə keçirilən müşavirədəki çıxışında bildirib ki, COP29-da 10 minlərlə xarici nümayəndə ölkəmizə gələcək, iki həftə ərzində Bakı dünyanın mərkəzi olacaq.

Bir sözlə, Prezident İlham Əliyevin rəhbərliyi ilə 20 il öncə həyata keçirilməyə başlanan uzaqgörən daxili və xarici siyasət Azərbaycanı dünyanın ən dinamik inkişaf edən dövlətləri sırasına çıxarıb. Dövlətimizin başçısı Azərbaycanın iqtisadi və hərbi qüdrətinin, beynəlxalq nüfuzunun gücləndirilməsi yolunda böyük inam və qətiyyətlə çalışıb. Vətən müharibəsi günlərində döyüşən orduya tapşırıqlarını birbaşa özü verib. Müzəffər Ali Baş Komandan üçrəngli bayrağımızın 30 ildən sonra Qarabağda, Şərqi

Zəngəzurda yenidən dalğalanmasına nail olub. Bu Qələbə regionda yeni reallıqların yaranmasına səbəb olub. Beləliklə bu gün cənab Prezident İlham Əliyevin hərtərəfli siyasəti sayəsində Azərbaycan təkcə regional iştirakçı deyil, həm də qlobal problemlərin həllinə təsir edə bilən bir ölkədir. Azərbaycan Liderinin artmaqda olan nüfuzu ölkənin siyasi gücünü artırmaqla yanaşı, ölkəmizi bir çox sahələrdə Avropa qitəsi üçün vacib, əvəzolunmaz və etibarlı tərəfdaşa çevirib.

Beləliklə də, bu gün Prezident İlham Əliyev cənablarına ünvalanan təbrik məktubları da dövlət başçımızın son 20 ildə uğurla, qətiyyətlə Azərbaycanın haqq, ədalət təfdarı olduğunun göstəricisi olmaqla, həmçinin məktublarda ölkəmizin dünya arenasında yüksək nüfuz qazanması, beynəlxalq gündəlikdəki çoxsaylı mühüm məsələlərin həllində fəal rol oynaması, regional sülh və sabitliyin möhkəmləndirilməsi istiqamətində birgə əməkdaşlıq münasibətlərinin qurulması ilə bağlı nəzərəçarpan uğurlar əldə etməsi öz ifadəsini tapıb. Bütün bu dəyərləndirilmələr isə təbii ki, Prezident İlham Əliyevin beynəlxalq uğurlu siyasətinə, səmərəli fəaliyyətinə verilən yüksək qiymətin ifadəsidir.

# “DƏMİR YUMRUQ” yerindədir və hər zaman yerində olacaq!

44 günlük İkinci Qarabağ müharibəsində dünya hərb tarixinə yeni səhifə yazan yenilməz Azəbaycan Ordusu növbəti qələbəyə imza atdı. Belə ki, Müzəffər Ali Baş Komandan, Prezident İlham Əliyev cənablarının "Dəmir yumruq" siyasəti ilə Ordumuzun Azərbaycanın Qarabağ iqtisadi rayonunda keçirdiyi daha bir böyük missiyanı uğurla başa çatdıraraq separatçıları təslim olmağa məcbur etdi. Bir günə təmin edilən qələbə yenilməz Ordumuzun malik olduğu imkanların olduğunu və Azərbaycanın müstəqilliyinə, suverenliyinə qarşı bütün təxribatların qarşısı qətiyyətlə alınır və alınacağının sübutu idi.

Bəli, dövlət o zaman güclü və qüdrətli, ən əsası, sözün əsl mənasında, müstəqil olur ki, onun gələcəyini düşünən, atdığı hər addımda dövlət maraqlarını öndə saxlayan Lideri vardır. Məhz bu gün Azərbaycanın müstəqil dövlət kimi mövcudluğu, dünya birliyində layiqli yer tutması, sözünün imzası qədər əhəmiyyəti, sabitlik diyarı kimi nüfuz qazanaraq bütün sahələrdə inkişafı, bir sözlə, yeniliyə əsaslanan inkişaf modeli liderlik amili ilə birbaşa bağlıdır. Hər bir dəyərləndirmə, hadisələrə düzgün qiymət bu günün fonunda keçilən yolun təhlilini bir tələb kimi qarşıya qoyur. Müzəffər Ali Baş Komandan, Prezident İlham Əliyev hər il olduğu kimi, 2023-cü ilin dekabrın 31-də Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü və Yeni il bayramı münasibətilə xalqımıza təbrik müraciətində qalib xalqa ilin nailiyyət yekunundan danışaraq suverenliyimizin tam bərpasının məhz 2023-cü il ərzində reallaşdığını diqqətə çatdırdı. Dövlət başçımız cəmi birgünlük antiterror tədbirləri ilə işğalçıların ərazimizdən çıxarılması prosesini böyük uğur kimi ön plana çəkərək bu münasibətlə Azərbaycan xalqını təbrik etdi: “Cəmi bir gün, ondan da az davam edən antiterror tədbirəri Azərbaycan Ordusunun tam Zəfəri ilə nəticələnmişdir. Separatçı rejim çökmüş, bizim qarşımızda diz çökmüş, ağ bayraq qaldırmış, təslim olmuş, torpaqlarımızdan əbədi olaraq çıxarılmış və tarixin zibilxanasına atılmışdır. Bununla Azərbaycanda separatizmin kökü kəsildi və separatizm - bu bəla bizim torpağımızda bir daha baş qaldıra bilməz!”.

Bəli, sözü imzası qədər dəyərli olan qurucu, birləşdirici, Azərbaycan xalqının bütün istək və arzularını həyata keçirən, öz siyasətində Azərbaycan dövlətinin və xalqının maraqlarını ən ali məqsəd kimi görən və bütün qüvvəsini bu istiqamətdə səfərbər edən, xalqın birmənalı şəkildə dəstəklədiyi, etimad göstərdiyi və etibar etdiyi qalib xalqın qalib lideridir. Çünki son 20 illik prezidentlik dövründə çoxəsrlik Azərbaycan tarixində xalqımıza "Dəmir yumruq" siyasəti ilə Qarabağ Zəfərini bəxş edən, bizi qalib xalqa çevirən Prezident, Ali Baş Komandan İlham Əliyev cənablarının Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü və Yeni il bayramı münasibətilə xalqımıza təbrik müraciətində söylədiyi kimi: "Tarixi Zəfərimiz - İkinci Qarabağ müharibəsindəki Zəfər, antiterror əməliyyatı, işğalçılardan azad olunmağımız, separatçı rejimin çökməsi bütün azərbaycanlıları haqlı olaraq bir araya, bir yumruq halına gətirir".

Dövlət başçımızın qətiyyətinə və prinsipiallığına inanan Azərbaycan xalqının böyük əksəriyyəti şübhə etmirdi ki, Ali Baş Komandan indiyədək bütün vədlərini yerinə yetirib, dediyi sözlərə əməl edib. 30 ilə yaxın işğal altında olan torpaqlarımızı Prezident, Ali Baş Komandan İlham Əliyev cənablarının rəhbərliyi ilə Müzəffər Azərbaycan Ordusu işğaldan azad etdi.

Prezident İlham Əliyev müraciətində bildirdi ki, bütün bu qələbələrlə qürur hissi keçiririk: "Mən o vaxt da demişdim ki, heç kim bizim iradəmizə təsir edə bilməz. Biz haqq yolundayıq, öz sərhədimizi özümüz nəzarətə götürmüşük və heç kimə imkan verməlik ki, bizim torpağımızda at oynatsın. Bu, bizim torpağımızdır, bu torpağın sahibi bizik, nə lazım biliriksə, onu da edəcəyik, beynəlxalq hüquq çərçivəsində, o cümlədən beynəlxalq humanitar hüquq çərçivəsində. O da dərs olmadı işğalçılara, o da dərs olmadı onların arxasında dayanan anti-Azərbaycan qüvvələrə. Ona görə sentyabr ayında keçirilmiş antiterror tədbirləri labüd idi və biz bunu keçirdik, bununla da fəxr edirik, qürur hissi keçiririk. Hər bir Azərbaycan vətəndaşı, dünyada yaşayan hər bir azərbaycanlı haqlı olaraq qürur hissi keçirir". Ali Baş Komandan müraciətində: "Ermənistan rəhbərliyi də bu tarixi dərslərdən nəticə çıxarmalıdır və özünü elə aparmalıdır ki, bizim qəzəbimizə tuş gəlməsin" mesajı Qalib Liderin bütün dünyaya mesajı idi.

Prezident İlham Əliyev müraciətdə Böyük Qayıdış – Qarabağ və Şərqi Zəngəzur mövzusuna da toxunaraq həmvətənlərimizin öz doğma torpaqlarına qayıtması ilə müxtəlif yaşayış məskənlərində artıq həyatın bərpa edildiyini də nəzərə çatdırdı. Qarabağda qısa zamanda yenidən qurulan kəndlər və şəhərlər, ümumilikdə buranın böyük tikinti meydançasına çevrilməsi Azərbaycanın iqtisadi inkişafının maddi əsaslarının möhkəmliyinin göstəricisidir. Prezidentin qeyd etdiyi geniş bərpa işləri ilə bağlı göstəricilər dövlətimizin sülhə, əmin-amanlığa və inkişafa nə dərəcədə maraqlı olduğunu, bütün dünyaya bəyan etdi. Çünki dövlət başçımızın söylədiyi kimi: "Bu torpaqların sahibləri bizik – Azərbaycan xalqıdır". Bu torpaqların sahibi Azərbaycan xalqı olduğu üçün də haqqı, ədaləti, ərazi bütövlüyümüzü bərpa edərək öz torpaqlarımıza sahib olduq. Ali Baş Komandanın tarixi müraciətində bir daha vurğuladı ki, məhz bu gün bütün bu uğurlarla azərbaycanlıları haqlı olaraq müstəqil Azərbaycanla fəxr edir, başını dik tutub yaşayır, alnıaçıq, üzüağ yaşayırlar. Bu qələbə, bu zəfər xalqımızın bir olması, bir yumruq kimi birliyinin nəticəsidir. Dövlət başçımızın müraciətində söylədiyi kimi: “”Dəmir yumruq” bizim Zəfər salnaməmizin, birliyimizin rəmzidir və Azərbaycan xalqını, bütün dünya azərbaycanlılarını əmin etmək istəyirəm ki, "Dəmir yumruq" hər zaman yerində olacaq!”.

Düşmən bilməlidir ki, “Dəmir yumruq” yerindədir. Qoy, “Dəmir yumruğ”unuz hər zaman yerində olsun, Cənab Prezident! Qoy xalqımızın, dövlətimizin, ordumuzun birliyi heç vaxt sarsılmasın!

## Qalib Azərbaycan yeni-yeni hədəflərə doğru inamla addımlayır

Tarixinin ən qüdrətli Azərbaycanı növbəti mühüm seçim qarşısındadır. Xalq prezident seçkilərinə böyük coşqu ilə hazırlaşır. Bu, müstəqillik tariximizin sayca 9-cu prezident seçkiləridir. Belə ki, 30 ildən sonra ərazi bütövlüyünü təmin etmiş müstəqil Azərbaycanın tarixində ilk dəfə seçkilər bütün ölkə ərazisində keçiriləcək. Yəni, bu seçkilər ərazi bütövlüyümüzün və suverenliyimizin təsbitidir. Bu dövr suverenliyimizin təmin olunduğu 20 sentyabr tarixindən başlayır və yeni hədəflərlə zəngindir. Bu dövrün xeyir-duasını 7 fevral tarixində keçiriləcək növbədənkənar prezident seçkiləri verəcək. Hər bir Azərbaycan vətəndaşı seçki hüququndan istifadə edərək bu prosesdə fəal iştirak edəcək, qalib xalqın qalib Liderinə səs verməklə zəfərlərimizin davamlılığına dəstək olacaq. Eyni zamanda, bu seçkilər ölkəmizə düşmən gözü ilə baxanlara qarşı daha inamlı mübarizə aparmağımız üçün bizə yeni siyasi güc verəcək. Prezident İlham Əliyevin hər bir müsahibəsi çağırışlarla zəngin olduğu kimi, yanvarın 10-da verdiyi müsahibəsində ölkəmizin bu günü, gələcəyi, əsasən də Qarabağda baş verən proseslərlə bağlı çox vacib məqamlara toxunub, mövcud reallıqları diqqətə çatdırıb, qarşıda görüləcək işlərdən, planlardan bəhs edib, eyni zamanda, ciddi mesajlar verib "Yeni dövrün yeni hədəfləri olmalıdır" çağırışı qarşıdakı illərdə Azərbaycanın aydın mənzərəsini təqdim edir.

Azərbaycan Prezidenti İlham Əliyev daim çıxışlarında bildirir ki, hər dövrün öz tələbləri var. Biz 1990-cı illərin tələbləri ilə XXI əsrdə yaşaya bilmərik. Hətta bu gün müharibədən sonra yeni dövr başlayır. Əvvəlki dövrlərdə əldə edilmiş bütün uğurları biz kənara qoymalıyıq: "Bəli, bu, bizim üçün fundament yaratdı, baza yaratdı, imkan yaratdı ki, biz əsas məqsədimizə çataq. Ancaq əgər biz oturub bütün günü o dövr haqqında danışsaq, gələcək haqqında düşünməsək, onda nə olacaq. Biz gələcək haqqında düşünməliyik. Biz zamanı qabaqlamalıyıq".

Bütün fəaliyyəti ilə Ulu Öndər Heydər Əliyevin siyasi kursunun, onun zəngin dövlətçilik məktəbinin layiqli davamçısı olduğunu təsdiqləyən cənab İlham Əliyev iqtisadi amilə xüsusi önəm verərək digər sahələrin

də inkişafı üçün möhkəm təməl yaratdı. Bu siyasətin nəticəsində yeni-yeni hədəflərə nail olmaq üçün səylər göstərir. Məhz bu uğurlar bu gün beynəlxalq aləmdə inkişafın Azərbaycan modelinin mövcudluğunu önə çəkir və öyrənilməsinin vacibliyini şərtləndirir. Təbii ki, bu günümüzü müstəqilliyimizin ilk illərində yaşanan durumla müqayisə etdikdə müqayisəsi mümkün olmayan reallıqların şahidi oluruq. O vaxt Azərbaycanda xaos hökm sürürdü. Bu gün Azərbaycanda sabitlikdir. O vaxt Azərbaycanda hərc-mərclik var idi. Bu gün Azərbaycanda sülh, əmin-amanlıqdır. O vaxt Azərbaycanın iqtisadiyyatı tənəzzülə uğrayırdı. Bu gün Azərbaycan dünyada ən dinamik inkişaf edən ölkələrdən biridir. O vaxt Azərbaycan vətəndaş müharibəsi ilə üz-üzə qalmışdı. Bu gün Azərbaycanda milli birlik, milli həmrəylik mövcuddur. O vaxt Azərbaycanda total böhran hökm sürürdü. Bu gün dünyanın aparıcı dairələri də etiraf edirlər ki, Azərbaycan ən qüdrətli ölkəyə çevrilməkdədir. Bütün bunları edən, yaradan, xalqın dəstəyinə arxalanan xalqımızın Ümummilli Lideri Heydər Əliyev olmuşdur. Prezident İlham Əliyev bildirib: "Bu gün Heydər Əliyev siyasəti bütövlükdə bütün sahələrdə davam etdirilir. 2003-cü ildə Azərbaycan xalqı mənə böyük etimad göstərərək Prezident vəzifəsinə seçdiyi gündən bu günə qədər bu siyasətə sadiqəm. Mən 2003-cü ildə bu barədə sözümü demişəm. Mən bu siyasətə sadiq qalacağam və 2003-cü ildən bu günə qədər Azərbaycanda gedən uğurlu inkişaf Heydər Əliyev siyasətinin təntənəsidir, müstəqil Azərbaycanın təntənəsidir."

Prezident İlham Əliyev yanvarın 10-da yerli televiziyalara verdiyi müsahibəsində bildirdi ki, biz ölkəmizin suverenliyini tam bərpa etmişik: "Biz əsas vəzifəni, siz də qeyd etdiyiniz kimi, bir neçə ay bundan əvvəl həll etmişik, ölkəmizin suverenliyini tam bərpa etmişik və sentyabr hadisələri, əlbəttə ki, ümumi kontekstdən çıxarıla bilməz". Dövlət başçısı onu da qeyd etdi ki, sentyabra qədər getdiyimiz yol məqsədyönlü yol idi, məqsədə hesablanmış yol idi, düzgün yol idi. İstər siyasi müstəvidə, istər hərbi müstəvidə, istər ölkəmizdə gedən proseslər nöqteyi-nəzərindən bu hadisə bütün işlərimizin elə bil ki, son nidası idi: "Bu gün biz 2024-cü ilə suverenliyini tam bərpa etmiş ölkə kimi, xalq kimi başlayırıq".

Ölkə rəhbəri, eyni zamanda, üçrəngli bayrağımızı Xocalı və Xankəndidə ucaltdığı zaman keçirdiyi hisslərini bölüşərək bildirmişdi: "Xocalıda bayrağı qaldırandan sonra biz tam əminliklə deyə bilərik ki, Xocalı

qurbanlarının qanı yerdə qalmadı. Xankəndidə isə bayrağın qaldırılması ədalətin tam bərpası idi və Zəfərimizin son nöqtəsi idi".

Prezidentin müsahibəsində önəmli məqamlardan biri də fevralın 7-də keçiriləcək növbədənkənar prezident seçkiləri barədə fikirləri və seçkiləri şərtləndirən əsas amillərlə bağlı səsləndirdiyi açıqlamalar oldu. Prezident İlham Əliyev bunu ilk növbədə, sentyabr hadisələrindən sonra yeni dövrün başlanğıcı ilə əlaqədar olduğunu bildirdi: "Suverenliyimiz tam bərpa olunub. Sentyabr ayında biz elə bir dövrə yekun vurmuşuq ki, bu, epoxal bir hadisədir. Yəni, Azərbaycanın çoxəsrlik tarixində buna oxşar Zəfər olmamışdır. Bütün amilləri - siyasi, hərbi və 30 illik işğalı, ərazinin relyefini, müdafiə xətlərinin çox olmasını nəzərə alsaq bu, xalqımızın, dövlətimizin ən parlaq Qələbəsidir. 30 il ərzində işğal altında olmuş ərazilərin işğaldan azad edilməsi və suverenliyi tam bərpa etməyimiz yeni dövrün başlanğıcı idi". İkinci səbəbin ilk dəfə olaraq müstəqil həyatımızda ərazilərimizin hər bir yerində keçiriləcək birinci seçkilərin məhz prezident seçkilərinin olmasının vacibliyini vurğulayan dövlət başçımız əlavə etdi ki, prezident kimi fəaliyyətinin 20 ili tamamlandı. "Bu da bir dövrdür və bunu da biz bir yekun kimi qəbul etməliyik. 20 ildən sonra yenidən prezident seçkilərinin keçirilməsi təbii ki, bu xronoloji dövrü də əsaslandırmış olur".

Dövlət başçısı İlham Əliyevin qeyd etdiyi kimi, prezident seçkiləri bu yeni dövrə də xeyir-dua verəcək. Yeni dövrün yeni hədəfləri olmalıdır: "Biz yeni dövrə köhnə hədəflərlə gedə bilmərik, çünki o hədəflər artıq əldə edildi və indi bəzi ölkələr var ki, öz tarixi keçmişini, tarixi uğurları illər boyunca, onilliklər ərzində istismar edirlər. Halbuki, onların özlərinin o zəfərlərə heç bir aidiyyəti yoxdur. Yəni, biz o ölkələrdən olmaq istəmirik. Biz nə etmişiksə etmişik, xalq da bunu qiymətləndirir və qiymətləndirəcək".

Bir sözlə, əvvəlki seçkilərdə olduğu kimi, Azərbaycan xalqı yenə tarixi seçimini edəcək – sabitliyə, əmin-amanlığa, bütövlüyə səs verəcək. Çünki xalq-iqtidar birliyi Azərbaycanda inkişafımızın əsas amilidir. Prezident İlham Əliyev xalqa müraciətində demişdir: "Mən həmişə Azərbaycan xalqının dəstəyini hiss edirəm. Bu dəstək mənə güc verir. Bu dəstək bizim inkişafımızın əsas şərtidir. Xalq-iqtidar birliyi Azərbaycanda inkişafımızın əsas amilidir. Xalq-iqtidar birliyi bizim məqsədyönlü siyasətimiz

bu gün Azərbaycanı qüdrətli dövlətə çevirmişdir. Siyasətimizin mərkəzində həmişə Azərbaycan vətəndaşı, onun problemləri, qayğıları, onun rifahı olubdur. Keçdiyimiz yol şərəfli yoldur, qələbələr, uğurlar yoludur. Əminəm ki, biz həmişə qələbələr yolu ilə gedəcəyik".

Bir sözlə, Azərbaycanın çağdaş tarixində yeni intibah mərhələsinin əsasını qoyan, milli mənafelərə söykənən strateji siyasi kursun ardıcıllığını təmin edən, təvazökarlığı həyat tərzinə çevirən Azərbaycan Prezidenti, Ali Baş Komandan İlham Əliyev son 20 il ərzində sözü ilə əməli bir olan, hər bir vətəndaşının problemini öz problemi, qayğısını öz qayğısı kimi qəbul edən, iştirak etdiyi bütün seçkilərdə xalqın mütləq əksəriyyətinin səsini, etimadını qazanan, parlaq zəkası, peşəkar idarəçilik qabiliyyəti və praqmatik yanaşması ilə xalqının Prezidenti olduğunu əməli və yorulmaz fəaliyyəti ilə sübuta yetirmişdir. İnanıram ki, 7 fevral 2024-cü il tarixində Azərbaycan xalqı cənab İlham Əliyevə səs verməklə yeni hədəfləri birlikdə həyata keçirməyin ilk addımını atacaq.

## BÖYÜK ZƏFƏR: Döyüşdən seçkiyə

Budur, xalqımız bir neçə gün öncə ən böyük tarixi zəfərlərindən daha birinə imza atdı. 44 günlük müharibədə və lokal xarakterli antiterror tədbirləri çərçivəsində bütün ərazilərimiz qüdrətli Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi ilə, igid oğullarımızın misilsiz qəhrəmanlığı ilə düşməndən azad edildisə, fevralın 7-də keçirilən Zəfər seçkisi bütöv və azad Azərbaycanın ALİ TƏSDİQİ oldu. Bu tarixi təntənəni Azərbaycan xalqına yaşadan cənab İlham Əliyevin prezident seçkilərində inamlı qələbə qazanaraq növbəti müddətə dövlət başçısı seçilməsi, xalqın öz Liderinə sarsılmaz inamından qaynaqlanmaqla, son iyirmi ildə görülən işlərə, qazanılan uğurlara verilən tarixi dəyərdir.

7 fevral prezident seçkiləri həm də başqa bir tarixi məqamla da yadda qaldı. Budəfəki prezident seçkiləri bu vaxta qədər görülməmiş ən yüksək seçici fəallığı ilə də tarixə düşdü. Ən ucqar, dağlıq yaşayış ərazilərində əhalinin seçki məntəqələrinə axın etməsi, məsuliyyətli vətəndaş mövqeyi sərgiləməsi, ilk növbədə, bu xalqın öz qalib liderinə olan böyük sevgisinin nümayişi oldu.

Xüsusilə, yüksək seçici fəallığı beynəlxalq müşahidəçilərin də diqqət mərkəzində olub. Seçkilərin nəticələri barədə ən nüfuzlu beynəlxalq müşahidəçilərin fikirləri Azərbaycana qarşı ikili oyun yürüdən qərb dairələrinə ən böyük və ədalətli zərbə oldu. Bir məqama diqqət edək: nüfuzlu beynəlxalq təşkilatlar, müxtəlif ölkələri təmsil edən çoxsaylı müşahidəçilər tərəfindən bununla bağlı səslənən fikirlər və mətbuata verilən bəyanatların ruhu seçkilərin məhz qanunçuluğa hörmət və ədalət prinsipi əsasında keçdiyinin bariz göstəricisidir. Prezident seçkilərinə qatılan digər namizədlərin YAP-ın namizədi cənab İlham Əliyevi parlaq qələbə münasibətilə təbrik etmələri siyasi mədəniyyət nümunəsi olmaqla yanaşı, həm də səsvermənin nəticələrinin Azərbaycan xalqının dövlət başçısına olan inam və etimadının daha bir təsdiqidir. Bu, həm də ölkəmizin sosial-iqtisadi inkişafı və xalqımızın rifahı yolunda həyata keçirilən qətiyyətli siyasətə milli həmrəylik nümunəsi olaraq cəmiyyətin bütün təbəqələri tərəfindən verilən yüksək qiymətin və dəstəyin əyani təzahürüdür.

Bəli, hətta Qərbdəki ən radikal mənfi qüvvələr də etiraf edirlər ki, Azərbaycanın seçki təcrübəsi və mükəmməl qanunvericilik bazası var.

Bu elə bir həqiqətdir ki, heç bir qarayaxma kampaniyası bu gerçəyi dəyişdirə bilməz. Buna görə də fevralın 7-də növbədənkənar prezident seçkiləri çox yüksək səviyyədə, tam şəffaf və demokratik prinsiplərə uyğun keçirildi. Əksər beynəlxalq müşahidəçilər, müstəqil rəy institutlarının təmsilçiləri seçki axşamı bu fikri özəlliklə keçirdikləri mətbuat konfranslarında qeyd edirdilər. Ən önəmlisi də odur ki, tam əksəriyyəti qərbi təmsil edən Avropa ölkələrinin təmsilçiləri bu fikri dönə-dönə qeyd edirdilər. Onların diqqət çəkdikləri bir başqa məqam Azərbaycanda medianın seçki prosesində iştirakı üçün yaradılan şərait barədə idi. Onlar vurğulayıb ki, seçkiqabağı proses, eləcə də seçki günü səsvermənin gedişatının işıqlandırılması prosesinə xeyli sayda yerli və beynəlxalq media subyekti cəlb olunmuşdu. Bu, digər ölkələr üçün nümunədir. Bu sadaladığımız faktlar riyakar qərb siyasətçilərinə ən böyük cavadır!

Növbədənkənar prezident seçkiləri bir sıra məqamları və əhəmiyyəti ilə şanlı tariximizə həkk oldu. Biz 30 ildən sonra ilk dəfə olaraq ərazi bütövlüyümüz tam təmin edilmiş şəkildə seçki keçirdik və bu seçki bütün ölkə ərazisini əhatə etdi. Keçmiş məcburi köçkün bacı və qardaşlarımız öz yurdlarında seçici olaraq səsverməyə qatıldılar. Bununla da biz ərazi bütövlüyümüzü və suverenliyimizi bir daha təsdiq edərək bütün dünyaya nümayiş etdirdik. Həm də qalib, müzəffər xalq olaraq, alnıaçıq-üzüağ. Odur ki, bu seçkilər Zəfər seçkisi olaraq tariximizdə əbədi qalacaq. Qeyd edim ki, seçki kampaniyası başlayandan prosesin sonunadək bütün işlər qanun çərçivəsində, demokratik prinsiplər üzərində quruldu, yeddi namizədin hər birinə bərabər imkanlar yaradıldı. Beynəlxalq və yerli müşahidəçilərin apardıqları monitorinqlərin, keçirilən "exit-poll"arın nəticələri də seçkilərin obyektiv, demokratik keçirildiyini təsdiqlədi. Bu, Azərbaycanda dərin köklərə malik demokratiyanın təzahürüdür.

Cənab İlham Əliyevin son 20 ildə hər bir vədi reallıqda öz aydın ifadəsini tapıb: "Xalq hər zaman özünə diqqətin şahidinə çevrilir. Cənab İlham Əliyev 2003-cü ildə xalqın böyük əksəriyyətinin səsini qazanaraq Prezident seçildikdən sonra andiçmə mərasimində əhalinin sosial müdafiəsinin gücləndirilməsini, yoxsulluq deyilən sosial bəlanın aradan götürülməsini prioritet məsələ kimi önə çəkdi. Onun sosial dövlət fəlsəfəsinin əsasında hər bir vətəndaşın layiqli həyat şəraitinin təmin edilməsi prinsipi dayanır. Ölkəmizin iqtisadi qüdrətinin artması vətəndaşların sosial

rifahının yüksəldilməsinə yönəlmiş layihələrin həyata keçirilməsinə zəmin yaradıb. Bu siyasətin ən önəmli istiqamətlərindən biri ölkəmizdə keçmiş qaçqın və məcburi köçkünlərə 30 ilə yaxın bir dövrdə göstərilən diqqət və qayğıdır. Cənab İlham Əliyev onlarla görüşlərində daim böyük əminliklə bildirirdi ki, yaradılan şərait müvəqqəti xarakter daşıyır, tezliklə soydaşlarımız dogma yurd-yuvalarına qayıdacaq, bu torpaqlada yeni həyat başlayacaq. Qürurvericidir ki, soydaşlarımız 7 fevral prezident seçkilərinə öz dogma yurd-yuvalarında qatıldılar. İşğaldan azad edilmiş ərazilərimizdə seçici fəallığı 93 faizdən çox olub. Bu rəqəm tarixi Zəfərimizin müəllifi cənab İlham Əliyevə böyük etimadın göstəricisidir."

Artıq indi xalqımızın və dövlətimizin həyatında yeni parlaq bir dövr başlayır. Cənab İlham Əliyevin ölkəmizə növbəti yeddi ildə rəhbərliyi ilə bizi ötən 20 ildə əldə edilmiş nailiyyətlərin davamı ilə yanaşı, fəth ediləcək daha uca zirvələr, böyük hədəflər gözləyir. Bu, indikindən də qüdrətli, bütün sahələr üzrə hərtərəfli inkişaf etmiş, güclü iqtisadiyyata sahib müstəqil Azərbaycan olacaq. İlham Əliyev cənabları nadir tarixi şəxsiyyətlərdəndir ki, xalqına verdiyi bütün vədləri tam şəkildə və vaxtında yerinə yetirib. O, dövlətimizi ağır sınaqlardan, mürəkkəb proseslərdən üzüağ çıxarıb, dünyanı bürüyən və ağır fəsadlar törədən dərin böhranları ölkəmizə buraxmayıb. Vaxtı ilə haqqı tapdanan, səsi eşidilməyən, hərbi təcavüzə məruz qalan, torpaqları işğal edilən Azərbaycan bu gün regionun lideri, dünyanın strateji əhəmiyyətli ölkəsidir. Odur ki, xalqımızın daha xoşbəxt, səadət dolu günləri, dövlətimizin ən əzəmətli, güclü illəri hələ qarşıdadır. Böyük, bütöv və qüdrətli Azərbaycan!

## Dünya ictimaiyyəti terrorçuların qəhrəmanlaşdırılmasına laqeyd qalmamalıdır

Tarixən ermənilər müxtəlif ağır cinayətlərin, kütləvi qırğınların, qətliamların törədilməsində iştirak ediblər. Bu cinayətlərdə onlar əsasən muzdlu, eləcə də müəyyən xarici qüvvələrin, dövlətlərin əlində alət olublar və bu gün də ermənilər üçün bu "ənənə" davam edir. Belə ki, ermənilər son iki yüz il ərzində azərbaycanlılara və türklərə qarşı qətliamlar, soyqırımlar törədiblər. 1905-ci, 1918-ci illərin qırğınları, eləcə də müasir dövrümüzdə Xocalı soyqırımı buna sübutdur. İyulun 29-da sərhədçilərimiz tərəfindən saxlanılan 1991-ci ildə Xocalı rayonunun Meşəli kəndində Azərbaycan milliyyətindən olan şəxslərə qarşı soyqırımı cinayətləri törətmiş, Azərbaycan Cinayət Məcəlləsinin 103 və 107-ci maddələri üzrə cinayətləri törətməkdə təqsirləndirilən və 10 ildir ki, beynəlxalq axtarış elan edilməklə məhkəmənin qərarı ilə barəsində həbs qətimkan tədbiri seçilmiş hərbi cani Vaqif Xaçaturyanın yaxalanmasından dərhal sonra Ermənistan Xarici İşlər Nazirliyinin qeyri-adekvat bəyanatlar verməsi, əslində azərbaycanlılara qarşı 30 il davam edən müharibə cinayətlərinin dövlət səviyyəsində törədildiyini və İrəvanın bu gün də öz çirkin əməllərinə haqq qazandırmaqda davam etdiyini göstərir. Bundan əlavə, Xaçaturyanın həbsi 1948-ci il 9 dekabr tarixli "Soyqırımın qarşısının alınması və cəzalandırılması haqqında Konvensiya"nın, 1948-ci il 10 dekabr tarixli "İnsan hüquqları haqqında" Ümumi Bəyannamənin və 1966-cı il 10 dekabr tarixli "Mülki və siyasi hüquqlar haqqında" Beynəlxalq Paktın tələbləri ilə də tam legitim və qanunidir. Həmçinin, 25 nəfərin öldürülməsi, 14 şəxsə müxtəlif dərəcəli bədən xəsarətləri yetirilməsi, 358 nəfər azərbaycanlının isə hüquqi əsaslar olmadan qanuni yaşadıqları yerlərdən didərgin salınması faktlarını görməzdən gələn Ermənistanın müharibə canisini "insan haqları" pərdəsi altında müdafiə etməsi absurddur. Çünki bu gün də Ermənistan hələ də revanşist niyyətindən əl çəkməyib və hər bir xüsusi hala Azərbaycan əleyhinə istifadə edə biləcəyi imkan kimi yanaşır. Bu yanaşma ilə bölgədə sülhü və sabitliyi təmin etmək asan deyil.

Bir məqamı da vurğulamaq istərdim ki, Azərbaycan Vaqif Xaçaturyanı erməni olduğu üçün yox, məhz təkzibedilməz dəlillərlə təsdiqlənən

müharibə cinayətlərinə görə yaxalayıb. Azərbaycan dövləti üçün cinayət törətmiş şəxslər qanun qarşısında bərabərdirlər və cinayət təqibi insanların irqindən, milliyyətindən, dinindən, dilindən asılı olmayaraq hər kəsin qanun və məhkəmə qarşısında hüquq bərabərliyi əsasında həyata keçirilir. Bu mənada Ermənistan Xarici İşlər Nazirliyi siyasi manipulyasiyalara əl ataraq Bakının erməni əsilli sakinləri hədəfə alması onlar arasında təşviş yaradaraq Azərbaycan cəmiyyətinə reinteqrasiyasına mane olmağa cəhd etməsi mənasız və absurdur, hərbi caninin saxlanması ətrafında şou yaratmaqla yeni manipulyasiyalara əl atmaqdan çəkinsin. Çünki Azərbaycan istər Ermənistanda, istərsə də Rusiya sülhməramlılarının müvəqqəti nəzarət zonasındakı bütün hərbi canilərin yaxalanması və ədalət mühakiməsinə təhvil verilməsi prosesini bundan sonra da qətiyyətlə davam etdirəcək. Xaçaturyanın yaxalanması ilə Azərbaycan dövləti göstərdi ki, heç nə unudulmur və müharibə canininhüquqi qiymətin verilməsi, o cümlədən 30 illik bir dövrdə sülh və insanlıq əleyhinə cinayətlər törətmiş hər bir cinayətkarın ifşa olunaraq məsuliyyətə cəlb edilməsində nə qədər qətiyyətlidir. Azərbaycan bundan sonra da ardıcıl olaraq öz suverenliyinin, ərazi bütövlüynün və hərbi qüdrətinin artırılması, o cümlədən vətəndaşlarının hüquq və azadlıqlarının qorunması istiqamətində beynəlxalq hüquq çərçivəsində bütün tədbirləri görəcək.

V.Xaçaturyanın saxlanılması haqqında Ermənistan tərəfinin iddiaları isə uydurmadan başqa bir şey deyil və buna görə beynəlxalq müstəvidə adekvat reaksiya görmür. Azərbaycanın hüquq-mühafizə orqanlarının əlində Xaçaturyanın Meşəli qətliamının icraçılarından olmasına dair faktlar mövcuddur, lazım olarsa, bu faktlar beynəlxalq instansiyalara da təqdim edilə bilər və atılan addım beynəlxalq konvensiyalara uyğundur.

Bu yerdə Azərbaycan Prezidenti İlham Əliyev Şuşa Qlobal Media Forumunda çıxışı zamanı Azərbaycana qarşı əsas təhlükələrlə bağlı fikirlərini bildirərkən diqqətə çatdırdı ki, biz artıq 30 il bizi narahat edən təhlükənin öhdəsindən gəlmişik. Dövlətimizin başçısı bizi ayıq olmağa, keçmişi unutmamağa çağırdı. Çünki Vətən müharibəsində aldığı dərsə baxmayaraq, Ermənistan dövlətində və cəmiyyətində revanşist ideyalarla yaşayan qüvvələr var. Azərbaycanda anadan olan və ölkəmizin çörəyini yeyən Vaqif Xaçaturyan kimilər arxadan kürəyə bıçaq vuranlardandır. Biz həmişə demişik ki, dinc erməni əhalisi Qarabağda azərbaycanlılarla

yanaşı yaşaya bilər. Lakin problem ondadır ki, orada dinc əhali kimi qalan ermənilərin hər biri ciddi surətdə yoxlanılmalıdır. Bəli, dövlətimizin başçısının da qeyd etdiyi kimi, qonşularımızın "xalqımıza qarşı nifrəti normal insan psixikasına" sığmır. Biz qisas almaq üçün deyil, başımıza gətirilənlərin bir daha təkrarlanması üçün olanları unutmamalıyıq. Çünki biz bir dəfə səhv etmişik. Qonşulara çox inandıq və acısını hələ də çəkirik.

Xaçaturyan kimilərinin həbsi və onların cəzalandırılması nifrətin başını əzəcək tək yoldur. Torpaqlarımızı işğaldan azad edərək beynəlxalq hüququ və bu istiqamətdə qəbul olunmuş beynəlxalq qətnamələrin icrasını təmin etdiyimiz kimi, Azərbaycan xalqına qarşı cinayətlər törətmiş şəxsləri məsuliyyətə cəlb etməklə hüququn, ədalətin bərpasına özümüz nail olmaqla, president formalaşdıracağıq.

## Azərbaycanın haqq səsini heç bir qüvvə susdura bilməz

Məlum olduğu kimi, Avropa Şurası Parlament Assambleyasının ötən gün başlayan qış sessiyasının ilk iclasında Azərbaycan nümayəndə heyətinin etimadnaməsinin təsdiqlənməməsi bu qurumun bəzi dövlətlərin siyasi aləti olduğunu bir daha ortaya qoydu. Almaniyalı deputat Frank Şvabenin Azərbaycan nümayəndə heyətinin etimadnaməsinin təsdiqlənməməsi ilə bağlı təklifinin dəstəklənməsi isə AŞPA-nın imicinə ciddi ləkədir və onun ədalətinə şübhə salır.

Bu heç də təəccüb doğurmur. Çünki AŞPA tərəfindən Azərbaycan əleyhinə qətnamələrin qəbulu artıq ənənəvi hal alıb. Avropa Birliyi və Avropa Parlamenti kimi Avropa Şurası və AŞPA da Azərbaycana qarşı daim qərəzli, qeyri-obyektiv mövqeyi ilə seçilən qurumlardandır. Xüsusilə də, son vaxtlar Avropa Parlamentinin, AŞPA-nın, onlara qoşulan bəzi ermənipərəst Avropa ölkələrinin parlamentlərinin ölkəmizin əleyhinə qəbul etdikləri və həqiqətə uyğun olmayan, qərəzli, yalan, böhtan dolu qətnamələrin arxasında Fransanın və bu ölkənin prezidenti Emmanuel Makronun durduğu artıq hər kəsə bəllidir. Qəbul edilən qətnamə Azərbaycana qarşı ədalətsiz yanaşmanın təzahürüdür, tamamilə qərəzlidir. Fransanın lobbiçiliyi və Almaniyanın dəstəyi ilə Avropa qurumları ölkəmizin müstəqil xarici siyasət kursu həyata keçirdiyini və kimlərinsə boyunduruğu altına girmək istəmədiyini heç bir halda həzm edə bilmirlər.

Belə olan halda, 2001-ci ildə üzv olduğumuz AŞPA Azərbaycana lazımdır və bu illər ərzində nə verib? Hər bir önəmli hadisə keçilən yolun təhlilini bir zərurət kimi ortaya qoyduğundan 23 illik üzvlüyün Azərbaycana nə verdiyini, ən əsası ötən bu illər ərzində Azərbaycanda siyasi və iqtisadi islahatların vəhdətliyinin qorunması əsasında hansı uğurlara imza atıldığına fikir versək aydın olar ki, Azərbaycan Avropa Şurasına tamhüquqlu üzv qəbul olunmaqla demokratik dəyərlərə sadiqliyini sözdə deyil, əməldə təsdiqlədiyini dünyaya nümayiş etdirdi. Ən əsası qurum qarşısında götürdüyü öhdəliklərə sadiqliyini arxada qalan illərdə atdığı addımları ilə sübut etsə də fürsət düşən kimi bunun dəyərləndirilməsi olaraq qarşı tərəfin ikili siyasəti ilə üz-üzə qalıb. Ən əsas məqam isə

demokratik prinsiplərin inkişafı ilə məşğul olan Avropa Şurası işğala məruz qalan Azərbaycanla işğalçı Ermənistanı eyni vaxtda tamhüquqlu üzv kimi qəbul edəndə ədalət meyarını irəliləyən illərdə necə qoruyacağına işıq salmışdı. Çünki bu gün AŞPA-da açıq-aşkar saxtakarlıq edilir, bir çox faktlar təhrif olunmuş formada verilir, reallıqlara, həqiqətlərə dırnaqarası baxılır. Belə olan halda yarımçıq AŞPA Azərbaycana lazımdırmı?

Avropa Şurası Parlament Assambleyasının Azərbaycan-Ermənistan münaqişəsinin davam etdiyi 30 il ərzində, eyni zamanda, 44 günlük Vətən müharibəsi zamanı və müharibədən sonra daim ermənipərəst mövqe ilə çıxış etdiyi hər kəsə məlumdur. Uzun illər ölkəmizə qarşı yürüdülən haqsız siyasət qarşısında ötən gün Azərbaycanın AŞPA-dakı nümayəndə heyətinin həmin qurumla əməkdaşlığını və təşkilatdakı iştirakını qeyri-müəyyən müddətə dayandırması verilmiş doğru qərardır. Qeyd edək ki, AŞPA-ya üzv olduğumuz 2001-ci ildən bəri öz ərazimizdə və Ermənistanda bir milyona yaxın azərbaycanlının fundamental hüquqlarının kobud şəkildə pozulması, minlərlə günahsız insanın milli mənsubiyyətinə görə ermənilər tərəfindən qətlə yetirilməsi və işğal olunmuş torpaqlarımızın etnik təmizləməyə məruz qalması ilə bağlı nümayəndə heyətimizin müzakirələr aparması və müvafiq qərarlar qəbul olunmasına təkid etməsinə baxmayaraq AŞPA bu məsələlərlə məşğul olmadığını, Ermənistan–Azərbaycan münaqişəsinin yalnız ATƏT çərçivəsində müzakirə oluna biləcəyini israr edirdi.

Bu gün isə AŞPA Qarabağda qalıb Azərbaycan qanunları əsasında yaşamağa dəvət olunan ermənilərin öz seçimi ilə rahat şəkildə, heç bir güc tətbiq olunmadan köçüb getməsini insan haqlarının pozulması kimi dəyərləndirir və hətta Azərbaycandan ermənilərin həmin əraziyə qaytarılmasını tələb edir. Bu AŞPA tarixində görünməmiş ikiüzlülük, ədalətsizlik, Avropa siyasətində irqi, dini ayrı-seçkiliyin ən parlaq təzahürüdür. Belə bir şəraitdə Azərbaycan nümayəndə heyəti yeganə düzgün və ləyaqətli qərar qəbul etdi. Azərbaycanla bağlı məsələ səsverməyə çıxarılmadan öncə nümayəndə heyətimiz AŞPA-nın ölkəmizə qarşı haqsız demarşına cavab bəyanatı səsləndirərək AŞPA binasını tərk ediblər. Eyni zamanda, 23 illik AŞPA-dakı fəaliyyətimiz bu qurumun əsl məqsəd və məramını anlamaq kifayətdir. Aydın oldu ki, Fransa, Almaniya kimi böyük dövlətlərin maraqları bir çox hallarda beynəlxalq ədalət, qanunların aliliyi

və demokratiya prinsipləri ilə uzlaşmaya da bilər və bu halda AŞPA tərəfindən bəyan edilmiş dəyərlər bilərəkdən arxa plana keçirilir.

Amma həmin dairələr düşünməlidir ki, Azərbaycan beynəlxalq ictimaiyyətin tam əksəriyyəti ilə qarşılıqlı hörmətə əsaslanan münasibətlər qurub. Avropa ölkələri, həmçinin təşkilatları ilə ikitərəfli və çoxtərəfli əlaqələrini də inkişaf etdirmək əzmindədir. Eyni zamanda, Avropa əsas ticari tərəfdaşlarımızdan biri olmaqla bərabər, ölkəmiz Avropanın enerji təhlükəsizliyində mühüm rol oyanır. Bu baxımdan da Azərbaycana qarşı əsassız təzyiqlər özlərinə də mənfi təsir edə bilər. Bütün bu faktları nəzərə alanda Azərbaycanın AŞPA-da fəaliyyətini müvəqqəti dayandırması Avropanın ziyanına, ölkəmizin isə xeyrinədir. Azərbaycan elə bir qayadır ki, onu sarsıtmaq mümkün deyil. Bu realllığı da qəbul etməlidirlər ki, Azərbaycan dövləti siyasi iradə nümayiş etdirərək Avropa Şurasının 30 ildə yarada bilmədiyi sülhü 2020-ci ildə 44 gün ərzində yaratdı. Bu gün bölgədə yeni siyasi reallıqlar yaradan Azərbaycan sülh, əməkdaşlıq və inkişaf istiqamətlərində irəli doğru addımlar atır. Xalqın və dövlətin maraqlarına uyğun olaraq reallaşdırılan bu siyasətin qarşısını heç bir qüvvə ala bilməz.

## Qalib Lider İlham Əliyev: “Sözümüz imzamızdır”

Fevralın 7-də Azərbaycanda keçirilən prezident seçkiləri bir sıra məqamları ilə yaddaqalan oldu və tariximizdə önəmli yer qazandı. İlk ondan başlayaq ki, zəfər seçkiləri adlandırılan bu seçkilər ilk dəfə olaraq ölkəmizin bütün ərazisində, o cümlədən işğaldan azad edilən ərazilərdə də keçirildi. Seçki günü ən əlamətdar hadisə ölkə başçısı, Müzəffər Ali Baş Komandan İlham Əliyevin ailə üzvləri ilə birlikdə 122 saylı Xankəndi seçki dairəsinin 14 saylı seçki məntəqəsində səs verməsi oldu. Bu, sıradan bir hadisə deyildi. Prezidentin Xankəndində səs verməsi “erməni separatçılarının tabutuna vurulan son mismar” idi. Prezident o binada səs verməklə həm Ermənistana, həm də onun xarici havadarlarına mesaj vermiş oldu – bu torpaqların gerçək sahibləri bizik və bu dünya durduqca belə olacaq.

Fevralın 14-də isə Azərbaycan Prezidenti İlham Əliyevin Milli Məclisdə andiçmə mərasimi keçirildi. Prezident İlham Əliyev andiçmə mərasimində gələcəkdə görüləcək işlər, həyata keçiriləcək siyasətlə bağlı geniş məzmunlu nitq söylədi. Ölkə başçısının çıxışındakı bəzi məqamları xüsusi qeyd etmək lazımdır. Cənab Prezident bildirdi ki, indi isə yeni dövr başlayır. "Biz bu dövrə alnımız açıq, üzümüz ağ, başımız dik daxil oluruq. Bu dövrün böyük nailiyyətləri olacaq, mən buna şübhə etmirəm. Çünki son illərin tarixi onu göstərir ki, qarşıya qoyduğumuz bütün vəzifələr icra edildi. Əlbəttə ki, bütöv Azərbaycan bu dövrə qədəm qoymuş, bütövləşmiş birlik nümayiş etdirmiş, o cümlədən bu seçkilərdə böyük birlik nümayiş etdirmiş xalq böyük uğurlara imza atacaq. Mənim buna şübhəm yoxdur".

Gəlin əldə edilən iqtisadi inkişaf tempinə nəzər salaq. Azərbaycanın iqtisadiyyatını düzgün əsaslar üzərində qurması hər bir çətinliyin, problemlərin aradan qaldırılmasında öz sözünü deyir. İlham Əliyev təkcə cari ilin ötən bir ayının sosial-iqtisadi göstəriciləri əsasında Azərbaycanın dayanıqlı iqtisadi inkişafı barədə aydın təsəvvür yaratdı. Belə ki, bu ilin yanvar ayında ümumi daxili məhsul 5 faiz, qeyri-neft sektorunda isə 12 faizdən çox artıb. Müqayisə üçün qeyd edildi ki, 2003-cü ildə ümumi daxili məhsulumuz 7 milyard dollar idi, keçən ilin yekunlarına görə isə bu rəqəm 72 milyard dollardır. Bu, 20 ildə iqtisadiyyatımızın inkişafının

əsas göstəricisidir. 2003-cü ildə valyuta ehtiyatlarımız 1,6 milyard dollar idisə, bu gün bu, artıq 69,5 milyard dollardır. Bu gün heç kimdən asılı olmayan Azərbaycan inamla, uğurla inkişaf edir, öz xarici siyasətini də buna uyğun şəkildə aparır. Sosial sahədə görülmüş işlər də göz qabağındadır. 2003-cü ildə minimum əməkhaqqı 9 manat idi. İndi 345 manatdır. Minimum pensiya 2003-cü ildə 20 manat idi. Bu gün 280 manata çatıb. Orta pensiya 500 manatdan çoxdur. Orta əməkhaqqı 940 manatdır. Dinamikanın olması sabaha daha böyük inamla addımlamağa əsas verir. Bu fakt inkaredilməzdir ki, İlham Əliyev 2003-cü ildən bu hədəfi qarşıya qoyub: İqtisadi tərəqqi yalnız rəqəmlərdə deyil, insanların gündəlik həyatında öz əksini tapmalıdır. Ümumiləşdirilmiş şəkildə qeyd etsək, güclü iqtisadiyyat, güclü ordu, daxili sabitlik, xalq-iqtidar birliyi dövlətimizin siyasətinin əsas amilləridir.

Azərbaycan Prezidentinin andiçmə mərasimindəki digər bir fikri də çox önəmli idi. Preziden dedi: "2003-cü ildə verdiyim bütün vədlər yerinə yetirildi. Əldə edilmiş bütün nailiyyətlərin mənbəyi Azərbaycan xalqıdır, onun mənə göstərdiyi inam və onun vahid amal ətrafında birləşmə bacarığıdır. Biz doğrudan da bütün dünyaya sübut etmişik ki, böyük xalqıq, biz öz taleyimizi özümüz həll edirik, ölkə qarşısında duran problemləri özümüz heç kimin köməyi olmadan həll edirik və əsaslı şəkildə həll edirik.

Verdiyim vədlər arasında təbii ki, ilk növbədə, ölkəmizin ərazi bütövlüyünün bərpası idi. O vaxt və ondan sonrakı illərdə, o cümlədən 2018-ci ildə bax bu kürsüdən andiçmə mərasimində demişdim ki, Ermənistan-Azərbaycan münaqişəsi yalnız və yalnız Azərbaycanın ərazi bütövlüyü çərçivəsində öz həllini tapmalıdır, heç vaxt Azərbaycan xalqı öz ərazisində ikinci erməni dövlətinin yaradılmasına imkan verməyəcək və nəyin bahasına olursa-olsun biz öz doğma torpaqlarımızı azad edəcəyik. O gündən cəmi 2 il yarım keçdi və Azərbaycan xalqı bir yumruq kimi birləşərək Vətən müharibəsi nəticəsində torpaqlarımızın böyük hissəsini azad etmişdir, 300-dən çox şəhər və kənd azad olunmuşdur, o cümlədən bizim mədəniyyət paytaxtımız Şuşa şəhəri işğalçılardan azad edilmişdir. Biz qan tökərək, şəhidlər verərək tarixi ədaləti bərpa etdik.

Allah bütün şəhidlərimizə rəhmət eləsin. Biz onların və on minlərlə Azərbaycan gəncinin şücaəti, fədakarlığı, qəhrəmanlığı sayəsində bu gün azad Qarabağda yaşayırıq, qururuq, ərazi bütövlüyümüzü bərpa edən, öz

ləyaqətini bərpa edən xalq kimi qururuq, yaradırıq, şəhər və kəndlərimizi yenidən qururuq.”

Müharibəni şanlı Zəfərlə başa vuran Azərbaycan ədalətli və prinsipial yanaşmalarına sadiqdir. Lakin postmüharibə dövründə revanşizm mövqeyindən çıxış edən məğlub Ermənistanın təlimatları ölkə hüdudlarından kənardan aldığı aydın şəkildə müşahidə edilir. Məlumdur ki, uzun illər ərzində Ermənistan və təcavuzkar dövlətin ərazisi məhz regionda gərginliyin yaradılması üçün istifadə olunub. Sıravi erməni xalqı əsrlər boyu bu siyasətin qurbanı olub və məhz bu siyasətin nəticəsində Ermənistan müasir beynəlxalq münasibətlər sisteminin dalan dövlətinə çevrilmişdir. Bu səbəbdən rəsmi İrəvan dünyada hərbi cinayətkar ölkə kimi tanınmalıdır. Bir neçə gün öncə baş verən təxribat da rəsmi İrəvanın hərbi cinayətlərinə bəraət qazandırılmasına hesablanıb. Prezident İlham Əliyev bildirib: "Üç il ərzində biz yenə də səbir göstərmişdik, biz yeni gərginləşmə vəziyyəti yaratmaq fikrində deyildik və İkinci Qarabağ müharibəsindən antiterror əməliyyatına qədər keçən dövr ərzində bunun bütün xronoloji məqamları bir daha onu göstərir ki, Azərbaycanın mövqeyi ədalətli mövqedir. Düzdür, Ermənistan və onun arxasında duran qüvvələr bunu görmək istəmirlər. Ancaq hər şey sənədləşdirilib, bu gün heç nəyi gizlətmək mümkün deyil. Üç il ərzində nəinki Ermənistan öz silahlı qüvvələrini Qarabağ bölgəsindən çıxarmayıb, hətta əlavə silah-sursat göndərib, minalar göndərib, bizə qarşı mina terroru davam edib, daha geniş vüsət almışdır. "

Bəli, bu fikirlər Qalib Liderin öz xalqının parlaq gələcəyi üçün düşündükləri, gələcək fəaliyyət proqramıdır. Bir sözlə, Prezident İlham Əliyevin inaqurasiya mərasimindəki çıxışı proqram xarakterli idi və qarşıdakı dövrdə yeni hədəflərə dair konkret istiqamətləri özündə ehtiva edirdi. Çıxışının sonunda isə Prezident İlham Əliyev xüsusi vurğuladı: “Biz öz məsələmizi həll etmişik. Biz bu gün Ağdamdayıq, Füzulidəyik, Laçındayıq, Cəbrayıldayıq, Zəngilandayıq, Qubadlıdayıq, Kəlbəcərdəyik, Şuşadayıq, Hadrutdayıq, Xocalıdayıq, Ağdərədəyik, Əsgərandayıq, Xankəndidəyik! Bu yeni dövr uğurla başlayır. Əminəm ki, uğurla da davam edəcək. Bu yolda hamımıza uğurlar, yolumuz açıq olsun!”

# Münhen Konfransı: NÖVBƏTİ ZƏFƏR!

Azərbaycan beynəlxalq arenada daha bir siyasi-diplomatik zəfəri ilə yadda qaldı. Prezident İlham Əliyevin Münxen Təhlükəsizlik Konfransı çərçivəsində keçirdiyi görüşlər beynəlxalq rezonans yaradıb. Bu, beynəlxalq ictimai rəyin formalaşmasında rol almış transmilli media subyektlərinin səhifələrindən daha aydın görünür. Azərbaycan Prezidentinin ABŞ-ın Dövlət katibi Antoni Blinken, Almaniya Kansleri Olaf Şolts, Ermənistanın baş naziri Nikol Paşinyan, ATƏT-in fəaliyyətdə olan sədri İan Borqun və digər şəxslərlə keçirdiyi görüşlər barədə xarici mediada çoxsaylı məqalələr dərc olunub. İnternet axtarış sistemləri göstərir ki, bu məqalələrin sayı 100-lərlədir. Bu kontekstdə diqqət çəkən məqam təkcə dövlətimizin başçısının keçirdiyi görüşlər barədə informasiya yayan media subyektlərinin kəmiyyəti ilə bağlı deyil. Ənənəvi yanaşmadan fərqli olaraq bu dəfə Avropadan yayımlanan transmilli media ilə yanaşı, Asiya və Afrikanın da nüfuzlu qurumları mövzunu gündəmdə saxlayıblar. Çin, Hindistan, Yaponiya, Səudiyyə Ərəbistanı, Qətər və digər 10-larla ölkədə fəaliyyət göstərən media subyektləri də mövzuya diqqət yetiriblər.

Bir məqama diqqət yetirək: konfransın açılışından 2 gün əvvəl – fevralın 14-də Azərbaycan Prezidenti İlham Əliyevin inauqurasiya mərasimi keçirilmişdi və xarici media subyektləri də həmin mövzuya eyni həssaslıqla yanaşmışdılar. Növbədənkənar prezident seçkiləri günü və 14 fevral andiçmə mərasimi barədə də 100-lərlə məqalələr dərc edilmişdi. Bütün bunlar onu deməyə əsas verir ki, son dövrlərdə dövlətimizin adının çəkildiyi bütün proseslər ciddi şəkildə beynəlxalq reaksiya doğurur və xarici media subyektləri Azərbaycan mövzusunu diqqətdə saxlayırlar. Bu da təsadüfi deyil.

Azərbaycan iqtidarının uzun müddət ərzində apardığı müstəqil və balanslı xarici siyasət kursu öz bəhrəsini verməkdədir. Belə ki, Azərbaycan dünyanın bütün qitələrində, fərqli qütblərdə yerləşən ölkələrində eyni dərəcədə diqqətlə izlənilir. Azərbaycanın həmmüəllifi olduğu regional və beynəlxalq layihələr onu dünya üçün əvəzedilməz ölkəyə çevirir. Bundan əlavə, dövlətimiz Qərb ölkələri üçün əhəmiyyətli enerji qaynaqlarından biri, həmçinin Avropa ilə Asiya arasında ən mühüm nəqliyyat qovşağıdır. İki qitəni birləşdirən ən sərfəli nəqliyyat dəhlizləri Azərbaycan ərazisində

layihələndirilib. Bu dəhliz Avropa və Asiya ilə yanaşı, bütövlükdə dünya üçün də əhəmiyyət daşıyır.

Diqqət edin, dünyanın nüfuzlu siyasətçiləri, dövlət və hökumət rəsmiləri Azərbaycan Prezidenti ilə görüşə özləri can atırdılar, yəni, görüş üçün özləri təşəbbüs göstərirdilər. Bu, ölkəmizin və onun Liderinin nüfuzunun göstəricisidir. Artıq hər kəs Azərbaycanın böyük bir gücə çevrildiyini qəbul edir. Azərbaycan təkcə regionda deyil, dünya miqyasında da özünü orta güc kimi nümayiş etdirməkdədir. Biz dünyaya sübut etdik ki, ərazi bütövlüyümüzü də, suverenliyimizi də özümüz bərpa etməyə qadirik. Təbii ki, bu reallığı bütün dünya başa düşür. Anlayır ki, Azərbaycana kifayət qədər təcrübəli, peşəkar, təcrübəli diplomat, siyasi xadim rəhbərlik edir. Bu da şübhəsiz ki, özü-özlüyündə bir sıra qərarların qəbulunda öz təsirini göstərir.

Digər bir baxımdan unutmayaq ki, qərb ölkələri Azərbaycana qarşı Ermənistanın təxribat oyunlarına heç də yumşaq münasibət göstərmirlər. Çünki strateji baxımdan Azərbaycanın ticarət dövriyyəsinin 50 faizdən çoxu Qərb dövlətlərinin üzərinə düşür. Qərbin özünün enerji təhlükəsizliyi Azərbaycan enerjisinə bağlıdır. Ayrı-ayrı Qərb dövlətləri ilə strateji müttəfiqliyimiz var. Xüsusilə də, bunun 9 dövlətlə olduğunu qeyd etmək istəyirəm. Bizi hər zaman çox ciddi məqamlarda müdafiə edən İtaliya, İngiltərə kimi dövlətlər mövcuddur. Hesab edirəm ki, Azərbaycan Prezidentinin Münxendə olan son görüşü onu göstərdi ki, bu dövlətlərdə məsələyə çox ciddi baxırlar. Azərbaycanla Qərb təsisatları arasında münasibətlərin üstün səviyyədə qalmasında maraqlıdırlar.

Münhen Təhlükəsizlik Konfransında Prezident İlham Əliyevə olan diqqət bir daha onu deməyə əsas verir ki, Azərbaycan dünyanın müxtəlif bölgələrində fəal tərəfdaşlığı təşviq edən, etibarlı tərəfdaş kimi qəbul olunan, dünyada qlobal problemlərin həllində fəal iştirak edən, bu prosesə əməli töhfələr verən ölkə kimi qəbul olunur. Bu barədə dövlət başçımız inaqurasiya mərasimində də bəyan etmişdi. Biz MTK-da bunun real təzahürünü gördük.

Azərbaycan bu illər ərzində Qoşulmama Hərəkatının sədri kimi böyük nüfuz qazanıb. COP 29-a ev sahibliyi ilə bağlı dəstək isə bu nüfuzun daha da artdığını göstərdi. Azərbaycan illərdir, çoxtərəfli danışıqlar aparmaq, dünyanın ayrı-ayrı regionlarında hətta bir-birilə əks mövqedə olan

tərəfləri bir araya gətirmək bacarığı sərgiləyib. Dünya ictimaiyyəti də Azərbaycanı qlobal təşəbbüskar kimi qəbul edir.

Təsadüfi deyil ki, dünyanın ən mötəbər, strateji baxımdan olduqca əhəmiyyətli tədbirlərinə ev sahibliyi məhz Azərbyacana etibar edilir. Belə ki, dünya birliyi BMT-nin İqlim Dəyişmələri üzrə Çərçivə Konvensiyasının Tərəflər Konfransının 29-cu sessiyasının - COP29-un indiyə qədər bir sıra beynəlxalq tədbirlərə ev sahibliyi etmiş, bu sahədə kifayət qədər təcrübə toplamış Bakıda keçirilməsi ilə bağlı qərar qəbul edib. Bu isə o deməkdir ki, dünya birliyinin Azərbaycana olan etimadı tamdır və güvənlidir. Şübhəsiz, rəsmi Bakının həmin tədbirə ev sahibliyinin dünya ölkələri tərəfindən dəstəklənməsi Azərbaycanın effektiv, çoxtərəfli danışıqlar aparmasının, dünyanın ayrı-ayrı regionlarındakı fərqli baxışları bir araya gətirməsinin, qlobal problemlərin həllinə töhfə verməsinin, bir sözlə, güclü potensiala malik olmasının nəticəsidir.

Bəli, Cənubi Qafqaz, Xəzər dənizi, Qara dəniz, Mərkəzi Asiya, Yaxın Şərq, postsovet məkanı, Avropa və digər regionlarla geniş əlaqələri olan ölkəmiz bu gün belə inam və etimad sahibidir. Bütün bunlar Azərbaycanın qlobal səviyyədə öz siyasətini həyata keçirməyi bacaran etibarlı tərəfdaş imicini qazanmasından, müstəqil dövlət kimi dünya xəritəsində öz layiqli yerini tutmasından, ölkəmizin xarici siyasətinin artıq qlobal xarakter daşıdığıdan xəbər verir.Ölkəmiz təmsil olunduğu platformalarda bütün tərəfdaşlarla geniş əlaqələr qurub, səmərəli qarşılıqlı əməkdaşlığa nail olub. Bu səbəbdən Azərbaycan qlobal səviyyədə öz siyasətini həyata keçirməyi bacaran etibarlı tərəfdaş kimi dəvət olunur. 60-cı Münxen Təhlükəsizlik Konfransı da bunu bir daha təsdiqləmiş oldu. Etibarlı və səmərəli tərəfdaş kimi bu gün Azərbaycan dünya birliyinin ehtiramla yanaşdığı lider ölkədir!

## Azərbaycanın ictimai-siyasi həyatında növbəti tarixi hadisə – YAP-nın VII qurultayı

Zamanın sınaqlarından çıxmış, xalqın etimadını layiqincə doğrultmuş, Yeni Azərbaycan Partiyası müstəqil Azərbaycanımızın firavan gələcəyinin dünəni, bu günü və gələcəyi naminə öz fəaliyyətini göstərən siyasi partiyadır. Necə ki, Yeni Azərbaycan Partiyasının yaradıcısı, Azərbaycan xalqının xilaskarı ulu öndərimiz Heydər Əliyev demişdir: "Yeni Azərbaycan Partiyası dünənin, bugünün, gələcəyin partiyasıdır".

Prezident, Yeni Azərbaycan Partiyasının Sədri İlham Əliyevin 4 il əvvəl martın 5-də partiyanın VII qurultayında böyük əminliklə söylədiyi bu fikirlər keçilən yolun təhlili fonunda qarşıdakı hədəflərin təqdimatı oldu. Dövlət başçımız çıxışı zamanı bir çox məsələlərə toxunaraq partiyamızın VII qurultayının ölkəmizin ictimai-siyasi həyatında önəmli hadisə olduğunu bildirmişdir. Hər günü zəngin tarixinə uğur səhifəsi kimi yazan Yeni Azərbaycan Partiyasının fəaliyyətində yeni mərhələnin başlanğıcı kimi dəyərləndirilən 5 mart 2021-ci il tarixdə keçirilən VII qurultaydan ötən 4 ildə yeni Nizamnaməyə və Proqrama uyğun atdığı addımlar, həyata keçirdiyi tədbirlər bugünümüzün reallıqlarında özünün aydın ifadəsini tapır. Qurultayın keçirilməsini zəruri edən əsas amil tarixi Zəfərimizin yaratdığı reallıqlar, partiyanın Proqramında əksini tapan hədəflərin hər birinə yüksək səviyyədə nail olması idi. Ulu öndər Heydər Əliyevin ən böyük arzularından biri ərazi bütövlüyümüzün təmin olunması, işğaldan azad edilmiş torpaqlarımızda üçrəngli bayrağımızın dalğalanması, soydaşlarımızın öz doğma-yurd yuvalarına qayıtmaları idi. Bu hədəf dahi şəxsiyyətin yaradıcısı olduğu Yeni Azərbaycan Partiyasının Proqramında da öz əksini tapmışdır.

Partiyanın yaranma zərurətini nəzərə alsaq bu qeyd edilən hədəfə nail olmaq üçün vacib olan addımların aydın mənzərəsini təqdim edə bilərik. Dövlət başçısı, YAP Sədri İlham Əliyev partiyanın VII qurultayında söylədiyi "Faktiki olaraq 1992-ci ilin noyabr ayı gənc ölkəmizin həyatında yeni bir mərhələyə yol açdı. Ondan sonra heç bir il keçməmiş-1993-cü ilin oktyabr ayında Heydər Əliyev xalqın mütləq əksəriyyətinin dəstəyi ilə Prezident vəzifəsinə seçildi və ölkəmizin böhrandan çıxma prosesi

artıq başladı. Biz bu tarixi yaxşı bilməliyik. O tarixi yaşamayanlar isə bunu öyrənməlidirlər. Mən demişəm, bizim dərsliklərdə bu tarixlə bağlı geniş məlumat verilməlidir. O tarixin canlı şahidləri öz xatirələrini bölüşməlidirlər ki, bu tarix əbədi yaşasın" - fikirlərlə YAP-ın ölkəmizin həyatında rolunu bir daha təqdim etdi.

Prezident İlham Əliyev bildirdi ki, yeni bir vəziyyət yaranıb. Bu vəziyyəti biz yaratmışıq. Azərbaycan reallıqları yaradan ölkədir. Bundan əvvəlki dövrlərdə də ölkəmizin təşəbbüsləri ilə reallaşan bir çox layihələr bölgəyə yenilik gətirdi, əməkdaşlığın yeni formatlarını şərtləndirdi. Azərbaycanın uğurlu enerji diplomatiyası dövlətlər, xalqlar arasında əməkdaşlıq əlaqələrinin genişləndirilməsində öz sözünü deyir. Regional çərçivədə qurulan əlaqələr beynəlxalq miqyas alıb. İkinci Qarabağ müharibəsində tarixi Zəfərimiz Azərbaycanın bu imkanlarını daha da genişləndirdi. Bu gün Azərbaycan sülh gündəliyinin, yeni əməkdaşlıq formatlarının müəllifi kimi mövqeyini daha da möhkəmləndirir.

Qurultayda qəbul edilən önəmli qərarlardan biri də 6 siyasi partiyanın öz müraciətləri əsasında Yeni Azərbaycan Partiyasına qoşulması oldu. Bu mühüm addım ölkəmizdə dialoq mühitinin dərinləşməsinə və demokratik ənənələrin inkişafına xidmət edən mühüm addımlar sırasındadır. Atılan bu kimi addımlar Yeni Azərbaycan Partiyasının xalqın partiyası olduğunu bir daha təsdiqləyir. Bu mühüm məqamı da xüsusi qeyd etməliyik ki, Prezident İlham Əliyevin təşəbbüsü və rəhbərliyi ilə Azərbaycanda milli həmrəyliyə və sağlam dialoqa xidmət edən siyasi islahatlar həyata keçirilir və bu islahatlar nəticəsində ölkəmizin siyasi sistemində keyfiyyətcə yeni, konstruktiv dialoq və plüralist əməkdaşlıq mərhələsi başlandı. 44 günlük İkinci Qarabağ müharibəsinin getdiyi dövrdə 50-dən artıq siyasi partiyanın Prezident İlham Əliyevə dəstəyini birgə qəbul etdikləri bəyanatda ifadə etməsi ictimaiyyət tərəfindən böyük rəğbətlə qarşılandı. Bu, siyasi partiyalar arasında birliyin, həmrəyliyin bariz nümunəsidir. 50-dən artıq siyasi partiyanın Vətən müharibəsi zamanı atdığı addım Azərbaycanın siyasi sisteminin milli məsələlərdə həmrəy olduğunu nümayiş etdirdi.

VII qurultay, həmçinin yeniliklərlə tarixə yazıldı. 40 nəfərdən ibarət İdarə Heyətinin, 13 nəfərdən ibarət Təftiş Komissiyasının tərkibi təsdiqləndi, partiyanın tərkibində Veteranlar Şurası yaradıldı. Yeni

Azərbaycan Partiyasının yeni Nizamnaməsinə uyğun olaraq, Yeni Azərbaycan Partiyasının Sədri İlham Əliyevin Sərəncamı ilə Mehriban xanım Əliyeva partiya sədrinin Birinci müavini, Əli Əhmədov partiya sədrinin müavini, Tahir Budaqov partiya sədrinin müavini – Mərkəzi Aparatın rəhbəri təyin edildilər.

Eyni zamanda, qurultayda partiyanın yeni Nizamnaməsinin qəbul edilməsi, yeni Proqramın 3 ay müddətində hazırlanması ilə bağlı İdarə Heyətinə verilən tapşırıq hər bir partiya üzvünün vəzifələrini müəyyənləşdirir. Yeni tərkibin formalaşması, yeni qərarların qəbulu qarşıdakı dövrdə də bütün qüvvə və bacarıqların səfərbər olmasına çağırışlar etdi. 2021-ci ilin dekabrında "Biz birlikdə güclüyük!" devizi altında 5 fəsildən ibarət yeni Proqram təsdiqləndi. Təbii ki, əsas hədəflərdən biri Böyük Qayıdış proqramının uğurlu icrasına dəstək olmaqdır.

Prezident İlham Əliyev ən vacib məsələ olan gənclərlə bağlı növbəti, xüsusi əhəmiyyət daşıyan fikirlərini söyləyərək bildirib ki, gənc nəslin tərbiyə edilməsi hər bir dövlət üçün xüsusi əhəmiyyət daşıyan məsələdir. "Siyasi partiyalarda fəaliyyət göstərən gənc nəslə elə təlimat verilməlidir ki, onlar gələcək həyata hazırlıqlı olsunlar, onlar ölkəmizin müstəqilliyini hər şeydən üstün tutsunlar", – deyən dövlət başçısı istiqamət yollarını açıqlayaraq diqqətə çatdırdı ki, hamılıqla, o cümlədən Yeni Azərbaycan Partiyasında Veteranlar Şurasına tapşırıqlarını da verməsi bir daha hər kəsi məsuliyyətə çağırdı: "Bu Veteranlar Şurasının tərkibində tanınmış hörmətli insanlar fəaliyyət göstərəcəklər. Mən onlardan da xahiş edirəm ki, onlar da çox fəal olsunlar, bölgələrdə olsunlar, gənc nəslin nümayəndələri ilə görüşsünlər. Ölkə haqqında həqiqətləri gənc nəsil bilmir, hansı ki, 1991-1992-ci illəri görməyiblər. Bu haqda məlumat verilməlidir ki, onlar bilsinlər, biz nəyin bahasına bugünkü reallıqları əldə etmişik. Vətən müharibəsi ilə bağlı, postmüharibə dövrü ilə bağlı məlumatlar verilməli, bütün bunlar izah edilməlidir. Çünki xaricdən, oradan-burdan yalan, saxta məlumatlar gəlir və bəzi hallarda gənc insanlar buna inanırlar. Məhz o hesabat da bunun üzərində qurulur və gənc nəslimizin milli ruhda, milli-mənəvi dəyərlər ruhunda tərbiyə edilməsi ən başlıca vəzifələrdən biridir. Ənənələrimiz, dəyərlərimiz, yaşayış tərzimiz – bütün bunlar bizim sərvətimizdir, biz bunu itirə bilmərik və itirməməliyik. Ona görə gənc nəslin tərbiyə edilməsi çox önəmli məsələdir və burada milli-mənəvi

dəyərlər ön plandadır. Digər önəmli məsələ isə odur ki, – Yeni Azərbaycan Partiyası həmişə bu sahədə fəal olub, bizim dövlət siyasətimiz də bu sahədə birmənalıdır, – Azərbaycanda yaşayan bütün xalqların nümayəndələri bir ailə kimi yaşayırlar və bundan sonra da bir ailə kimi yaşayacaqlar. Bu, bizim böyük sərvətimizdir. Mən də müxtəlif tədbirlərdə demişəm ki, bizim dini və etnik müxtəlifliyimiz bizim böyük sərvətimizdir".

Prezident İlham Əliyev Yeni Azərbaycan Partiyasının VI qurultayından 3 il ötdüyünü və bu illər ərzində böyük nailiyyətlər və qələbələr əldə olunduğunu deyib: “Bu illər ölkəmiz üçün, bölgəmiz üçün həlledici illər olmuşdur. Üç il ərzində ölkə həyatında bir çox önəmli hadisələr baş vermişdir. Təbii ki, onların arasında ən önəmlisi ərazi bütövlüyümüzün bərpa edilməsi, Vətən müharibəsində parlaq Qələbənin qazanılmasıdır. Azərbaycan öz ərazi bütövlüyünü bərpa etdi, tarixi ədaləti bərpa etdi, işğalçıları əzəli torpaqlarımızdan qovdu və beləliklə, tarixi ədalət bərpa olundu. Bizim şanlı Qələbəmiz qürur mənbəyimizdir”.

Bəli, bu Qələbə həqiqətən də bizim qürur mənbəyimizdir. Bu reallığı Azərbaycan xalqı görür və bəlkə də bu son 32 ildə bu qədər qürurlu olmamışdı - 44 gün ərzində tariximizin Zəfər Salnaməsi yazıldı, Azərbaycanımız bütövləşdi. Məhz bu tarixi Qələbə Prezident İlham Əliyevin sözünə, vədinə sadiq qalan dövlət başçısı imicini qazanması bütün sahələrdə təsdiqlənməsinin reallığıdır. Bu yerdə Prezident İlham Əliyevin 2003-cü ildə keçirilən andiçmə mərasimində söylədiyi bu fikirləri bir daha yada salmaq yerinə düşər: "Bütün bunları həyata keçirmək və Azərbaycanı qüdrətli dövlətə çevirmək üçün, ən başlıcası, ölkədə Ümummilli Lider Heydər Əliyevin siyasəti davam etdirilməlidir. Bu gün yüksək kürsüdən çıxış edərkən, mən Azərbaycan xalqına söz verirəm ki, bu siyasətə sadiq qalacağam, heç vaxt bu yoldan dönməyəcəyəm, Heydər Əliyevin siyasətini davam etdirəcəyəm".

Sonda Prezident İlham Əliyev cənablarının dediyi fikirlə sözümü bitirmək istərdim: "Bir sözlə, bir çox hallarda dediyim kimi, bugünkü qurultayı da bu sözlərlə yekunlaşdırmaq istərdim: "Qarabağ bizimdir, Qarabağ Azərbaycandır!".

## Məntiq tükənən yerdə böhtan başlayır

Fransız psixoloq Julyer iddia edir ki, insanlarda satqınçılıq və xəyanət simptomları bir dəfə formalaşırsa, bu, sistemli şəkildə davamlı olur və ətraf mühitə ikrah yaranır. Bu məntiqlə yanaşsaq aydın olur ki, bu gün müxalifət, o cümlədən Əli Kərimli kimilər illərdi ki, eyni mühitdə qalıb, zaman-zaman bir-birilərinə xəyanət ediblər və demək olar ki, artıq bir periodiklik yaranıb və bu koronavirusdan da güclü virusa çevriliblər. Nəticə nə oldu?

Azərbaycan xalqı koronavirus pandemiyasından çıxdıqdan sonra dövlətin, millətin maraqlarını heçə sayan Ə.Kərimli kimi antimilli ünsürün şər və böhtanlarını bağışlamayacaq və sərt ölçü götürmələrini, cəmiyyətdən təcrid olunmalarını tələb edəcək. Bu, haqq-hesab isə çox ağır olacaq. Çünki tarixi faktları saxtalaşdırmaq olmaz, tarix unudulmur…. Belə ki, başda AXCP sədri Əli Kərimli və dəstəsi olmaqla bir qrup antimilli ünsür aldıqları sifarişlər əsasında hər vəchlə Azərbaycanın imicini zədələməyə, dövlətimizin ölkənin inkişafı üçün gördüyü işlərə kölgə salmağa çalışırlar. Gah ermənipərəst Fransanı, onun Azərbaycana qarşı açıq şəkildə düşmənçilik aparan ermənisifət prezident Makronu, gah Cənubi Qafqazdakı maraqları naminə anti-Azərbaycan oyunlar quran ABŞ-ni müdafiə edən Əli Kərimli kimilər bilməlidirlər ki, artıq xəyanətin son və heç bir halda geridönüşü mümkün olmayan mərhələsidir.

Bu gün Azərbaycanın regionun şəriksiz liderinə çevrilməsinin bünövrəsində də, məhz xalq-iqtidar birliyi dayanır və bu birliyi pozmağa çalışan Əli Kərimli kimilərin ən tutarlı cavabını isə xalq özü verib və verəcək... Bunu 2016-cı ilin aprel döyüşləri, hazırda Azərbaycan-Ermənistan sərhədində baş verən hadisələr və ötən ilin sentyabr ayının 19-da işğalçı Ermənistanın etdiyi təxribatlarına görə əməlli-başlı dərsini verdi. “Dəmir yumruğ”un davamı olaraq “Qisas” və “Qətiyyətli cavab” əməliyyatları Ermənistana layiq olduğu yeri göstərdi. 2020-ci il sentyabrın 27-də başlanan 44 günlük İkinci Qarabağ müharibəsində dünya hərb tarixinə yeni səhifə yazan yenilməz Azəbaycan Ordusu – 2023-cü il sentyabrın 20-də növbəti qələbəyə imza atdı. Belə ki, Müzəffər Ali Baş Komandan, Prezident İlham Əliyev cənablarının “Dəmir Yumruq” siyasəti ilə güclü Ordumuzun əsgər və zabitləri Azərbaycanın Qarabağ iqtisadi rayonunda

keçirdiyi daha bir böyük missiyanı uğurla başa çatdıraraq separatçıları təslim olmağa məcbur etdi. Qısa müddətdə - bir günə təmin etdiyi qələbə yenilməz Ordumuzun malik olduğu imkanların olduğunu və Azərbaycanın müstəqilliyinə, suverenliyinə qarşı bütün təxribatların qarşısı qətiyyətlə alınır və alınacağının sübutu idi. Ali Baş Komandanımızın Xocalı soyqırımının ildönümünü 32 ildən sonra ilk dəfə Xocalıda, özü də xocalılarla qeyd etməsi ermənilər kimi isa qəmbərləri, pənah hüseynovları, cəmil həsənliləri, əli kərimliləri, gültəkin hacıbəyliləri və bu kimi satqın, erməniyə nökərçilik edənlər onu da anlamalıdırlar ki, Azərbaycanın güclü ordusu var və Ali Baş Komandanın söylədiyi kimi: "Bizə xor baxanlara, torpağımıza göz dikənlər, uğurumuzu həzm edə bilməyənlər heç vaxt unutmasınlar ki, "Dəmir yumruq" yerindədir və hər zaman yerində olacaq! Heç kim bizimlə diktat və ultimatum dili ilə danışa bilməz! Bunu heç kim unutmasın! Onu da unutmasın ki, Qarabağ Azərbaycandır!".

## Qarabağ cənnətə dönür

Dövlətimiz erməni vandalizminə, barbarlığına şahid olmuş Qarabağı cənnətə çevirəcək. Hazırda Prezident İlham Əliyevin iradəsi və qətiyyəti sayəsində işğaldan azad olunmuş ərazilərdə quruculuq, bərpa işləri aparılır. Artıq bu gün Xankəndidə keçmiş separatçılar tərəfindən tikilən binalarda separatizmin izləri silinir. Ən hiddət doğuran odur ki, Ermənistan yenə də məsələyə siyasi don geyindirərək qarayaxma kampaniyası ilə məşğuldur. Ancaq işğalçı erməni və onun havadarları anlamalıdırlar ki, onların tikdikləri binaların heç bir əhəmiyyəti yoxdur və bu binalar seperatizmin göstəricisidir.

Eyni zamanda, o zaman 44 günlük Vətən müharibəsindən sonra işğaldan azad edilmiş ərazilərimizdə Ermənistan silahlı qüvvələrinin vandallığının izlərini açıq-aydın görmək mümkündür. Hayların işğal etdikləri ərazilərimizdə törətdikləri kütləvi vandalizm aktları Ermənistandakı etnik psixoloji vəziyyəti özündə ehtiva edir. Vandal ermənilərin bu niyyətlərini gözlərində qoymaq üçün xunta rejiminin işğal dövründə Xankəndidə inşa etdiyi binaların sökülməsinə başlanılıb. Xüsusilə də, "Parlament" adlanan bina Azərbaycana qarşı işğal və soyqırımı planlarının cızıldığı və qərarların qəbul olunduğu terrorçu yuvası olub, YERKRAPA isə terrorçu dəstədir və minlərlə azərbaycanlının ölümündə əli var. Digər tərəfdən, haradan baxsan, bu tikililər qanunsuzdur. Azərbaycanda hazırda çox mühüm tarixi proseslər yaşanır.

Ölkəmizin ərazisində ikinci erməni dövləti qurmaq istəyən xunta rejiminin rəhbərləri ötən il antiterror tədbirləri nəticəsində bir-bir həbs olundular. İndi isə onların səpdikləri separatizm toxumları məhv edilir. Mənfur düşmənin daha bir tikilisi – üstdən baxdıqda xaç formasında inşa edilmiş "veteranlar" binasının da sökülməsi işlərinə başlanılıb. Bu yerdə onlara bir daha xatırlatmaq lazımdır ki, həyasızcasına başqa dövlətin ərazisinə soxulub, orada kütləvi qırğınlar, vandalizm aktları törədən, separatizm siyasəti həyata keçirənlərə hansı üzlə veteran adı veriblər?! Artıq illərlə törətdikləri və rəhbərlik etdikləri cinayət əməllərinə görə onların qanun qarşısında cavab vermək zamanıdır.

Azərbaycan dövləti daim tolerant siyasət yürüdərək Qarabağdakı separatizm qalıqlarını diplomatik yolla təmizləmək istəyini bütün beynəlxalq

platformalarda bəyan edib. Lakin buna məhəl qoymayan Ermənistan hakimiyyəti və başda Makron Fransası olmaqla onun havadarları məsələnin ciddiliyini, Azərbaycanın gücünü və Prezident İlham Əliyevin iradəsini nəzərə almamaqla böyük səhvə yol veriblər.

Prezident İlham Əliyev həmişə çıxışlarında “mənim sözüm imzam qədər qüvvətlidir”, – deyir. İşğaldan azad olunmuş torpaqlara səfərləri və qısa bir zaman kəsiyində görülən uğurlu işlər, həyata keçirilən layihələr məhz Qalib Liderin sözünün və əməlinin vəhdətinin nümayişidir. Prezident İlham Əliyev bu günə qədər verdiyi bütün vədləri yerinə yetirib. Çünki sözü imzası qədər qüvvətli olan liderdir! "Mənim sözüm imzam qədər qüvvətlidir!", – deyən Prezident İlham Əliyevin Azərbaycana rəhbərlik etdiyi ilk gündən həyata keçirdiyi siyasət isə respublikamızın davamlı yüksəlişini, möhkəmlənməsini, qüdrətlənməsini təmin edib. Bu inkişaf kompleks xarakter daşıyaraq cəmiyyət həyatının bütün sahələrində yüksəlişə yol açıb. Və bu gün erməni vandalizminin əsirlikdə olan şahidləri - güllələnmiş büstlər doğma Vətənindədir. Prezident İlham Əliyev işğaldan azad olunmuş torpaqlarımıza səfərləri zamanı dediyi kimi: “Dahi şəxsiyyətlərimizin büstləri bizim Qələbəmizin rəmzidir. Onların ruhu şaddır. Onlar doğma Vətənə qayıdıblar... Natəvan, Üzeyir bəy, Bülbül milli ruhumuzun təcəssümüdür. Milli ruhumuzun təcəssümü olan şəxsiyyətlərin, xüsusən Üzeyir bəyin büstünün Qafqazın incisi, mədəniyyətimizin beşiyi olan Şuşaya qaytarılması yeni milli mədəni intibahımızın rəmzi olacaq”.

### ***Fransada Natəvanın heykəlinə qarşı vandalizm, bu ölkənin gerçək simasıdır***

Ən əsası Qarabağın sonuncu varisi – Xan qızı Natəvanın ürəkdağlayan yadigarı - Şuşadakı evinə baxanda ancaq qəzəb və təəssüf hissi keçirmək mümkündür. Ermənilərin Şuşada törətdikləri vandallığı isə Xurşidbanunun timsalında bütün dünya mədəni irsinə qarşı vəhşilik adlandırmaq olar. Dahilərin xatirələri tək əlyazmalarında, qoyub getdikləri əsərlərdə deyil, həm də ömürlərini keçirdikləri mənzillərdə də yaşayır.

Fransada Xurşidbanu Natəvanın heykəlinə qarşı vandallıq Qərbdə radikallaşmanın və islamofobiyanın utancverici təzahürüdür. Azərbaycan Xarici İşlər Nazirliyinin xüsusi tapşırıqlar üzrə səfiri Elşad İskəndərov

Bakıda "Müxtəlifliyin qorunması: 2024-cü ildə islamofobiya ilə mübarizə" mövzusunda keçirilən beynəlxalq elmi konfransın "Multikulturalizm, islam və sivilizasiyalar toqquşması nəzəriyyəsi: islamofobiyanın yenidən düşünülməsi" adlı plenar iclasında çıxışı zamanı bu barədə danışaraq deyib ki, islamofobiya fenomenində Qərb dünyasında müsəlmanların qlobal dəyərlərə qarşı çıxan tərəf kimi göstərilməsi yanlışdır. Heykələ qarşı sərgilənən münasibət bunun tam əksini göstərir. Bu il mart ayınnı 4-də Xurşidbanu Natəvanın Fransanın Evian-le-Ba şəhərindəki heykəli götürülərək Azərbaycan səfirliyinin nəzdindəki Mədəniyyət Mərkəzinə çatdırılıb. Heykəlin Mədəniyyət Mərkəzinin bağında yerləşdirilməsi ilə bağlı işlər davam etdirilir. Heykəli götürərkən üzərindəki örtük açılıb. Müəyyən olunub ki, abidənin üzərinə qırmızı boya atılmaqla yanaşı - heykəlin gözləri, adının və Azərbaycan yazısının yazıldığı hissələrə qırmızı boya çəkilib - onun özünə də zərər verilib. Belə ki, heykəlin burnu və barmaqları qırılıb. Bu, Fransanın gerçək simasıdır.

## Dostluq və qardaşlığın əsl nümunəsi – Kurmanqazı adına Uşaq Yaradıcılıq Mərkəzi

Bu gün Azərbaycanın xarici siyasət strategiyasının prioritet istiqamətlərindən birini Türk dövlətləri ilə mövcud münasibətləri daha da inkişaf etdirmək, əlaqələri bütün sahələr üzrə genişləndirmək təşkil edir. Xüsusilə, Azərbaycan-Qazaxıstan əlaqələri bütün sahələrdə uğurla inkişaf edir, dövlət və hökumət başçılarının qarşılıqlı səfərləri ölkələrimiz arasında əməkdaşlığın ildən-ilə güclənməsinə mühüm təsir göstərməkdədir. İki dövlət arasında ən müxtəlif sahələrə dair imzalanmış mühüm sazişlər əməkdaşlığın yüksək dinamizmlə inkişaf etdirilməsinə zəmin yaratmışdır. Ortaq tarixə, mədəniyyətə malik olan türk dövlətləri arasında bütün sahələrdə əməkdaşlıq əlaqələrinin möhkəmlənməsi böyük perspektivlərdən xəbər verir. Ölkələrimiz və xalqlarımız arasında siyasi, iqtisadi, humanitar sahələrdə əməkdaşlıq əlaqələrinin inkişafı istiqamətində əldə edilmiş ciddi nailiyyətlər ümumilikdə dövlətlərarası münasibətlərin inkişafında öz sözünü deyir. Qazaxıstanın iqtisadi cəhətdən inkişaf etməsi, dünya miqyasında artan nüfuzu, eyni zamanda, Azərbaycanın iqtisadi baxımdan bölgədə lider rolunu oynaması, regionda və beynəlxalq aləmdə nüfuzunun daim artması kimi ümumi oxşarlıqlar əlaqələrimizin genişlənməsi üçün yaxşı zəmin yaradır. Ümumiyyətlə, Azərbaycan-Qazaxıstan əlaqələri son illərdə daha da inkişaf etmişdir.

Qazaxıstan dövləti Azərbaycanın Cənubi Qafqazdakı strateji yerini və rolunu düzgün qiymətləndirir, ölkəmizlə çoxşaxəli əməkdaşlığın gücləndirilməsinə mühüm diqqət yetirir. Azərbaycan-Qazaxıstan münasibətlərinin ölkəmizin milli maraqlarına uyğun təşəkkül tapması ulu öndər Heydər Əliyevin müəyyənləşdirdiyi xarici siyasət kursunun mahiyyətindən irəli gəlmişdir. Ulu öndərin balanslaşdırılmış xarici siyasət doktrinasını uğurla davam etdirən Prezident İlham Əliyev Qazaxıstanla ikitərəfli əlaqələrin genişləndirilməsini ilk gündən vacib amil kimi nəzərdən keçirmişdir. Dövlət başçılarının qarşılıqlı səfərləri əlaqələrin daha da gücləndirilməsi baxımdan mühüm əhəmiyyət kəsb etmişdir.

Xüsusilə də, son illərdə bu aspektdə görülən işlər davamlı xarakter daşıyır, dövlət başçıları səviyyəsində təşkil olunan qarşılıqlı səfərlər,

imzalanan sənədlər qarşıda yeni əməkdaşlıqlar üçün zəmin yaradır. Yenidən Prezident seçilən İlham Əliyev bu il fevralın 14-də keçirilən and-içmə mərasimindəki nitqində diqqəti Türk dünyası ilə bağlı ölkəmizin siyasətinə yönəldib: "Biz beynəlxalq təşkilatlarla bağlı bundan sonra da öz addımlarımızı atacağıq, ilk növbədə, Türk Dövlətləri Təşkilatı çərçivəsində səylərimizi davam etdirəcəyik. Bu, bizim üçün prioritetdir". TDT-nin Azərbaycan üçün əsas beynəlxalq təşkilat olduğunu vurğulayan dövlətimizin başçısı əlavə edib: "Bizim başqa ailəmiz yoxdur. Bizim ailəmiz Türk dünyasıdır".

Qeyd edim ki, Azərbaycan Respublikası ilə Qazaxıstan Respublikası arasında diplomatik əlaqələr 1992-ci il avqustun 30-da yaradılıb. 1993-cü ilin yanvarında Qazaxıstanın Azərbaycanda, 2004-cü ilin martında isə Azərbaycanın bu ölkədə səfirlikləri fəaliyyətə başlayıb. 2008-ci ilin sentyabrında Azərbaycanın Qazaxıstanın Aktau şəhərində baş konsulluğu açılıb.

Xatırladaq ki, Prezident İlham Əliyevin Qazaxıstana son səfəri 2023-cü il noyabrın 2-də olub. Son il yarım ərzində Prezident İlham Əliyev Qazaxıstana dörd dəfə səfər etmiş, Qazaxıstan Prezidenti isə bu müddət ərzində üç dəfə ölkəmizdə olub. Bu günə qədər Azərbaycanla Qazaxıstan arasında 150-yə yaxın sənəd imzalanıb. Bu, təkcə 1 il 6 ay ərzində 40-a yaxın mühüm ikitərəfli sənəd imzalanıb. Ortaq tarixi, dini və mədəniyyəti bölüşən, eyni soykökə malik olan hər iki xalq arasındakı əlaqələrin tarixi qədim dövrlərə gedib çıxır. “Ortaq keçmişdən ortaq gələcəyə" şüarını reallığa çevirən bu cür səfərlər Türk dünyasının gələcəkdə daha böyük siyasi güc kimi meydana çıxmasını şərtləndirir”.

Xüsusilə qeyd etmək lazımdır ki, Prezident İlham Əliyev ilə qazaxıstanlı həmkarı arasındakı görüşdə qarşılıqlı fəaliyyətin digər məsələləri, o cümlədən beynəlxalq strukturlarda, ilk növbədə, BMT və Türk Dövlətləri Təşkilatında birgə fəaliyyət müzakirə olunub. "Türk Dövlətləri Təşkilatı çərçivəsində qarşılıqlı fəaliyyəti gələcəkdə də möhkəmləndirməyin zəruri olmasına dair vahid fikrə gəldik. Çünki bu təşkilat yaxın, dost, doğma ölkələri birləşdirir, həmçinin böyük potensiala, ən başlıcası inkişaf potensialına malikdir”, – deyə Azərbaycan Prezidenti mətbuata bəyanatında bildirib.

Prezident İlham Əliyev ərazi bütövlüyünü və suverenliyini bərpa etməkdə Azərbaycana verdiyi daimi dəstəyə və azad edilmiş ərazilərin

bərpasına göstərdiyi yardıma görə Qazaxıstan prezidentinə təşəkkür edib: “İlk növbədə, istərdim ki, işğaldan azad olunmuş Füzuli şəhərində Kurmanqazı adına Uşaq Yaradıcılıq Mərkəzinin inşasına dair təşəbbüsünə görə Kasım-Jomart Kemeleviçə bir daha təşəkkürümü bildirim. Bu, Prezidentin şəxsi qərarıdır və bu qərardan həmin layihənin reallaşdırılmasına qədər çox az vaxt keçib. Sabah biz birlikdə bizim keçmiş məcburi köçkün uşaqların təhsil alacağı, həmçinin dostluğumuzun və qardaşlığımızın mərkəzi olacaq bu mərkəzi açacağıq. Bu, Qazaxıstanın Azərbaycana qardaş köməyidir, bu, Qazaxıstanın Azərbaycana hədiyyəsidir və azad edilmiş ərazilərin bərpasına dəstəyidir”.

Qazaxıstan Prezident Kasım-Jomart Tokayev mətbuata bəyanatında bildirib ki, bu dövlət səfəri dövlətlərimiz arasında əməkdaşlığın inkişaf perspektivləri nöqteyi-nəzərindən çox mühümdür: “Azərbaycan Sizin rəhbərliyinizlə böyük tarixi qələbə əldə edib. Bu, dövlət suverenliyinin bərpa olunmasıdır. Qazaxıstan xalqı bununla bağlı böyük sevinc hissi keçirib. Biz bu mövzuda danışmışıq. Mən Sizə təbrik məktubu ünvanlamışam. Zənnimcə, bu, uzun illər ərzində Sizin dövlət suverenliyinin bərpasına yönəlmiş və son nəticədə tarixi həqiqətin bərpası ilə nəticələnən səylərinizin qanunauyğun yekunudur”.

Onu da qeyd edək ki, Qazaxıstanda Ulu Öndər Heydər Əliyevin həyat və yaradıcılığına həsr olunmuş sənədli film çəkilib və nümayiş etdirilib. Bu, qazax xalqının Ümummilli Liderə verdiyi böyük dəyərin daha bir göstəricisidir.

Bir sözlə, qarşılıqlı səfərlər, imzalanan sənədlər Azərbaycan-Qazaxıstan münasibətlərini daha da gücləndirəcək, qardaş dövlətlərin və xalqların maraqları çərçivəsində bundan sonra da inkişaf edəcək və bütün sahələrdə əməkdaşlığımızın göstəriciləri nəzərəçarpacaq dərəcədə artacaq.

## 31 Mart: Yaddaşımızdan silinməyən qətliam

Son iki yüz ildə Azərbaycan tarixinə bir çox şanlı səhifələrlə yanaşı, faciələr və soyqırımları, müsibətlərlə dolu səhifələr də yazılıb. Bu dəhşətli hadisələrdən biri 1918-ci ilin mart-aprel aylarında erməni daşnaklarının bolşeviklərlə birgə azərbaycanlılara qarşı həyata keçirdiyi soyqırımdır. Düz 106 il öncə - 1918-ci il martın 30-u gecə saatlarında Bakıda başlanan kütləvi qırğınlar 20 minə yaxın günahsız insanın, o cümlədən çoxlu sayda qoca, qadın və uşaqların öldürülməsi ilə nəticələnib. Martın 30-dan aprelin 2-dək davam edən kütləvi qırğınlarda Stepan Şaumyanın rəhbərlik etdiyi erməni bolşevik dəstələri Bakıda minlərlə insanı qətlə yetirib, müsəlman ziyarətgahlarını yandırıb, Bakı əhalisinin 400 milyon manatlıq əmlakını müsadirə ediblər. Kütləvi qırğınlar zamanı şəhərin ən möhtəşəm məscidi sayılan Təzəpir məscidi aramsız top atəşinə tutulub, ermənilər Bakının ən möhtəşəm memarlıq incilərindən olan "İsmailiyyə" binasını yandırıblar.

Azərbaycanlılara qarşı həyata keçirilən soyqırımı siyasəti təkcə Bakı şəhəri ilə məhdudlaşmayıb. Martın 31-də erməni daşnakları Şamaxı qəzasının 53 kəndində 8027 azərbaycanlını, o cümlədən 2560 qadın və 1277 uşağı qətlə yetiriblər. Qubanın 162 kəndində öldürülən günahsız azərbaycanlıların sayı isə 16 mindən artıq olub. Erməni daşnakları Lənkəran, Muğan bölgəsi və Dağlıq Qarabağda minlərlə kəndi yandırıb, on minlərlə insanı vəhşicəsinə qətlə yetiriblər. 1918-ci il iyulun 15-də Azərbaycan Demokratik Respublikasının yaratdığı Fövqəladə Təhqiqat Komissiyası bu qırğınlarla bağlı çoxsaylı sənədləri toplayaraq hökumətə təqdim edib, 1919-cu ildə Azərbaycan parlamenti 31 Mart tarixinin Azərbaycanlıların Soyqırımı günü kimi qeyd olunması barədə qərar qəbul edib. Bu qanlı faciəyə əsl hüquqi qiymət ulu ö ndər tərəfindən verildi. Məhz ümummilli lider Heydər Əliyev 1998-ci il martın 26-da “1918-ci il mart soyqırımı haqqında” Fərman imzalayıb. Qeyd edək ki, bu gün Prezident İlham Əliyev “1918-ci il azərbaycanlıların soyqırımının 100 illiyi” haqqında imzaladığı Sərəncama əsasən, erməni-bolşevik silahlı dəstələrinin 100 il əvvəl azərbaycanlılara qarşı törətdikləri bəşəri cinayətlər barədə həqiqətlərin ölkə və dünya ictimaiyyətinə daha dolğun çatdırılması məqsədilə genişmiqyaslı tədbirlər həyata keçirilib.

Qeyd edək ki, bu gün bizim qarşımızda duran başlıca vəzifə ermənilərin azərbaycanlılara qarşı törətdikləri cinayətin soyqırımı kimi beynəlxalq hüquqi qiymətini almasına nail olmaqdır. Bu baxımdan Azərbaycanın Birinci vitse-prezidenti, Heydər Əliyev Fondunun prezidenti Mehriban xanım Əliyevanın, eləcə də Fondun vitse-prezidenti Leyla Əliyevanın təşəbbüsləri çox diqqətəlayiqdir.

Bu gün hər bir azərbaycanlı bəşər tarixində ən qanlı cinayətlərdən biri olan 31 mart soyqırımının günahsız qurbanlarının əziz xatirəsini ehtiramla yad etməklə yanaşı, Müzəffər Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi ilə şanlı Azərbaycan Ordusunun 44 günlük Vətən müharibəsində düşmən üzərində qazandığı tarixi Qələbənin sevincini yaşayır. Qəhrəman ordumuz düşməni darmadağın edərək bütün şəhidlərimizin, soyqırımə qurbanlarının qisasını aldı. Artıq bütün şəhidlərimizin ruhu şaddır. Çünki Prezident, müzəffər Ali Baş Komandan İlham Əliyev cənablarının rəhbərliyi ilə 30 ilə yaxın işğalı altında qalan torpaqlarımız azad edildi.

Neofaşist ölkə olan Ermənistan, onun vandal ordusu "Dəmir yumruğ"un təsiri altında, igid əsgərlərimizin zərbələri qarşısında diz çökdü. Qələbəyə aparan uzun yol 44 gün davam edən İkinci Qarabağ müharibəsi ilə başa çatdı. İgid hərbçilərimizin, şəhidlərimizin qəhrəmanlığı sayəsində düşmən döyüş meydanında məhv edildi, məğlubiyyətini etiraf etdi. "Ermənilərin məğlubedilməzliyi" barədə yalanlar ifşa edildi. Ali Baş Komandanımız bütün dünyaya sübut etdi ki, məhz erməni kimi, insanlıq xüsusiyyətlərindən uzaq bir düşmən tərəfindən uzun müddət işğal altında qalan torpaqlarımızın azad edilməsinin yeganə yolu müharibədir. 44 günlük Vətən müharibəsi və qazanılmış qələbə Azərbaycan tarixinin ən parlaq səhifələri kimi milli yaddaşımızda əbədi olaraq qalacaqdır: "Mən bir daha deyirəm və hər dəfə də deyəcəyəm, bizim Qələbəmiz təkcə Ermənistan dövləti üzərində əldə edilmiş qələbə deyil, biz erməni faşizmini məhv etdik".

Bu gün biz artıq öz ərazi bütövlüyümüzü, suveren hüquqlarımızı bərpa etmişik. Erməni faşistlərinin darmadağın etdiyi, xarabaya çevirdiyi doğma torpaqlarımızda yenidən quruculuq işlərinə başlamışıq və tezliklə bu yerlərə həyat qayıdacaq. Lakin xalqımızın yaşadığı tarixi faciələri

heç zaman unutmamalıyıq. Bu hadisələr bizim şərəf və mübarizə tariximizin ən şanlı səhifələridir, qan yaddaşımızdır. Ümid edirik ki, özlərini demokratiyanın beşiyi olaraq qəbul edən Qərb dairələri nəhayət bu reallıqlara gözünü açacaq və bəşər tarixinin ən qanlı faciələrindən biri olan 31 Mart Azərbaycanlıların soyqırımı gününə layiqli hüquqi qiyməti verəcəkdir.

Allah soyqırımı qurbanlarının ruhunu şad etsin!

# Aprel döyüşləri – Zəfərin başlanğıcı – ŞƏRH

Tariximizə qalibiyyət ruhu kimi yazılan Aprel döyüşlərinin başlamasından 8 il ötür. Torpaqlarımızı 28 il işğal altında saxlayan Ermənistanın növbəti təxribatına cavab olaraq başladılan əks-hücum əməliyyatı nəticədə Tərtər rayonunun Talış kəndi ətrafındakı yüksəkliklər, Cəbrayıl rayonunun Lələtəpə yüksəkliyi və Cocuq Mərcanlı kəndi, Goranboy rayonunun Gülüstan kəndi və Tərtər rayonunun Suqovuşan kəndi istiqamətində bir sıra mühüm və strateji əhəmiyyətli mövqelər azad olundu. Aprelin 4-də Ermənistan ordusu itirilmiş mövqelərini geri qaytarmaq məqsədilə cəbhənin, əsasən, Ağdərə-Tərtər və Xocavənd-Füzuli istiqamətlərində mövqelərimizə yenidən hücum etdi, o zaman mövcud olan təmas xəttinə yaxın yaşayış məntəqələrimizi intensiv atəşə tutdu. Amma hərbçilərimiz bu hücumun qarşısını şücaətlə alaraq, Ermənistan ordusunu ağır məğlubiyyətə uğratdı və qarşı tərəf öz məqsədinə nail ola bilmədi.

Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi altında rəşadətli Silahlı Qüvvələrimizin düşmənə sarsıdıcı zərbə endirməsi və cəbhə boyunca irəliləməsi isə gözünü belə açmağa imkan tapmayan düşmənin böyük itkilər verərək geriyə çəkilməsi, qaçması ilə başa çatdı. Dörd günlük müharibə zamanı təkcə Ermənistan deyil, bütün dünya Azərbaycan Ordusunun gücünü gördü. Həmin döyüşlər, eyni zamanda, Ermənistan ordusunun gücü barədə yayılan mifi də darmadağın etdi. Döyüşlər Ermənistanın xahişi, yalvarışları və Rusiyanın vasitəçiliyi ilə 2016-cı il aprelin 5-də dayandırıldı. Erməni silahlı qüvvələri bu döyüşlərdə böyük itkilərə məruz qaldı. Ordumuzun qəti zərbələri nəticəsində qarşı tərəfin 30-dək tankı, 25-dən çox artilleriya qurğusu və digər zirehli texnikası məhv edildi, 320 hərbçisi öldü, 500-dən artıq döyüşçüsü yaralandı. Eyni zamanda, döyüşlərdəki ağır məğlubiyyət Ermənistanın siyasi-hərbi rəhbərliyində dərin çatların əmələ gəlməsinə səbəb oldu. Ermənistan silahlı qüvvələrində istefalar baş verdi, həbslər oldu. Bu döyüşlər Azərbaycan xalqının erməni işğalı altında olan torpaqların hərbi yolla azad edilməsinə inamını möhkəmləndirdi. Aprel şəhidləri isə xalqımızın qüdrətini, qələbə əzmini bir daha sübut etdi.

Prezident İlham Əliyev aprel döyüşlərində əldə edilmiş qələbə ilə bağlı deyib: "Aprel döyüşləri bizim şanlı hərbi qələbəmizdir, dövlətimizin,

xalqımızın, ordumuzun gücünü göstərən qələbədir... Bu döyüşlər onu göstərir ki, Azərbaycan xalqı və dövləti heç vaxt işğalla barışmayacaq, öz ərazi bütövlüyünü nəyin bahasına olursa-olsun bərpa edəcəkdir. Aprel döyüşləri, eyni zamanda, ordumuzun peşəkarlığını göstərmişdir. Ordumuz əlverişsiz mövqelərdən əks-hücum əməliyyatı apararaq strateji mövqelərə sahib oldu".

Uğurlu aprel qələbəsindən iki il sonra ordumuz daha bir böyük zəfər qazandı. 2018-ci ilin mayında Əlahiddə Ümumqoşun Ordu tərəfindən Naxçıvanın Günnüt kəndi və ətraf ərazilərin nəzarət altına alınması bir daha göstərdi ki, əsgər və zabitlərimiz qarşıya qoyulan istənilən tapşırığı yerinə yetirmək əzmindədir. 2018-ci il iyunun 26-da Azərbaycan Silahlı Qüvvələrinin yaradılmasının 100 illik yubileyi münasibətilə Bakının Azadlıq meydanında təntənəli hərbi parad keçirildi. Həmin paradda 2016-cı ilin Aprel döyüşlərində, 2018-ci ilin Naxçıvan əməliyyatında işğaldan azad olunmuş torpaqlarda qaldırılmış Azərbaycan bayraqları nümayiş etdirildi. Paradda çıxış edən Prezident İlham Əliyev demişdir ki, gün gələcək bu gün işğal altındakı torpaqlar azad olunandan sonra orada qaldırılacaq Azərbaycan bayrağı Azadlıq meydanına gətiriləcək və hərbi paradda göstəriləcək. O gün gəldi, azad edilmiş torpaqlarda qaldırılmış Azərbaycan bayraqları 2020-ci il dekabrın 10-da Bakının Azadlıq meydanında Vətən müharibəsində Qələbəyə həsr olunmuş Zəfər paradında nümayiş etdirildi.

Vurğuladığımız kimi, Aprel döyüşləri Vətən müharibəsində böyük qələbəyə gedən yolda mühüm əhəmiyyət kəsb edir. Bu, döyüşdə qazanılan təcrübə İkinci Qarabağ müharibəsində uğurla tətbiq olundu. Qalib Prezidentimiz İlham Əliyev cənablarının dediyi kimi, Böyük Qayıdışımız məhz Cəbrayıldan, Aprel döyüşlərində azad olunmuş Cocuq Mərcanlı kəndindən başladı. İkinci Qarabağ müharibəsindəki birinci ciddi uğurumuz da məhz Cəbrayıl şəhəri ilə, Cəbrayıl rayonu ilə bağlıdır. Bu, ölkəmizin tarixində əbədi qalacaq bir hadisədir. Çünki müharibənin birinci həftəsində, oktyabrın 4-də Cəbrayıl şəhəri işğaldan azad edildi.

Bir sözlə, Aprel döyüşləri işğalçılar üçün bir mesaj, bir siqnal idi ki, işğala son qoyun, torpaqlarımızdan çıxın, rədd olun. Belə ki, Prezident, Müzəffər Ali Baş Komandan İlham Əliyev hərbi hissənin şəxsi heyəti qarşısında çıxışı zamanı bildirmişdir: «Bizim Aprel döyüşlərindəki qələbəmizdə

xüsusi təyinatlıların çox böyük xidmətləri olmuşdur. Ancaq əfsuslar ki, Aprel hadisələri işğalçılar üçün dərs olmadı. Onlar işğalı əbədiləşdirmək üçün öz səylərini davam etdirdilər və Azərbaycana, onun Silahlı Qüvvələrinə hədə-qorxu gəlməyə davam etdilər. Bizi yeni müharibə ilə hədələyən düşmən İkinci Qarabağ müharibəsində öz dərsini aldı. "Qarabağ Ermənistandır və nöqtə" deyən düşmən bu gün "Qarabağ Azərbaycandır" deyir. Nəyin hesabına? Danışıqlar hesabına yox! Güc hesabına, qüdrət hesabına, Azərbaycan Ordusunun Zəfəri hesabına! Biz güclü ordu yaratmışıq. Bundan sonra da bu istiqamətdə işlər aparılacaq".

Bu gün biz fəxrlə xatırlayırıq ki, 4 günlük hərbi əməliyyatlardan sonra Prezident, Ali Baş Komandan İlham Əliyev azad olunmuş ərazilərimizə səfər edərkən növbəti zəfərlərin anonsunu verirdi, "Azərbaycan xalqı heç vaxt torpaqlarının işğal altında qalması faktı ilə barışmayacaq" bəyanatı da buna danılmaz sübut idi!

Müzəffər Ali Baş Komandan İlham Əliyev verdiyi bütün vədlərini yerinə yetirdi! Əldə edilən qalibiyyətlərdən sonra – 2018-ci il iyunun 26-da Azərbaycan Respublikası Silahlı Qüvvələrinin yaradılmasının 100 illik yubileyi münasibətilə Bakının Azadlıq meydanında təntənəli hərbi parad keçirildi. Bir sözlə, Aprel döyüşləri zamanı qazandığımız şanlı qələbə sübut etdi ki, Azərbaycan Silahlı Qüvvələri tez bir zamanda işğal altındakı bütün ərazilərimizi azad etmək gücündədir.

## Məğlub tərəf qalibin şərtlərini qəbul etmək məcburiyyətindədir

Bu gün açıq şəkildə görünür ki, qərb dairələri Cənubi Qafqazı yeni qan çanağına döndərmək üçün çırpınırlar. Məhz Qərb, onun missiyası Ermənistanı sülhə yox, belə təxribatlara sövq edir. Xüsusilə də, yenə də Azərbaycanın uğurlarını həzm edə bilməyən E.Makron Fransası ümid edir ki, təcavüzkar ölkəni bu şəkildə dəstəkləməklə bölgədə gərginlik yaradacaq və bundan istifadə edib çirkin məqsədini həyata keçirəcək. Amma Fransa rəsmiləri anlamalıdırlar ki, atdıqları bu kimi addımlarla heç nə əldə edə bilməyəcəklər, necə ki, nail ola bilmirlər. Bu yerdə onu da xatırladaq ki, Fransa son illər bu kimi məsələləri dəfələrlə BMT TŞ-na çıxarıb, lakin orada Azərbaycan əleyhinə təkliflər gündəliyə salınmayıb. Bu da səbəbsiz deyil. Çünki Azərbaycan öz müstəqilliyinə və tam suverenliyinə qovuşmaq üçün beynəlxalq hüququn norma və prinsipləri çərçivəsində hərəkət edib. Paris Avropa İttifaqında Azərbaycana qarşı sanksiyalar tətbiq etmək üçün qətnamə qəbul olunmasına çalışsa da, yenə fiaskoya uğrayıb.

Bu yerdə Azərbaycan Prezidenti İlham Əliyev cənablarının bu yaxınlarda bəyan etdiyi fikrə diqqət yetirək. Dövlətimizin başçısı bəyan etmişdir ki, Cənubi Qafqazda aparıcı mövqeyə sahib olmaq siyasəti yürüdən Fransa regionda odun üstünə benzin tökmək prinsipindən çıxış edir, Ermənistan isə militarizasiya siyasəti aparır. Ölkəmiz Ermənistana sülh və əməkdaşlıq təklif etdiyi halda Ermənistan hakimiyyəti isə regiona ABŞ və Aİ-nın hərbi bazasını yaratmağa çalışır. Bu yerdə belə bir sual ortaya çıxır: ABŞ və Aİ-nın hərbiçiləri Ermənistanı kimdən qorumaq üçün zəmanət vermək istəyir? Təbii ki, Azərbaycan müharibənin başa çatdığını və Ermənistanın ərazilərində gözü olmadığını açıq şəkildə bəyan edib. Qərbə isə Cənubi Qafqazda sülhün və əməkdaşlığın yaranması maraqlı deyil və ona görə də Ermənistanı silahlandırır. Qərbin bu addımları Cənubi Qafqazı yenidən müharibə meydanına çevirmək niyyətindən irəli gəlir. Beləliklə, qərb və digərləri var gücləri ilə Ermənistanı nəticəsi öncədən məlum olan müharibə fəlakətinə sürükləyirlər. Niyyətləri bəllidir: nə olursa olsun qan tökülsün, Ermənistanın kapituliyasiya durumundan çıxarsınlar, dağıdıcı müharibə yolu ilə nələrisə dəyişsinlər. Amma

normal düşüncə və reallığı anlamaq qabiliyyəti olan hər kəs bilir ki, hazırda Ermənistanın düşdüyü durumdan çıxması sadəcə mümkünsüzdür. Çünki 44 günlük müharibədə, eləcə də 23 saatlıq antiterror tədbirlərində Fransa da, bütün dünya da Azərbaycan Ordusunun təcavüzkar Ermənistanın ordusunu qarşısında necə diz çökdürdüyünə əyani şahidlik etdi. Eyni zamanda Vətən müharibəsindən sonra Azərbaycan Silahlı Qüvvələrinin daha da gücləndirildiyini bütün dünya bilir. Buna görə də cəmi 23 saata ermənilərin 30 il qurduğu istehkamları məhv etmiş Azərbaycana Fransa və Hindistanın Ermənistana verdiyi texnikanı darmadağın etmək üçün bir neçə saat kifayət etdiyini də bilməmiş deyil.

Prezident İlham Əliyev bu il yanvarın 10-da yerli televiziya kanallarına müsahibəsində də bəyan etdi ki, Ermənistan da bilməlidir ki, nə qədər silah alsa da, onlara nə qədər ürək-dirək versələr də, əgər bizə qarşı hər hansı bir təhlükə mənbəyi olsa, biz dərhal o təhlükə mənbəyini məhv edəcəyik: "Qoy eşidən eşitsin ki, biz görsək, bizə qarşı real təhlükə, o Fransanın sınıq-salxaq "Bastion" maşınları, o konserv bankaları yox, real təhlükə yaransa, biz preventiv addımlarla həmin təhlükəni istənilən nöqtədə məhv edəcəyik".

Beləliklə, Azərbaycan sülhə, sülh danışıqlarına sadiqdir və sülh danışıqları ilə bağlı mövqeyimiz aydındır, məntiqlidir, beynəlxalq hüquqa əsaslanır. Çünki Azərbaycan öhdəliklərinə də sadiq ölkədir. Əgər Ermənistan həqiqətən sülh istəyirsə, öhdəliklərinə tam şəkildə əməl etməli və ikitərəfli danışıqlar formatında Azərbaycanla razılığa gəlməlidir. Çünki bu gün diktəni edən qalib ölkə və qalib ölkənin Qalib Lideri Prezident İlham Əliyevdir və onun dediyi söz imzası qədər keçərlidir.

# Tarix unudulmur

## Hər kəs etdiyi əməllərin cəzasını çəkəcək

Əbəs yerə deyilmir ki, zaman hakim, tarix isə yaddaşdır və tarixi faktları saxtalaşdırmaq olmaz. Xalqımız 2003-cü ildən bu günə kimi "müxalifət" deyilən qurumun hansı məqsədlərə və kimlərə quluq etdiklərini, ən əsası isə satqınçılıqlarını bilirdi. Son 20 ildə Azərbaycan Prezidentinin öz xalqına göstərdiyi qayğı və bütün dünayını ağuşuna alan koronavirusa qarşı mübarizədə ancaq vətəndaşların sağlamlığının prioritet olduğunu deyərək dövlət başçımız "Biz birlikdə güclüyük!" şüarı ilə bütün uğurlu addımları atdığını xalqımız görür və öz Liderinə inanır. Prezidentimizin iqtisadi və xarici siyasət sahəsindəki bu uğurları isə müxalifəti təşvişə salıb.

Radikal fikirli, "görkəmli hüquqşünas", "millət fədaisi" satılıb-satan Əli Kərimli, öz savadsızlıqları və səviyyəsizlikləri ilə seçilən mətbuat orqanı ilə informasiya agentliklərini fərqləndirə bilməyən Qənimət Zahid və kökü, mənəviyyatı erməni xislətli, erməni təxribatına qahmar çıxan Sevinc Osmanqızı, satqınlığını hər cür formada nümayiş etdirən Arif Məmmədov, "Yurd" şefinin sədrinin əskisi olan Cəmil Həsənli, özünü "Milli Şura"nın "primadonnası" hesab edən Gültəkin Hacıbəyli, əldəqayırma "hüquq müdafiəçisi" Vidadi İskəndərli və bu kimi xalqın düşmənləri usanmaq bilmədən təcavüzkar ölkənin özləri kimi savadsız Ermənistanın baş naziri Nikol Paşinyanın müdafiə edən çıxışlar etməsinə nə ad vermək olar? Vicdansızlıq və nankorluq! Bir də, taylı-tayın tapar. Bu satqınların mənəvi deqrodasiyaya uğradıqlarıyla yanaşı, etnososioloji varlıq olaraq erməniləşdiklərini, tarixi düşmənlərimizlə eyni mental xüsusiyyətləri paylaşdıqlarını ortaya qoyurlar.

Bəli, hər kəs etdiyi əməllərin cəzasını çəkəcək.... Özü də xalqın qarşısında. 28 il "müxalifətdəyəm" deyənlərin əqidəsi, məsləki, satqınlığı, əxlaqsızlığını zaman özü elə üzə çıxarır ki... Təcavüzkar Ermənistanın yenidən törətdiyi təxribatlarına həmişə dəstək verən radikal müxalifət, xüsusilə də AXCP sədri Əli Kərimli, Gültəkin Hacıbəyli, Cəmil Həsənli, Sevinc Osmanqızı, Vidadi İskəndərli, Arif Məmmədov....kimilər necə ki, iş çətinə düşən kimi, "dövlətin yanındayıq", vəziyyət stabilləşən kimi olurlar iblis.

Çünki istər dələduzlar yuvası olan "Milli Şura", istər "beşinci kalon"un cinayətkar virusları anlamalıdırlar ki, indi 90-cı illərin əvvəlləri deyil. Arzuolunmaz ssenari düzənləmək istəyənlər isə unudublar ki, nə dövlət həmin dövlətdir, nə cəmiyyət! İndi dövlət cox güclüdür, cəmiyyət isə ağı-qaradan seçə bilir. Əldə olunan nailiyyətlər sırasında təhlükəsizlik, güclü ordu, əmin-amanlıq, sabitlik, inkişaf və sosial rifah öndə gəlir. Son illər cəbhədə düşmənə verilən cavab, bir qarış olsun belə torpaq verməmək, əksinə yeni mövqelər əldə etmək məhz bu gücün real göstəricisidir. Satqın, erməniyə nökərçilik edənlər anlamalıdır ki, Azərbaycanın güclü ordusu var və bu Ordu Ali Baş Komandanın əmri ilə qarşısına qoyulan istənilən vəzifəni yerinə yetirməyə, o cümlədən torpaqlarımızı işğaldan azad etməyə qadirdir. Heç kim şübhə etmir ki, əlverişli məqamda bu, mütləq baş verəcək. Bunu 2016-cı ilin aprel döyüşləri, hazırda Azərbaycan-Ermənistan sərhədində baş verən hadisələr və ötən ilin sentyabr ayının 19-da işğalçı Ermənistann etdiyi təxribatlarına görə Müzəffər Ali Baş Komandan, Prezident İlham Əliyev cənablarının "dəmir yumruq" siyasəti ilə güclü Ordumuzun Azərbaycanın Qarabağ iqtisadi rayonunda keçirdiyi daha bir böyük missiyanı uğurla başa çatdıraraq separatçıları təslim olmağa məcbur etdi. Bununla da Ermənistana layiq olduğu yeri göstərməklə Azərbaycanın müstəqilliyinə, suverenliyinə qarşı bütün təxribatların qarşısı qətiyyətlə aldı.

Qalib Liderimiz, Prezident İlham Əliyev sentyabrın 20-də xalqa müraciətində lokal antiterror tədbirlərinə başlanmasını şərtləndirən amillərə diqqəti yönəldərək bildirdi: "Ağır relyef şəraitində, düşmən tərəfindən uzun illər böyük mühəndislik işləri nəticəsində istehkamların mövcudluğu şəraitində, düşmən mövqelərinin təpələrdə, əlverişli yerlərdə yerləşdirilməsinə baxmayaraq, bizim hərbçilərimiz qəhrəmanlıq, peşəkarlıq göstərmişlər və qısa müddət ərzində bütün istiqamətlər üzrə əhəmiyyətli dərəcədə hərbi uğurlar əldə etmişlər. Ermənistan dövlətinin Azərbaycan ərazisində qanunsuz yerləşdirilmiş və Ermənistan dövlətinin öhdəliyinə baxmayaraq, bu günə qədər çıxarılmamış ordunun böyük hissəsi tamamilə məhv edilmişdir. Hərbi texnika məhv edilmişdir və sıradan çıxarılmışdır".

Bəli, sözü imzası qədər dəyərli və keçərli olan Ali Baş Komandan, Prezident İlham Əliyev nə vaxt, nəyi, necə etmək lazımdır – bunu özü

bilir. Dövlət başçımızın söylədiyi kimi: «Bizə xor baxanlara, torpağımıza göz dikənlər, uğurumuzu həzm edə bilməyənlər heç vaxt unutmasınlar ki, "Dəmir yumruq" yerindədir və hər zaman yerində olacaq! Heç kim bizimlə diktat və ultimatum dili ilə danışa bilməz! Bunu heç kim unutmasın! Onu da unutmasın ki, Qarabağ Azərbaycandır!".

Xalqımız əmin olsun ki, Vətənə və dövlətə qarşı xəyanət yolu tutan bu satqın və naqis xəyanətkarlar gec-tez öz layiqli cəzalarını alacaqlar – özü də Azərbaycan xalqı və qanunları qarşısında!

## Azərbaycanın uğurlarının kölgəsində alışıb-yananlar

İyirmi səkkiz ildir ki, "müxalifət" adı ilə yol gedənlər bu gün sosial söyüş müxalifəti olmaqları ilə dövlətə, xalqa, Azərbaycanın uğurlu inkişafına qara yaxanlar elə zənn edirdilər ki, bu əxlaqsızlıqları ilə xalqın dəstəyini bəlkə "qazandılar". Ancaq onların bu "arzusu" "qaşınmayan yerdən qan çıxarmağa" bənzəyir.

Bu gün müxalifət, o cümlədən AXCP sədri Əli Kərimli kimilər illərdir ki, eyni mühitdə qalıb, zaman-zaman bir-birilərinə xəyanət ediblər.

Prezident İlham Əliyev 44 günlük qələbəmizlə bağlı xalqa müraciətində bildirdi ki, torpaqlarımızın işğal altına düşməsində əsas günahkar Azərbaycan Xalq Cəbhəsidir: "Çünki əgər 1992-ci ildə onlar qanunsuz yollarla hakimiyyətə gəlməsəydilər, əgər dövlət çevrilişi etməsəydilər, bəlkə də, torpaqlarımız işğal altına düşməyə bilərdi",-deyən dövlətimizin başçısı bildiridi ki, Azərbaycan Xalq Cəbhəsi, onun rəhbərliyi ancaq bir məqsədi güdürdülər ki, öz ciblərini doldursunlar, öz yaxın adamlarını vəzifələrə təyin etsinlər və öz hakimiyyətinin ömrünü uzatsınlar: "Kəlbəcərin işğal altına düşməsi bax, bu çirkin addımların nəticəsi idi. Başqa cür ola da bilməzdi. İndi gənc nəsil xatırlamır, ancaq bilməlidirlər ki, o vaxt Azərbaycana kimlər rəhbərlik edirdi, hansı bilik sahibləri, hansı səriştə sahibləri".

Ali Baş Komandanımız dedi ki, əgər Heydər Əliyev 1993-cü ildə xalqın tələbi ilə hakimiyyətə gəlməsəydi, Azərbaycan nəinki öz qalan torpaqlarını itirəcəkdi, ümumiyyətlə, dövlətçilik əldən gedəcəkdi: "Bilməyənlər bilsinlər və gənc nəsil bunu bilsin, kim bizi bu bəlaya saldı? Kim bu bəlanın səbəbkarıdır? Kim bir milyon insanın ağır vəziyyətə düşməsinin səbəbkarıdır? O vaxtkı Azərbaycan Xalq Cəbhəsi hakimiyyəti. Əslində, indi paralel aparsaq, onların obrazı elə bil kollektiv Paşinyandır - savadsız, biliksiz, iradəsiz, qorxaq, fərari, idarəetmədə heç bir təcrübəsi olmayan, xarici dairələrin təsiri altında olan, onların əli ilə idarə olunan və öz ölkəsini məhv edən. Bax, kollektiv Paşinyandır onlar. Onları tanımayanlar, əgər onlar haqqında hər hansı bir təsəvvür yaratmaq istəsələr, Paşinyana baxsınlar. Onun addımlarına baxsınlar və onun simasında o vaxtkı

Azərbaycan Xalq Cəbhəsinin və ölkə rəhbərliyinin simasını görəcəklər".

"Biz erməni faşizmini məhv etdik", – deyən dövlətimizin başçısı bir daha bildirdi ki, bizim Qələbəmiz təkcə Ermənistan dövləti üzərində deyil, biz erməni faşizmini məhv etdik.

Ancaq bu gün içimizdə olan "şeytanlar" bu uğurları görüb alışıb - yanırlar. Türkiyəli məşhur yazarlardan biri Səbahəddin Əlinin "İçimizdəki şeytan" romanını yəqin ki, bir çoxlarınız oxumusunuz. Həmin romanın personajları bizim hazırkı Azərbaycan siyasi mühitinin məğlubları – Tofiq Yaqublunu, habelə onun hədəfə aldığı, ünvanlarına şok ittihamlar səsləndirdiyi Azərbaycan Xalq Cəbhəsi Partiyasının sədri Əli Kərimli və Milli Şuranın Koordinasiya Mərkəzinin üzvü Gültəkin Hacıbəylini xatırladır. Roman qəhrəmanlarının yaşantıları insanın daxili hesablaşmalarını qabardır, içindəki şər və xeyir xüsusiyyətlərini üzə çıxarır. Bu "şeytanlar" bilməlidirlər ki, yalan və riyakarlıq üzərində qurulan siyasət gec-tez iflasa uğramalıdır. Xüsusilə də, hazırda AXCP-də baş verən istefalar nə bu gün olub, nə də dünən. Nə qədr ki, savadsız, mənəviyyatdan uzaq, xalqa, dövlətə satqınçılıq mövqeyində olduğunu nümayiş etdirən, bir siyasi partiyanı idarə edə bilməyən, lovğalığı və təkəbbürü ilə partiya funksionelərinə hörmətsiz yanaşan Əli Kərimli kimi dəyəri olmayanın rəhbərlik etdiyi partiyadan istefa vermələri daha xeyirlidir. Ziyanın yarısından qayıtmaq da faydalıdır.

Belə bir deyim var: "Xəyanətin və satqınlığın ömrü az olduğu kimi, onu həyata keçirənlərin də ifşası hər zaman mütləq xarakter daşıyır". Başqa cür də ola bilməz. Niyə? Çünki bu məxluqlar, daha doğrusu, Qərbə təzim edən bu ünsürlərin qanı da, məkanı da Avropa küçələrindəki erməni üfunəti verən zibilliklər olub. O zaman "Vətən üçün pis olan, mənə faydalıdır" düşüncəsi ilə Qərbə təzim edən bəsit təfəkkürlü bu anti-milli ünsürlərin ölkəmizin uğurlarına, xalq-iqtidar birliyinin möhkəmlənməsinə, bir yumruq kimi birləşməsinə xələl gətirməyə çalışıblar. Bu, xəyanət, satqınçılıq deyilmi?

Tarixin bütün dönəmində xəyanət və satqınlıq bağışlanmaz cinayət olub. Xüsusilə, bu xəyanət və satqınlıq xalqına, dövlətinə və Vətənə qarşı ola. Xəyanət edən heç bir şəxsə haqq qazandırılmayıb, heç kim bağışlanmayıb. Azərbaycan xalqının mentalitetində də satqınlıq və xəyanət tarixən ən ağır əməl, cəzası isə çox ağır olan bir hal kimi qəbul edilib. Qərbə

təzim edən bəsit təfəkkürlü əli kərimlilər, cəmil həsənlilər, gültəkin hacıbəylilər, sevinc osmanqızılar, qənimət zahidlər, tofiq yaqublular, vidadi iskəndələr və bu kimi anti-milli ünsürlər Vətən nədir, hardan başlayır sualına cavab verməyə qadir də deyillər. Çünki onların kirayə verilən beyinlərinin “məhsulu” – "Vətən üçün pis olan, mənə faydalıdır". Bu gün yüzlərlə igid oğul və qızlarımız Vətən uğrunda, 30 il həsrətində olduğumuz dədə-baba torpaqlar uğrunda canlarından keçib, şəhidlik zirvəsinə yüksəlmişlər. Bu ucalığa yüksələnlərin ömür yolu nə qədər qısa olsa da, şərəfli və örnək sayılır. Vətənin azadlığı, istiqlaliyyəti yolunda canını qurban verən, xalqın rifahı və xoşbəxtliyi naminə şəhid olan qəhrəmanlar heç vaxt unudulmur, ölümləri ilə ölümsüzlüyə qovuşur.

Ümummilli lider Heydər Əliyev deyirdi: “Sizin qəhrəmanlığınız bu gün həyata atılan, orduda xidmətə gedən və hərbi xidmətə hazırlaşan gənclər üçün örnəkdir, nümunədir. Vətən yolunda canlarını qurban vermiş, şəhid olmuş Azərbaycanın Milli Qəhrəmanlarının həyatı, onların qəhrəmanlığı bütün xalqımız üçün, o cümlədən, xüsusən gənclərimiz üçün örnəkdir, dərsdir”. Ulu Öndərin layiqli davamçısı Qalib Sərkərdə, Prezident İlham Əliyev demişdir: “Siz öz şəhid olmuş övladlarınızla fəxr edə bilərsiniz. Bütün Azərbaycan xalqı şəhidlərimizlə fəxr edir. Şəhidlərimiz daim bizim ürəyimizdə yaşayır və əbədi yaşayacaqdır”.

Bəli, çünki bizim şəhidlərimiz Vətən, dövlət, xalq yolunda şəhid olublar. Ancaq anti-milli ünsürlər üçün xalq, Vətən anlayışları yoxdur. Azərbaycana qarşı xaricdən müxtəlif istiqamətlərdə qarayaxma kampaniyaları aparan özlərini “demokratiya carçısı” və “ədalət tərəfdarı” kimi qələmə verənlər, əslində, xarici anti-Azərbaycan dairələrin birbaşa nəzarəti altında və maliyyəsi ilə fəaliyyət göstərərək sifarişlər yerinə yetirənlərdir. Onların əsas məqsədi daha çox qrant almaq və mənimsəmək olub. Şübhəsiz ki, bu məqsədlərə xidmət edənlər xain və düşmən dəyirmanına su tökən Məhəmməd Mirzəli, Tural Sadıqlı, Orduxan Teymurxan, Arif Məmmədov, Vidadi İskəndərli, Sevinc Osmanqızı, Qənimət Zahid və digər anti-milli ünsürlər üçün xalq, millət, Vətən anlayışı yoxdur. Xüsusilə, sosial şəbəkələrdə sakitlik bilməyən ulayan sabiq səfir Arif Məmmədov işğalçı Ermənistan ordusunun vandallığını, təxribatlarını dəsdəkləyərək “yazıq erməni xalqının adı çıxıb” – deyə “müdafiəsinə qalxaraq çıxışlar etməkdədir. Soruşmaq istərdik: beynini kirayə verən Arif Məmmədov erməniləri niyə

bu qədər sevir? Cavabı o verməsə də, xalq verib. Elə buna görə də ermənilər sapı özümüzdən olan uzun zaman yemlədikləri xəyanətkar və satqınlardan istifadə etməklə Azərbaycan xalqını günahkar çıxarmağa çalışdılar.

Amerikalı yazıçı Paul Austerin xəyanətkar və satqınlar haqqında gözəl bir fikri var: "Sənə bir dəfə xəyanət edəni bağışlasan, səni yenə istifadə edər. Çünki xəyanət bir ruh halı deyil, xarakterin tökülüş formasıdır". Yəni bir dəfə xəyanət edən bunu davamlı etməyə artıq öyrənir. Ona görə də xəyanətkara cinsindən asılı olmayaraq, şərəfsiz deyilir. Bu şərəfsiz Arif Məmmədov işğalçı Ermənistan ordusunu "göyə" qaldıraraq "məğlubedilməz", qəhrəman, mübariz Azərbaycan ordusunu "kloun" adlandırır. Bu qədər alçaq, şərəfsizlik, deyərdim ki, ən böyük cinayətkarlıqdır. Arif Məmmədov və digər Avropadakı qaragüruhlar hər şeylərini kirayə verənlərdir. Beyin kirayəyə veriləndə isə beynin bioloji sahibindən hec nə gözləməyə dəyməz. Sabah hətta o, rahatlıqla erməni olduğunu belə dilə gətirə bilər.

Prezident İlham Əliyev bölgələrə səfəri zamanı bu mövzuya toxunaraq demişdir: "Sosial şəbəkələr nisbətən yeni bir anlayışdır, dünyada geniş şəkildə yayılır. Mən çox istərdim ki, ilk növbədə bu şəbəkələrdən informasiya, bilik əldə edilməsi üçün istifadə olunsun. Eyni zamanda, çox istərdim və xüsusilə mənim gənclərə müraciətim ondan ibarətdir ki, ölkəmiz haqqında dolğun məlumatı bax bu sosial şəbəkələr vasitəsilə dünyaya çatdırsınlar. Çünki bəzi hallarda Azərbaycan haqqında qəsdən formalaşdırılan rəy reallıqla tamamilə ziddiyyət təşkil edir".

Bu gün antimilli ünsür bir daha anlamalıdır ki, xalq Prezident İlham Əliyevə inanır. Dövlət başçısının cəmiyyətimizdə, Azərbaycanın isə dünyada imici, artan şöhrəti hələ sizi çox rahatsız edəcək. Çünki bu nüfuz və güc, xalqın etimad və dəstəyi kimi heç nə ilə müqayisə edilməyən kapitala, uğurlarımıza konvertasiya olunur. İngiltərənin məşhur humanist yazıçısı Uilyam Hezlit insanların şəxsiyyətlərə, liderinə inamını izah etmək üçün yazırdı: "Mən baş verən prosesləri tam mənada dərk etmək iqtidarında deyiləm, lakin mən öz liderimə inanıram. İnamımız nə qədərdirsə, gücümüz də də o qədərdir". Çünki bu gün Azərbaycana nəyisə diktə edə bilən qüvvə yoxdur. Prezident İlham Əliyevin uzaqgörən və qətiyyətli siyasəti nəticəsində Xankəndidəki separatçı və terrorçu xunta birdəfəlik ləğv

edildi. İndi Xankəndidə, Xocalıda, Ağdərədə, Əsgəranda, Xocavənddə Azərbaycan Bayrağı ucalır. Ordumuz ölkəmizin ərazi bütövlüyünü qətiyyətlə qoruyur. Eyni zamanda, Qazaxın 4 kəndinin qaytarılması prosesinə başlanılıb. Qısa zamanda bu hadisə də ölkəmizin hərbi-siyasi uğuru kimi tarixə düşəcək. Bu ilin noyabrında mötəbər tədbirə - COP29-a evsahibliyi etməsi Azərbaycana etibarın və etimadın təsdiqidir. 2024-cü ildə Bakı dünyanı narahat edən ekoloji və iqlim məsələlərinin həll olunduğu qlobal mərkəzə çevriləcək. Cənab Prezident İlham Əliyevin qeyd etdiyi kimi, COP29 beynəlxalq konfransını da biz yüksək səviyyədə keçirəcəyik, bu, ölkəmizin, xalqımızın növbəti böyük uğuru olacaq.

Bir sözlə görünən odur ki, Ulu Öndər Heydər Əliyevin uğurlu siyasəti Prezident İlham Əliyev tərəfindən layiqli formada davam etdirilir, qətiyyətlə Azərbaycan modelini dünyada gündəmə gətirir. Uğurlu siyasət ölkəmizin beynəlxalq arenada nüfuzunun gündən-günə artmasına səbəb olur.

Tarixinin ən qüdrətli Azərbaycanına qarşı aparılan məkrli oyunların, qarayaxma kampaniyalarının səbəbi də məhz budur. Azərbaycanı sevməyən, uğurlarını həzm edə bilməyən qüvvələr daim bu çirkinliklərə əl atıblar. Lakin onların heç bir effekti olmayıb. Çünki bu gün Prezident İlham Əliyevin yaratdığı qüdrətli Azərbaycan istənilən “hücumun” qarşısını almağa qadirdir və ölkəmizlə hədə-qorxu, təhdid dili ilə danışmaq qeyri-mümkündür. Elə Prezident İlham Əliyevin dediyi kimi: "Bu gün dünyada elə bir qüvvə yoxdur ki, hanısa qərarı bizə aşılasın, yaxud da bizə nəyisə diktə edə bilsin. Belə qüvvə yoxdur və nə qədər ki mən Prezidentəm, belə qüvvə olmayacaqdır!".

## Brüsseldə növbəti fiasko...

Qərb yenə Brüsseldə erməni sevgisinə bürünüb yeni şou yaratmağa çalışdır. Neçə həftələrdir erməni mediasının bəh-bəhlə Ermənistan ictimai rəyinə sırımağ istədiyi böyük "zəfər görüşü"elə arzu olaraq da bitdi. Erməni tərəfi bu görüşdə hərbi paktın imzalanacağını, Ermənistana böyük maliyyə və siyasi dəstəyi ehtiva edən sənədin qəbulunu gözləyirdi. Amma...Azərbaycanın qətiyyətli mövqeyi, Prezident İlham Əliyevin həm ABŞ həm də Avropa İttifaqı rəsmiləri ilə telefon danışığı zamanı prinsipial mövqedən çıxış etməsi "Brüssel oyunçularını" geri çəkilməyə məcbur etdi. Bəli, məhz Azərbaycan tərəfinin ədalətli və qətiyyətli mövqeyi, ölkə Prezidentinin qlobal miqyasda nüfuzlu Lider olmasının nəticəsidir ki, görüşün təşkilatçılarından olan ABŞ dövlət katibi Blinken dövlətimizin başçısına zəng edərək vəziyyəti izah etməyə məcbur oldu. Brüssel görüşünün digər təşkilatçısı Avropa Komissiyasının Prezidenti Ursula Fon der Lyayen Prezident İlham Əliyevə zəng edib, müzakirələr aparılıb. ABŞ dövlət katibi kimi, Avropa Komissiyasının Prezidenti də Prezident İlham Əliyevə 5 aprel görüşünə dair mövqeyini izah etməyə çalışıblar.

Əlbətddə Avropa İttifaqı, ABŞ və Ermənistan arasında Brüsseldə keçirilmiş görüş haqqında Ermənistanda böyük illüziyalar var idi. Hərbi paktın imzalanması, eləcə də hərbi-siyasi təhlükəsizlik sahəsində hərtərəfli dəstəyin nümayiş olunması və bu dəstəyin birtərəfli qaydada ödənişsiz icrası İrəvanın əsas niyyəti idi. Qərb dairələri öz ermənipərəst siyasətlərini daha qabarıq, açıq şəkildə reallaşdırmaq istəyirdilər. İstəyirdilər ki, qərbin istənilən qanlı təxribatı reallaşdırmaq üçün heç nədən çəkinməyəcəyini, xüsusilə Rusiyanı Cənubi Qafqaz bölgəsindən tamamilə sıxışdırıb çıxarmaq üçün prinsipial siyasət yürütdüyünü hər kəs görsün.

Sözsüz ki, bu siyasətin "anası" rolunda Fransa çıxış edir. Danılmaz faktdır ki, Fransanın, bütövlükdə, bəzi Qərb ölkələrinin öz geosiyasi maraqları naiminə rəsmi İrəvan vasitəsilə Ermənistan və Azərbaycan arasında sülh prosesini əngəlləməsi Cənubi Qafqazda qarşıdurmanı gücləndirir, regionun təhlükəsizliyinə əsaslı təhdid yaradır. Bütün dünya şahid oldu ki, Ermənistan baş naziri Nikol Paşinyanın ABŞ Dövlət katibi Antoni Blinken və Avropa Komissiyasının sədri Ursula Fon der Lyayenlə Brüssel

görüşündə də bu dairələr regionda sabitliyi pozmaq üçün yenə öz simalarını ortaya qoydular. Rəsmi Bakı hələ bir neçə gün öncə bəyan edirdi ki, sözügedən görüş tam şəffaf şəkildə keçirilmir. Aİ-Ermənistan-ABŞ müştərək konfransı açıq şəkildə birtərəfli və qərəzli xarakter daşıyır və ikili standart yanaşmasına əsaslanır. Bu konfrans erməni tərəfini xoş niyyətlə danışıqlara sövq etmək əvəzinə regionda yeni bölücü xətlər və dırnaqarası təsir dairələri yaradır. Deyilən kimi də oldu...

Heç də təsadüfi deyil ki, Brüssel görüşü ərəfəsində, aprelin 2-də Fransanın Avropa və xarici işlər naziri Stefan Sejurne ABŞ Dövlət katibi Antoni Blinken ilə birgə mətbuat konfransında fransalı nazir ölkəmizin əleyhinə böhtan xarakterli fikirlər səsləndirib. O, bütün diplomtik etiketləri kobud şəkildə pozaraq bildirib ki, guya Azərbaycanın ritorikası nəzarətdən çıxır və vəziyyətin gərginləşməsində Ermənistanı günahlandırmaq məqsədi güdür. Fransalı nazir bir az da irəli gedərək deyib ki, Bakının təbliğatı daha çox Rusiyanın Ukraynaya qarşı təbliğatı ilə üst-üstə düşür. Təbii ki, bütün bunlar saxtakar Stefan Sejurnenin, daha doğrusu, Fransanın beynəlxalq aləmdə Azərbaycan barədə təcavüzkar, sülhə, əməkdaşlığa meyilli olmayan dövlət imici formalaşdırmaq istəyindən başqa bir şey deyil.

Prezident İlham Əliyev regionda hazırki mövcud vəziyyəti qorumaq və eləcə də inkişaf etdirmək istiqamətində çoxsaylı addımlar atmışdır. Sülh, təhlükəsizlik və sabitlik üçün ardıcıl səylər daha da inkişaf etdirilmişdir. Eyni zamanda, dövlət başçımızın qətiyyəti və siyasi iradəsi, həmçinin əlavə etməliyik ki, müdrikliyi regional təhlükəsizlik təhdidlərinin də aradan qaldırılmasına kömək edir. Bütün regiona qarşı olan münasibət meyilləri və bununla bağlı olaraq etiraz mövqeyimiz dərhal nəzərə çatdırılır.

Digər bir baxımdan bütün bunlardan sonra ABŞ Dövlət katibi Antoni Blinkenin "Biz sülhün olduğu Cənubi Qafqaz istəyirik" -fikrinin səmimiyyətinə inanmaq çətindir. Amma hər şeyə rəğmən, Brüssel görüşündə rəsmi İrəvan bir daha Azərbaycanın ərazi bütövlüyünü tanıdığını bəyan etdi. Bu, bir daha onu göstərir ki, artıq dünya Azərbaycanın gücü və yaratdığı reallıqlarla hesablaşır. Dünya Azərbaycanın gücündən çəkinir və Bakıya nəyisə diktə edə bilmir. Həmçinin Azərbaycanla hədə-qorxu dilində danışmağın mümkün olmadığı və bunun heç bir nəticə verməyəcəyi

qlobal güclər tərəfindən də etiraf edilir. “Uzun illər ərzində işğal altında olan torpaqlarımızın azad edilməsi ilə bağlı BMT Təhlükəsizlik Şurasının qətnamələri beynəlxalq birlik tərəfindən həyata keçirilmədi. Sonda həmin qətnamələrin icrasını öz gücümüzə həyata keçirdik, bölgədə yeni bir güc və söz sahibi olduğumuzu sübut etdik. Azərbaycan mütəmadi olaraq öz mövqeyini qarşıya qoyaraq sübut edir ki, müstəqil siyasət yürütməklə bölgədə yeni mühit formalaşdırmaqdadır”.

Bir məqamı da xüsusi vurğulamaq lazımdır: Ermənistanı alətə çevirən ABŞ və Aİ Cənubi Qafqazda qarşıdurma yaratmaq, yeni münaqişə ocağı alovlandırmaq və bununla da bölgəmizdə hegemonluq etməkdə maraqlıdır. Ermənistanın silahlandırılması, bu ölkəyə açıq maliyyə dəstəyi göstərilməsi, son olaraq Brüsseldə aparılan gizli sövdələşmələr fonunda bölgəmizin ciddi təhlükələr astanasında olduğu faktdır. Beləcə Brüssel görüşü həm də bir faktı gün kimi bütün dünya ictimaiyyətinə çatdırmış oldu ki, qərbdəki siyasətbazlar nə qədər Cənubi Qafqazı qarışdırmada, sülh əvəzinə qan tökməkdə israrlı olsalar da, qarşılarında əzəmətli və müstəqil siyasət kursu yeridən qüdrətli Azərbaycan dövləti dayanır!

## COP29: Azərbayacana etimadın və dəyərin göstəricisi

Hər şeydən öncə qeyd olunması vacib məqam budur ki, Azərbaycanın dünyanın ən böyük və mühüm dövlətlərarası tədbirlərindən biri olan COP29-a 2024-cü ildə ev-sahibliyi etməsi üçün seçilməsi Azərbaycan Prezidentinin növbəti təntənəli qələbəsi kimi tarixə düşdü. Beynəlxalq ictimaiyyətin bu yüksək etimadı Azərbaycan dövlətinin nüfuz göstəricisinin bariz nümunəsidir. Bu qərar, Qoşulmama Hərəkatına sədrliyimiz və Təhlükəsizlik Şurasına üzvlüyümüzdən sonra xarici siyasətimizin ən böyük uğurudur. Eyni zamanda, son zamanlar Azərbaycana qarşı çirkin kampaniya aparan bəzi dairələrə tutarlı cavabdır. Dövlət başçısı bir daha bu spekulyasiyaları alt-üst etdi və Azərbaycanın müsbət imicinin üzərinə kölgə sala bilməyəcəklərini sübut etdi. Prezident İlham Əliyev bu təşəbbüsü ilə dövlətimizin qüdrətini bir daha dünyaya göstərdi və beynəlxalq aləmdə böyük etimad qazandığını nümayiş etdirdi. Ölkəmiz qlobal problemlərdən biri olan iqlim dəyişmələrinə qarşı səyləri səfərbər etmək və bu mübarizəyə töhfə verməklə dünyanın diqqət mərkəzində olacaq.

Ən diqqətçəkən məqamlardan biri də budur ki, bütün postsovet məkanında ilk dəfə olaraq məhz Azərbaycan bu mötəbər qlobal tədbiri keçirmək hüququna sahib oldu. Bu məsələdə beynəlxalq aləmin vahid mövqedən çıxış etməsi də Azərbaycanın dünyada getdikcə güclənən mövqeyinin, artan nüfuzunun əyani göstəricisidir. Beynəlxalq birliyin belə qlobal tədbirə evsahibliyini məhz Azərbaycan dövlətinə etibar etməsi dövlət başçımızın yürütdüyü siyasətə dünya səviyyəsində olan böyük hörməti, möhkəm dəstəyi nümayiş etdirir.

Gəlin bu nüfuzlu beynəlxalq tədbirə evsahibliyinin ölkəmiz üçün hansı dividentlər gətirəcəyini nəzərdən keçirək. Ondan başlayaq ki, COP29 konfransına evsahibliyi Azərbaycan üçün 2024-cü ilin ən mühüm hadisəsi və ölkənin yaşıl iqtisadiyyata keçid strategiyasının məntiqi davamı kimi qiymətləndirmək olar. Bu missiyaya uyğun olaraq  Prezident İlham Əliyevin Sərəncamı ilə 2024-cü il Azərbaycanda "Yaşıl dünya naminə həmrəylik ili" elan edilib.

"Azərbaycan neft-qaz ölkəsi kimi bu sahədə də özünü göstərəcəkdir

və dünyada hər kəs bir daha görəcək ki, bizim gündəliyimiz yaşıl enerji ilə bağlıdır. Yaşıl enerji növlərinin yaradılması və yaşıl enerjinin dünya bazarlarına nəqli hazırda bizim enerji siyasətimizin prioritetidir. Bu, reallıqdır və bütün dünya bunu bir daha görəcək", – deyə Prezident İlham Əliyev ötən il dekabrın 15-də COP29-un ölkəmizdə keçirilməsi ilə əlaqədar müşavirədə vurğulayıb.

Azərbaycan yaşıl enerji iqtisadiyyatına verdiyi önəmi əməli fəaliyyətlərlə də sübut edir. Buna misal olaraq, Azərbaycan 1990-cı illə müqayisədə 2030-cu ilə qədər istixana qazlarının miqdarının 35 faiz, 2050-ci ilə qədər isə 40 faiz azaldılmasını hədəfləyib.

Azərbaycan bərpaolunan enerji mənbələri üzrə yüksək potensiala malik olan ölkələrdəndir. Rəsmi açıqlamalarda xüsusilə qeyd olunur ki, ölkəmizin bərpaolunan enerji mənbələrinin texniki potensialı quruda 135, dənizdə 157 qiqavatdır. Bərpaolunan enerji mənbələrinin iqtisadi potensialı 27 qiqavat, o cümlədən külək enerjisi üzrə 3 min meqavat, günəş enerjisi üzrə 23 min meqavat, bioenerji potensialı 380 meqavatdır. Dağ çaylarının potensialı 520 meqavat həcmində qiymətləndirilir.

Dünyanı narahat edən çox ciddi problemlərdən biri canlı aləmə təsir edən iqlim dəyişmələridir. İqlim dəyişkənliyi Yer kürəsinin və ya onun ayrı-ayrı hissələrinin iqlimində hava parametrlərinin zamandan asılı olaraq dəyişərək statistik normadan əhəmiyyətli dərəcədə sapmaları ilə müşayiət olunur. İqlim dəyişmələrinin səbəbləri astrofiziki, geofiziki və Günəşdə vaxtaşırı baş verən fiziki proseslər, Yerin öz xəyali oxu və Günəş ətrafında hərəkəti zamanı baş verən dəyişmələr, şimal və cənub qütblərinin nutasiyası, vulkan püskürmələri kimi təbii amillərlə yanaşı, insanların təbiətə göstərdiyi antropogen təsirlərdir. İşğaldan azad edilmiş Qarabağ və Şərqi Zəngəzur, eləcə də Naxçıvan Muxtar Respublikası yaşıl enerji zonası elan olunub. Bu ərazilərdə yaşıl enerji növlərinin yaradılması və yaşıl enerjinin digər dünya ölkələrinə nəqli Azərbaycanın hədəf götürdüyü enerji siyasətinin prioritetidir.

Azərbaycanın belə bir möhtəşəm tədbirin keçirilməsi üçün seçilməsi təsadüfi deyil. İqlim dəyişmələrinin qarşısının alınması, ilk növbədə, istixana effektini törədən qazların atmosferə buraxılmasını ya sıfır səviyyəsinə endirilməsini, ya da əhəmiyyətli dərəcədə azaldılmasını tələb edir. Bu isə öz növbəsində enerji transformasiyanın əsas istiqaməti olan

bərpa olunmayan enerji mənbələrindən (kömür, neft, qaz, torf, müxtəlif növ bitumlar və s.), bərpa olunan enerjiyə (günəş, külək, su axarları və s.) keçmək deməkdir. Dünya İqtisadi Forumu bu prosesləri son onillikdə, yəni 2014-2023-cü ildə necə getdiyini təhlil edib.

Təhlilə əsasən, dünya ölkələrinin Enerji Keçidi İndeksi hesablanıb. Tədqiqatlara görə, bu siyahıya İsveç 75,5 indeksi ilə başçılıq edir. Minimal Enerji Transformasiya İndeksi (40) Yəməndə qeyd edilib. Azərbaycanın indeksi 62-yə bərabərdir və bu göstərici ilə ölkəmiz dünyada 32-ci yerdədir.

Energetika Nazirliyinin məlumatına əsasən, Azərbaycanın bərpa olunan enerji potensialı quruda külək və günəş enerjisinin həcmi 27 qiqavatdan çoxdur. Xəzər dənizində isə külək enerjisi 157 qiqavat təşkil edir. Azərbaycan 2027-ci ilə qədər 3 qiqavat külək və 1 qiqavat günəş enerjisini istehsal etməyi planlaşdırır.

Prezident İlham Əliyev hələ 2004-cü ilin oktyabrın 21-də "Azərbaycan Respublikasında alternativ və bərpa olunan enerji mənbələrindən istifadə olunması üzrə Dövlət Proqramı"nın təsdiq edilməsi haqqında Sərəncam imzalayıb. Sərəncamın icrası ilə əlaqədar Qarabağda, Bakıda, Naxçıvanda böyükhəcmli işlər həyata keçirilib. 2023-cü ilin yanvar-sentyabr aylarında ölkədə elektrik enerjisi istehsalı 20 milyard 279,7 milyon kVt-saat təşkil edib ki, bu da əvvəlki ilin müvafiq dövrü ilə müqayisədə 0,1 faiz çoxdur. Azad olunmuş Qarabağda və Şərqi Zəngəzurda 2021-2023-cü illər ərzində 170 meqavat gücündə hidroelektrik stansiyalar istifadəyə verilib. 2024-cü ilin sonuna qədər bu rəqəm 270 meqavata çatacaq. Bir neçə ildən sonra isə azad edilmiş ərazilərdə hidroelektrik stansiyaların ümumi gücü 500 meqavat təşkil edəcək.

Bu gün enerji keçidinə xidmət edən bütün istiqamətlərdə Azərbaycan sürətlə irəliləyır. Bu, öz əksini ölkədə energetika infrastrukturunun tam yenilənməsi, enerji təminatının yüksək səviyyədə və təhlükəsiz şəraitdə təmin edilməsi, həmin sahəyə məqsədli investisiya və digər fəaliyyətlərdə öz əksini tapıb. Azərbaycanın enerji transformasiya sahəsində lider olması bu fəaliyyətlərin kompleks şəkildə həyata keçirilməsinin nəticəsidir. Bu səbəbdən COP29 sessiyasının Bakıda keçirilməsi təsadüfi xarakter daşımır və ölkədə innovasiyaların inkişaf strategiyasının nəticəsidir.

COP29 həm də böyük insan kütləsinin Azərbaycana gəlməsi, beynəlxalq media qurumlarının ölkəmizə diqqət ayırması ilə yadda qalacaq. Çünki tədbirin keçiriləcəyi günlərdə 10 minlərlə xarici nümayəndə ölkəmizə gələcək, iki həftə ərzində Bakı dünyanın mərkəzi olacaq. Müəyyən ehtimallara görə, təqribən 70-80 min xarici qonaq bu müddət ərzində ölkəmizdə olacaq. Bir sözlə, COP29 iqlim dəyişikliyi ilə mübarizədə çox vacib və dünyanın ən əhəmiyyətli tədbirlərindən biridir. Azərbaycan artıq beynəlxalq tədbirlərə ev sahibliyi etmək sahəsində özünə yetərincə müsbət imic qazanıb. Bu tədbir Azərbaycanın neft-qaz ölkəsi olmaqla yanaşı, yaşıl iqtisadiyyatı nə dərəcədə prioritet sahə kimi gördüyünü bütün dünyaya sübut edəcək.

## **Prezident İlham Əliyevin növbəti diplomatik uğuru:** ***4 kənd bir güllə atılmadan, şəhid vermədən azad edildi***

Azərbaycan Ordusu Müzəffər Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi ilə 44 günlük Vətən müharibəsindən sonra öz ərazi bütövlüyünü bərpa etməklə yanaşı, həm də bölgədə yeni reallıqlar yaratdı. Tarixi Zəfərimizdən sonra Azərbaycanın beynəlxalq aləmdə nüfuzunun artması diqqətdən kənarda qalmır. Dövlətimizin xarici siyasəti çoxşaxəlidir. Ədalətə və beynəlxalq hüquqa söykənən xarici siyasətimiz diplomatik uğurlarımızın davamlılığında, Azərbaycanın yeni dostlar və tərəfdaşlar qazanmasında, yeni əməkaşlıq formatlarının və sülh gündəliyinin müəllifi kimi nüfuz qazanmasında əhəmiyyətli rol oynayır. Təkcə cari ilin arxada qalan dövründə ölkəmizin qeyd olunan istiqamətlərdə qazandığı uğurlara, ev sahibliyi etdiyi beynəlxalq əhəmiyyətli tədbirlərin say tərkibinə və əhatə etdikləri mövzulara diqqət yetirmək kifayətdir. Hər bir tədbir, həmçinin reallaşan qarşılıqlı səfərlər Azərbaycanın artan nüfuzu ilə yanaşı, ayrı-ayrı sahələrdə zəngin təcrübəyə malik olduğunu təsdiqləyir.

“Bu gün biz güclüyük!” – deyən Ali Baş Komandanımız, Prezident İlham Əliyev cənablarının praqmatik xarici siyasəti və diplomatiyası nəticəsində nail olunub. Belə ki, ötən il sentyabrın 19-dan 20-nə keçən gecə Qarabağda keçirilən lokal xarakterli antiterror tədbirlərində düşmənə elə bir dərs verildi ki, onlar bunu heç zaman unutmayacaqlar. Cəmi 23 saat davam etmiş lokal antiterror tədbirləri nəticəsində bütün ölkə üzrə suverenliyimiz bərqərar oldu. Xankəndi və ətrafı erməni separatçılarından tamamilə təmizləndi. Bəli, Ermənistanın birinci kapitulyasiyası 10 dekabr 2020-ci il paradı ilə qeyd edildisə, ikinci kapitulyasiya 8 noyabr 2023-cü ildə Xankəndi paradı ilə qeyd edildi.

2024-cü il aprelin 19-da heç bir vasitəçi olmadan Qazaxın Ermənistan tərəfindən işğal olunan 4 kəndinin - Bağanis Ayrım, Aşağı Əskipara, Xeyrimli və Qızılhacılının Azərbaycana qaytarılması barədə razılıq əldə edilməsi, özü də bu, bölgədə gərginlik yaratmaq istəyən və bu gün də davam edən Qərbin aktivliyi şəraitində baş verdi. Prezident İlham Əliyev bir daha göstərdi ki, onun rəhbərlik etdiyi Azərbaycan regionun təhlükəsizliyinə səbəb olacaq təhdidləri aradan qaldırmaq iqtidarındadır və

regionda əsas söz sahibi Azərbaycandır. Kimin nə deməyindən asılı olmayaraq, dövlətimiz öz maraqlarını qətiyyətlə müdafiə edəcək, qarşısına qoyduğu hədəflərə nail olacaq. Qərbin uzun müddət tirajladığı müharibə açıqlamaları isə cəfəngiyyatdan başqa bir şey deyil. Çünki bu yolla həmin qüvvələr, əslində, Ermənistanı qorxu altında saxlayaraq, tam şəkildə öz iradəsinə tabe etdirmək siyasəti güdürdülər. Lakin həmin qüvvələr 30 illik həsrətə cəmi 44 gün ərzində Ali Baş Komandanımızın "Dəmir yumruq" siyasəti ilə güclü Azərbaycan Ordumuzun rəşadətli əsgər və zabitlərinin qəhrəmanlığı ilə nəyə qadir olduğunu gördülər və tarixi Zəfər onların bütün cəfəng ssenarilərini alt-üst etdi. Artıq bu gün bütün beynəlxalq güclər Azərbaycanla hesablaşmağa məcburdur. Çünki Azərbaycan Cənubi Qafqazın güclü lider dövlətidir və Azərbaycanın iradəsindən kənar regionda hər hansı planın həyata keçirilməsi qeyri-mümkündür.

Beləliklə, qeyd etmək istərdim ki, Azərbaycan və Ermənistan rəsmilərinin keçirdikləri görüşdə Ermənistanın işğal altında saxladığı 4 Azərbaycan kəndinin də azad edilməsinə razılıq verməsi sıradan bir hadisə deyil. Bu, əslində, iki ölkənin beynəlxalq vasitəçilər olmadan apardığı və müsbət nəticələr əldə etdiyi ilk uğurdur. Bu uğura Prezident İlham Əliyevin praqmatik xarici siyasəti və diplomatiyası nəticəsində nail olunub. Ona görə də demək olar ki, Azərbaycanın 4 kəndinin də işğaldan azad edilməsi barədə əldə olunmuş razılıq, məhz Prezident İlham Əliyev diplomatiyasının uğurudur.

Azərbaycanla Ermənistan arasında əldə olunmuş razılaşmanı alqışlayan Avropa İttifaqı Şurasının Prezidenti Şarl Mişel sosial şəbəkə hesabında yazıb: "Ermənistan və Azərbaycan arasında 1991-ci il Alma-Ata Bəyannaməsinin iki ölkə arasında sərhədlərin delimitasiyası üzrə əsas götürülməsinə dair əldə olunan razılaşmanı xoş qarşılayırıq. Brüsseldəki danışıqlar zamanı da hər iki ölkənin ərazi bütövlüyünün tanınması şərti ilə sərhədlərin delimitasiyası önəmli yer tutub. Bu proses, həmçinin bütün regiondakı vəziyyətin sabitləşməsi və sülh yolu ilə kommunikasiyaların açılmasına xidmət edəcək".

Bəli, bu gün Prezident İlham Əliyevin son 21 illik prezidentlik fəaliyyəti dövründə Azərbaycan xalqına yaşatdığı uğurlar bir daha göstərir ki, Müzəffər Ali Baş Komandan İlham Əliyev tarixi torpaqlarımızın geri qaytarılmasında, xalqımızın illərlə pozulan hüquqlarının sona qədər

bərpasında qətiyyətlidir və bu məsələdə heyrətamiz prinsipiallıq, səy göstərir. Bu tarixi Qələbə həm də onu göstərir ki, dövlətimizin başçısının dediyi kimi, xalqımız ona məxsus olan torpaqların bir qarışından belə imtina etməyəcək, bu məsələdə kimsəyə güzəşt olunmayacaq! Çünki Azərbaycan həmişə haqqın və ədalətin tərəfdarıdır. Bu yerdə Prezident İlham Əliyev cənablarının Münxendə Ermənistanla münasibətlərimizin normallaşdırılması məsələsi barədə danışarkən öz fikirlərini həmişəki kimi aydın və səlis şəkildə dilə gətirdiyini bir daha xatırlatmaq istərdim: "Biz informasiya dünyası dövründə yaşayırıq. Hər kəs yaxşı bilir harada nə baş verir. Ona görə qeyri-ciddi və manipulyativ mahiyyət daşıyan açıqlamalar, əlbəttə ki, ciddi qəbul edilmir. Bizim mövqeyimiz birmənalıdır. Biz nəyi deyiriksə, birincisi, həqiqətə əsaslanırıq. İkincisi, mövqeyimizi açıq bildiririk. Beynəlxalq tərəfdaşlar da bilirlər ki, biz nə istəyirik".

Bir sözlə, Prezident İlham Əliyevin cəsarətli addımları, qətiyyətli siyasəti qarşıda duran digər strateji hədəflərə çatmağa imkan verəcək.

## Sosial şəbəkələrdə qazilər üzərindən oyun quranlar...

Məlum olduğu kimi, Azərbaycanda vətəndaşların sosial rifahı hər zaman əsas prioritetlərdən hesab edilir. Azərbaycan Prezidenti İlham Əliyev cənabları son 20 ildə ölkəmizdə veteranlara, şəhid ailələrinə yönəlik sosial layihələrin sayına, bu layihələrin icrasına ayrılan vəsaitlərin miqdarına nəzər salsaq, görərik ki, Prezident İlham Əliyevin həssas kateqoriyadan olan vətəndaşlara göstərdiyi diqqət həqiqətən də misilsizdir. Prezident İlham Əliyevin imzaladığı sərəncamlar əsasında irimiqyaslı layihələrin həyata keçirilməsi, Qarabağ müharibəsi əlilləri və şəhid ailələrinin mənzil və məişət şəraitinin yaxşılaşdırılması üçün fərdi və çoxmənzilli yaşayış binalarının tikilib istifadəyə verilməsi, eləcə də bu kateqoriyadan olan insanların avtomobillərlə təmin olunması bunun əyani təsdiqidir.

Qeyd edək ki, Prezident İlham Əliyevin müvafiq Sərəncamı ilə 2021-2025-ci illər ərzində şəhid ailələri, müharibə əlilləri və digər həssas qrupa aid olan insanların mənzillə tam təminatının həyata keçirilməsi üçün Dövlət Proqramı təsdiqlənib. Nəticədə bu günə kimi bu kateqoriyaya aid olan 13 mindən çox şəxs mənzil və ya fərdi evlərlə təmin edilib. Prezident İlham Əliyevin imzaladığı həmin sərəncamlara əsasən şəhid ailələrinə, qazilərə və əhalinin digər həssas qruplarına aid insanlara verilən təqaüdlərin həcmi artırılıb. Bu gün ölkəmizdə şəhid ailələrinin qarşılaşa biləcəyi hər hansı bir kiçik problemin belə həll edilməsi həm cəmiyyət, həm də dövlət olaraq əsas prioritetlərdən sayılır. Eyni zamanda, dövlət başçımız tərəfindən şəhid ailəsi üçün Prezident təqaüdünün məbləğinin artırılması və "Şəhid ailəsi üçün Azərbaycan Respublikası Prezidentinin təqaüdü"nün təsis edilməsi haqqında" Fərmanda da dəyişiklik edilməsi bu baxımdan önəmlidir.

Sənədə əsasən şəhid ailəsi üçün Azərbaycan Prezidentinin təqaüdünün aylıq məbləği 2023-cü il yanvarın 1-dən 500 manatdan 600 manata qaldırılıb. Həmçinin dövlət başçısının "20 Yanvar şəhidinin ailəsi üçün Azərbaycan Respublikası Prezidentinin təqaüdünün təsis edilməsi haqqında" Fərmanına əsasən 20 Yanvar şəhidinin ailəsi üçün Azərbaycan

Prezidentinin təqaüdünün aylıq məbləği 2023-cü il yanvarın 1-dən 600 manat müəyyənləşdirilib. Yalnız 2022-ci ildə şəhid ailələri və müharibə əlillərinə 1500-dən çox mənzil və fərdi ev verilib. 2020-ci ilin Vətən müharibəsindən bu günədək isə həmin kateqoriyadan olan 4500 vətəndaş mənzillə təmin olunub. Ümumilikdə isə bu günə qədər 13 mindən çox şəhid ailəsi və müharibə veteranı mənzillə təmin olunub ki, bu da çox yüksək göstəricidir. Bu rəqəmlərin özü sübut edir ki, Prezident İlham Əliyev hər zaman şəhid ailələrinin, veteranların, müharibə əlillərinin mənzil-məişət problemini yaxşılaşdırmaq üçün ciddi addımlar atıb, onların hər bir probleminə xüsusi diqqətlə yanaşıb.

Eyni zamanda, vurğulamaq istərdim ki, ölkəmizin Birinci vitse-prezidenti Mehriban xanım Əliyevanın rəhbərlik etdiyi Heydər Əliyev Fondu tərəfindən də bu kateqoriyadan olan insanlarla bağlı müxtəlif layihələr həyata keçirilir. Bütün bunlar onu deməyə əsas verir ki, şəhid ailələri, qazilər və əhalinin digər həssas qruplarına aid insanlara diqqət və qayğının göstərilməsi, onların rifah halının yaxşılaşdırılması dövlətimizin yürütdüyü siyasətin prioritet istiqamətlərindən biridir. Həmçinin, Vətən müharibəsindən sonra Prezident İlham Əliyevin 2020-ci il 8 dekabr tarixli Fərmanı ilə "YAŞAT" Fondu yaradılıb. Məqsəd müharibədə yaralanan, sağlamlıq problemi yaşayan veteranların müalicəsini yüksək səviyyədə həyata keçirməkdədir. Eləcə də şəhid olmuş qəhrəmanlarımızın övladlarına müvafiq müavinətlərin verilməsi, onlara xüsusi imtiyazların tanınması artıq təmin olunub.

Lakin bütün bu uğurlara baxmayaraq "fəaliyyəti" ancaq dağıdıcılığa, ölkəmizin əldə etdiyi uğurlara qara yaxmağa köklənmiş radikal müxalifət bu məsələyə də "özünəməxsus şəkildə" yanaşır. Belə ki, antimilli şurada cəmləşən dağıdıcı ünsürlər ya dövlətin guya sosial məsələlərin həllinə diqqət etmədiyini iddia edir, ya da ölkəmizdə həyata keçirilən sosial siyasət fonunda dövlətin qazilərin, şəhid ailələrinin və müharibə əlillərinin sosial rifahının yüksəldilməsi istiqamətində atdığı addımları öz adlarına çıxmağa çalışırlar və nəhayət ki, bu cür oyunlara "dur!" deməyin vaxtıdır. Bunu da cəmiyyətimiz etməlidir. Sosial şəbəkələrdə qazilər üzərindən oyun quranlara cəmiyyət layiq olduqları cavabı verməlidir.

Cəmiyyətimiz Əli Kərimli kimilərə qandırmalıdır ki, qazilərimiz, şəhid ailələrimiz sosial şəbəkə aləti deyil... Hacıbəyli, Qənimət Zəhid, Sevinc

Osmanqızı, Vidadi İskəndərli və bu kimi manqurtlar bilməlidirlər ki, bu gün bütün şəhid ailələri və qazilər dövlət tərəfindən qayğı ilə əhatə olunub. Radikal müxalifət düşərgəsi və onların xaricdə məskunlaşmış satqınları ölkəmizə qarşı çirkin kampaniyalar aparmaqla ermənipərəst dairələrin dəyirmanına su tökməyə çalışırlar. Bu o satqınlardır ki, Vətən müharibəsində əldə olunan qələbəyə kölgə salmaq istədilər, ancaq xalq onları bir dəfəlik tarixin zibilliklər arxivinə atdı. Ancaq bunu anlamadılar. Bu gün qazilərə "canıyanalıq" göstərmək istədilər.

Ancaq belələri unudurlar ki, dövlətə, xalqa qarşı edilən xəyanətlər heç zaman bağışlanmır. Özünü xalqa "canıyanan" göstərməyə çalışan AXCP sədri Vətən müharibəsi dövründəki fürsətcil mövqeyini arxa plana keçirib, bu dəfə də şəhidlərimizin, qazilərimizin kölgəsində uğursuz manipulyasiya həyata keçirməyə çalışsa da, onun danışdığı yalanlar bumeranq effekti ilə öz sifətinə çırpılır. Məsələn, Əli Kərimlinin əsassız iddialarının əksinə olaraq, şəhid ailələrinin, qazilərin, müharibə veteranlarının sosial problemlərinin həlli ilə bağlı genişmiqyaslı tədbirlərin həyata keçirilməsi, onlara verilən aylıq müavinətlərin dövlət başçısının müvafiq qərarı ilə artırılması, hətta müharibə iştirakçıları ilə bağlı ortaya çıxa biləcək hər hansı bir formal problemin operativ şəkildə öz həllini tapması üçün müvafiq komissiyanın yaradılması hər kəsə gün kimi aydındır.

Belə olan halda bu reallığı Ə.Kərimli billə-bilə xain xislətli nəyi etiraf edir? Bir də sosial şəbəkə "qəhrəmanları" Zəfərimizdən keçən bu üç il ərzində hansı qazinin, yaxud şəhid alənin problemi ilə maraqlanıb? Bütün bunlar bir daha onu göstərir ki, Vətən müharibəsində xalqın yanında yer almayanlar yeni yalanlar uydurmaqla siyasi səhnəyə qayıtmaq istəyirlər. Bu isə mümkün deyil! Ancaq Azərbaycan dövlətinin həyata keçirdiyi sosial siyasətin mərkəzində Azərbaycan vətəndaşı və onun firavan yaşam tərzi dayanır və bu gün Prezident İlham Əliyevin rəhbərliyi ilə əhalinin sosial rifahının yüksəldilməsi, sosial infrastrukturun ən müasir standartlara uyğun qurulması istiqamətində məqsədyönlü siyasət həyata keçirilir. Xalq 20 ildən çoxdur ki, Prezident İlham Əliyevin apardığı uğurlu siyasətin şahididir. Dövlət başçımızın imzaladığı müvafiq sənədlər əsasında şəhid ailələri mənzillərlə təmin edilir. 2021-ci ildə 3000, postmüharibə dövründə 3500 mənzil verilib. Beləliklə, ümumilikdə 12500 şəhid ailəsi və

müharibə əlili mənzil və fərdi evlə, 7400 müharibə əlili avtomobillə təmin olunub.

Göründüyü kimi, Əli Kərimlinin budəfəki “iddiaları” da qərəzli və əsassızdır. Sadəcə olaraq, AXCP sədri növbəti dəfə özünü “siyasi meydanda” saxlamaq, daha doğrusu, onu maliyyələşdirən xaricdəki ermənipərəst dairələr qarşısında özünü “təsdiq etmək” üçün yenə də ortaya atdığı boş fikirlərlə gündəmə gəlməyə çalışır. Bu isə nə onun özünə, nə də ətrafındakılara heç bir siyasi dividend qazandırmayacaq. Çünki Azərbaycan xalqı onların əsl simasını yaxından tanıyır. Sosial istifadəçi gənclər Əli Kərimlinin antitəbliğat kampaniyasını pisləyərək, belələrinin cəzalandırılması tələbəi ilə çıxışı ediblər.

Göründüyü kimi, bir sözlə, cəmiyyətimizin həssas təbəqəsi olan Qarabağ müharibəsi əlilləri, şəhid ailələri və veteranları adından istifadə edərək antitəbliğat aparmağa cəhd edən Əli Kərimlini elə bu kateqoriyadan olan insanlar, Vətənini sevən gənclər peşman etdilər. Sosial şəbəkələrdən istifadə edən ictimaiyyət nümayəndələri bu dəfə də dövlətin yanında olduqlarını, cənab Prezident İlham Əliyevin siyasətini dəstəklədiklərini sübut etdilər. Bu fakt özlüyündə bir daha həm Əli Kərimli kimi radikal müxalifət, həm də onlara himayədarlıq edən anti-Azərbaycan dairələri üçün şillə kimi cavab oldu.

## MÜNDƏRİCAT

Zərifə Quliyeva

# ZƏFƏR TARİXİMİZİN FATEHLƏRİ

Bakı–2024

---


| | |
|---|---|
| Mətbəənin direktoru | – Fuad HÜSEYNOV |
| Texniki redaktor | – Azər RƏSULOV |
| Texniki korrektor | – Təranə RƏHİMOVA |
| Dizayner | – Samirə QAMBAYEVA |
| Çap | – Oktay YUSİFOV |
| Səhifələnmə | – Günel ƏSƏDOVA |
| Cild | – Gövhər NURULLAYEVA |
| | – İlhamə MİKAYILOVA |



*Kitab* ***"AFPoliqrAF"*** *mətbəəsində hazır diapozitivlərdən ofset üsulu ilə çap olunmuşdur.*

afpoliqraf@mail.ru | Tel.: +994 (12) 510 96 74
afpoliqraf@gmail.com | Mob.: +994 (50) 405 96 74

Yığılmağa verilmişdir: 15.05.2024
Çapa imzalanmışdır: 05.06.2024
Qarnitura: Cambria
Şərti çap vərəqi: 23
Formatı: 70x100 $^{1}/_{16}$
Tiraj: 300



## Zərifə Quliyeva

"Zəfər tariximizin fatehləri" tanınmış ictimai-siyasi xadim, YAP Veteranlar Şurasının üzvü, "Modern İnkişaf və Ailə" İctimai Birliyinin sədri, **Zərifə xanım Quliyevanın** sayca 7-ci ci kitabıdır. Onun "Ömrün son baharı" kitabı "İlin kitabı" nominasiyasının ən yaxşısı olmuş, Simurq Milli Mükafat Fondunun 2006-cı il "Baharın uğur çələngi" müsabiqəsi laureatının ali dərəcəli diplomuna layiq görülmüşdür. Z.Quliyeva, həmçinin "Sənsiz səninlə", "Son ümidim", "Tale yazısı" və "Nicat günü" adlı kitabların da müəllifidir.

Z.Quliyeva, həm də Respublikanın ictimai-siyasi həyatında fəal iştirakına görə diqqət mərkəzində olub. O, Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin mart 2017-ci il tarixli Sərəncamı ilə "Tərəqqi" medalına layiq görülmüşdür. Onun aldığı mükafatların siyahısı çox zəngindir. Bu mükafatların ən qiymətlisi isə təltiflər arasında əlçatmaz zirvə olan "Heydər Əliyevin 100 illiyi (1923-2023)" yubiley medalıdır. Zərifə Quliyeva Ulu öndərin 100 illiyinə həsr olunmuş tədbirlərdə, həmin tədbirlərin bəzilərinin təşkilində fəallığına, Heydər Əliyev irsinin tədqiqində və təbliğində xüsusi xidmətlərinə, dövlət quruculuğunda, o cümlədən azərbaycançılıq ideyasının həyata keçirilməsində, ölkənin sosial-iqtisadi, elmi-texniki və mədəni inkişafındakı xidmətlərinə görə Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 2 fevral 2024-cü il tarixli Sərəncamı ilə "Heydər Əliyevin 100 illiyi (1923-2023)" yubiley medalı ilə təltif edilmişdir.


9 789952 541847